*Bu kitab "**Əbülqasim Firdovsi. Şahnamə**" (Bakı, Yazıçı, 1987) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərcümə edəni, ön sözün və izahların müəllifi: **Mübariz Əlizadə**

Redaktorları: **Balaş Azəroğlu**
**Məmmədağa Sultanov**
**Abbasəli Sarovlu**

**891.55 - dc 21**
**AZE**
**Əbülqasim Firdovsi. Şahnamə.** Bakı, "Öndər nəşriyyat", 2004, 432 səh.

Klassik Şərq şerinin fəxri olan Əbülqasim Firdovsinin "Şahnamə" əsəri bütün dünyada şöhrət qazanmış, bədii söz və hikmət aşiqləri tərəfindən sevilə-sevilə oxunmuşdur. Dahi Nizaminin "sözü gəlin kimi bəzəyən tuslu ustad" deyə vəsf etdiyi şairin dünya ədəbiyyatı xəzinəsində öz təravətini min ildir saxlayan bu əsərinə Şərqin böyük sənətkarları yüksək qiymət vermişlər.
Tarixi-fəlsəfi epopeya olan "Şahnamə"nin hər bir dastanı şairin dünyagörüşünü, onun öz zəmanəsinə münasibətini əks etdirir.

**ISBN 9952-416-27-9**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

# ŞƏRQ POEZİYASININ QİYMƏTLİ İNCİSİ

Bəşər mədəniyyəti tarixində silinməz iz buraxan dahi sənətkarlardan biri Əbülqasim Firdovsi (934-1024) və dünya ədəbiyyatı xəzinəsində təravətini əbədi saxlayan şah əsərlərdən biri isə onun "Şahnamə"sidir.

Fars-tacik klassik şerinin fəxri olan Firdovsi bədii sözün qüdrəti ilə, böyük Nizaminin sözləri ilə desək: "Şerin elə bir qiymətli gövhərini yonmuşdur ki, onun tör-töküntüsü ilə bir çox bədii söz gəlinini bəzəmək olar".

Min ilə yaxındır ki, "Şahnamə" dünyaya səs salmış, bədii söz, hikmət və gözəllik aşiqlərini öz pərəstişkarlarına çevirmiş, sevilə-sevilə oxunmuş, bir çox ölməz sənətkarların istifadə mənbəyi olmuş, kimi onu təqlid etmiş, kimi ona nəzirə yazmış, kimi onun qəhrəmanları, kimi onun müəllifi haqqında dastanlar yaratmış, kimi onun tərcüməsi, kimi isə onun şərhi və tədqiqini özü üçün şərəf hesab etmişdir. Əsrlər ötmüş, nəsillər biri digərini əvəz etmiş, bəşər yeniyetməlik dövründən təkamül mərhələsinə qədəm qoymuş, insan zəkası elm və texnikanın, yeni mədəniyyətin inkişafında möcüzələr yaratmış, "Şahnamə" isə öz gənclik təravəti ilə yaşamış, ondakı ülvi, bəşəri məzmun və dərin fəlsəfi idrak yeni elm baxımından daha dolğun, daha düzgün kəşf edilmiş və kəşf edilməkdədir. Hazırda dünyanın bir çox xalqları "Şahnamə"ni öz ana dillərində oxuyur, öyrənir, onun yaradıcısı dahi Firdovsini öz doğma şairi kimi sevir və xatirəsini əzizləyirlər. Böyük sənətkar özü bəşər mədəniyyəti xəzinəsinə bəxş etdiyi bu nadir şeir incisinin həqiqi qiymətini, onun əbədiyyətə qovuşacağını bütün müasirlərindən daha yaxşı dərk etmiş və öz inamını əsərin sonunda bu misralarla ifadə etmişdir:

Otuz il ağır zəhmətə dözmüşəm,
Bu farsca əsərlə dirilmiş ecəm.
Abad qəsrlər ki göyə baş vurar
Günəş istisindən, yağışdan uçar.
Elə bir uca qəsrdir bu əsər
Ki, görməz yağışdan, küləkdən zərər.
Toxum səpmişəm torpağa şeirdən,
Sağam, ölmərəm dünya durduqca mən.



"Şahnamə"nin dünya ədəbiyyatının şah əsərləri sırasında fəxri yer tutmasının və Firdovsiyə ölməzlik qazandırmasının sirri nədədir? Bu suala görkəmli alim İ.S.Braginski vermişdir. O, "Şahnamə"ni əsatiri tarixi əfsanələrdən, lirik məhəbbət dastanlarından və nadir şeriyyət incilərindən əmələ gəlmiş okeana oxşadaraq yazır: "Okeanın üst səthi əzəmətli, onun eni, uzunu ucsuz-bucaqsızdır. Lakin onun ilk baxışda görünməyən ikinci həyatı dərinliyi daha da əzəmətlidir. Onun dibi Alp hündürlüyündə olan uca dağ silsilələri ilə örtülmüşdür. Yuxarılarda suyun hərarəti otuz dərəcəyə çatdıqda aşağı laylarda onun dörddə birinə də çatmır. Okeanın bu dərinliklərində hələ nə qədər əsrarəngiz və ecazkar aləm gizlənmişdir!

"Şahnamə" okeanının ikinci həyatı da belədir. Qarşımızda o bir yandan ucsuz-bucaqsız səthi, digər tərəfdən ölçüyəgəlməz dərinliyi ilə təcəssüm edir" (*И.С.Брагинский.* "К истории таджикской и персидской литературы". Москва, 1972, с.247).

Qeyd etməliyik ki, bu möhtəşəm hikmət okeanının birinci həyatı, onun əzəmətli səthi on əsr davam edən tarix boyunca dünyanın hər yerində şair, alim, rəssam və bütün sənət və hikmət aşiqlərinin diqqət mərkəzində durub, onları öz misilsiz hüsnünə heyran etmişsə də onun daha mənalı və cazibəli olan ikinci həyatını açan, dərinliklərdəki ecazkar aləmi, ondakı nadir gövhərləri kəşf edən və dünyaya tanıtdıran alimlər olmuşdur.

Firdovsi və onun "Şahnamə"si haqqında onlarla tədqiqat işi, monoqrafiya yaradılmış, ölməz şairin əsəri dünya dillərinə tərcümə edilmiş, "Şahnamə" mövzularında bədii əsərlər yazılmış, 1934-cü ildə Firdovsinin anadan olmasının minilliyi təntənəli bayram edilmişdir.

Azərbaycanlılar çox qədim zamanlardan "Şahnamə" və onun müəllifinə böyük hörmət bəsləmişlər. Dahi Nizami "Xosrov və Şirin", "Yeddi gözəl" və "İskəndərnamə"sində Firdovsi qəhrəmanlarına müraciət edərək, onlara əbədi həyat bəxş edən naxışlar vurmuş və ölməz sənətkarı "sözü gəlin kimi bəzəyən tuslu ustad şair" deyə vəsf etmişdir.

XIX əsrdən başlayaraq "Şahnamə"dən parçalar ana dilimizə tərcümə olunmuş və bu tərcümələr toplanıb 1934-cü ildə kiçik, lakin nəfis bir kitab şəklində çap olunmuşdur. Böyük dramaturqumuz Hüseyn Cavidin "Səyavuş" dramı da həmin dövrdə yaranaraq tamaşaya qoyulmuşdur.

Firdovsinin tərcümeyi-halı haqqında dəqiq məlumat yoxdur. Onun həyatı barədə əfsanəvi rəvayətlərin çox olmasına baxmayaraq, şairin əsil adı, anadan olması, vəfat etməsi tarixləri haqqında qəti fikir söyləyən və öz fikrini inandırıcı sənədlərlə sübut edən müəllifi hələ ki, biz tanımırıq. Bu sətirləri yazanın fikrincə, hər hansı böyük bir sənətkarın, o cümlədən Firdovsinin də təvəllüdü və ölümü haqqında dəqiq məlumat yoxdursa, təzkirəçi və tarixçilərin əksəriyyətinin göstərdiyi və hamının həqiqətə uyğun hesab etdiyi tarixi qəbul etməklə kifayətlənmək lazım gəlir. Ona görə ki, orta əsr müəlliflərinin əsərlərində şairin anadan olması və vəfat etməsi tarixinə dair ixtilaflar bir-iki, ən çoxu beş-altı ildən artıq deyildir, bu ixtilaflar əgər ciddi bir tarixi, siyasi hadisə ilə əlaqədar deyilsə, onları "dəqiqləşdirmək", məlum rəqəmi iki və ya üç il qabağa və ya geriyə çəkməyi "elmi kəşf" kimi oxucuya təqdim etmək mənasız işdir. Çünki, müasir insanları maraqlandıran əsas məsələ klassiklərin əsərlərindəki ictimai-fəlsəfi məzmun və bədii-estetik keyfiyyətdir. Ona görə də bu xüsusiyyətlərə malik bir əsəri yazarkən, müəllifin yaşının otuz ya otuz iki olması, əlbəttə, ikinci, bəlkə də onuncu dərəcəli məsələdir. Bu cəhətdən İran elmi-ədəbi ictimaiyyətinin gəldiyi qərarı düzgün hesab etməmək olmaz. Onlar Firdovsinin müxtəlif mənbələrdə 930-940-ci illər arasında doğulub, 1020-1025-ci illər arasında öldüyünü göstərən rəqəmləri nəzərdən keçirərək, böyük şairin təvəllüd ilini 934, vəfat tarixini 1024-cü illər göstərməyi qərara almışlar.

Firdovsi 90 illik ömrünün 30-35 ilini "Şahnamə" kimi əbədiliyin möhrü vurulan və müəllifinə ölməzlik haqqı qazandıran əsərini yaratmağa sərf etmişdir.

Şərti olaraq "əsatiri", "qəhrəmanlıq", "tarixi" dastanlar adlandırılmış "Şahnamə"nin mündərəcəsi ibtidai insanların yer üzündə ilkin təşəkkül dövründən başlamış eramızın VII əsrinə qədər, əsasən Asiya qitəsində baş vermiş hadisələrin poetik təsvirini əhatə edir.

"Şahnamə"də öz bədii ideya təkamülünü tapmış dastanların və onlarda təsvir olunan əsatiri, yarım əfsanəvi və hətta tarixi qəhrəmanların ilk mənşəyini çox qədim zamanlarda icma halında yaşayan ibtidai insanların bəsit, lakin qanadlı təxəyyülündə axtarmalıyıq. Bu dastan və nağıllarda tərənnüm edilən nəcib bəşəri hisslər ibtidai insanların xəyalındakı vüsəti dərk etmək üçün əlimizdə bir meyar ola bilər.



Sinfi cəmiyyətin – quldarlığın yaranması və dinlərin əmələ gəlməsi ilə ibtidai insanların təxəyyülündən doğan nağıllar və dastanlar yazıya köçürülür, onlardakı qəhrəman surətləri ilahiləşdirilir, dastanların dini, şifahi – xəlqi variantları meydana çıxırdı.

Zaman ötdükcə dini variantlarla xalq variantları arasında çarpazlaşma, qarşılıqlı təsir əmələ gəlir ki, bu da öz əksini əvvəlcə folklorda və ondan istifadə ilə yaranan bədii əsərlərdə tapır.

"Şahnamə"nin ilk sələfi sayılan "Xvataynamak" məhz bu kimi əsərlərdən idi. Tarixi mənbələrin verdiyi məlumata görə pəhləvi dilində olan "Xvataynamak" ərəb qoşunları İranın paytaxtı olan İstəxri (Mədaini) işğal edərkən onların əlinə keçmiş, ərəb dilinə tərcümə edilərək xəlifə Ömərə təqdim olunmuşdur. Xəlifə əsərin məzmunu ilə tanış olduqda onun atəşpərəstlik ayinlərini təsdiq edən və İran şahlarının əzəmətindən bəhs edən bir kitab olduğunu bilib rədd etmişdir.

Qeyd etmək lazımdır ki, "Xvataynamak"ın əsl nüsxəsi itmişsə də, orta əsrlərdə İran tarixinə aid bir çox əsərlərdə ona istinad edilib, misal gətirilir. Bu da əsərin VIII əsrin ortalarında Əbdüllah İbnül-Müqəffə tərəfindən ərəbcəyə tərcümə edilməsi haqqında rəvayətin doğru olması ehtimalını gücləndirir. "Xvataynamak"dan gətirilən ərəbcə parçaların əsərin xəlifə Ömərə təqdim edilən ilk tərcüməsindən alınması ehtimalını da müəyyən qeyd-şərt ilə əsassız hesab etmək olmaz.

"Şahnamə"nin farsca ilk variantları, natamam halda olsa da, samanilər sülaləsinin (874-995) hakimiyyəti dövründə yazılmışdır. Müxtəlif mənbələrin verdiyi məlumata görə Firdovsiyə qədər dörd və ya beş müəllif dəri (fars) dilində nəzm və nəsr ilə "Şahnamə" yazmaq təşəbbüsündə olmuşdur. Firdovsi də "Şahnamə"nin giriş hissəsində öz sələfləri barəsində söz açır, həm pəhləvi, həm də farsca bu mövzuda yazılmış ona məlum olan əsərlər haqqında qısa məlumat verir.

"Kitabın hazırlanması barədə" sərlövhəli parçanı böyük şair təvazökarlıqla belə başlamışdır:

Nə vardı demişlər, nə qalmış, deyim?

Həmin parçada şair birinci növbədə "Xvataynamak"ın yaranmasına işarə ilə yazır:

Qədimlərdə vardı böyük bir kitab
Ki, dastanlarıydı onun bihesab.
Gəzərdi pərakəndə əldən-ələ,
Onu hər kəs istərdi əzbər bilə.

Belə bir kitabın, ona daxil olan dastanların necə toplandığı və ya yazıya köçürüldüyünü Firdovsi demək olar ki, "Xvataynamak" haqqında rəvayətlərdə göstərildiyi kimi izah edir. O da təsdiq edir ki, qədim tarixin tədqiqi ilə məşğul olan bir ağıllı, cəsarətli nəcibzadə, dünya görmüş, kamal sahibi möbidləri başına toplayıb, dünyanın necə qurulduğunu, qəhrəmanların necə çarpışıb qələbə çaldığını, necə ölüb getdiyini onlardan öyrəndi və çox böyük bir dastan yazdı:

Cəsarətlə yazdı elə bir əsər,
Böyüklər ona afərin söyləyər.

Dəqiqinin "Şahnamə" yazmağa başlaması və hələ gənc ikən öz qulu tərəfindən öldürüldüyünə görə məqsədinə nail ola bilməməsi haqqında Firdovsinin yazdığı sətirlər elmi əsərlərdə verilən məlumata tamamilə uyğun gəlir. "Şahnamə"nin mətnində Firdovsi bir daha Dəqiqidən söz açaraq, onun yazdığı min beyti öz əsərinə daxil edir və Zərdüşt zamanında İran şahı Guştasp ilə Turan şahı Ərcasp arasında gedən müharibələrdən bəhs edən və natamam qalan dastanı tamamlamaqla, Dəqiqinin adını və əsərini ədəbiyyat tarixində əbədiləşdirmək kimi nəcib bir iş görür.

Sonrakı beytlərdən aydın olur ki, onun "Şahnamə" yazmaq fikrində olduğunu bilən "can qədər əziz bir dostu" həmin mövzuda olan əsərin mətnini köçürüb şairə verir və onu başladığı işi davam etdirib sona çatdırmağa təşviq edir. Əsərlə tanış olan Firdovsi sanki onun müəllifini xeyirxah bir insan, təkcə sözünü deyil, canını belə ondan əsirgəməyən dost kimi öz gözündə canlandırıb yazır:

Mən o mətnə baxdım, aldım ələ,
Nə gördüm ki: məndən də əvvəl hələ
Var imiş ağıllı, sayıq bir cavan,
Neçə nəsli dünyada şöhrət tapan.
İradə, həya sahibi bir nəfər,
O, sözdən düzübdür gözəl incilər.
Mənə söylədi: – Gəl, əlimdə nə var,
Nə söz, can belə istəyirsən, apar!
Sənindir, çatarsa əlim hər nəyə,
Ağız açma heç başqa bir kimsəyə.

Göründüyü kimi, burada Firdovsi ələ keçirdiyi qiymətli mənbənin və onun müəllifinin adını çəkmir. Şairin öz sözündən aydın olur ki,



onun əlinə ölməz əsərini yazmaq üçün lazım olan, bütün məlumatı əhatə edən bir zəngin mənbə keçmişdir. Belə bir mənbə hansı əsər ola bilərdi? Belə bir suala fərziyyə ilə deyil, inamla cavab vermək olar ki, söhbət Əbu Mənsur Əl-Müəmmərinin nəsr ilə yazıb 957-ci ildə tamamladığı "Şahnaməye-Əbu Mənsuri"dən gedir. Bu fikri Firdovsinin əsər sahibi haqqında dedikləri də qüvvətləndirir. Şairin yazdıqlarından aydın olur ki, onun başını ərşə ucaldan o səxavətli cavanmərd, xoşniyyət insanı heç vaxt görməmişdir, taleyindən də xəbəri yoxdur:

Onuntək bir insan bizi tərk edib,
Solubdur çəmən, sərv bağdan gedib
Ölübmü, yaşarmı? Bilmirəm xəbər,
Ölübsə böyük itki vermiş bəşər.
Təəssüf, o ağla, kamala heyif!
Uca qamətə, xoş camala heyif!
Ümid qalmamışdır onu tapmağa,
Dönübdür ürək bir əsən yarpağa.

Beləliklə, "Şahnamə"ni yazarkən Firdovsinin hansı yazılı mənbələrdən faydalandığı barədə müəyyən qənaətə gəlmiş oluruq. Lakin bu mənbələrin böyük şair üçün ancaq ikinci dərəcəli əhəmiyyəti olmuşdur. Dahi şairin belə bir ölməz əsəri yazarkən istifadə etdiyi birinci dərəcəli mənbə, tükənməz xəzinə, özünün dönə-dönə qeyd etdiyi kimi, dünya görmüş, ağıllı, müdrik adamlardan eşitdiyi nağıllar, dastanlar olmuşdur. Firdovsinin Qəznəyə gəlib Sultan Mahmud sarayına yol tapması haqqında mövcud olan müxtəlif rəvayətlərdən biri az-çox təbii görünür ki, qısaca olaraq, onun məzmununu qeyd etməyi lazım bilirik. Həmin rəvayətə görə, şair qoca yaşlarında ikən əsərini dərbara təqdim etmək üçünmü və ya şikayət üçünmü Qəznəyə gəlmiş, ancaq saraya yaxın buraxılmadığından şəhər kənarına çıxıb qəm-qüssəsini dağıtmaq məqsədi ilə gəzişirmiş. Onun güzarı səfalı bir bağa düşür və orada kiçik bir üns məclisinə təsadüf edir. Dərbar şairlərindən Ünsüri, Fərruxi, Əscüdi güllü-çiçəkli ağacların kölgəsində yaşıl çəmənlikdə əyləşib şərab içir, şeir deyirdilər. Firdovsi ayaq saxlayıb onların şeirləşməsinə qulaq asır. Şairlər yad adamın yaxında dayandığını görüncə, nə istədiyini soruşurlar. Firdovsi şeirdən xoşlandığını və onların dediyi şeirləri dinləmək istədiyini söyləyir. Şairlər isə onu başdan eləmək üçün deyirlər: "İndi ki, şeirdən xoşun gəlir, yaxın gəl, şeirləşək. Şərt-

imiz belə olsun, biz hərəmizə bir misra deyəcəyik, misralar eyni vəzn və qafiyədə olmalıdır. Əgər sən dördüncü misranı bədahətən deyib rübaini tamamlaya bilsən, məclisimizdə əyləşəcəksən. Bunu bacarmasan, dərhal bağı tərk etməlisən".

Firdovsi şərti qəbul edir, yarış başlanır. Saray şairləri mücərrəd bir gözəlin vəsfində deyirlər:

Ü n s ü r i : – Ay nurlu üzün qədər deyildir rövşən
Fə r r u x i: – Açmaz yanağın misli qızılgül gülşən.
Ə s c ü d i : – Kirpiklərin ilə deşilər hər covşən
F i r d o v s i: – Eynən elə ki, Givin oxu ilə Peşən.

Dahi şair bu təsadüfi müsabiqədə bircə misra ilə böyük qələbə qazanmışdı. Saray şairlərinin söylədiyi misralar dövrün məhəbbət lirikasında mübaliğəli istiarə və məcazların təkrarından başqa məziyyətə malik deyildi. Firdovsi isə rübaidə ən çətin sayılan sonuncu, tamamlayıcı misranı bədahətən deməklə kifayətlənməmiş, həm də ona yeni məzmun gətirərək "Şahnamə"də təsvir etdiyi cəngavərlik səhnələrindən biri ilə əlaqələndirmişdi.

Şübhəsiz ki, şairlər belə bir istedad sahibinə artıq xor baxa bilməzdilər. Ehtimal etmək olar ki, şairin Sultan Mahmud sarayına getməsinə və əsərini Qəznə hökmdarına təqdim etməsinə onlar şərait yaratmışdılar. Belə bir fərziyyə nisbətən inandırıcı olsa da, müxtəlif mənbələrdə onu rədd edən, hətta adları yuxarıda çəkilən dərbar şairlərinin Firdovsi əleyhinə saray intriqasında fəaliyyətdə olduqlarını göstərən yazılara da təsadüf edirik. Firdovsinin saraya dəvət olunması və ya özünün gəlməsi, "Şahnamə"ni hansı şəraitdə, nə vaxt yazıb tamamlaması və şaha təqdim etməsi, Sultan Mahmudun əsərə və onun müəllifinə münasibəti haqqında yaranıb yayılmış, sonralar yazıya köçürülmüş əfsanələr o qədər müxtəlif və biri digərinə zidd görünür ki, onlardan hansının tarixi həqiqətə yaxın olduğunu söyləmək hələlik mümkün deyildir.

Firdovsinin tərcümeyi-halına aid hamı tərəfindən təsdiq olunmuş məlumat yalnız budur ki, şair Tus şəhərində kiçik torpaq sahibi dehqan ailəsində anadan olmuş, uzun ömür sürmüş, Sultan Mahmud "Şahnamə" üçün vəd etdiyi ənamı ona vermədikdən sonra ölməz sənətkar doğma şəhərinə qayıdıb vəfat etmişdir. Şairin özü "Şahnamə"də dönə-dönə qocalıqdan şikayətlənir, xüsusilə cavan oğlunun ölümündən sonra yaşamaqdan bezdiyini açıq söyləyir.



Firdovsi dahi şair, mütəfəkkir olmaqla bərabər böyük insan olmuşdur. Vətənini, xalqını coşqun məhəbbətlə tərənnüm edən sənətkar yer üzündə yaşayan bütün insanların sülh, əmin-amanlıq şəraitində səadətə qovuşmalarını arzu etmişdir. Əllidən artıq dastanı əhatə edən bu əsərdə hadisələr tarixin müxtəlif dövrlərində, müxtəlif coğrafi mühitdə, müxtəlif tayfalar, qəbilələr, dövlətlər, xalqlar, şəxsiyyətlər arasında cərəyan etsə də, mətləb birdir. Tarix boyu bəşəriyyətin bütün parlaq beyinlərini düşündürən, bizim zəmanəmizdə öz aktuallığını tam dolğunluğu ilə qoruyan xeyir ilə şər qüvvələri arasındakı barışmaz mübarizə "Şahnamə"nin ideya xəttini, bütün dastanların əsas mövzusunu təşkil edir.

"Şahnamə"ni ilkin Şərq intibahının ən böyük diqqətəlayiq ədəbi abidəsi adlandırmaq olar. Bu əsatiri, qəhrəmanlıq, tarixi əsərin əvvəlindən axırına qədər hər yerində insanpərvərlik ideyası qızıl xətt ilə davam edir, insanın əzəmətini, onun vüqarı, nəcib hissləri və ülviyyətini pozan, ləkələyən nə varsa, hamısına qarşı dahi şairin kin və qəzəblə dolu ittihamnaməsi oxunur. Firdovsiyə görə, insan mənəviyyatını pozan, onu yırtıcı heyvanlar səviyyəsinə qədər alçaldan amillərdən biri hakimiyyət ehtirasıdır. Tarix boyu baş verən ən ağır cinayətlərin, qanlı müharibələrin kökünü şair məhz hökmdarlara xas olan bu Əhrimən sifətində görüb, bir çox dastanlarda dönə-dönə həmin məsələdən bəhs açır, dəhşətli səhnələr təsvir edir, hakimiyyət, taxt-tac, şöhrət və sərvət naminə dünyanı qan dəryasına döndərən caniləri lənətlə damğalayır. Hakimiyyət ehtirası atanın oğul, qardaşın qardaş qanına boyanmasına gətirib çıxarır. Zöhhakın hakimiyyətə tez çatması üçün hiylə ilə atasını öldürməsi, Solm ilə Turun torpaq və sərvətlərini artırmaq üçün ağıllı, nəcib doğma qardaşları İyrəcin başını namərdliklə kəsmələri, Şiruyənin ata qatili olması və sairə quldarlıq, feodal ictimai quruluşlarına xas olan faciələrdir ki, dahi şair ölməz əsərində bədii təfəkkürün qüdrəti ilə ibrətamiz səhnələr yaratmışdır.

"Şahnamə"də çoxlu müharibə səhnələri təsvir olunur. Şairin fikrincə, bəşəriyyətin ən böyük faciəsi, xalqların dözülməz fəlakəti müharibədir. Hər bir müharibənin təsvirindən sonra qələbənin kimin tərəfində olduğuna fərq qoymadan, böyük insanpərvər şair sanki oxucusuna müraciətlə fəlsəfi mühakiməyə başlayır. Yüz minlərlə insan atlı, piyada yurdunu, ailəsini, peşəsini tərk edib, silaha sarılır, çarpışır, öldürür, ölür, səhralar insan qanından al boyanır, leş leş üstə qalanır. Nə üçün? Şair bu suala cavab axtarır və tapır:

Qılınc oynadan şah evlər yıxar,
Mənəmlik edər, aləmi qırdırar.

Şair bu cür "qılınc oynadan", "mənəmlik edən" hökmdarların eyni zamanda zalım, qaniçən, ağıldankəm adamlar olduğunu göstərdiyi kimi, onların faciəli aqibətlərini də bacarıqla və ibrətləndirici boyalarla təsvir etmişdir. Zöhhak, Səlm, Tur, Keykavus, Bəhmən, Əfrasiyab, Dara, Kamus və başqa hökmdarların taleyi bu cəhətdən səciyyəvi və düşündürücüdür.

"Şahnamə"də təsviri verilmiş müharibələri məqsəd və xarakterinə görə iki qismə ayırmaq, onlara ədalətli və ədalətsiz vuruşmalar adı vermək olar. Şair "qılınc oynadan", qırğın törədən hökmdar surətlərinə qarşı, təcavüzkarlığı məhkum edən, sülhü, dostluğu insanlar, xalqlar arasında münasibətlərin təməli kimi müdafiə edən fədakar qəhrəman surətləri də yaratmışdır. Bu kimi qəhrəmanlardan Turan hökmdarı Əfrasiyabın qardaşı Əğrirəsi xüsusi qeyd etmək olar. Əfrasiyab İrana hücum edərək böyük ərazini tutmuş, başda şah Nuzər olmaqla minlərlə iranlını əsir almışdır. Çox keçmir ki, yeni İran ordusunun Zalın başçılığı ilə cəbhəyə yaxınlaşması xəbəri Turan şahına çatır. O, dərhal Nuzəri öldürür və Sari şəhərində saxlanılan iranlı əsirləri qırmağı da qardaşına əmr edir. Əğrirəs şah əmrini yerinə yetirmir. O, əsirləri buraxır, başındakı atlılarla Reyə, qardaşının yanına gəlib ona təkidlə məsləhət görür ki, nahaq qan tökməkdən əl çəksin, ordusunu alıb öz ölkəsinə qayıtsın. Əlbəttə, Əğrirəsin hərəkəti və sözləri Əfrasiyabı qəzəbləndirir. O, qılıncı çəkərək öz doğma qardaşının belindən vurur və bir zərbə ilə onu iki bölür. Firdovsi canını sülh yolunda, minlərlə silahsız insanı mütləq ölümdən xilas etmək yolunda qurban verən bu xeyirxah, nəcib insanpərvərin ölümünü şərəfli ölüm hesab edir, təsirli misraları ilə ona yas saxlayır.

Başqa bir dastanın qəhrəmanı Söhrab döyüş meydanında görüb tanımadığı atası Rüstəmlə üz-üzə vuruşur, hətta qalib də gəlir, Rüstəm al dillə onun güclü pəncəsindən qurtarır və onlar təkbətək döyüşün davamını sabaha saxlayırlar. Döyüşdə gücünü sınayıb qalib gələcəyinə şübhə etməyən Söhrab bütün bu vuruşmaları mənasız hesab edir. O, atasını axtarır, adam öldürməyi cinayət sayır. Dahi şair gənc pəhləvanın bu nəcib hisslərini yadda qalan bir epizodda təsvir etmişdir.

Rüstəm vətənini yenilməz cəngavərin cəngindən xilas etmək naminə şəninə yaraşmayan hiylə işlətmək qərarı ilə səhər tezdən güləş



meydanına gəlib hərifi gözləyir. Söhrab at üstə, gülər üzlə çatıb, Rüstəmi düşmən kimi deyil, sanki gecə sübhə qədər bir məclisdə oturub qədəh tutduğu dost kimi salamlayıb deyir:

Danış bir, necə yatmısan, durmusan?
Niyə qəlbini kinlə doldurmusan?
Əlindən o gürzü, qılıncı gəl at!
Yerə vur o qovğanı, dostluq yarat!
Gəl, atdan düşək, üz-üzə əyləşək,
Doyunca şərabdan içək, şənləşək.
Qılaq əhd, çarpışmayaq bir də biz,
Ədavətlə çırpınmasın qəlbimiz.
Əgər başqası gəlsə də meydana,
Biz, işrətlə sadiq qalaq peymana.

Söz yox ki, böyük sülh carçısı şair, gənc Söhrabın dili ilə fikrini söyləmiş öz arzusunu qələmə almışdır. Bu kimi epizodlar "Şahnamə"də çoxdur. Müharibəni xalqların ən böyük fəlakəti hesab edən Firdovsi ölməz əsərinin bir çox sevimli qəhrəmanlarını sülhsevərlik bəzəyi ilə bəzəmişdir. Bu kimi nəcib sifətə malik olan qəhrəmanlardan söz açarkən Səyavuş surəti haqqında qısaca danışmamaq olmaz. Səyavuş, mübaliğəsiz demək olar ki, Firdovsi dühası ilə tipikləşdirilmiş çoxcəhətli müsbət qəhrəman surətidir. O, şairin yelbeyin, şəhvətpərəst, "qılınc oynadan" şahlardan biri kimi qələmə aldığı Keykavusun oğlu olsa da, tərbiyəsini Rüstəmdən almışdır.

Səyavuş, demək olar ki, şairin idealıdır. Firdovsi bu qəhrəman surətini mənəvi paklıq, alicənablıq, insanpərvərlik, sülhsevərliyin timsalı kimi yaratmışdır. O, məhz mənasız müharibələrin, qırğınların qarşısını almaq üçün varisi olduğu taxt-tacdan, ata yurdundan əl çəkməyə məcbur olur, qürbətə düşür, mənəvi əzablar çəkir, faciəli şəkildə öldürülür. Səyavuş sülh və xalqların dostluğu ideyası yolunda qurban gedir. Lakin feodal quldarlıq cəmiyyətində mövcud olan adətlər bu facieni çətin və uzun sürən vuruşmaların başlanğıcına çevirir.

Burada bir cəhəti də qeyd etməyi lazım bilirik ki, Firdovsi müharibə səhnələrini təsvir edərkən tam obyektiv mövqe tutmuşdur. O, bu cəhətdən əsərinin böyük məhəbbətlə yaratmış olduğu baş qəhrəmanı Rüstəmə belə güzəştə getməmişdir. Bunu biz Rüstəmin Səyavuş qanını almaq üçün Turana hərbi səfərinin təsvirində aydın görürük. Tu-

ran ordusunu tarmar edib Əfrasiyabı şahlıqdan əl çəkib qaçmağa vadar edən Rüstəm yerli əhalini qırıb çatmağı davam etdirir. İnsanpərvər şair bunu sevimli qəhrəmanına bağışlaya bilmir və onun hərəkətini qəzəblə mühakimə edir:

Qılınc oynadı, sel kimi axdı qan,
Yerin halına ağladı asiman.
Bütün ölkəni çaldılar, çapdılar,
Nə vardı əlində elin qapdılar.
Kəsildi günahsızların başları,
Suvardı o torpağı göz yaşları.
Qırıldı qoca, həm cavan birbəbir,
Qadınlar, uşaqlar alındı əsir.
Cinayət törətmişdi Əfrasiyab,
Bütün ölkəni qoydu Rüstəm xarab.

Firdovsinin böyüklüyü ondadır ki, o, keçmişdə baş vermiş faciəli hadisələri yalnız təsvirlə kifayətlənmir. Şair yaratdığı obrazların sərgüzəşti və taleyindən öz müasirlərinə və gələcək nəsillərə ibrət dərsi vermək üçün istifadə edir. Tarixin yetişdirdiyi bütün böyük sənətkarlar kimi, Firdovsini də düşündürən əsas məsələ insanların həyatı, təhlükəsizliyi və səadəti olmuşdur. Şairə görə xalqlar üçün ən qiymətli nemət sülh və əmin-amanlıqdır. Ona görə də Firdovsi həmin neməti insanların əlindən alan təcavüzkar hökmdarları bütün əsər boyu nifrət və lənətlə damğalayır, onların acınacaqlı aqibətini də bədii boyalarla göstərir. Bu cəhətdən böyük sənətkarın yaratmış olduğu Ərdəşir, Dara, İskəndər, Ənuşirəvan, Xosrov Pərviz, Bəhrami-Çubin surətləri, onların həyat yolu, aqibəti də maraqlı və ibrətamizdir.

Firdovsini düşündürən və "Şahnamə"də əksini tapan mühüm məsələlərdən biri də feodal cəmiyyətində hökm sürən sosial bərabərsizlik, ondan doğan ədalətsizlikdir. Ölməz əsərin bir sıra dastanlarında məhəbbətlə tərənnüm etdiyi əkinçilər, maldarlar, qullar, sənətkarların maddi və mənəvi məhrumiyyətə məruz qalması böyük şairin ürəyini ağrıdır. Əlinin əməyi ilə minnətsiz çörək yeyən, insanları ərzaq, geyim və hər cür həyat ləvazimatı ilə təmin edən, qaniçən zöhhaka qarşı xalq üsyanına başçılıq edən Dəmirçi Kavə kimi qəhrəman yetişdirən zəhmətkeşlərin səadəti üçün şair yollar axtarır. Maddi bərabərsizliyi, ictimai zülmü aradan qaldırmaq üçün Firdovsi, əsərinin ayrı-ayrı epizodlarında bir-birindən fərqlənən fikirlər irəli sürür. Böyük şairin



fikrincə, ictimai ədalətsizliyi yox etmək üçün ədalətli, ideal hökmdarın varlığı əsas şərtdir. Bu şərt mövcud olduqda şair ictimai bərabərliyin yaradılması üçün düşündüyü yolları şərh edir ki, onların ikisi haqqında qısaca qeydlərlə kifayətlənmək olar.

Bəhram-Gur "Şahnamə"də yaradılmış ideal hökmdar surətlərindən biridir. Bütün dastan boyu şair onun nəcib insani sifətlərindən söz açır. Ovlaqda ikən onun yanına bir kəndli gəlib deyir:

– Tarlanı suvararkən su bir deşik açıb yerin altına axmağa başladı. Oradan qəribə səslər gəlir, zənnimcə, xəzinə olmalıdır.

Bəhramın əmri ilə həmin yer qazılır, möhtəşəm bir saray aşkara çıxarılır ki, içi saf qızıldan qayrılıb, cəvahiratla bəzədilmiş öküz, ceyran, tavus və başqa quş, heyvan heykəlləri ilə doludur. Öküz heykəllərindən birinin sağrısında "Cəmşidin xəzinəsi" sözləri yazılmışdır. Vəzir şaha müjdə verir ki, tale ona belə bir tükənməz sərvət bəxş etmişdir. Bəhram isə "Daşıyın, saraya aparın!" əmrini vermək əvəzinə deyir:

Xəzinə ki, Cəmşid qoyub yadigar,
Mənə yox, onun irsi xalqa çatar...
Nə zəhmət çəkib, nə qılınc vurmuşam,
Nə də o büsatı özüm qurmuşam...
Tamah hissini qəlbinizdən atın!
O qiymətli gövhərləri siz satın!
Qızılla gümüş toplasaz hər qədər,
Sayın, qoymayın, vaxtı getsin hədər.
Nə çoxdur dul arvad, yetim, qarnı ac,
Salıb dərbədər onları ehtiyac,
Nəvazişlə dəvət edin dərbara,
Bu sərvətləri paylayın onlara!

Bəhramın hökmü yerinə yetirilir, qatar-qatar qızıl, gümüş aclara, yoxsullara paylanır. Bundan əlavə Bəhram bir çox acgöz, xəsis, soyğunçu varlının sərvətlərini də mərd və namuslu yoxsulların ixtiyarına verir. Lakin ideal bir hökmdarın sadəcə səxavət və qayğısı cəmiyyətdə ictimai, maddi bərabərsizliyə son qoymaq üçün kifayətdirmi? Görünür ki, Firdovsinin özü də bu suala cavab tapmır. İnsanların səadətini sülh, əmin-amanlıq və maddi, ictimai bərabərlikdə görən şair utopiyaya da müraciət etmişdir. Maraqlıdır ki, Firdovsi də öz utopiyasını, Nizami kimi, İskəndərin adı ilə bağlamışdır, lakin müraciət obyektləri eyni olsa

da, bu iki dahi sənətkarın ictimai fəlsəfi görüşlərində fərqli və təzadlı cəhətlər özünü tam aydınlığı ilə göstərir. Nizami utopiyasında maddi, ictimai və hüquq bərabərliyi əsasında qurulmuş cəmiyyətdə zəhmət həlledici amildir. Bu cəmiyyətdə bütün insanlar firavan həyat sürür, təbiət və zəhmətin bəxş etdiyi şirin nemətlərdən istədikləri kimi istifadə edirlər. Cəmiyyət bolluq, zənginlik, sağlamlıq, şənlik əsasında inkişaf etmişdir. Hətta ictimai binalar qızıl və qiymətli daşlarla bəzədilmişdir.

"Şahnamə"də İskəndərin getdiyi Brəhmənlər ölkəsində insanlar "soadəti" könüllü yoxsulluq və məhrumiyyətdə tapmışlar. Doğrudur, burada hakim və məhkum yoxdur. Hamı bərabər və azaddır. Ancaq bu bərabərlik aclıq və çılpaqlıq bərabərliyidir. Azadlıq dünyanın nemətlərindən məhrumluq azadlığıdır. Bu isə əlbəttə, sözün əsl mənasında xoşbəxtlik deyil, bir növ ellikcə zahidlik, tərki-dünyalıqdır.

Firdovsi düşünür və nəhayət onun diqqətini Məzdək haqqında şifahi və yazılı ədəbiyyatda geniş yayılmış rəvayətlər cəlb edir. Məzdəkilik VI əsrin ilk illərində Sasanilər dövlətinin hər yerini çulğamış xalq üsyanının ideoloji mənbəyi olmuşdur. Sasani şahlarından Qubadın sarayında ağlı, biliyi, zəkası ilə yüksək məqam və nüfuz sahibi olan Məzdək xalqın halına acıyan, ictimai ədalətsizliyin kökünü maddi bərabərsizlikdə görən açıq düşüncəli mütəfəkkirdir. Onu düşündürən belə bir acı həqiqətdir ki, bütün maddi nemətləri yaradan zəhmətkeş insanlar olduğu halda, özləri aclığa, məhrumiyyətə məhkumdurlar. Onların zəhmətinin bəhrəsindən isə bir ovuc tüfeyli varlanıb, naz-nemət içində firavan yaşayır, hakimiyyət sürür. Məzdək onu da dərk edir ki, heç bir varlı istismar və soyğunçuluqla əldə etdiyi sərvəti öz xoşuna yoxsullara, bu sərvətin həqiqi sahibləri olan zəhmətkeşlərə qaytarmaz. Odur ki, "dərətçiləri qarət etməli" nəzəriyyəsini irəli sürür. O, yeri gəldikcə, öz müdrik mühakimələri və təsirli nəsihətləri ilə şah Qubadın ürəyini yumşaltmış və maddi-ictimai təzadın dəhşətlər törədə biləcəyinə onu inandırmışdır. Məzdək məramını icra üçün aclıq çəkən kütlələrin şah dərbarına üz tutub yardım istəməsindən istifadə edir.

Şahın razılığından bacarıqla istifadə edən Məzdək varlıların anbarlarının açılıb yoxsullara paylanmasına göstəriş verir. Məzdək öz var-yoxunu da xalqın ixtiyarına verir. Şahın anbarları da boşaldılır. Məzdəkin məramı bütün dünyaya yayılır. Bütün insanların bərabərliyi Məzdək dininin prinsipi kimi qəbul edilir. Qubadın zahirdə Məzdəklə razılaşmaqdan başqa çarəsi yox idi. Məzdək hətta vəliəhd Kəsranı da özü ilə həmfikir etməyə çalışır. Lakin cavan şahzadə hiyləgər və amansızdır. O, Məzdək hərəkatında zərər çəkmiş böyük feodalları ətrafına toplayıb, əlbəttə, ikiüzlü atası Qubadın razılığı ilə xalq üsyanını boğmağın qanlı və amansız planını hazırlayır. Həmin plana əsasən, Qubad Məzdəkə göstəriş verir ki, ölkənin hər yerindən bütün görkəmli tərəfdarlarını "şahın görüşünə" dəvət etsin. Məzdək sadəlövhlüklə bu əmrə əməl edir.

Qubadın vəliəhdi Kəsra ətrafına topladığı feodalların atlıları vasitəsi ilə geniş bir sahədə xəndəklər qazdırır və gələn "qonaqların" hamısını xəndəklərdə boğazlarına qədər torpağa basdırır. Sonra isə vəliəhd Kəsranın hökmü ilə Məzdək dara çəkilir, dünənə qədər özünü böyük inqilabçı mütəfəkkirin tərəfdarı kimi qələmə verən Qubad isə cəlladbaşı oğluna minnətdarlığını bildirərək, xalq üsyanı başçısını lənətlə yad edib, onu "dinsiz", "divanə" adlandırır.

Etiraf etməliyik ki, yığcam bir müqəddimədə bütünlüklə "Şahnamə" haqqında hətta ötəri bəhs açmaq imkan xaricindədir. Bəşərin mədəni həyata ilk addımlarını atdığı əsatiri zamanlardan eramızın VII əsrinədək İranda və regionda baş vermiş hadisələrin bədii-epik salnaməsi olan bu ölməz əsər haqqında cildlərlə kitablar yazılmış və yazılacaqdır. "Şahnamə"də əlli hökmdarın sərgüzəşti, saysız döyüş səhnələri, yenilməz və sarsılmaz qüdrət sahibi cəngavərlərin qəhrəmanlığı, sadə və zəhmətkeş insanın qurub yaratmaq fəaliyyəti, xeyir ilə şər arasında gedən mübarizənin barışmazlığının qanunauyğunluğu, insan təbiətindəki ülvi və nəcib hisslərin tərcümanı olan pak məhəbbət dastanları dahi sənətkarın zəkası ilə ahəngdar şəkildə bir yerə toplanaraq insan ağlını heyran edən misilsiz, vahid bir epopeyaya çevrilmişdir.

Firdovsiyə görə, şahlar, pəhləvanlar, peyğəmbərlər, filosoflar, sənətkarlar dünyaya gəlir, gedir, xatirələrdə qalan onların yaxşı, ya pis əməlləridir. Bu xatirələri yaşadan yeganə bir qüvvə vardır ki, yaşayır və əbədi yaşayacaqdır. Bitməz-tükənməz qüdrət sahibi olan bu qüvvə xalqdır. Yer üzünü insanlar üçün cənnətə çevirən zəhmətkeş xalqdır!

* * *

Bu sətirlərin müəllifi xalqımızın Nizamidən başlamış M.F.Axundova, M.Ə.Sabirə, H.Cavidə qədər bir çox bədii söz ustalarının Firdovsiyə və onun ölməz epopeyasına göstərdikləri hörmət və məhəbbəti nəzərə alaraq hələ gənc yaşlarından "Şahnamə"ni ana dilinə çevirmək

arzusundaydı. 1943-cü ildən ADU-da fars ədəbiyyatı tarixinin tədrisinə başladıqdan sonra bu həvəs artdı və ilk tərcümə nümunəsini 1946-cı ildə "Azərbaycan" jurnalında, "Firdovsi və Azərbaycan" sərlövhəli məqalə ilə birlikdə çap etdirdi. Elə həmin illərdən Azərbaycan klassikləri və fars-tacik şairlərinin əsərlərini azərbaycancaya müntəzəm tərcümə və nəşr etdirmək vərdişi "Şahnamə"nin tərcüməsinə başlamaq üçün mütərcimə müəyyən cəsarət verdi. İyirmi ildən artıq davam edən yorucu zəhmətin ilk bəhəri olan "Şahnamə"nin birinci cildinin tərcüməsində əsas götürülmüş bəzi prinsipləri əziz oxucuların nəzərinə çatdırmağı lazım bilirəm.

Tərcümə farsca hazırlanıb doqquz cilddə çap edilmiş elmi-tənqidi mətn əsasında orijinaldan edilmişdir.

Mütərcim Firdovsinin dediklərini eyni ilə azərbaycancaya çevirməyə ciddi fikir vermiş, tərcümədə sərbəstliyi rəva görməmişdir, çətin də olsa, orijinalın vəznini, əruzun "mütəqarib" bəhrini saxlamışdır. Bu, ona görə zəruri idi ki, dahi sənətkar şerin ölçüsünü əsərin məzmununa fövqəladə məharətlə elə uyğun seçmişdir ki, özündən sonra gələn Nizami, Dəhləvi, Nəvai və Cami kimi onlarca başqa görkəmli Şərq şairi tarixi qəhrəmanlıq dastanlarını yalnız bu ölçüdə yazmışlar. Əruzun təfiləsində (taktlarında) mütəqarib bəhrini "Fəulün, fəulün, fəulün, fəul" sözləri ilə ölçmüşlər. Bunlar dilimizdə "yazarsan, yazarsan, yazarsan, yazar" sözlərinin ölçüsünə uyğun gəlir.

Zənnimizcə, təcrübə göstərir ki, min illik tarixə malik olan poeziyamızda heca vəzni ilə yanaşı milli şeir ölçüsü kimi işlənən əruzdan tamamilə imtina etmək lazım deyildir. Xüsusilə, klassiklərin əsərlərini inkişaf edib büllurlaşmış dilimizə tərcümə edərkən bu əsərlərin orijinaldakı vəznini saxlamaq mümkündür.

Dilimizdə qarşılığı olmayan bəzi dini, əfsanəvi, hərbi istilahlara isə rəqəmlər əsasında kitabın sonunda qısa izah verilmişdir.

***Mübariz Əlizadə***





## YARADANIN ADI İLƏ

O xaliq ki vermiş bizə əqlü can,
Onun qüdrəti vəsfə sığmaz, inan.
Odur xalqa şöhrət, şərəf, şan verən,
O, ruzi verəndir, o, yol göstərən.
Yeri, göyləri xəlq edən də odur,
Onun varlığından Günəş aldı nur.
Zamanda, məkanda onu gəzmə sən!
Zamanı, məkanı odur cəm edən.
Görən olmayıb xaliqi bir nəfər,
Onu görməyə cəhd qılma hədər.
Onu dərk qılmaz təfəkkür, xəyal,
Xəyala sığarmı məgər bu cəlal?
Söz ilə onu vəsfə versən qərar,
Nə ağlın çatar, nə dilin söz tapar.
Ağıl, dərkinə cəhd qılsa əgər,
Onu gördüyü bir şeyə bənzədər.
Necə olduğun kimsə etməz bəyan.
Müti bir qul ol, xidmətində dayan!
O, ruhla, ağılla olunmaz qiyas,
Onu dərk üçün yoxdur əldə əsas.
Bu fikrin, düşüncənlə sən, söylə bir,
Necə dərk edərsən ki, xaliq nədir?
Deyirlər: "O vardır!" Qəbul et, inan!
Soruşma "Nədir, hardadır?" heç zaman!
İnamla əvəz et sual-sorğunu,
Bilik əldə etsən taparsan onu.
Kimin elmi olsa o güclü olar,
Qoca qəlbə elm ilə gənclik dolar,
Bilikdən böyük sərvət olmaz, yəqin,
Vara "yox" demək, bil, çətindir, çətin!

## AĞLIN TƏRİFİ

Çatıb ağlı vəsf etməyin növbəsi,
Ağıl hörmətə çatdırar hər kəsi.
Nə bilsən ağıl barədə söylə sən!
Sözündən bəhərlənsin hər dinləyən.
Bizə hər nə bəxş eyləmişsə Xuda,
Ağıldan əzizi nədir dünyada?
Ağıl nur saçar qəlbə, zinət verər,
Çətin gündə iqbala yol göstərər.
Ağıl ağladandır, ağıl güldürən,
Ağıl qaldırandır, ağıl endirən.
Ağıldan bəhər görməsə bir kişi,
Keçər ahü fəryad ilə hər işi...
Ağıldan bir arif danışmış gözəl,
Olub sözləri el dilində məsəl.
Deyirlər: kimin yox ağıldan payı,
Kəsilməz cahanda onun ah-vayı.
Onu xalq "divanə" adlandırar,
Qohum, qardaş belə ondan yan durar,
Səadət ağılda, nicat ondadır,
Ağılsız olan şəxs zindandadır.
Ağıldır hər insan üçün can gözü,
Gözü yox, görərmi səadət üzü?
Ağıl əsl mənasıdır xilqətin,
Bilin qədrini bu əziz nemətin!
Ağıl hər xətərdən canı hifz edər,
Sənə hər səadət ağıldan yetər.
Bu üç nemətin qədrini bil hər an
Ki, onlardadır həm xeyir, həm ziyan.
Bilik öyrənərsə bir insan əgər,
Bununla başı göylərə yüksələr.
Ağılla canı kimdi vəsf eyləyən,
Əgər mən desəm, varmı bir dinləyən?
Səni dinləyən yoxsa sus, ey həkim!
Danış xilqət haqqında, mən dinləyim!.



## DÜNYANIN YARANMASI HAQQINDA

Həqiqət budur, söyləyim, dinlə sən,
Bu aləm təşəkkül tapıbdır nədən.
Yoxu tanrımız döndəribdir vara,
Bununla çıxıb qüdrəti aşkara.
Düşünsən, əsası bütün aləmin
Bu dörd ünsür olmuş əzəldən yəqin.
Nə görsən, eşitsən, nə duysan, demək,
Əsası – su, torpaqdır, oddur, külək,
Ən əvvəlcə od başladı yanmağa,
O verdi hərarət soyuq torpağa.
Külək qalxdı söncək odun şöləsi,
Sərinlikdə axdı suyun çeşməsi.
Bu dörd ünsür hazır olunca, bilin,
Əsası quruldu bütün aləmin.
Yarandı əcəb maddələr durmadan,
O gövhərlər ilə bəzəndi cahan.
Yarandı, quruldu yeni bir büsat,
Bu sürətlə dövr eyləyər kainat...
Fələklər tutub yerlərində qərar,
Coşub, hərlənib, dairə vurdular,
Yarandı dəniz, çöl, çəmən, dağ, bulaq,
Bütün yer üzü oldu bir çılçıraq.
Dağın sinəsindən sular çağladı,
Yaşıl bitkidən dağ kəmər bağladı.
Qəribə bir ulduz da etdi zühur,
O ulduz qara torpağa saçdı nur.
Günəş parladı, od buraxdı yerə,
Qızışdı fəza, sel-su axdı yerə.
Göyərdi ağaclar, təzə bitkilər,
Ağaclar boy atdı, gətirdi bəhər.
Ağac öz kökü üstə sabit qalar,
O da canlıdır, vaxt gələr, məhv olar.
Gəlib cürbəcür canlılar ərsəyə,
Hücum çəkdilər bitkiyə, meyvəyə.
Çəmənlikdə, dağlarda yurd saldılar,

Yeyib yatdılar, sustalıb qaldılar.
Ağılsızda iş görməyə yox hünər,
Nə tapdı yeyər o, şişər, piylənər.
Həyatda nə yaxşı qanar, nə yaman,
İbadət nədir, anlamaz heç zaman.
Ədalətli, qüdrətli Pərvərdigar
Edib hikmətini belə aşikar.
Odur xilqətin baisi, yaxşı bil!
Bəşər gizli əsrara vaqif deyil!

## İNSANIN YARANMASI HAQQINDA

Daha sonra dünyaya gəldi bəşər,
Onunla açıldı bütün sirrlər.
Vüqarla tutar başını sərvtək,
Ucaldar onu söz, ağıl, elm, əmək.
O hümmət, iradə ki, insanda var,
Qul olmuş önündə bütün canlılar.
Həqiqət görən gözlə salsan nəzər,
Bütün xilqətin rüknü olmuş bəşər.
Düşünmə quru sözdür "insan" demək,
Bu sözdə olan sirri bilmək gərək.
Bəşərsən, iki aləmin fəxrisən,
Yaratmış səni başqa cür xəlq edən,
Çalış daima sən, alış zəhmətə
Ki, zəhmət səni çatdırar hörmətə.
Bəşərsən əgər, pisliyin at daşın,
Yəqin bil, səlamət qalar öz başın.
Nəzər sal, fələk durmadan hərlənir,
Bizə dərd də, dərman da ondan gəlir.
Nə illər qocaldıb onu sarsıdar,
Nə qəmdən, kədərdən edər ahu-zar.
Nə aram olar gərdişindən bir an,
Bizimtək o çəkməz işindən ziyan.
Onun əmridir: artıq, əskik nə var,
Görər yaxşını həm pisi aşikar.



## GÜNƏŞİN YARANMASI HAQQINDA

Qızıl rəngli yaquta bənzər fələk,
Nə tozdur, nə tüstü, nə su, nə külək.
Yanar onda saysız işıqlı çıraq,
Sanarsan bəzənmiş bahar fəsli-bağ.
O gövhər ki, daim saçar qəlbə nur,
İşıqlandıran kainatı odur.
Bir altun süpərtək o hər gün səhər
Çıxıb şərqdən aləmə nur səpər.
Geyər əyninə nurlu köynək cahan,
Qara torpağa nur çilər asiman.
Çıxar şərqdən qərbə doğru gedər,
Günəş bu yolu gündə təkrar edər.
Çatıb qərbə gözdən itincə haman
Qara pərdəyə örtünər bu cahan.
Günəş, ey bütün aləmə nur səpən,
Qaranlıqda qoydun məni sən nədən?

## AYIN YARANMASI HAQQINDA

Qaranlıq gecədə Ay olar çıraq,
Çalış pis əməldən uzaq gəz, uzaq,
Otuz gün fəzada gəzib, dövr edər.
Gecə zülmətində Yerə nur səpər.
O gah incələr, görsənər sapsarı,
Sanarsan bir aşiqdir, itmiş yarı.
Elə incələr ki, görünməz, gözə,
Gecə seyrini saxlayar gündüzə.
Ayın hər gecə başqa bir həddi var,
O vaxt nuru artar ki, Ay bədr olar.
İki həftə artar, olar o bütün,
Solar, incələr sonralar günbəgün...
Bu təkrarı qismət edib həqq ona,
Ötər əsrlər, dərdi yetməz sona.

## PEYĞƏMBƏRİN VƏSFİ

Bilik, din sənə doğru yol göstərər,
Tapar bu yol ilə nicatı bəşər.
Əgər dərdinə axtarırsan əlac
Səni zillətə salmasın ehtiyac.
İtaət qıl hər işdə peyğəmbərə,
Yaman fikri qəlbindən at bir kərə!
Demiş vəhyi tənzilləri göndərən[1],
Bizə əmr ilə nəhyə yol göstərən
Mürsəl nəbidən sonradır mötəbər.
Əbubəkrə tay olmamış bir nəfər.
Ömər dini-islama verdi rəvac,
Müsəlmanlığın başına qoydu tac.
Çatıb vəsf üçün Osmanın növbəti,
Həmi izzəti vardı, həm isməti.
Xəlifə olub növbət ilə Əli,
Məhəmməd onu vəsf edibdir, bəli!
Demiş ki: "Əli olmasaydı əgər,
Qazanmazdı İslam bunca zəfər.
Mənəm elm şəhri, Əlidir qapım".
Necə mən bu sözlərdə nöqsan tapım?
Bu sözlərdə məna dərindir, dərin,
Dilindən çıxıbdır o, peyğəmbərin.
Məhəmməd – Günəş, dostları aydılar,
Onun dinini doğru yol saydılar.
Mənəm əhli-beytin qulu hər zaman[2],
Onun vəsfidir hər qula imtahan.
Bu dünya geniş bir dənizdir ki, var,
Gecə-gündüz onda coşar dalğalar.
Dəniz içrə yetmiş gəmi seyr edər[3],
Hamı yelkən açmış, üzər, hey gedər.
Bəzənmiş gəlintək böyük bir gəmi,
Edib hüsnünə valeh o, aləmi.
Onun sərnişini Nəbidir, Vəli[4],
Məhəmməddir övladı, bir də Əli.
Bu dəryaya salsan ağıllı nəzər,
Nə sahil görərsən, nə dibdən əsər.
Coşur hər zaman, susmayır dalğalar,
Belə bir dənizdə hamı qərq olar.
Əgər mən boğulsam, Nəbi var, Vəli,
Yetər dadıma hər iki dost əli.
Əlimdən tutar taci-təxt sahibi,
Zəfər bayrağı, nurlu bəxt sahibi..

## KİTABIN HAZIRLANMASI BARƏDƏ

Nə vardı demişlər, nə qalmış, deyim?
Ağacda nə bar qalmış, ondan yeyim?
Böyük bir ağac kölgəsində əgər,
Əliboş otursam verərmi bəhər?
Kimin başına sərv sayə salar,
Xətadan, bəladan uzaqda qalar.
Salarsa mənim başıma sayə sərv,
Verər fikrimə yaxşı sərmayə sərv.
Bu dastanı ilhamla yazsam əgər,
Onun şöhrətilə başım yüksələr.
Əsər şairi göylərə qaldırar,
Əsərdir cahandan qalan yadigar.
Mənim sözlərimdə tapılmaz yalan,
Nə əfsun, nə əfsanə yazdım, inan!
Ağılla oxu, rəmz tapsan əgər,
Düşün, rəmz mənaya yol göstərər.
Qədimlərdə vardı böyük bir kitab,
Dəyərliydi, dastanları bihesab.
Uzun illər o gəzdi əldən-ələ,
Onu hər kəs istərdi əzbər bilə.
Yetişdi nəcibzadə bir pəhləvan,
Ağıllı, cəsarətli, söz anlayan,
Qədim dövr tarixini öyrənən,
Əsatirə min dürlü məna verən.
Bütün ölkədən yığdı möbidləri
Tapılsın deyə hər sözün cövhəri,

Hüzurunda toplandı əhli-kamal,
Kamal əhlinə verdi çoxlu sual,
Dedi: – Kim bu dünyanı fəth eylədi?
Köçüb getdi, sonra gələn neylədi?
Neçə fatehə taleyi oldu yar,
Qazandı zəfər, bəs nədən oldu xar?
O şahlar ki, tutmuşdular dunyanı,
O cahü-cəlaldan nişanə hanı?
Böyüklər ona söylədi birbəbir
Qədim şahların macərası nədir.
Rəvayətləri dinlədi qəhrəman,
Gedib başladı bir böyük dasitan,
O da dünyada qoydu bir yadigar,
Böyüklər onu hörmət ilə anar.

## ŞAİR DƏQİQİNİN DASTANI

Kitabdan bu dastanları bir zaman
Seçib, sevdi söz qədrini anlayan.
Ağıllı, bilikli adamlar ki, var,
Bu dastanların aşiqi oldular.
Yetişdi, nəhayət, igid bir cavan,
Gözəl söz deyən, təbi, şeri rəvan.
Dedi: – Bu kitabı çəkim nəzmə mən,
Ona "afərin" söylədi hər görən.
Bilinməzdi əvvəllər əsli, soyu,
Yamanlıqla çarpışdı ömrü boyu.
Əcəl həmlə etdi ona nagahan,
Qara tac qoyub başına, verdi can.
Verib canını adətinə fəda,
Üzü gülmədi bircə gün dünyada.
Dönüb taleyi, bəxti azdı yolun,
Əlində həlak oldu o bir qulun.
Qara bəxt əlindən alıb içdi cam,
Ölüb getdi, qaldı əsər natamam.
İlahi, bağışla onu sən özün,
Qiyamətdə üstündə olsun gözün...



## KİTABIN ƏSASININ QOYULMASI

Dedim onda mən: bəxtim olsa kömək,
Yazıb bu kitabı bitirmək gərək....
Zəmanə salırdı məni qorxuya,
Tutub dostları hey sual-sorğuya,
Deyirdim bu işdə geciksəm əgər,
Girər ortaya başqa bir bəxtəvər.
Deyildi mənə taleyim yar o gün,
Kasaddı bazarı sözün büsbütün.
Tərəddüd edirdim uzun bir zaman,
Nə yazdımsa, qaldı özümdə haman.
Bütün ölkəni çulğamışdı savaş,
Darısqaldı yol, iş gedirdi yavaş.
Cahanda gözəl sözdən özgə nə var?
Sözün qədrini söz qanan artırar.
Söz olmazsa Allahın öz məzhəri,
Bizə rəhbər etməzdi Peyğəmbəri.
Şəhərdə mənə dost idi bir nəfər,
Yanımda əzizdi o canım qədər.
Mənə söylədi: – Fikrinə afərin,
Sənin tutduğun doğru yoldur, yəqin.
Tapıb pəhləvicə bu dastanı mən,
Gətirrəm, yolundan geri dönmə sən!
Cavansan, rəvandır, şirindir dilin,
Qələmlə olar həll hər müşkülün.
Cəsarətlə çək nəzmə "Şahnamə"ni,
Böyüklər böyük işlə sevsin səni.
Yazıb mətni dostum gətirdi mənə,
Yeni canla ilham yetirdi mənə.
Mən o mətnə baxdım, alınca ələ
Nə gördüm ki: məndən çox əvvəl hələ
Var imiş ağıllı, sayıq, bir cavan,
Neçə nəsli dünyada şöhrət tapan.
İradə, həya sahibi bir nəfər,
O, sözdən düzübdür gözəl incilər.
Mənə söylədi: – Gəl, əlimdə nə var,

Nə söz, can belə istəyirsən, apar.
Sənindir, çatarsa əlim hər nəyə,
Ağız açma heç başqa bir kimsəyə!
Məni saxladı əldə bir almatək,
Nə daş qoydu dəysin mənə, nə külək.
O xoştinətin sayəsində haman
Ucaldı başım ərşə yerdən, inan!
Gözündə qızıl sanki torpaq idi,
Səxavətdə Hatəmlə ortaq idi.
Tutardı bu dünyanı olduqca xar,
Vəfalı cavanmərd idi, namdar.
Onuntək bir insan bizi tərk edib,
Solubdur çəmən, sərv bağdan gedib.
Ölübmü, yaşarmı? Bilmirəm xəbər,
Ölübsə, böyük itki vermiş bəşər.
Təəssüf o ağla, kamala heyif!
Uca qamətə, gül camala heyif!
Ümid qalmamışdır onu tapmağa,
Dönübdür ürək bir əsən yarpağa.
Düşür yadıma mehriban sözləri,
Özü yoxsa da, var könüldə yeri.
Deyirdi: –Yazarsansa "Şahnamə"ni,
Çalış şahlara çatdır o töhfəni.
Mən indi bir ölməz əsər başlaram,
Ürəkdən böyük şahı alqışlaram.

## SULTAN MAHMUDUN VƏSFİ

O gündən ki, yoxdan var olmuş, cahan,
Hələ gəlməmişdir belə hökmran.
Günəşdən başa tac qoyanda fələk
Cahan parladı nurla şirmayıtək.
Bütün yer üzü geydi nurdan geyim,
O nur mənbəyi kimdi? Qoy mən deyim.
Əbülqasim! O bəxti ağ hökmdar,
Günəş təxti tacının üstə durar.



Bəzək verdi dünyaya başdan-başa,
Dönər altuna əl vurarsa daşa.
Oyandı mənim taleyim bir zaman,
Düşündüm: başımdan çəkilmiş duman,
Dedim: – İndi artıq olar söz demək,
Keçən əsrlər olsun aşkar gərək.
Dilimdə gecə vaxtı şahın adı,
Yumuldu gözüm, qəlb evim parladı.
Yuxumda nə gördüm ki, bir çeşmə var,
Suyunda onun nurlu bir şam yanar.
Gecə zülmətində bütün yer üzü
Batıb nura, xatırladır gündüzü.
İpək don geyinmiş dərə, dağ, çəmən,
Qoyulmuş uça taxt firuzədən.
Oturmuş o taxt üstə bir hökmdar,
Başında cavahir dolu tacı var.
Sağında qoşun səf çəkib üzbəüz,
Solunda döyüş filləri yeddi yüz.
Durub qarşısında ağıllı vəzir,
Xeyir işlərə şahı təşviq edir.
Məni qoydu heyran şahın qüdrəti,
O saysız qoşun, fillərin heybəti.
Bu cahü cəlalı görən anda mən
Soruşdum təəccüblə sərkərdədən:
– Şahın tacı aydırmı, təxti fələk?
Sizə ordu, ya saysız ulduz deyək?
Cavab verdi sərkərdə: – Ey bixəbər.
Məgər yatmısan, dur, açılmış səhər!
Bu, Hindistanın şanlı sultanıdır,
Bu, Rumun qızıl taclı xaqanıdır.
Ədalətlə vermiş cahana bəzək,
Günəşdir onun tacı, təxti-fələk,
Bu gün sayəsində o şah Mahmudun
Olub mehriban, dost qurdla qoyun.
Çinə, Kəşmirə, Hində bir sal nəzər,
Bütün padişahlar ona baş əyər.
Beşikdə ikən dil açan bir uşaq

Çəkər Mahmud adın hər addan qabaq.
Böyük şahlara versə fərman əgər,
Sözündən qaçırmaz boyun bir nəfər.
Onun vəsfini sən də qıl ixtiyar,
Olar, bil, cahanda adın bərqərar.
Oyandım, atıldım yerimdən necə,
Deyən gündüz oldu qaranlıq gecə?
Oturdum, şahın vəsfini başladım,
Sözümlə o sultanı alqışladım.
Yuxum qalmasın qoy cavabsız dedim,
Cahanda onunla murada yetim.
Onun vəsfi vacibdir hər şairə,
Odur çatdıran xalqı yüksəklərə.
Cahan sayəsində gülüstan olub,
Buludla fəza, yer çiçəklə dolub,
Yağış yağdı vaxtında, yer oldu nəm,
Bu dünya üzü oldu Bağı-İrəm.
Ədalətlə İranı abad edib,
Çatıb şöhrətə, elləri şad edib.
Səxavətlə məclisləri şənlədər,
Qılıncı döyüşlərdə min qan edər.
Gücü fil gücü, ruhca – incə mələk,
Buludtək əli var, dəniztək ürək.
Ala bilməmiş düşmən ondan xərac,
Eli, yurdu bilməz nodir ehtiyac.
Hamı hökmdarı sevər can qədər,
Şaha, min canı olsa, qurban edər.
Birinci: onun öz kiçik qardaşı,
Tapılmaz tayı, az da olsa yaşı,
Şahın sayəsində yaşar şadiman,
Hünər meydanında odur qəhrəman.
Ata hər kəsə Nəsirəddin olar,
Onun təxti Ay, tacı Pərvin olar
O Tus qəhrəmanı, iti pəncə şir
Döyüşdə edər əjdahanı əsir.
Pula pul deməz, paylayar yoxsula,
El istər həmişə o xoşbəxt ola.



O istər görə xalqı allahpərəst,
Çün allahpərəstlər olar şahpərəst,
Başından şahın olmasın tacı kəm,
Onun könlünə salmasın kölgə qəm.
Sağ olsun canı tac ilə, təxt ilə,
Kədərsiz, ələmsiz, işıq bəxt ilə.
İşə başlayım, bəxt əgər olsa yar,
Cahanda əsərdir qalan yadigar.

## KƏYUMƏRS

Ata söyləmiş oğluna bir xəbər,
Gəzər dilləri, keçsə də əsrlər.
Cahanda kim ilkin olub hökmdar,
Böyüklər ona göstərib etibar?
Qədim dövr tarixini izləyən,
Böyük şahlar haqqında dastan deyən
Demiş: şah birinci Kəyumərs idi,
Başa tac qoyub, "padişaham" dedi,
Həməl bürcünə varid olcaq Günəş[5]
Yerin çöhrəsi yazdan oldu güləş.
Quzu bürcü nur saçdı, güldü cahan,
Cahanı bahar fəsli etdi cavan.
Kəyumərs olunca cahanda ağa,
Köçürtdü büsatını yüksək dağa.
Qoyub təxtinə dağ başında əsas,
Düşündü: gərək el geyinsin libas.
Pələng ovladı, əldə etdi dəri,
Geyindi zəri şah o gündən bəri.
Adamlar həvəs göstərib paltara,
Qənim oldular vəhşi heyvanlara.
Tapıldı geyim, sonra da el tamam
Şikarın ətindən bişirdi təam.
Otuz il cahanda olub hökmdar,
Sanardın Günəş təxtdən nur saçar
Boyu sərv idi, qolları yay kimi,

Camalı iki həftəlik Ay kimi.
Onu şah yaratmışdı pərvərdigar,
Var üzündə şaha xas bir vüqar.
Çöl heyvanları hər tərəfdən gəlib,
Onun dövrəsində gəzib, dincəlib.
Önündə ikiqat olub durdular,
Belə oldu şahənşaha bəxti yar.
Böyüklər hamı baş əyərdi ona,
İtaət edib "şah" deyərdi ona.
Bir oğlu var idi gözəl – sanki ay,
İgiddi, hünərdə atasına tay.
Səyamək, – ona şah qoymuşdu ad,
Onun varlığıyla şahın könlü şad.
Sevərdi onu can qədər hökmdar,
Yanardı gözündən olanda kənar.
Belə keçdi dövran da xeyli zaman,
Şahın şöhrəti, şanı artdı hər an.
Əgər saymasaq təkcə Əhriməni,
Yox idi şahın dünyada düşməni.
Nəzər saldı Əhrimən hər yanına,
Paxıllıq od oldu onun canına.
Onun qurd kimi oğlu da var idi,
Böyük bir qoşunda o sərdar idi.
Səyaməkdəki bəxt, qüdrət, cəlal
Paxıl qəlbinə yükləmişdi məlal.
Keçirmək üçün təxti-tacı ələ,
Çalışdı sala aləmə vəlvələ.
Dedi fikrini hər kəsə qorxmadan,
Xəbərdar idi məqsədindən cahan.
Xəbərsizdi ancaq Kəyumərs özü,
Sanardı onundur bütün yer üzü.
Nəhayət gəlib tapdı o şahı tək,
Pələng paltarında nəcib bir mələk,
Ədəblə şahın oğluna əydi baş,
Ona düşmənin qəsdini etdi faş.
Səyamək bilib düşmənin qəsdini,
O murdar divə qarşı coşdu kini.



Qoşun topladı hər tərəfdən dağa,
Hazırlaşdı o divlə çarpışmağa,
Nədir hərb, – bilməzdi onda bəşər,
Yox idi zirehli geyimdən əsər.
Pələng cildini taxdı şah əyninə,
Yürüş əmri verdi qoşun əhlinə.
Gəlib çatdılar üz-üzə ordular,
Səyamək dayandı üzündə vüqar.
Divin gördü şahzadə yal-yappalın,
Onun üstünə cumdu əyni yalın.
Qara div keçirdi onu cənginə,
Ölüm çökdü şahzadənin rənginə.
Göyə qaldırıb, tulladı torpağa.
Zərif sinə keçdi dəmir caynağa.
Səyamək olub div əlində tələf.
Köçüb getdi şah məclisindən şərəf
Kəyumərsə çatdı uğursuz xəbər
Oğul dərdi düşsə dağa, dağ çəkər.
Edib tərk təxti, töküb göz yaşı,
Vurub başına öz əliylə daşı.
Yanaqları qan, bağırı da qan idi,
Hər iki gözü qanlı imman idi.
Qoşun əhli batdı yasa, ağladı,
Elin göz yaşı sel kimi çağladı.
Deyərdin bu dünya geyinmiş qara,
Dəyib hər kəsin bağrına min yara.
Nə insan, nə heyvan bütün canlılar
Dağa üz tutub etdilər ahü-zar.
Gedib çatdılar şah dərgahına,
Şərik oldular dərdinə, ahına.
Bir il yas tutub, ağladı hökmran,
Sifariş yetişdi ona Tanrıdan.
Ona həqq adından dedi bir mələk:
*– Sənə göz yaşı etməz əsla kömək.*
Qoşun topla, həqq əmrini et qəbul,
Divin başını əzməyə hazır ol!
Çalış qanlı düşməndən al intiqam,

Divi yer üzündən çıxart, qov tamam!
Kəyumərs də göy səmtinə açdı əl,
Dedi: – Qoy zəlil olsun o bədəməl.
Şahın əzbəri oldu haqqın adı,
Gözündən axan yaşları saxladı.
Qara divdən alsın deyə intiqam,
Yeyib-yatmağı şah bilirdi haram.

Səyaməkdən oğluydu tək yadigar,
Qazandı vəzirlər qədər etibar.
Ona verdi Huşəng adı şah özü,
Ağıllı cavandı, açıqdı gözü.
Canından, gözündən tutardı əziz,
Həyatı o sevməzdi Huşəngsiz.
Susayanda şah düşmənin qanına,
Tələb etdi Huşəngi öz yanına.
Ona söylədi fikrini birbəbir,
Daha qalmadı şah könlündə sirr.
Dedi: – Bir qoşun toplayım mən gərək
Ki, nərə çəkərkən kar olsun fələk.
Sən ol ordunun başçısı, ey cavan,
Mənəm getməli, sən yeni pəhləvan.
Yığıb başına qurd, pələnglə bəbir,
Dayandı pərilərlə bir səfdə şir.
Qoşun quş, pəri, vəhşilər dəstəsi,
Qəzəbliydi, qorxmazdı sərkərdəsi.
Önündə gedirdi nəvə ordunun,
Kəyumərs özü arxasınca onun.
Qara div qoşunla yetişdi haman,
Göyə qaldırıb qorxudan toz, duman.
O heyvanlara baxdı, mat qaldı div,
Qəzəbli şahı gördü, sustaldı div.
Qara divlərin ki yolun kəsdilər,
Cumub basdılar, çeynəyib əzdilər.
Atıb pəncə Huşəng bir aslan kimi,
Divi üzdü yerdən burulğan kimi.
Yerə vurdu, aldı çölün daşını,
Bədəndən ayırdı onun başını.
Zəlil eylədi qan içən düşməni,
Qoyuntək yıxıb soydu Əhriməni.
Səyamək üçün intiqam aldı şah,
Kəyumərsin ömrü sona çatdı, ah!
O getdi, qalır işləri yadigar,
Hər insandan aləmdə bir ad qalar.
Bu fani dünyada gəzib bir zaman,
Qazanca yol açdıqda çəkdi ziyan.
Bu dünya bir əfsanədir, ol tanış,
Yaxşı-yaman heç bir kəsə qalmamış.

## HUŞƏNG

Ədalətli Huşəng, o gənc hökmdar,
Kəyumərs yerində tutarkən qərar.
Cavandı hələ, qırx yaşı var idi,
Ağıllı, fərasətli huşyar idi.
O gün ki, qədəm qoydu şah təxtinə,
Dedi: – Mən şaham, siz rəiyyət mənə.
Mənə yeddi ölkə gətirmiş pənah,
Mənəm aləmə hökm edən padişah.
Böyük tanrı yar oldu, çaldım zəfər,
Cahan xalqı məndən ədalət görər.
Ədalətlə dünyanı qıldı abad,
Onun sayəsində hamı oldu şad.
Birinci odu kəşf edib hökmdar,
Qırılmaz daşı odda yandırdılar,
Daşı od əritdi, dəmir etdi saf,
Bəşər başladı etməyə inkişaf.

Dağa bir gün Huşəng etdi səfər,
Yanında adam vardı beş-on nəfər,
Uzaqdan uzun bir şey oldu əyan,
Qara, ildırım sürətiylə qaçan.
İki qan bulağıydı sanki gözü,

Saçır ağzı tüstü, yanır yer üzü.
Tamaşa qıldı ona təmkinlə şah,
Böyük bir daş aldı ələ kinlə şah
Atanda güc ilə daşı hökmran,
Şahın zərbəsindən yayındı ilan.
O daş getdi dəydi qaya bağrına,
Qırıldı, səpildi qaya dörd yana.
Ağır zərbə aldı, qaya partladı,
Toxunduqda daşa daş od parladı,
İlan ölmədi, oldu bu sirr faş
Ki, od mənbəyidir təbiətdə daş.
Çöküb diz, göyə açdı əl hökmdar,
Dedi: – Afərin, şükr, pərvərdigar,
Hədiyyə mənə vermisən böylə nur.
Bu gündən belə xalqa qiblə odur
Dedi: – Xaliqin nurudur od yəqin,
Cahanda pərəstiş oda eyləyin!
Gecə od qalandı uca dağ qədər,
Gəlib şahla əyanlar əyləşdilər.
Şərab içdi, bayram edib, oldu şad,
Əziz bayrama şah "Sədə" qoydu ad.
"Sədə" qaldı Huşəngdən yadigar,
Cahanda çox olsun belə hökmdar,
O, dünyanı abad edib, xalqı şad,
Edər xalq Huşəngi rəhmətlə yad.

Birinci dəmirçi olub hökmdar,
Dəmirdən hazırlardı balta, mişar.
Suvarma üçün sonra gəzdi çara,
O üz tutdu dəryalara, çaylara.
Yol açdı, çölə axdı arxla sular;
Adamlar əzabdan xilas oldular.
Bütün xalqa azuqə çatsın deyə,
Özü başladı əkməyə, biçməyə.
Çalışdı hamı əldə etsin çörək,
Öz haqqında hər kəs düşünsün gərək.
Kömək etdi Huşəngə Pərvərdigar,



Cüyür, ceyranı, guru etdi şikar.
Dedi: – Bəslənib, fayda versin gərək,
Qoyunla ulaq, bir də südlü inək.
Ayırdı tükü yumşaq heyvanları,
Kəsib başını, soydurub onları,
Tükü isti sincab, tülkü, dələ,
Səmurdan o xəzlər düzəltdi belə..
Bu minval ilə soydu heyvanları,
Geyindirdi xəzlərlə insanları.
Çalışdı, yaratdı, yedi, payladı,
Köçüb getdi, tarixdə qaldı adı.
Olunca onun ömrü, dövranı xoş,
Apardı əcəl, təxtini qoydu boş.
Ölüm vermədi bircə an da aman,
Nə huş qaldı Huşəngdə, nə təvan,
Vəfa gözləmə, bu cahandan əl üz,
Sənə mehribanlıqla göstərməz üz.

## TƏHMURƏS

Var idi şahın bir zirək övladı
Ki, Təhmurəsi-divbənd idi adı.
Ata təxtinə əyləşəndə cavan
Bütün ölkəyə hökmü oldu rəvan.
Qoşundan o möbidləri birbəbir
Çağırdı, başa saldı mətləb nədir.
Dedi: – Təxt ilə tac mənimdir bu gün,
Xəzinə, qoşun, hər nə varsa bütün.
Gərək pisliyi məhv edəm dünyada,
Salam zalımı öz əlimlə oda.
Verəm aləmə Əhrimənden nicat,
Mənə tabe olsun gərək kainat.
Gəzib axtaram faydalı hər nə var,
Edəm xalqımın xeyrinə aşikar.
Dedi: – Qırxın hər yerdə vardır qoyun,
Qoyunlar ki, qırxıldı, ayrıldı yun,

O yundan hazırlatdı xalqa libas,
Döşətdi yerə çoxlu xalça, palaz,
Atı eşşəyi tutdu, ram eylədi,
Ot, arpa, saman topladı, yemlədi,
Seçib vəhşi heyvanları birbəbir,
Tazıdan, tuladan götürdü xeyir.
Tutub onları dağda tədbir ilə,
Gətirdi o, ram etdi zəncir ilə,
Uçuşda baxıb yoxladı hər quşu,
Edib qırğını, şahini əl quşu.
Tutub verdi təlim, ova başladı,
Bu tədbirini aləm alqışladı.
Toyuqla xoruzdan tutunca xəbər
Ki, xoş banlayırlar açılcaq səhər,
Gətirdi, dedi: – Saxlayın bunları,
Toyuq saxlayan xalqın artar varı.
Mənim əmrimə siz itaət edin,
Böyük Tanrıya siz ibadət edin!
O doğru yola salmış insanları,
Bizə ram qılmışdır heyvanları,
Şahın bir vəziri var idi təmiz,
Xeyirxahdı, xalqın yanında əziz.
Ağıllı, fərasətli Şəhrəsb adı,
Cahanda onun şöhrəti parladı.
Sevərdi şahın dadına çatmağı,
Unutmuşdu sanki yeyib, yatmağı.
O bəxt ulduzuydu böyük padişahın,
Salıb qorxuya canını bədxahın,
Şahı dəvət eylərdi düzgün yola,
O istərdi hər işdə düzlük ola.
Elə xeyirxah oldu ki, hökmdar,
Büründü xuda nuruna aşikar.
Gedib tutdu əfsunla Əhriməni,
Minib at kimi hiyləgər düşməni,
Belinə yəhər qoydu xeyli zaman,
Çapıb dördnala aləmi hökmran.



Salıb divləri qorxuya bu hünər,
Xəyanət yolunu tutub getdilər.
Qəbul etdi divlər belə bir qərar:
– Salınsın gərək təxtdən hökmdar.
Xəbər çatdı Təhmurəsə nagahan,
Qəzəbdən gözündə qaraldı cahan.
Döyüşmək qərarı verib əzm ilə,
Acıqla ağır gürzü aldı ələ.
Yığıldı bütün divlər, əfsunçular,
Ürəklərdə kin, sel kimi cumdular,
Qara div idi ordu sərkərdəsi,
Göyə yüksəlirdi onun nərəsi,
Cahan şahı Təhmurəs o meydana
Qədəm qoydu təkcə özü mərdana.
Döyüş başladı təkbətək div ilə,
Aman vermədi divə bir an belə.
Çoxun vurdu gürz ilə sərdi yerə,
Tutub çəkdi bir qismini zəncirə.
Əsir etdi çün divləri hökmdar,
Aman istəyib, şaha yalvardılar.
Dedilər: – Gəl, öldürmə, biz əhd edək,
Sənə faydalı bir hünər öyrədək.
Aman verdi o divlərə hökmdar,
Dedi: – Sirri tez eyləyin aşikar!
Azad etdi şah divləri, müxtəsər,
Ona açdılar ki, nədir bu hünər.
Şaha yazmaq öyrətdi divlər, odur,
Biliklər onun qəlbinə saçdı nur,
Müəllim olub div şahın oğluna,
Həvəslə otuz dil oxutdu ona.
Ərəb, pəhləvi, soğd, çin, rum, dəri,
Bütün dillər oldu şahın əzbəri.
Biri şah olarsa otuz il əgər,
Necə göstərər bundan artıq hünər?
Çatınca əcəl, köçdü, getdi o da,
Yaşar zəhmətinin barı dünyada.

## CƏMŞİD

Onun oğlu Cəmşid, o ali məqam,
Sonsuzdu onda şaha ehtiram.
Ata təxti üstündə tutdu qərar,
Qızıldan başa tac qoyub hökmdar,
Olub şahlıq əzmi onun rəhbəri,
Dalınca apardı bütün elləri.
Ədalət, səadət gətirdi elə,
Baş əydi ona div, pəri, quş belə.
Cahanda çəkildi şərəflə adı,
Onunla Kəyan təxti də parladı...
Dedi: – Həqqin imdadı ilə bu dəm
Sizin şahınız, həm də bir möbidəm.
İşıqlı yola sövq edib elləri,
Qısaldam gərək mən yaman əlləri,
Birinci, silah qeydinə qaldı şah,
İgid ad alar əldə olsa silah.
Dəmir oldu tədbiri ilə xəmir,
Dəbilqə, zireh, sinəbənd, bir də tir.
Qılınc, nizə, zubin, möhkəm sipər
Qalıbdır cahanda o şahdan əsər.
Bu işdə əmək sərf edib əlli il,
Nələr kəşf edib, xalqa pünhan deyil,
Daha əlli il çəkdi paltar qəmi,
Geyindirdi başdan-başa aləmi.
Kətanla ipək, yun, qezil – harda var,
Tapıb yaxşı xəzlər, zərif parçalar.
Əyirmək də öyrətdi, eşmək də o,
Eni arqaca vurdu ilməkdə o.
Toxundu, tikildi, yuyuldu libas,
Bu təlimlər oldu Cəmşidə xas.
Bu iş bitdi, qurdu yeni bir büsat,
Həyatdan o razıydı, ondan həyat.
Yığıb dövrəsinə peşəkarları,
Bu işdə o bir əsri etdi yarı.
O kəslər ki, Katuzilər adlanır[6]



İbadəti hər işdən üstün sanır,
Ayırdı camaat içindən tamam,
Dedi: – Abidə olmalı dağ məqam.
İbadət edib xaliqə hər zaman,
Ömür istəsinlər şaha Tanrıdan.
Daha başqa bir dəstə Nisarilər
Silah gəzdirən, hər biri şiri-nər
İgidlərdi cəngavər, aslan kimi,
Hərə ölkə cismində bir can kimi,
Şahın taxtına onlar idi dayaq,
Bu adla tanınsın dedi hər qoçaq.
Bütün ölkə doysun, barınsın deyə
Bəsudi adı verdi bir dəstəyə.
Əkib, bəsləyib, toplayır neməti,
Götürməzlər heç kimsədən minnəti.
Geyər köhnə paltar boyun əymədən,
Özündən çıxar bir qaba söz desən.
Nə söz dərdi anlar, nə divan qəmi,
O, zəhmətlə abad edər aləmi.
Bir azadə şair belə nəql edər:
"Olar qul bəşər, tənbəl olsa əgər".
Daha başqa bir tayfa – Ohyuxoşi,
Çalışmaq, yaratmaqdı daim işi.
Bu tayfa hünərli sənətkar idi,
Bilikli, savadlı, çox hüşyar idi.
Çalışdı daha əlli il durmadan,
Yeyib-içdi, həm payladı hökmran.
O hər tayfaya verdi layiq məqam,
Məqama görə eylədi ehtiram.
Dedi: – hər kəsin həddi vardır, bəli,
Bu həddi hər insan özü bilməli.
Daha sonra əmr eylədi divlərə
Ki, qatsın suyu, torpağı bir yerə.
Hazır oldu palçıq, verildi qərar,
Qəliblərdə kərpic kəsilsin hamar.
Divə bu işi etibar etdilər,
Bina tikməyi divlər öyrətdilər.

Uca qəsrlər tikdi, eyvan, hamam,
Binalarda yerləşdi məxluq tamam.
İşıq mənbəyi gəzdi xeyli zaman,
Daşa əvvəl-əvvəl gətirdi güman.
Çapıb daşları, tapdı gövhərləri,
Əqiq, ləl, yaqut, simü zəri.
Tapıb bir neçə ruh açan ətrlər,
Xalq onları, bilindi də işlədər.
O kəşf etdi kafuru, mişk, ənbəri,
Gülab, ud, ban ilə süsənbəri[7]
O hər dərdə dərman edib aşikar,
Təbabət də ondan qalıb yadigar.
O çox sirləri xalqa etdi əyan,
Belə padişah görməmişdi cahan.
Daha sonra keçsin dənizdən deyə,
Qayıqla yol açdı o hər ölkəyə.
Bu yolda çalışdı daha əlli il,
Ağıl müşkül həllində aciz deyil.
Bütün işləri qurtarıb bu sayaq,
O basdı göyə yerdən ilkin ayaq.
Qayırtdırdı bir təxt Kəyan təxti tək,
Ona verdi gövhərlər ilə bəzək.
Alıb çiyninə div onu hər zaman
Göyə qaldırar, istəsə hökmran.
O təxtin içində böyük hökmdar
Fəzada Günəştək tutardı qərar.
Cahan qaldı heyran onun təxtinə,
Hamı afərin söylədi bəxtinə.
Edib xalq Cəmşidə gövhər nisar,
Belə bir günə Novruz ad qoydular.
Təzə il başı Hürmüzi-fərvədin[8],
Başa çatdırıb yerdəki zəhmətin.
Böyüklər sevinclə bəzəndi o gün,
Quruldu bütün ölkədə toy, düyün.
Belə şanlı bayram neçə əsr var
Qalıbdır o şahdan bizə yadigar.
Belə keçdi üç əsr işlər gözəl,
Ölən olmadı çatmayınca əcəl.



Naxoşluqdan yamandan iz qalmadı,
Divə hakim oldu bəşər övladı.
Boyun əydi şah əmrinə div, pəri,
Ədalət abad eylədi hər yeri...
Bu şənlik davam etdi xeyli zaman,
Bəşər tapdı hər bir bəladan aman.
Edib ömr asudə Cəmşid şah,
Bütün xalqa o padişahdı pənah.
Gəzib aləmi, başqa şah görmədi,
Taca, təxtə özgə pənah görmədi.
Mənəmlik edib baxmadı Allaha,
O, baş əymədi xaliqə bir daha.
Şahı yoldan azdırdı birdən qürur,
Düşündü nə şah, həm də Allah odur.
Dedi: – Yox mənə bu cahan içrə tay,
Ağıllı tapılmaz özümdən savay.
Mənimlə yaranmış cahanda hünər,
Hanı mən kimi padişah bir nəfər?
Bütün aləmə mən bəzək vurmuşam,
Onu öz iradəmlə tək qurmuşam.
Yeyib, yatmaq ilə mənə borclusuz,
Qədəm atmaq ilə mənə borclusuz.
Bu söz saldı möbidləri dəhşətə,
Daha qalmadı yer sözə, söhbətə.
Ulu tanrı döndərdi Cəmşiddən üz,
Ona qarşı hər yanda başlandı söz.
Xarablaşdı əhvalı gündən-günə,
Mənəmlik gəlib xaliqin şəninə.
Zəka əhli şair buyurmuş belə:
Şah oldunmu, Allahına ol kölə!
O kəslər ki, Allahına xor baxar,
Onun qəlbini qorxu, hürkü sıxar,
Qürur etdi Cəmşidi bəxti qara,
Toxundu fərəh güzgüsü daşlara.

Var idi haman dövrdə bir kişi,
İgiddi, atıb vurmaq idi işi.
Ərəb şahı varlı bir insan idi,

Cəmin qorxusundan pərişan idi.
Deyərlərdi Mərdas onun adına,
Çatardı elin bir zaman dadına.
Kim axtarsa hər cinsdən mal-davar,
Görərdi, biri yox, mini onda var,
Var idi bir oğlu, o xoştiynətin,
Bəlasıydı sanki bütün xilqətin.
Soruşsan, əsil adı Zöhhak idi,
Başı boş, dilavərdi, napak idi..
Verib xalq ona pəhləvicə ləqəb,
Çağırdı onun adını Bivərəsb[9].
Əgər tərcümə etsələr "bivəri",
Deyər: "dəh hezar" kim bilirsə dəri[10].
Qızıl təsməli vardı on min atı,
Onun bu rəqəmdən alınmış adı.
Gecə-gündüz enməzdi atdan yerə,
O şöhrət bilirdi: gəzə, at sürə.
Geyib əyninə "xeyirxahlıq" donu,
Gəlib bir səhər tapdı şeytan onu,
Qılıqla o, Zöhhakı tutdu dilə,
Onun könlünü tez gətirdi ələ.
Göründü ona gənc – mənsəbpərəst,
Edər bu mərəz hər bir insanı məst.
Dedi: – Məndə bir sirr var, ey cavan,
Sənə söylərəm, sirrimi saxlasan.
Görüb sadədil, verdi fərman ona,
Cavan and içib, etdi peyman ona.
Dedi: – Sirrini saxlaram hər zaman,
Bu gündən sənə mən mütiyəm, inan!
Dedi: – Sən ləyaqətdə yox bir nəfər,
Heyif ki, keçir günlərin bisəmər,
Nəsihət eşit məndən, ey novcavan,
Atandır səni taxt-tacsız qoyan.
Onun canına qıymasan sən əgər,
Yaşar bu qoca bir neçə əsrlər.
Səninçin yaranmış bu cahü-cəlal,
Qopar başını, tacını əldən al!



Mənim sözlərimi eşit, yox demə,
Yəqin, şah olarsan bütün aləmə.
Bu söz qorxu saldı onun canına,
Oğul da susarmış ata qanına?
Dedi şeytana: – Sən bunu yaxşı bil,
Mənə başqa əmr et, bu mümkün deyil.
– Ay oğlan, – dedi, – danma peymanını,
Əbəs odlara salma öz canını!
Əgər andını pozmuş olsan, inan,
Olarsan zəlil, kam alar şah baban.
Bu sözlər o gənci müti eylədi,
Sənin əmrinə tabeyəm – söylədi, –
Sənin sözündən heç zaman çıxmaram,
De, mən neyləyim ki, yox olsun atam?
Dedi: – Gəl, bunu qoy mənim öhdəmə,
Başın göylərə yüksələr, qəm yemə!
Ərəb şahının bir bağı var imiş,
Səfalı, gözəl, güllü gülzar imiş.
Belə adəti vardı ki, hər gecə
İbadət üçün qalxaraq gizlicə,
Tutardı önündə çıraq bir kəniz,
Yuyardı şah əndamını tərtəmiz.
Onu şeytan izlərdi illər boyu.
Yolun üstə qazdı dərin bir quyu,
Quyu ağzına düzdü çır-çırpı tez,
Töküb torpağı, tapdadı, itdi iz.
Ərəb padişahı, o şanlı ağa
Gecə vaxtı durdu, yol aldı bağa.
Quyu ağzına çatcağın düşdü şah,
Əzildi o mömin kişi, öldü, ah!
Yaman gündə o xeyrxah hökmdar
Sanardı dalında cavan oğlu var.
Yolunda rahatlıq nədir, bilməmiş,
O qəmgin olanda üzü gülməmiş
Nə bilsin ki, bir gün o zatı xarab
Onun qətli ilə olar kamiyab.
Ata qətlinə qoydu Zöhhak əl,

Eşitdi həkimdən belə bir məsəl:
Oğul qan içən olsa aslan kimi,
Ata qanına qıymaz insan kimi.
Belə olmasa, başqa bir sirr var
Soruşsan, anası bu sirri açar.
Rəzalətlə girdi ata qəsdinə,
Yiyə çıxdı Zöhhak onun təxtinə.
Qoyub tac, Ərəbdə olub hökmran,
Eli gördü ondan xeyir, həm ziyan.

Görüncə o tabe olur şeytana,
Təzə bir kələk qurdu şeytan ona.
Dedi: – Bir kərə dinlədin sən məni,
Neca, gör, murada yetirdim səni?
Bu gün bağlasan əhdü peyman yenə,
Vəfa eyləsən dönmədən əhdinə,
Olarsan bütün aləmin sərvəri,
Tək insan deyil, quş, balıq, div, pəri –
Sənə qul kimi baş əyərlər, inan,
Dedi: – Əmrinə hazıram hər zaman.
Eşitcək bunu, şeytan əhsən dedi,
Təzə bir kələk başlayım mən dedi.
Girib özgə cildə, necə bir cavan,
Ağılda, fərasətdə nadir cavan,
Gəlib çıxdı Zöhhak dərbarına,
Ona söylədi çoxlu mədhü səna.
Dedi: – Lazım olsa şaha xidmətim,
Gözəl aşpazam, var böyük şöhrətim.
Ərəb şahı oldu ona mehriban,
Dedi: – Aşpazım ol mənim, ey cavan.
Vəzir qoydu qol şah fərmanına,
Gəlib mətbəxi verdi təhvil ona.
O vaxt çox çeşidli deyildi yemək;
Yeyərdi hamı, adətən, bir xörək,
Qoyun kəsdi şeytan, inək, həm toyuq,
Yedirtdi şaha qanlı, isti, soyuq.
Onu bəslədi qanla aslan kimi
Ki, gümrah ola vəhşi heyvan kimi.



Çalışdı girəndə şahın yanına,
Yayılsın sözü yağ kimi canına.
Yumurta yedirtdi ona bir zaman,
Yedi şah, qızışdı vücudunda qan.
Yedikcə dedi: – Afərin, afərin,
Tapılmaz tayın bu hünərdə sənin.
Yəqin etdi şeytan işi baş tutar.
Dedi: – Nuşican olsun, ey hökmdar!
Vəzifəm budur! Səy edim mən gərək,
Sabah dadlı olsun bu gündən xörək.
Düşündü gecə, nə bişirsin səhər
Ki, salsın şahı heyrətə birtəhər.
Qızartdı neçə qırqovul, kəkliyi,
Gətirdi, dedi: – Padişahım, di ye!
Ağılsız ərəb padişahı o gün
Yedi, aşpaza oldu qul büsbütün.
Üçüncü gün artsın çeşidlər deyə,
Gətirdi toyuqla quzu süfrəyə.
Döşəndikdə dördüncü gün süfrəsi,
Qoyuldu qızarmış dana püştəsi.
Saçardı ətir zəfəranla gülab,
Təzə müşkə oxşardı köhnə şərab.
Dadınca xörəkdə olan ləzzəti,
Çoxaldı ona Zöhhakın hörməti.
Dedi "aşpaza": – Göstəribsən hünər,
Mənə söylə, bir istəyin var əgər.
Dedi "aşpaz": – Ey padişahım, yaşa,
Uzun ömrünü vur fərəhlə başa.
Əzizdir mənə hörmətin, izzətin,
Ağırdır bu boynumdakı minnətin,
Məni qərq edibsən naza, nemətə,
Məni çatdırıbsan böyük hörmətə.
Deyilsəm də layiq, könül arzular:
Nəsibim ola belə bir iftixar.
Əgər lütf edib, versə rüsxət mənə,
Öpüb, üz qoyam şahımın çiyninə.
Eşitdikdə Zöhhak bu söhbəti,
Ona çatmadı xahişin illəti.

Dedi: – Məncə, bu iş deyildir çətin,
Qoy artsın bununla sənin hörmətin.
Açıb çiynini: – Gəl, – dedi, – busə al!
Öpüb, söylədi: – İndi sağlıqla qal!
Yoxa çıxdı, sanki gömüldü yerə,
Bu iş baş verib dünyada bir kərə.
Öpüş yerlərindən çıxanda ilan
Əlac axtarıb, şah çəkdi fəğan.
Nəhayət, o əfiləri kəsdilər,
Yeri var, təəccüb edirsən əgər.
Şahın hər iki çiyni sanki çinar,
İki şaxə verdi, iki şahmar.
Təbiblər yığışdı bütün ölkədən,
Çox oldu ağıllı fikir söyləyən.
Yada düşməyən bir dəva qalmadı,
O dərdə əlac eyləyən olmadı.
O dəm girdi şeytan təbib cildinə,
Gəlib tapdı Zöhhakı xəlvət yenə.
Baxıb söylədi: – Yox bu dərdə çara,
İlanlar belə qalmalı bir ara.
Toxunma, yemək ver, doyur onları,
Acıqlandırıb kəsmə heyvanları,
Adam beyni ancaq yesinlər gərək,
Yəqin öldürər onları bu xörək.
Bu sözlərlə şeytan düşünsən əgər,
Bilərsən ki, izlərdi nə fitnələr.
O istərdi: keçsin həyata sözü,
Boşalsın adamdan bütün yer üzü.

Bir az sonra İranda üsyançılar,
Bütün ölkəyə vəlvələ saldılar...
Bütün xalq döndərdi Cəmşiddən üz,
Qara qır kimi oldu parlaq günüz.
Yolundan çıxıb, ağlını azdı şah,
Ona olmadı tanrı lütfü pənah.
Budur, hər yetən oldu bir hökmran,
Hər addımda bir təxti-tac axtaran
Qoşunlar düzüldü, döyüş başladı,



Qəzəb rəmzi olmuşdu Cəmşid adı.
Olub bir neçə dəstə iranlılar,
Ərəb mülkünə doğru yollandılar.
Eşitmişdilər bir igid əjdaha
Ərəblərdə var ki, baş əyməz şaha.
Hər iranlı şah axtara-axtara
Gəlib tapdı Zöhhakı dərdə çara.
Dedilər: – Ərəb mülkünün şahısan.
Buyur, həm də İranda ol hökmran!
Verib təxtü tac vəd, yalvardılar,
Gəlib əjdaha etdi İranı xar.
İran mülkünə şah olunca həmən,
Bir ordu yığıb hər iki ölkədən,
Alıb, Təxti-Cəmşidə[11] oldu rəvan,
Ona bir üzüktək göründü cahan.
Hücuma keçincə yeni hökmdar,
Daha olmadı bəxt Cəmşidə yar.
Atıb təxtü tacı, əliboş, zəlil
Qaçıb getdi, gizləndi gözdən yüz il.
Verən olmadı kimsə ondan xəbər,
Adı şah, özündənsə yoxdu əsər.
Yüz il keçsə də çıxdı bir gün üzə,
O, Çin dəryasında göründü gözə.
Budur, əjdahadan qaçıb gizlənən
Əsir oldu Zöhhak əlində həmən.
Keçirdikdə Cəmşidi Zöhhak ələ,
Aman vermədi bircə gün də belə,
Mişarla onu böldü tən ortadan,
Xilas oldu bir zülmkardan cahan.
Bada verdi şahlıq busatın zaman,
Zaman kəhraba oldu, Cəmşid saman.
Kim ondan ziyadə olub hökmdar?
O, zəhmət çəkib, kam alır başqalar.
Verib yeddi yüz illik ömrün bada,
Çox iş gördu – yaxşı, yaman – dünyada.
Şah adil olarsa, sevər xalq onu,
Zəmanə üzər zalımın boynunu.

## ZÖHHAK

Bütün aləmə oldu Zöhhak şah,
Min il zülm əlindən bəşər çəkdi ah
Zamanə yaman çox yaşatdı onu,
Sanardın ki, yetməz cəfanın sonu.
Zəka sahibi oldu hər yerdə xar,
Cəhalət sayıldı hünər, iftixar.
Kəsildi ağa aləmə cadugər,
Aman vermədi xeyrə aləmdə şər.
Haçan Cəmşidi təxtdən saldılar,
Evindən iki qız əsir aldılar.
Şahın qızları idi o bir cüt bacı,
Gözəllər başının bu bir cüt tacı,
Birinci bacının adı Şəhrinaz,
İkinci bacının adı Ərnəvaz,
Kəniz verdilər Zöhhaka qızları,
Kama əjdaha çəkdi ulduzları.
Dəyişdirdi onlardakı xisləti,
Tutub əyri yol, atdılar isməti.
Mürəbbisi Zöhhak olanda məgər,
Qalar yaxşılıq, doğruluqdan əsər?
O ancaq bilirdi danışsın yalan,
Vurub, öldürüb, xalqı etsin talan.
İki oğlanı, rəsm idi, hər gecə,
Qul olsunmu ya zadəgan, gizlicə
Tutub darğa təslim edər dərbara,
Şahın dərdinə bəlkə olsun çara,
Kəsib başını, beynini pörtərək
İlanlarına şah edərdi xörək.
O vaxtlar var idi iki şahzadə,
İki parlaq inci kimi dəryada.
Biri – Ərmayıl adlı dindar idi,
Biri – Kərmayıl, zirək, huşyar idi
Təsadüf belə oldu rastlaşdılar,
Ürəkdə olan dərdləri açdılar.
Dedilər: – Yadelli əlindən aman,



Olub zülmdən xalqın halı yaman.
Biri söylədi: – Gəl, gedək dərbara,
Deyək, aşpazıq biz də, o qəddara
Kələk baş tutarsa, duşünmək gərək.
Yazıq xalqa bəlkə kömək göstərək.
Heç olmazsa hər gün iki gəncdən
Birini xilas eyləyək pəncədən.
Gedib oldular Zöhhakın aşpazı,
Xörəklər hazırlandı on cür azı,
Şahın mətbəxində o iki cavan,
Uzun sürmədi, oldular hökmran.
Qaranlıq çökəndə hər axşam çağı
O şah istəyərdi rahat yatmağı.
İki gənci Zöhhak cəlladları
Sürüklərdilər zorla mətbəx sarı,
Üz üstə atarlardı bir anbara,
Edərlərdi təslim aşpazlara.
Ürəklər bu haldan dönərdi qana,
İki xeyirxah odlana-odlana
Əli varmadan başlayardı işə,
İlahi, şahın başına daş düşə!
Ahı onların yandırardı daşı,
Necə öldürər qardaş qardaşı?
Tapa bilməyib dərdə başqa əlac,
Kəsib bir cavan başını naəlac,
Alıb gizlicə bir qoyun beynini,
Qatardı bu beynə onun beynini.
Qaçırdıb ikinci cavanı haman,
Deyərdi: – Şəhərdən uzaqlaş aman!
Qoyunla adam beynini tən yarı
Qatıb, yemləyərdi iki şahmarı.
Bu minval ilə o iki xeyirxah
Otuz gəncə hər ay olardı pənah.
Yığıldı bu yolla iki yüz nəfər,
Pənahgah tapıb, orda gizləndilər,
Verib hər birinə neçə baş qoyun,
Dedilər: – Alın, çöllərə üz qoyun!

Gedib tutdular dağda onlar qərar,
Şəhərdən uzaqda məkan saldılar.
Bu kürdlər ki var, onların nəslidir,
Bütün ömrü dağda keçir, bəllidir,
Bir adətdi Zöhhakda bu, hər zaman
Sevərdi: desinlər ona qəhrəman.
Soraq tutsa bir pəhləvan ad alıb,
Neçə pəhləvanı atından salıb,
Deyərdi ki, gəlsin gərək o qoçaq
Mənimlə bu meydanda qurşaq tutaq,
Eşitdikdə, var ölkədə bir gözəl
Mələklər kimi, hüsnünə yetməz əl.
Nə adət qanardı, nə məzhəb, nə din,
Salardı ayaq altına ismətin.

Hələ qırx il ömrü qalırdı onun,
Fələk başladı ziddinə bir oyun.
Sarayda, yanında gözəl Ərnəvaz,
Yatırkən gecə, sübhə qalmış bir az,
Nə gördü ki; gözlənmədən üç nəfər
Dilavər saraydan çıxıb gəldilər.
İkisi böyükdü, biri çox cavan,
Boyu sərv, alnında fərri-kəyan[12]
Cavan bağlayıb şahtək altun kəmər,
Əlində öküzbaşlı gürz gəzdirər.
Çalıb, çarpışır, şahı məğlub edir,
Kəmənd ilə Zöhhakı almış əsir.
Dəmavənd dağına sürüklər onu,
Dalınca çəkər bir böyük ordunu.
Yuxu zalımın bağrını etdi qan,
İlan kimi qıvrıldı, çəkdi fəğan.
Atıldı yerindən, qopardı haray,
Düşüb lərzəyə yüz sütunlu saray.
Gəlib dəhşətə şah çəkən nərədən
Ayüzlü gözəllər oyandı həmən.
Dedi Ərnəvaz: – Ey böyük hökmdar,
Mənə söylə, könlündə nə sirr var?



Yatırdın mənimlə evində rahat,
Nədən qorxdun, ey şah, de, asudə yat.
O dilbərlərə söylədi padişah:
– Bu sirri açıb söyləməkdir günah,
Sizə sirrimi eyləsəm mən əyan,
Ümidsiz qalarsız canımdan, inan.
Çox israr qıldı ona Ərnəvaz,
Dedi: – Sirri aç, eyləmə etiraz.
Tapaq bəlkə də dərdinə çarə biz,
Elə dərd yox ki, ola çarəsiz.
Nə görmüşdü röyada faş eylədi,
O dilbərlərə birbəbir söylədi.
Ayüzlü gözəl Ərnəvaz açdı dil,
Dedi: – Çarə axtar, hələ gec deyil.
Cahan bir üzükdür əlində sənin,
Bəşər, quş, pəri, div rəiyyətlərin.
Çağır, topla hər yandan alimləri,
Min əfsun düzəldən münəccimləri.
Açıb sirrini söylə möbidlərə,
Çalış, tövbə qıl, zülmü at bir kərə!
Tanı düşməni, vaxtı vermə bada,
Bəşər bil onu, div, pəri olsa da.
Gəz, axtar, çıxart düşməni aşkara,
Yaraşmaz bu şübhə, bu şəkk şahlara.
Danışdıqca o sərvqamət pəri,
Batırdı şahın beyninə sözləri.
Qaranlıq gecə bir qara qarğatək
Uçub getdi, bu aləmi qıldı tərk.
Dağın arxasından göründü çıraq,
Onun şöləsindən şəfəq saçdı dağ,
Xəbər verdi möbidlərə hökmdar,
Ağıllı, kamal sahibi harda var,
Hamı toplanıb, qoydu üz dərbara,
Dedi şah da röyasını onlara.
Ürək sirrini söylədi aşikar,
Dedi: – Söyləyin taleyimdə nə var?
Fələk dövr edir yaxşı, yoxsa yaman,

Deyin, məndən üz döndəribmi zaman?
Tapın, göstərin hardadır düşmənim,
Çatar kimlərə tacü-təxtim mənim?
Bu sirri əgər etməsəz aşikar,
Sizin boynunuzdur, o kəndir, o dar.
Düşüb qorxuya məclis əhli tamam,
Pıçıltı, işarə edirdi davam,
Dedilər: – Əgər doğru söz söyləsək,
Şirin canımızdan gərək əl üzək.
Desək haqq sözü biz əgər tərsinə,
Bu zalım bizi sağ buraxmaz yenə.
Davam etdi söz-söhbət üç gün belə,
Alan olmadı doğru bir söz dilə.
Qəzəbləndi dördüncü gün hökmdar,
Dedi: – Söyləyin hər şeyi aşikar.
Bilin, olsa susmaqda israr edən,
Onu kimsə görməz çıxıb sağ gedən.
Ürəklər əsir, göz dolu qanlı yaş,
Hamı qorxudan torpağa dikdi baş.
Var idi o məclisdə tək bir nəfər
Açıqgözlü, huşyar, sahibhünər,
Adı Zirək idi, hər işdə zirək,
Yarıb səfləri, qarşıya çıxdı tək.
Yox idi ağır sözlərə onda tab,
Cəsarətlə Zöhhaka verdi cavab.
Dedi: – Sakit ol, lovğalanmaq yetər,
Ölümdən qaçan olmamış bir nəfər..
Olub səndən əvvəl də çox hökmdar,
Ləyaqətlə ömrü başa vurdular.
Ədalətlə şahlıq edib dünyada,
Qoyub getdilər taci-təxti yada.
Əgər olsa insan polad bir qala,
Fələk verməz imkan salamat qala.
Sənin bir nəfər son qoyar bəxtinə,
O, sahib çıxar tacına, təxtinə.
Ana Afəridun verər ad ona,
Fələk göndərər xalqın imdadına.



Hələ tapmamışdır təvəllüd o şah,
Belə tez düşüb möhnətə, çəkmə ah.
Gəlincə həyata sahibhünər
Atar boy, verər bir ağactək bəhər.
Tutar başını yeddi göydən uca
Ki, çatsın əli bəlkə təxtə, taca
Gözəl qaməti sanki sərvi-rəvan,
Polad gürz çiynində o pəhləvan.
Edər gürz ilə qəsrini tarimar,
Sənin qollarını tutub bağlayar.
Eşitdikdə Zöhhak bu sözləri,
Bərəldi onun qorxudan gözləri:
– Fəridun nədən olmalı düşmənim?
Ona pisliyimmi yetibdir mənim?
Dedi möbid: – Ey şah, gözlə ədəb,
Bil, hər pisliyə var cahanda səbəb.
Əlində atası olanda həlak
Qəzəbdən olar oğlunun bağrı çak.
Çağa verməsin can acından deyə,
Edər bir inək dayəlik körpəyə.
Tutub öldürərsən o heyvan ki, var,
Fəridun onun intiqamın alar,
Qulaq verdi Zöhhak bu sözlərə,
Düşüb təxtdən, dəydi huşsuz yerə.
Görüncə bu əhvalı sirri açan
Çəkildi geri, itdi gözdən haman.
Şahın başına gəldi huşu o dəm,
Kəyan təxtinə qoydu bir də qədəm.
O gündən gəzib gizli, həm aşikar,
Fəridunu hər yerdə axtardılar.
Yeyib yatmayır, gülməyirdi üzü,
Qaranlıq kecəydi şahın gündüzü.

O gündən ötüb keçdi xeyli zaman,
İl-ildən şaha dar göründü cahan.
Fəridun doğuldu, elə bil o gün
Bu dünya kökündən dəyişdi bütün.

Boy atdı bəzənmiş cavan sərvtək
Ona verdi şahlıq kamalı bəzək...
O layiqdi Cəmşid kimi şahlığa,
Günəştək saçardı cahana şüa.
Bu dünyaya lazımdı yağmur qədər,
Ləyaqətli şah ruhları bəsləyər.
Fəriduna oldu fələklər də ram,
Fələk çərxi döndükcə o aldı kam,
Doğulmuşdu Bərmayə adlı inək,
İnəklər içində büsatlı inək.
Bir erkək tavusdan bəzəkli, qəşəng,
Çalırdı onun hər tükü başqa rəng.
Münəccimlərə çatdı bundan xəbər,
Tamaşasına toplaşıb gəldilər.
Baxıb söylədi hər qoca, hər cavan:
– Bu cür bir inək görməmişdir cahan.
O yandansa Zöhhak gündüz, gecə.
Gəzirdi Fəridunu hey gizlicə.
Fəridun atası olan Abətin
Baxıb gördü baş saxlamaqdır çətin.
Qaçaq düşdü, verdi cəfa canına,
Nə bilsin gedir əjdaha kamına?
Şahın gizli casusları bir zaman
Xəbər tutdular Abətindən haman.
Onu zülm ilə çəkdilər dərbara,
Günü oldu Zöhhak əlində qara.
Fəridun anası, o arif pəri
Görüncə həlak oldu bədbəxt əri,
Çalışdı səlamət qala övladı,
Fəranəkdi o qəhrəmanın adı,
Çölə qoydu üz, qəlbi qanla dolu,
Onun bir çəmənzara düşdü yolu,
Çəməndəydi Bərmayə adlı inək,
Gözəllikdə tavus büsatlı inək.
Qoruqçu önündə gedib əydi baş,
Gözündən axıtdı yerə qanlı yaş.
Dedi: – Südəmər körpəmi, ey cavan,



Əmanət götür, ver ölümdən aman!
Yetimdir, qəbul et, ata ol ona,
Bu südlü inək də qoy olsun ana.
Südüylə onu bəslə, bil, hər zaman
Mükafat verəm, hazıram, bil, inan.
Qoruqçu ona söylədi: – Ol əmin,
Qoy olsun inək südəmər körpənin.
Ürəkdən bu təklifi etdim qəbul,
Onun xidmətində mənəm sadə qul.
Üç il o inəkdən verib süd ona,
Əziz ömrü xidmətdə çatdı sona.

Yayıldı cahanda inək şöhrəti,
Onun dillərə düşdü söz-söhbəti.
Dedi şah Zöhhak: – O məlun inək
Tapılsın gərək, öldürülsün gərək!
Qaçıb, o çəmənzara gəldi ana,
İstədi əlac eyləsin oğluna.
Dedi: – Ey qoruqçu, küsüb, incimə,
Salıb həqq özü bir fikir qəlbimə...
Gərək mən bu tədbiri icra edim,
Tək övlad candan əzizdir, gedim.
Köçüm cadular ölkəsindən tamam,
Fəridunu Hindistana çatdıram.
Məni izləyənlər gözündən itim,
Gülüzlümlə Əlbürzə doğru gedim.
Basıb körpəni bağrına can kimi,
Dağa sarı yollandı aslan kimi.
O dağda var idi bir abid kişi,
Bu dünya ilə yoxdu əsla işi.
Fəranək dedi: – Ey olan pak din,
Yazıq bir kəsəm, yurdum İranzəmin,
Mənim bu əziz körpəmə sal nəzər,
O, bir gün gələr, təxti-tacı bəzər.
Ona hami ol, lütfünü qıl əta,
Yetimdir, əziz tut necə bir ata.
Qəbul etdi o körpəni xeyirxah,

Nə gəzdi bəhanə, nə də çəkdi ah.
Xəbər tutdu Zöhhak Bərmayədən,
Bilib, hardadır o bəzəkli çəmən,
Qəzəbdən dönüb şah qızmış filə
Başın kəsdi Bərmayənin kin ilə,
Görüncə çəməndə gəzir mal-qara,
Divan tutdu o dilsiz heyvanlara.
Fəridun sarayını çox gəzdilər,
Yox idi sarayda adamdan əsər.
Qəzəblə vurub od o kaşanəyə,
Gözəl qəsri döndərdi viranəyə.

Fəridun çatınca on altı yaşa,
Enib gəldi Əlburzdən birbaşa,
Anası önündə edib ahü zar,
Dedi: – Gizli bir sirri et aşikar.
Açıq söylə, axır, kim olmuş atam?
De, kimdən sənə yadigar qalmışam?
Mənə bu mühüm mətləbi sal başa,
Kiməm, söyləyim indi yar-yoldaşa.
Fərənək dedi: – Ey məqam axtaran,
Qulaq ver, sənə gör nə söylər anan:
Atan bir kişiydi, adı Abətin,
Ana yurdu isə bu İranzəmin.
Kəyan şahlarındandı o yadigar,
Ağıllı, bilikli, cəsur, namidar
Sayıb bir-bir əcdadını söyləsə,
Çatardı onun nəsli Təhmurəsə.
Mənimçin əziz, mehribandı atan,
Yox idi mənə xoş gün onsuz, inan!
O vaxtlar ki, Zöhhak – o cadupərəst
Sənin canına etmək istərdi qəsd,
Mən ondan səni gizlədirdim hər an,
Yaman günlər idi o günlər, aman.
Atanda var idi böyük bir ürək,
Səni bəsləyirdi necə gül-çiçək
Şahın çiyninin hər birindən ilan.



Göyərdi, o, İrana tutdu divan.
Atanın başın təndən etdi cüda,
İlanlar üçün beyni oldu qida.
Apardım səni bir elə cəngələ
Ki, bir kəs ora getməmişdi hələ.
Nə gördüm o yerdə? Gözəl bir inək
Çalırdı onun hər tükü başqa rəng.
Kəsib sahibi el içindən ayaq,
Yaşardı meşə içrə o şahsayaq.
Səni mən ona verdim, o novcavan
Çəkib nazını, bəslədi bir zaman.
Sənə dayə oldu o tavus inək,
Boy atdın da, oldun yenilməz pələng,
İnəkdən, çəməndən tutunca xəbər,
Gedib, şah Zöhhaka ərz etdilər.
Mən isə o yerdən səni nagəhan
Qaçırdım, nə ev qaldı, nə xaniman,
Gəlib gəzdilər, tapmadıqda səni
Tutub kəsdi Zöhhak Bərmayəni.
Nişan qalmasın qəsrimizdən deyə,
Vurub od, sovurdu külün də göyə,
Fəridun qulaq verdi bu sözlərə,
Başı qəm-kədərdən dikildi yerə.
Ədəblə xitab eylədi: – Ey ana,
Zəruri deyilmi sınaq aslana?
Bizə bunca zülm etmiş o bədəməl,
Gərək mən qılınca atım indi əl,
Edim zalimin qəsrini tar-mar,
Yəqin ki, mənə tanrı da yar olar.
Ana söylədi: – Düz deyil bu sözün,
Hələ kimsəsizsən, bilirsən özün.
O Zöhhakda həm taxt, həm tac var,
Durub əmrinə müntəzir ordular.
Qoşun istəsə yer üzündən əgər,
Hər ölkə verər atlı yüz min nəfər.
Cavanlıq gözüylə baxıb aləmə,
Belə sözləri bir daha söyləmə.

Cavanlıq şərabından hər kəs dada,
Deyər: qəhrəman tək mənəm dünyada.
Verər başını lovğalıqda hədər,
Oğul, könlünə tapmasın yol kədər.

Zaman keçdi, Zöhhak rahat olmadı,
Dilindəydi əzbər Fəridun adı.
O qorxardı təxtdən düşə torpağa,
Əsərdi, dönüb qəlbi bir yarpağa,
Çıxıb təxtə Zöhhak bir gün həmən,
Başında tacı ləlü firuzədən.
Hüzura tələb etdi əyanları,
Deyib dinlədi bir zaman onları.
Nəhayət, o, möbidlərə tutdu üz,
Dedi: – Elmdən nurlanır könlünüz.
Varımdır mənim düşmənim bir nəfər,
Məni istəyənlər bu sirri bilər.
Bilin, düşmənimdir mənim bir cavan,
Ağıllı, nəsəbli, igid, pəhləvan.
Belə söyləmiş möbid ondan mənə
Ki, xor baxmaq olmaz kiçik düşmənə.
Əgər düşmən olsa kiçik, ya zəlil,
Məhəl qoymamaq şaha layiq deyil.
Kiçikdirsə düşmən, fəqət qorxuram,
Gələr gün, o məndən alar intiqam,
Yığılsın gərək ordu hər ölkədən,
Qatım bir yerə divlə insanı mən.
Açım, söyləyim sirrimi aşikar,
Tükənmiş daha məndə səbrü qərar,
Yazın bir sənəd ki, bizim padişah
Olub daima xalq üçün xeyirxah.
Deyər doğru söz, bilməz əsla yalan,
Ədalətlidir, rəhmdil, mehriban.
Hamı qorxudan əydi Zöhhaka baş,
Onu qıldı təsdiqə hər kəs təlaş.
Yazıldı sənəd büsbütün ağ yalan,
Ona atdı imza qoca həm cavan.



Elə bu zaman çatdı şaha xəbər:
Salıb çöldə şivən şikayətçilər.
Dedi şah: – Burax onları təkbətək,
Hamı dərdini şaha açsın gərək.
Biri daxil oldu şah eyvanına,
Çağırdı onu hökmdar yanına.
Töküb qaşqabaq şah ona söylədi:
– Sənə zülm edən kim olub, qorxma, de!
Dedi: – Kavəyəm mən, işim – nalə, ah.
– Sənə zülm əlindən gətirdim pənah.
Dəmirlə oda bağlıdırsa peşəm,
Sənin yaxdığın odda mən bişmişəm.
Adın şah, özün əjdahasan məgər?
Utan, zülmdən əl çək, artıq yetər.
Səni yeddi ölkə bilir hökmdar,
Niyə zülmü etdin həmişə şüar?
Məgər tutmuşam mən böyük bir günah
Mənə dalbadal zülm edir padişah?
Niyə oğlumun qanı axsın gərək,
İlanlarına beyni olsun xörək?
Qulaq verdi Zöhhak bu sözlərə,
Donub qaldı, mıxlandı sanki yerə.
Bu məqsədlə ki, razı salsın onu,
Dedi: – Al, özünlə apar oğlunu!
Dedi Kavəyə şah: – Get, asudə yat!
O hökmü alıb, sən də imzanı at
Ki, şahın ədalət olubdur işi,
Hələ görməmiş zülmünü bir kişi.
Alıb Kavə hökmü, salınca nəzər
Ki, qol çəkmiş əyan ona sərbəsər,
Dedi: – Siz məgər xaliqi dandınız?
Belə qaniçən divə aldandınız?
O hər nə dedi, siz qəbul etdiniz?
Cəhənnəm yolunu tutub getdiniz?
Belə hökmü təsdiq edim mən necə?
Qoyun şah məni doğrasın indicə.
Coşub titrədi, qalxaraq bir kərə,

Cırıb doğradı hökmü, səpdi yerə.
Əziz oğlunu aldı Kavə o dəm,
Saraydan evə sarı qoydu qədəm.
Şaha zadəganlar dedi: – Afərin!
Cahan hökmünə baş əyərkən sənin,
Səni saxlasın hər bəladan fələk,
Döyüşdə güzəşt etməsin şah gərək.
Nə haqqı var ağzı yava Kavənin,
Önündə xoruztək qabarsın sənin?
Nə həddi edə rədd fərmanını?
Cırıb tullaya hökmü peymanını?
Dedi şah: – Məni dinləyirsiz əgər,
Sizə söyləyim bir qəribə xəbər?
Basınca ayaq Kavə dərbarıma,
Sədası çatınca qulaqlarıma,
Mənimlə onun ortasında haman
Dəmir dağ yarandı, deyərsəm, inan!
Fələk sirrini bilməyir bəndələr,
Bizi gözləyir bəlkə də bir xətər.
Saraydan çıxıb getdi Kavə o dəm,
Bazar əhli ətrafına oldu cəm,
Dedi xalqa Kavə ki, üsyan edin,
Qisas vaxtı çatmış, qana qan edin!
Dəri döşlüyü vardı ki, hər zaman
Asardı döşündən onu qəhrəman.
Onu nizəyə taxdı Kavə o gün,
Bazar əhli üsyana qalxdı bütün.
Gedib, əldə nizə çəkərdi fəğan
Ki, ey həqpərəstlər, olun qəhrəman!
Sevirsə Fəridunu bir kəs əgər,
O Zöhhaka tabe olarmı məgər?
Salın şahı təxtdən, Əhriməndir o,
Danıb tanrını, dinə düşməndir o.
Dəri bayraq altında toplandı xalq,
Atıb düşməni, dostunu andı xalq.
Qabaqda gedir Kavə, o pəhləvan,
Dalınca bir ordu ki, tutmaz cahan,



O addımlayır, baxmayırdı geri,
Bilirdi hayandır Fəridun yeri.
Görüncə çavan şahı xalq oldu şad,
Onun şəninə xaliqi etdi yad.
Baxıb nizədə döşlüyə şəhriyar,
Dedi: – Bəxtimin ulduzu oldu yar,
Asıldı dəri üstə rumi ipək,
Qızılla, cəvahirlə tapdı bəzək.
Zəfər rəmzi bildi onu hökmdar,
Başı üstə bir ay kimi asdılar,
Sarı, qırmızı, göydü üç qurşağı,
Qoyuldu adı Kaviyan bayrağı.
Günəştək saçardı o, zülmətdə nur,
Yaman gündə xalqın ümidi odur.
Neçə illər ötdü, dəyişdi cahan,
Olan işləri gizlədirdi zaman,
Fəridun duyurdu ki, Zöhhak üçün
Cahan bir məzara dönübdür bütün.
Kəmər bağlayıb, tac qoyub başına,
Gəlib əydi baş, söylədi: – Ey ana,
Döyüş vaxtı çatmış, gedim mən gərək,
Dua qıl, mənə Tanrı etsin kömək.
Gözündən edib sel kimi yaş rəvan,
Ana göylərə açdı əl, bağrı qan,
Dedi: – Ey bu aləmləri xəlq edən,
Əmanət qəbul et Fəridunu sən.
Onu cadulardan qoru, ey xuda,
Rəva görmə, pislər qala dünyada.
Fəridun hazırlıq görərkən yola,
Çalışdı bu tədbiri gizlin qala.
Var idi iki qəhrəman qardaşı,
Fəridunun onlardan azdı yaşı.
Birinə Kəyanuş verilmişdi ad,
İkincisi Pormayə, qəmdən azad.
Fəridun dedi: – Ey igidlər, gəlin,
Olun şad, qəm-qüssədən dincəlin.
Fələk dövrü imdad edər bəxtimə,

Əlim tez çatar tacıma, təxtimə.
Dəmirçibazar səmtinə tez gedin,
Mənə bir ağır gürz sifariş edin!
Onun əmrini tez qəbul etdilər,
Dəmirçibazar səmtinə getdilər.
Bu işdə kimin var idi şöhrəti,
Fəriduna ərz eylədi xidməti.
Fəridun ki, pərgarı aldı ələ,
Dedi: – Gürzümüz olmalı, bax belə:
Öküz başlı gürzün o arif cavan
Çəkib rəsmin yerdə, verdi nişan.
Neçə usta qatdı gecə gündüzə,
Ağır gürz hazırlandı, çıxdı üzə.
Fəridunu görcək bütün ustalar,
Sevinclə onu dövrəyə aldılar.
Dedilər: – Bizə varsa fərmayişin,
Buyur, başla, canla görək hər işin.
Fəridun çəkib cizgilər torpağa,
Onu göstərib bir neçə ustaya,
Dedi: – Gördünüzmü, daha durmayın,
Mənə bir belə gürz hazırlayın.
Qırılmaz dəmirdən uzun dəstəsi,
Başında poladdan öküz kəlləsi.
Çalışdı gecə-gündüz o ustalar,
O gürzü Fəriduna çatdırdılar.
Fəridun çağırdı sənətkarları,
Verib bəxşiş, alqışladı onları.
Dedi: – Çəkməyin qəm, qazansam zəfər,
Sizin başınız göylərə yüksələr,
Yerə basdırılsa şah, o əjdaha.
Bilin, zülm edilməz sizə bir daha.

Fəridun tez almaq üçün intiqam,
Yeyib-yatmağı da unutdu tamam.
Yemi atların istədi bol ola.
Yazın son ayında o çıxdı yola.
Saray qarşısında yığıldı qoşun,



Hamı xidmətinə dayandı onun.
Dedi: – Qəm, kədər çəkmək artıq yetər,
Sizin başınız göylərə yüksələr.
Əgər basdırılsa yerə əjdaha,
Sizi qoymaram darda mən bir daha,
Qoşun qalmasın ac deyə, hər nə var,
Yığıb fillərə, kəllərə çatdılar.
Kəyanuşla Pormayəni padişah
Götürdü yanınca pənah, xeyirxah.
Fəridunun hərçənd ki, azdı yaşı,
Baş əydi ona hər iki qardaşı.
Başı kinlə, qəlbi kədərlə dolu,
Külək sürətilə gedirdi yolu.
Gəlib çatdı Ərvəndruda haman[13],
Belə olmalı taci-təxt axtaran.
Məgər pəhləvi bilməyirsən nədir?
Bil, Ərvənd ərəbcə haman Dəclədir.
Gəlib Dəcləyə ordusuyla tamam,
Dedi: – Ey bərə işlədəndər, salam.
Dayanma, tələs, ey bərə işlədən,
Hazırlaş, suya sal qayıqları sən.
Qoşunla məni çatdır o sahilə,
Qalan olmasın burda bir kəs belə.
Qoşunla gərək Dəclədən tez keçəm,
Hədər getdi sahildəki bir gecəm.
Qayıqçı ona etmədi etina,
Qayıq vermədi Abətin oğluna.
Dedi: – Əmrinə baş əyim mən necə?
Mənə şah özü tapşırıb gizlicə:
Əlində möhürlü cavaz olmadan[14]
Çibin uçmaq istərsə, vermə aman!
Fəridun qəzəblə onu dinlədi,
– Nə qorxum dənizdən mənim? – Söylədi.
Kəyan əzmi ilə götürdü ayaq,
Atın üstünə quş kimi qalxaraq.
Başında döyüş əzmi, qəlbində kin,
Atı sürdü ağuşuna Dəclənin.

Görüncə bunu, cürət etdi qoşun,
Suya saldılar at dalınca onun.
Balıqtək suda üzdü atlar o gün,
Yəhərlər su altında qaldı bütün.
Çıxıb sahilə, seçdilər bir hədəf,
Hamı getdi Beytülmüqəddəs tərəf.
Dili pəhləvicə olan atlılar
Ona Gəngdej-hudec ad qoydular[15].
Ərəbcə adı Xaneye-pak olub[16],
O yer bir zaman Qəsre-Zöhhak olub,
Çapıb gəldilər, ta göründü şəhər,
Hamı bu şəhərdən dilərdi bəhər.
Fəridun bir mil şəhərdən kənar
Dayandı, baxıb gördü bir qəsr var.
Saçar nur sanki Zühəl, Müştəri,
Gözəldir, könül oxşayır hər yeri...
Onun qülləsi göylərə yüksəlib,
Baxanda, sanardın ki, ulduz dəlib.
Yəqin etdi ki, Əjdaha qəsridir,
Şahın məskəni – pürbəha qəsridir.
Dedi dostlara: – Siz baxın qəsrə bir,
Bu yerdən göyə nur kimi yüksəlir.
Görüncə onu getmiş əldən qərar,
Yəqinim budur: onda bir sirr var.
Geçikmək xətadır bu yerdə, bilin,
Bizə bağlıdır taleyi bir elin.
Ağır gürzü aldı ələ pəhləvan,
Cilovtökmə oldu o qəsrə rəvan.
Sanardın ki, oddur, uzun yol ötüb,
Keşikxanənin qarşısında bitib,
Yəhərdən ağır gürzü alcaq ələ,
Salıb zərbəsi aləmə vəlvələ,
Vurub saldı caduları yan-yana,
Çağırdı böyük həqqi imdadına.
O qorxmaz igid bir əlində yaraq
At üstə böyük qəsrə basdı ayaq.



O tilsim ki, ətrafda qurmuşdular,
Vurub gürz ilə eylədi tarümar.
Qırıb, sərdi caduları yan-yana,
Gəlib çatdı o möhtəşəm eyvana.
Girişdə yazılmışdı Zöhhak adı,
Fəridun söküb torpağa tulladı.
Qədəm basdı cadu dolu eyvana
Atıldı neçə vəhşi div meydana.
Əzib başını onların, etdi xar,
O cadupərəst qəsrdə hökmdar
Qələm çəkdi Zöhhak şahın bəxtinə,
Qoyub tac, oturdu onun təxtinə,
Çıxardı hərəmxanəsindən o dəm
Şəvə saçlı, ay üzlü bir çox sənəm.
Dedi: – Başını tez yuyun onların
Qara fikirdən ruhların qurtarın!
Verib onlara haqq yolundan nişan,
Gözəllər təmizləndi çirkabdan.
Mürəbbiləriydi hamı bütpərəst,
Odur, düzlüyə qalmamışdı həvəs.
O Cəmşid şahın qızları dil açıb,
Qızıl güllərin üstə nərgiz saçıb,
Dedilər Fəriduna: – Ey qəhrəman,
Qoca dünyada qal həmişə cavan.
Doğub hansı ulduzla bəxtin sənin?
Şirin barısan hansı tər şaxənin?
Bu aslan yatağına basdın qədəm,
Əlinlə sənin məhv edildi sitəm.
Bu cadu əlində düşəndən dara
Keçər ömrümüz bəxtimizdən qara.
Hələ görmədik biz belə bir cavan,
Səninək hünər sahibi qəhrəman.
Onun qəsrinə sahib oldun əcəb,
Edirsən yəqin təxtü tacı tələb.
Fəridun dedi: – Bir kəsə tacü təxt
Vəfa qılmamışdır, nə tale, nə bəxt?
Bu Zöhhak ilə düşmənəm, qanlıyam,

Mənəm Abotin oğlu, iranlıyam.
Onu tutdu, öldürdü bu əjdaha,
Budur, gəlmişəm ki, alım qanbaha.
Mənə dayə – Bərmayə adlı inək,
Deyərdin: odur bu cahana bəzək.
Axıtdı bu, o dilsizin qanını,
Gərək mən alam qatilin canını.
O zalımdan almaq üçün intiqam
Mənə verdi İranda rüsxət anam.
Əzəm başını mən gərək durmadan,
Ona rəhm qılmaq günahdır, inan.
Eşitcək bunu Ərnəvaz – ol pəri,
Açıldı ürəkdə olan sirləri.
Dedi: – Şah Fəridun, demək, sənmisən?
Bu cadunu, bu zalımı məhv edən?
O sənsənmi təxtdən salarsan divi,
Əlinlə olar tarümar zülm evi?
İki şah qızı – düşmənə kam idik,
Ölüm qorxusundan ona ram idik,
İlan olsa da, arvad olduq ona,
Göyərçin sığındı ilan qoynuna.
Fəridun dedi: – Çəkməyin qəm, kədər,
Muradımca dönsə bu dövran əgər,
Kəsib əjdaha nəslini tərtəmiz
O napakdan qoymaram qalsın iz
Mənə düz deyin, qorxmayın bir daha,
Bilim hardadır qan içən əjdaha.
Gözəllər bu sirri ona açdılar
Ki, Zöhhakı xar etsin o namidar.
Dedilər: – O getmişdir Hindistana,
Əlindən cahan əhli doymuş cana.
Qırar xalqları, verməz əsla aman,
Düşüb qorxuya taleyindən yaman.
Ona bir münəccim demiş bu sözü
Ki, səndən yaxa qurtarar yer üzü,
Gələr bir igid, zəbt edər təxtini,
Qara torpağa gömdürər bəxtini.



Bunu hər zaman yad edər, odlanar,
Bu işıqlı dünyanı zindan sanar.
İlanlarsa, çiynində axşam, səhər
Ona olmazın hey əziyyət verər,
İlanlar bir az sakit olsun deyə
Qaçar əjdaha ölkədən-ölkəyə.
Dönər qəsrinə tez, o getsə hara,
Dayan, gözlə gəlsin, onu sal tora,
Gözəl qız bütün sirri açdı belə,
Fəridun onu dinlədi şövq ilə

Uzaq ölkəyə şah edəndə səfər
Var idi onun yaltağı bir nəfər.
Onun olsa da sərvəti, neməti,
Sevərdi şaha qul kimi xidməti.
Xəzinə, saray sahibi olsa da,
Deyərdi: mənəm şah yanında gəda.
Ona Kondrov adı vermişdilər,
O, Zöhhaka olmuşdu sadiq nökər,
O gün Kondrov qəsrə gəldi, haman
Nə gördü: yeni tacidar bir cavan
Oturmuşdu təxt üstə asudə, şad,
Boyu sərvdir, ay üzündə nişat.
Sağında ona naz satır Şəhrinaz,
Solunda ayüzlü gözəl Ərnəvaz.
Baxıb gördü: dolmuş qoşunla şəhər,
Önündə igidlər şahın baş əyər,
Nə adı, nə də sirri vurdu üzə,
Fəridunu al dillə tutdu sözə.
Dedi: – Xoş gəlibsən bizə, şəhriyar,
Yaşa, hərnə qədər ki, bu aləm yaşar.
Mübarək ola təxti-tacın sənin,
Nədir borcu, şahım, sənə bəndənin?
Qul olsun, sənə yeddi ölkə, cahan,
Cahan sən kimi şah görübdür haçan?
Fəridun ona söylədi: – Gəl bəri,
Əyan etdi pünhan olan sirləri.

Buyurdu ona şah: – Ey kəndxuda,
Gedib süfrə aç, borcunu qıl əda
De gəlsin bu gün qəsrə sazəndələr,
Şərab ver bizə, yaxşı göstər hünər.
Ləyaqətli məclis quran bir adam
Hünərlə yanımda tapar ehtiram.
Önündə elə süfrə aç təxtimin,
Qul ol qarşısında uca bəxtimin.
Onun əmrini dinlədi kəndxuda,
Edib borcunu şah yanında əda.
Gətirtdirdi sazəndə, dadlı şərab,
Xörəklər düzüb, qəsrə səpdi gülab.
Fəridun unutdu qəmi, möhnəti,
Davam etdi sübhə qədər işrəti.
Görüb Kondrov: xəlvət olmuş ara,
Edib məclisi tərk o qəlbi qara.
Minib yel kimi yol gedən bir kəhər,
Çapıb getdi Zöhhaka versin xəbər.
Şaha çatdı, bir qul kimi əydi baş,
Nə görmüşdü, bir-bir ona etdi faş.
Dedi: – Bu cahan hökmdarı, sənin
Dönübdür nədən tərsinə işlərin?
Qoşunla gəlib üç nəfər pəhləvan,
Sənin qəsrinə girdilər qorxmadan
Üçündən biri lap yeniyetmədir,
Boyu sərvdir, görkəmi sanki şir.
Yaşı azdır, ancaq məqamı uca,
Böyüklər onu vəsf edir bolluca.
Başı gürzünün oxşayır bir dağa,
Önündə qoşun üz qoyur torpağa.
İki qəhrəman da alıb yanına,
At üstə gəlib şahın eyvanına.
Qırıb çatdı sən qurduğun tilsimi,
Çıxıb təxtə, əyləşdi bir şah kimi.
O divlər ki, qəsrində vardı sənin,
Keşik xidmətində durardı sənin,
Əzib onları, tökdü dörd bir yana,



Beyinlər səpildi bütün eyvana.
Dedi şah: – Gəl, bunca qorxma nahaq,
Nə bildin ki, o gəlməmişdir qonaq?
Dedi Kondrov: – Ey böyük hökmdar,
Qonağın əlində məgər gürz olar?
Sənin adını təxti-tacdan silər,
Qonaqda olarmı belə bir hünər?
Dedi şah: – Təşvişə düşmə nahaq,
Uğurlu olar məncə üzlü qonaq.
Dedi Kondrov: – İndi, ey şəhriyar,
Mənim şahıma bir sualım da var:
Tutaq, bu igidlər gəlibdir qonaq,
Hərəmxanədə neyləyir bəs qoçaq?
Cəmin qızlarını alıb yanına,
Yayar söhbəti yağ kimi canına.
O gah Şəhrinazın yanağın öpər,
Dönər Ərnəvazın dodağın öpər.
Gecə qəsrdə başqa bir toy tutar,
Sənəmlərlə baş bir balışda yatar.
Ayüzlü iki nazlı dilbər gözəl
Ki, səndən savay vurmamış kimsə əl,
Girər qoynuna olcağın keyfi çağ,
Nə lazım sənə belə üzlü qonaq?
Bu söz saldı Zöhhakı qısqanclığa,
Ölüm arzuladı o, bir anlığa.
Qızışdı, söyüş söyməyə başladı,
Ucaldı onun göylərə fəryadı.
Dedi: – Kondrov, mən səni bir daha
Gözətçi qoya bilmərəm dərgaha.
Dedi: – Şah büsatın gedərsə bada,
Necə eyləyərsən məni kəndxuda?
Bu gün bir tükə bağlıdır varlığın,
Mənimçün nə lazım havadarlığın?
Belə iş hələ çıxmamış qarşına,
Qızışma, düşün, qıl əlac başına.
Xəmirdən çıxan tük kimi indi sən
Kənar qalmısan tac ilə təxtdən.

Gəlib düşmənin gürz ilə nagahan,
Tutub qəsrini, saldı orda məkan.
Dağıtmış sənin qurduğun tilsimi,
Qucar sevgili yarını ər kimi.
Bu sözdən acıqlandı Zöhhak şah,
Coşub, çəkdi odlu ciyərdən bir ah,
Günəş batdı zülmətdə dəryalara,
Gecə oldu, aləm geyindi qara.
Qoşun əhlinə söylədi hökmdar:
– Yəhərlənsin atlar qoşunda nə var.
Böyük bir qoşun qəsrə oldu rəvan,
Hamı div kimi cüssəli qəhrəman.
Bu işdən Fəridun tutunca xəbər
Bütün yolları atlılar kəsdilər.
Töküldü qoşun əhli atdan yerə,
Salıb düşməni təngələrdə girə[17]
Şəhər əhli də toplaşıb damlara,
Tamaşa edirdi bu vurhavura.
Kimin Zöhhaka nifrəti var idi,
Fəriduna onlar havadar idi.
Qılınc, oxla başlandı bərk qırhaqır,
Dam ustdən də kərpic yağır, daş yağır.
Yağıb sanki yazda buluddan dolu,
Atı, atlıya dəydi, kəsdi yolu.
Şəhər sakini – minlər ilə cavan,
Döyüşdə bişən hər qoca pəhləvan
Qoşuldu Fəridun adamlarına,
Hucum etdi Zöhhak dərbarına.
Belə etdi elan atəşgədə:
– Cavan olsa da şahımız ölkədə,
Ona tabeyik həm qoca, həm cavan,
Yolunda fəda eylərik başla can.
Daha qoymarıq təxtə Zöhhakı biz,
O çiyni ilanlı, o napakı biz.
Qoşunla şəhər əhli birləşdilər,
Deyərdin: yerindən qopub dağ gedər.
Şəhərdən qara toz ucaldı göyə,



Büründü Günəş sanki göy pərdəyə.
Baxıb gördü Zöhhak: olar tez tələf,
Qoşundan qaçıb gəldi qəsrə tərəf.
Geyindi zireh əyninə hiyləgər
Ki, şah olduğun bilməsin bir nəfər.
Yanaşdı dama, atdı yaylı kəmənd,
Daş üstə kəməndi onun oldu bənd.
Nə gördü o birdən: gözəl Şəhrinaz
Fəridun ilə başlamış işvə, naz,
Ayüzlu, qara telli o şux nigar
Onun adını nifrət ilə anar.
O qısqandı, az qaldı ki, odlana,
Kəmənd atdı damdan uca eyvana.
Nə candan o qorxardı, nə təxtdən,
Kəmənd ilə damdan atıldı həmən.
Əlində poladdan iti dəşnəsi,
Pəri üzlülər qanının təşnəsi.
Yerə endi, ancaq Fəridun bu dəm
Atıldı yerindən beş-altı qədəm.
Alıb gürzü yerdən elə vurdu ki,
Başında dəbilqə bölündü iki.
Ağır gürz qalxdı ikinci kərə,
Bu dəmdə mələk endi göydən yerə.
Dedi: – Vurma həqq əmridir, ver aman!
O, işgəncələr görməli bir zaman.
Bu halda ki, almış əlindən yara,
Qolu bağlı çatdır onu dağlara.
Apar, dağda zəncirə çək, həbsə al,
Qohum-qardaşından tamam ayrı sal!
Fəridun eşitcək bunu, durmadan
Kəmənd eşdi aslan gönündən haman.
Onun əl-qolun bəndə çəkdi elə
Ki, açmaq müyəssər deyildi filə.
Qızıl təxtə çıxdı o gün şadman,
Götürdü ərəb rəsmini ortadan.
Tutub xalqa üz, söylədi hökmdar:
– Sənətkar, əkinçi, – əgər ağlı var,

Əlinə silah almasın bir daha,
Bu cür ad qazanmaq deyildir rəva.
Sənətkar döyüşçü olubdur məgər
Ki, qanlı döyüşdə qazansın zəfər?
Biri ustadır, digəri pəhləvan,
Hərə öz işində olar kamiran.
Qarışsa əgər bu ona, o buna,
Dönər yer üzü qan dolu ümmana.
Sizə zülm edən hökmdar hardadır?
O, bəndə çəkilmiş, işi dardadır.
Gedin əmr edin sülh ilə şadkam,
Hərə öz işində çalışsın müdam.
Camaat o pak qəlbli sərvərin
Sözün dinləyib, söylədi afərin!..
Fəridun nəsihət verib onlara,
Dedi: – Salmasın heç kəsi haqq dara.
Məni ölkənizdə edən hökmran
Sizin bəxtinizdir, deyil bu yalan.
Bizi pak olan tanrı Əlbürzdən
Seçib, göndəribdir ki, gürzümlə mən
Əzib basdıram əjdahanı gora,
Cahan zülm əlindən yaxa qurtara.
Bizə lütfünü haqq edibdir əta,
Bu yolda çıxa bilməz əldən xəta.
Bütün aləmə mən bu gün sərvərəm,
Bu yerdə həmişə qala bilmərəm.
Qalaydım əgər burda xeyli zaman,
Olardım sizinlə daha mehriban.
Böyükləri diz çökdü, öpdü yeri,
Ucaldı saraydan təbil səsləri.
Qoşun çıxdı getdi, boşaldı şəhər,
Gəzib doymadan, almadan bir bəhər,
Çəkib bəndə Zöhhakı mərd atlılar
Üz üstə bir at üstünə atdılar.
Çapıb getdilər, çatdılar Şirxana,
Qoca dünya olmuşdur ibrətxana.
Bu çöllər, bu dağlar görüb kimləri,



Özün bir düşün, əsrlərdən bəri?
Qolu bağlı Zöhhakı gənc hökmdar
At üstündə Şirxana çatdırdılar.
Qovurdu onu dağda dördbir yana,
Hazırlaşdı qərq eyləsin al qana,
Bu anda çatıb, söylədi bir mələk:
– Sözüm var sənə, gizli qalsın gərək.
Dəmavəndə bu zalımı tək apar,
Qonşusuz, yanınca özün get çapar,
Yanınca adamlar götürsən əgər,
Götür etibarlı olan şəxslər.
Elə şəxslər ki, vəfadar ola,
Sənə dar günündə havadar ola.
Alıb getdi Zöhhakı gənc hökmdar,
Dəmavəndə atlı gəlib çatdılar.
O dağda Fəridun baxıb hər yerə,
Göründü keçilməz, dərin bir dərə,
Döşündə bir ucsuz-bucaqsız kaha,
Kaha əlverişli göründü şaha.
Başı üstə asmaqçın o qəddarı
Daşa çaldı möhkəm neçə mismarı.
Onu çəkdi zəncir ilə çarmıxa,
Canı zalımın zillət ilə çıxa.
Asıldı kaha içrə o əjdaha,
O, dünya üzü görmədi bir daha.
Əsir eyləyən oldu axır əsir,
Min illər ötübdür, o zillət çəkir...

## FƏRİDUN

Fəridun olub aləmə hökmdar,
Özündən savay görmədi tacdar.
Qədəm qoydu şah qəsrinə şahtək,
Kəyan təxtü tacına verdi bəzək.
Seçib *mehr* ayında əziz bir günü[18],
Çıxıb təxtə qoydu Kəyan börkünü.

Daha zulmdən qalmamışdı əsər,
Bütün xalq oldu azad, bəxtəvər.
Xilas oldu zülmün əlindən hamı,
Sevinclə quruldu bir el bayramı.
Yığıldı o şənliklərə el tamam,
Əlində hərə tutdu yaqut cam.
Şərab saf idi, elsevər şah cavan,
Təzə ay, təzə don geyinmiş cahan.
Şah əmr etdi: – Tonqal alovlandırın,
Oda mişk, ənbər tökün, yandırın.
Bəzənsin işıqla, ətirlə cahan,
Bu şən bayrama ad verək: Mehrəqan[19].
Hər il şənlənək biz bu gündə gərək,
Bir il işləsək də, o gün dincələk.
O şahdan qalıb Mehrəqan yadigar,
O gün işləmə, bayramı tutma xar!
Fəridun ki, şahlıq edib beş yüz il,
Yamanlıq nədir bilmədi ölkə, el.
Bu dünya ona qalmadı, ey oğul,
Tamahdan saqın, qəm yemə, nikbin ol!
İnan, heç kəsə qalmamışdır cahan,
Səadətdən onda görən yox nişan.
Fərənək hələ tutmamışdı xəbər,
Onun oğlu dünyaya şahlıq edər.
O, Zöhhakı təxtdən salıb, xar edib,
Onu min əzaba giriftar edib.
Nəhayət, gəlib müjdə çatdı ona:
Şahın təxti qismət olub oğluna.
Gedib əvvəl-əvvəl yuyundu təmiz.
Anıb xaliqi torpağa qoydu üz.
O xoş müjdədən olsa da qəlbi şad,
Edib şah Zöhhakı lənətlə yad,
Dedi: – Çox şükür, tanrı, pərvərdigar,
Mənim istəyimcə dönüb ruzigar.
Onun bir yaxın sirdaşı var idi,
Ona hər zaman yarü qəmxar idi.
Çağırdı, ona söylədi gizlicə



Ki, oğlu onun şah olubdur necə.
O, bir həftə hey payladı simü zər,
Şəhərdə fəqir qalmadı bir nəfər,
Daha yeddi gün yığdı əyanları,
Sevincinə etdi şərik onları.
Yaratdı evində böyük təmtəraq,
Açıb süfrə, hər gün çağırdı qonaq.
Əlində var idi böyük xəznələr,
Hesabsızdı onlardakı simü zər.
Görüncə əziz oğlunu hökmdar,
Gözündə cəvahir, qızıl oldu xar.
Cavahir alıb xəznədən bir daha,
Hazırlatdı layiq libaslar şaha,
Ərəb atları seçdirib ilxıdan,
Yəhər qoydu altun, cavahirnişan.
Dəbilqə, zireh, nizə, zubin, sipər,
Hazırlatdı şahanə tacü kəmər.
Qatarla dəvə – yüklü saldı yola,
Dedi: – Pak olan tanrıya şükr ola.
Hədiyyə qılıb hər nə var, oğluna,
Dilində dua gəldi çatdı ona.
Fəridun buna afərin söylədi,
Ana töhfəsini qəbul eylədi.
Qoşun əhlinə çatdı bundan xəbər,
Baş əydi cavan şaha sərkərdələr.
Dedilər ki, sən ölkənin fəxrisən,
Yox olsun cahandan səni sevməyən.
Həmişə səni eyləsin tanrı şad,
Ədalətlə dünyanı etdin abad.
Gəlib hər tərəfdən böyüklər o gün
Saray qarşısında düzüldü bütün.
Tutub əl hamı o uca dərgaha,
Şahın canına eyləyirdi dua.
Bu niyyətlə etdi hamı həqqi yad
Ki, olsun həmişə Fəridun şad.
Uzun ömr sürsün belə hökmdar,
Var olsun cahanda bu xoş ruzigar.

Bir az sonra çıxdı Fəridun yola,
O istərdi hər işdən agah ola.
Ürəkdə bir ölkə qəmi, el qəmi,
Çıxıb gəzdi başdan-başa aləmi.
Görüncə xərabə qalıb bir diyar,
Edib zülm əli ölkəni tarümar,
Ədalətlə qurdu o yerdə divan,
Ağıllı olan zülmə verməz aman.
Behişt kimi dünyaya vurdu bəzək,
Bitirdi şoranlıqda da gül, çiçək.
Ötüb Amoli, gəldi Təmmişəyə;
Fəridun o yerlərdə olmuş, deyə,
Bu adlar tanınmış bütün dünyada,
Salır şəhriyarı şəhərlər yada.

Yaşı ancaq əlli olardı onun,
O vaxtlar üç övladı vardı onun,
Uşaqların oğlan idi hər üçü,
Taca, təxtə şayan idi hər üçü.
Hamı sərv boyluydu, lalə yanaq,
Deyərdin, üç alma verib bir budaq,
İkisini doğmuş gözəl Şəhrinaz,
Anaydı kiçik oğluna Ərnəvaz.
Fəridunun əyanlarından biri –
Ki, yüksəkdi şahın yanında yeri.
Adı Cəndəl idi, özü qəhrəman,
Fəriduna hər işdə can yandıran,
Dedi Cəndələ: – Gəz bu dünyanı sən,
Əsilzadələrdən seç, üç qız bəyən!
Çalış, nəslinin yüksək olsun tacı,
Pəri üzlü, pakizə doğma bacı.
Əsildə, nəsəbdə mənim adıma,
Gözəllikdə layiq üç övladıma,
Necə taleyi birdir oğlanların.
Bir olsun boyu, görkəmi onların.
Bəyəndi o pakizə fikri qoçaq.
Şahın əmrinə asdı Cəndəl qulaq,



Ağıllı, şirindilli, huşyar idi,
Xeyir işlərə hümməti var idi.
Götürdü yanınca neçə xeyirxah,
"Uğurlar ola, get!" – dedi padişah,
Yola çıxdı könlündə sonsuz maraq,
Sözə, söhbətə hey asırdı qulaq.
Bilincə ki, şahın filan ölkədə
Gözəl qızları var, çətin bilsə də,
Gedib öyrənir onları gizlicə,
Camalda necədir, kamalda necə?
O çox şah görüb, gəzdi çox ölkələr,
Fəqət tapmadı gəzdiyindən əsər.
O ağlı işıqlı, dili, qəlbi düz,
Yəmən şahı dərgahına tutdu üz.
Yəmən şahının, – tutdu Cəndəl xəbər, –
Var üç gövhəri, hər üçü tazə-tər.
Dayandı önündə onun sanki qul;
Necə sərv önündə durar qırqovul.
Öpüb torpağı, səcdə qıldı şaha,
Şirin dillə vəsf eylədi bir daha.
Yəmən padişahı dedi Cəndələ:
– Dualar yaraşsın o şirin dilə!
De, kimdən gətirdin sifariş, soraq,
Buyur, elçisən ya əziz bir qonaq?
Dedi Cəndəl: – Ey padişah, şən yaşa,
Sənə ox atılsa, toxunsun daşa.
Mən, iranlıyam, xidmətində qulam,
Fəridun şahdan gətirdim salam.
Qədəm qoymuşam şanlı dərgahına,
Sifariş varımdır Yəmən şahına.
Fəridun özü tapşırıbdır mənə,
Salam söyləyim şah adından sənə,
Fəridun o şahdır, düşünsən əgər.
Kiçik saymayanlar onu yüksələr.
Dedi: söylə məndən Yəmən şahına
Saça ətr, mişk, ənbər eyvanına.
Ərəblərdə şan-şöhrəti parlayan,

Fələk bəxtinə verməmişdir ziyan.
Deyir ki, mənəm İrana hökmdar,
Xəzinəm, gücüm, təxti-tacım da var.
Taca, təxtə layiq üç oğlum mənim
Varımdır, bilir dostum, həm düşmənim.
Hər arzuya, hər istəyə çatdılar,
Mənim sayəm altında boy atdılar,
Gərək indi mən üç boyu şümşada
Tapam üç gəlin – hər üçü şahzada.
Ağıllı adamlardan aldım soraq,
Deyirlər: əlinlə yanar bu çıraq.
Varındır sənin pərdədə üç nigar,
Gözəllikdə, paklıqda dastandılar,
Hələ onlara verməmiş kimsə ad,
Bu müjdə mənim könlümü etdi şad,
O üç qardaşa mən də ad vermədim,
Seçilsinlər adla – rəva görmədim.
Bu qiymətli gövhərlər indi gərək
Qovuşsun, baxaq, bəhrəsin biz görək.
Üç ismətli qızla bu üç qəhrəman
Ola bir-birinə əziz, mehriban.
Fəridun belə söyləmiş, indi sən
Cavabın nədir, söylə, Şahi-Yəmən?!
Sudan ayrılan bir çiçəktək haman
Yəmən şahının rəngi soldu yaman.
Düşündü: bu sevda mənə verməz əl,
Gözümdən uzaqlaşsa bu üç gözəl,
Olar hər günüm bir gecətək qara,
Ağıllı cavabdır bu dərdə çara.
Dedi elçiyə: – Ey çatan izzətə,
Gəl, indi qoyaq son bu söz-söhbətə.
Tələsmə cavab almağa sən fəqət,
Gərək mən bu işdə edəm məsləhət.
Ata qəlbinə şadlıq oldu haram,
Verib elçiyə yer, qılıb ehtiram,
Sarayda qəbul etmədi kimsəni,
Gedib fikrə, tək çəkdi qəm-qüssəni.



Dedi: – Nizədarlar çölündən gedin,
Siz əyanları qəsrə dəvət edin.
Yığıldı bütün başçılar dərbara,
Açıb dərdini şah dedi onlara:
– Evimdə mənim nurlu üç şəm yanar,
Görüb onları gözlərim nurlanar.
Fəridun bizə elçilər göndərib,
Yolum üstə amma əcəb tor sərib.
O üç şəmi istər əlimdən ala,
Nə tədbir görürsüz bu müşkül hala?
Deyir elçi: söylər Fəridun, mənim
Üç oğlum varımdır, gülüm, gülşənim.
O, üç oğluna istəyir üç qızı,
Dilim tutmayır söz, danışam, düzü,
Əgər razı olsam, alışar könül,
Yalan da Fəriduna layiq deyil.
Desəm: istəyindir mənə iftixar,
Ürək odlanar, göz yaşım hey axar,
Onun əmrini rədd qılsam əgər.
Yəqin ki, Fəridun küsər inciyər
Bu gün yer üzündə odur hökmdar,
O, kin bəsləsə, axırı pis olar?
Ağıllı adamlar deyir: bir zaman
Fəridun Zöhhaka uddurdu qan.
O Zöhhakı tədbirlə almış əsir,
Onu saymayan öz canından bezir.
Budur mətləbim, başlayın siz sözə,
Açıq söyləyin, sirr çıxsın üzə.
Ağılda sınaqdan çıxan başçılar
Dil açdı, dedi: – Ey böyük hökmdar,
Budur fikrimiz ki, səni hər külək
Dəbərtsə yerindən, ölək biz gərək.
Fəridun olub aləmə şəhriyar,
Məgər biz quluq ki, bizə xor baxar?
Budur borcumuz, söz deyək, iş görək,
Əli nizəli meydana at sürək.
Yeri xəncər ilə meyistan edək,

Göyü nizələrlə neyistan edək[20].
Əgər şahlığın bağlıdır bunlara,
Bu işdə çalış, tap bir özgə çara.
Tələblərlə sən elçini sal yola,
Qoy o, bu tələblərdən aciz qala.
Yəmən şahı əyanları dinlədi,
İşin əvvəlin, axırın bilmədi.

Şahın elçisini çağırdı səhər,
Yəmən şahı saçdı dilindən göhər.
Dedi: – Var böyük hörmətim şahına,
Nə əmri olarsa, mütiyəm ona.
Ona söylə: yüksəkdir hərçənd adın,
Əzizdir yanında hər üç övladın.
Oğul çox dəyərli olar şah üçün,
Xüsusi bəzəkdir o dərgah üçün.
Sənin sözlərin, bil, qəbuldur mənə,
Mənim hər qızım bir oğuldur mənə.
Fəridun göz istərsə məndən əgər,
Tutarsa Yəmən mülkünü sərbəsər,
Ağırdır bulardan mənə, üç balam,
Evimdən gedə, daim həsrət qalam.
Belə istəyirsə əgər hökmdar,
Qədəm qoymaram buyruğundan kənar.
Mənim üç qızım, şah buyursa əgər,
Bu şərt ilə ancaq yanımdan gedər:
Üç oğlun ki var, taci-təxtə bəzək,
Yaxından görəm onları mən gərək.
Mənim ölkəmi qərq edib də nura,
Gəlib hər üçü xidmətimdə dura.
Görüm onlar aqil, fərasətlimi?
Təsəlli tapıb, şad edəm qəlbimi.
Sınaqdan keçirdim, duyarsam əgər,
Ədalətdən onlarda vardır əsər,
Mən öz adətimlə o üç hurini
Verim onlara – üç gözüm nurini.
Şahın xatiri istəsə hər zaman



Edim onları xidmətinə rəvan.
Yəmən şahına Cəndəl asdı qulaq,
Öpüb toxtini hörmət ilə qonaq,
Təşəkkürlə tərk eyləyib dərbarı,
Alıb yol, düzəldi Fəridun sarı.
Çatıb şah dərbarına durmadan,
Olub-keçmişi qıldı bir-bir bəyan.
Çağırdı hər üç oğlunu hökmdar,
Ürək sirrini eylədi aşikar.
Dedi o, necə göndərib Cəndəli,
Yəmən padişahından almış "bəli".
– Yəmən padişahı, – dedi hökmdar, –
Salar sərvtək sayə, həm boy atar.
Təmiz incitək üç qızı var onun,
Gözündə oğuldur bu qızlar onun.
Əgər tapsa onlar kimi qız, fələk
Ayaqlarını bir-bir öpsün gərək.
Mən o qızlara elçi göndərmişəm,
Yəmən padişahına söz vermişəm.
Siz indi onun xidmətinə gedin,
Əyər-əskiyini işin həll edin!
Ağıllı, ədəbli olun, həm qoçaq,
Danışsa, verin diqqət ilə qulaq.
Onun qarşısında ədəb göstərin.
Əgər söz soruşsa, cavabın verin!
Bilin, padişah bəsləmiş hər cavan
Çəkinsin gərək hər yaman duyğudan.
Açıq dilli, mömin ola, pak ürək,
Açıq göz igid, arif olsun gərək.
Ağılda nümunə ola bir elə,
Verə doğru sözlərlə zinət dilə.
Mən hər nə deyirsəm, əməl eyləyin!
Səadət taparsız, bu yolla yəqin.
Yəmən şahının başqadır qiyməti,
İti gözlülükdə tapıb şöhrəti.
Təmiz qəlbə malik olan üç oğul
Ata fikrini sözsüz etdi qəbul.

Əyib baş, Fəridundan ayrıldılar,
Sözündən bilik, təcrübə aldılar.
Olarsa Fəridun kimi hər ata,
Edər oğluna elmi ürfan əta.
Qayıtdı evə hər üçü şadman,
Gecə yatdı asudə hər üç cavan.
Günəş asdı göydən qızıl pərdələr
Verib nuru ilə səhərdən xəbər.
Üç oğlan büründü qumaş paltara,
Tələb etdi möbidləri dərbara.
Bir ordu yürüş başladı durmadan,
Günəş üzlü idi, hamı qəhrəman.
Gəlişdən tutunca xəbər Sərv şah:
– Bəzənsin, – dedi – sərvtək barigah.
Yəməndən böyük bir qoşun topladı,
Qonaqlarını pişvaza yolladı.
Yəmən mülkünə çatcaq üç qəhrəman,
Yəmən əhli pişvaza çıxdı həmən.
Yola mişk, mey, zəfəran səpdilər,
Payəndazları oldu durrü gövhər.
Meyə, mişkə qərq oldu at nalları,
Alıb altına simü-zər yolları,
Qonaqlıq düzəldi cavan şahlara,
Yığışdı bütün başçılar dərbara.
Açıldı qıfıl hər ağır xəznədən
Ki, gizlində saxlardı Şahi-Yəmən,
"Üç ayüzlü cənnət gülü dilbəri
Bu dünyada xilqət olandan bəri
Elə sərvlər bağiban əkməmiş,
Bəşər heç zaman ətrini çəkməmiş,
Hələ görməmiş ağrı üç gülbədən,
Fəqət incimiş saçları şanədən.
Qoyub hər biri başına tacı-zər,
Yanında cəvahir dolu xəznələr,
Gətirdi o üç dilbəri şah ata
O üç qəhrəman gəncə qıldı əta.
Yəmən şahı kinlə çəkib gizli ah,



Dedi: – Dad əlindən, Fəridun şah!..
O xoşbəxt adamdır ki, yoxdur qızı,
Kimin var qızı parlamaz ulduzu.
Dedi Sərv möbidlərə aşikar
Ki, şah ayla evlənsə, xoşbəxt olar.
Bu üç qız gözümdən əziz olsa da,
Verib onlara, söylərəm: əlvida,
Bilib cismdə can, göz içrə bəbək,
Sevib daima, bəsləsinlər gərək.
Dedi: "Yaxşı yol", başladı çathaçat.
Düzəldi yola yüz dəvə, saysız at.
Yol almış, gedir üç kəcavə, budur,
Tapıbdır Yəmən mülkü gövhərdə nur.
Ağıllı, nəcib olsa övlad əgər,
Qız olsun, ya oğlan, nə fərq eylyər?
Çatıb kamına üç kamallı çavan,
Fəridun hüzuruna oldu rəvan.

Fəridun bölüb aləmi üç yerə,
Bu sirri əyan etdi möbidlərə.
Biri Rumi Xavər, biri Türkü Çin,
Üçüncü igid yurdu İranzəmin.
Salınca nəzər şah Səlm oğluna:
- Halaldır – dedi – Rumu Xavər ona.
Buyurdu: götürsün qoşun, durmadan
Şahənşah kimi Şərqə olsun rəvan.
Oturdu Kəyan təxtinə Səlm şad,
Ona xalq "Xavərxuda" verdi ad.
Baxıb Tura, Turanı verdi ona
Ki, şahlıq edə Çinlə Türküstana.
Fəridun ayırdı qoşun Tur üçün,
Qoşunla yol aldı Çinə Tur o gün.
Qoyub tac, təxt üstə tutdu qərar,
Əl açdı, kəmər bağladı hökmdar.
Böyüklər nisar etdi gövhər ona,
"Turanşah" deyildi o şah oğluna.
Çatıb bölgüdə İyrəcin növbəti:

– İrandır, – dedi şah, – onun qisməti.
Həm İranı, Nizəvəran dəştini,
Başında olan tacı, şah təxtini
Ona verdi, etdi onu tacdar,
Möhür, təxt, kürsü, bütün ixtiyar.
Üç alinəsəb, üç cavan hökmran
Sürərdi ömür şad, şən, kamiran.

Ötüb keçdi illər, yenə ruzigar
Dəyişdi, zamanın, demə, sirri var,
Fəridun qocaldı, dolunca yaşa,
Ömrünün yazı keçdi çatdı qışa.
Həyatın budur hökmü, bilsən əgər,
Qocaldıqda insanlar əldən düşər.
O gün çatdı ki, işlər oldu yaman,
İki şahı azdırdı yoldan zaman.
Gəlib cuşa Səlmin kini, hiddəti,
Dəyişdi onun niyyəti, tinəti.
Tamah könlünü çulğadı odlara,
Oturdu vəzirlə, düşündü-çara.
Ata bölgüsü xoş deyildi ona.
O, vermiş İranı kiçik oğluna.
Qırışdı üzü, çökdü kin qəlbinə,
Yola saldı bir elçi getsin Çinə,
Yetirsin dedi qardaşına salam,
Desin: daima şən yaşa, şadkam.
Bil, ey Çin və Turan şahənşahı, sən
Təmiz qəlb ilə qismətindən keçən,
Ziyan gördün, ancaq üzə vurmadın,
Uca sərvtək boynunu burmadın.
Eşit indi məndən yeni bir xəbər
Öz əhvalımızdan, unutdun məgər?
Biz üç qardaşıq, taci-təxtə bəzək,
Gətirdi kiçik qardaşın bəxti tək.
Ağıl yaşdadır, mən böyük qardaşam,
Hər üstünlük olsa, demək, mən başam.
Tutaq, mən yoxam, sən ki varsan, niyə



O çıxsın gərək taci-təxtə yiyə?
Neçin olsun İran, Yəmən İyrəcin?
Mənim qismətim Rumla Xavərzəmin?
Sənin Çində, Turanda ötsün yaşın,
İranda şah olsun kiçik qardaşın.
Bu bölgü ədalətlimi? Bir düşün,
İtirmiş atan ağlını büsbütün.
Çinə doğru yollandı elçi, çapar,
Turanşah hüzurunda tutdu qərar.
Bilincə nə fikrə düşüb qardaşı
Qızışdı Turun da beyinsiz başı.
Əsib coşdu zəncirdəki şir kimi,
Alovlandı əndamı təndir kimi.
Dedi: – Tez qayıt şah dərgahına,
Yetir bu cavabı sən öz şahına,
De: mən də şərikəm bu fikrə, düzü,
Atam, gənc ikən aldadıbdır bizi.
Əkib öz əliylə elə bir ağac
Qan ilə suvarmaqdır ancaq əlac.
Bu haqda deyib dinləməkçin, bizə
Oturmaq gərək xəlvəti üz-üzə.
Fikir söyləyək, söz alıb, söz verək,
Şahın xidmətinə adam göndərək.
Bir elçi tapaq biz şirindil, qoçaq,
Ürək sirrini padişaha açaq.
Budur mətləbin məğzi, məndən eşit:
Gərək susmasın aldadılmış igid.
Bu işdə gecikmək bizə ardır, ar,
Geciksən, yəqin fürsət əldən çıxar.
Cavab ilə elçi dönüb dərbara,
Dedi qardaşın sözlərin aşkara.
Bu qardaş Çinə doğru oldu rəvan,
O qardaş Ruma aldı yol durmadan,
Yarı yolda bir mənzilə çatdılar,
Məhəbbət balına zəhər qatdılar.
Görüş pərdəni atdı üzdən tamam,
Açıldı bu söhbətdə gizli məram.

İtidilli bir möbidi seçdilər,
Bilikli, ağıllıydı, sahibhünər,
Edib yadları yanlarından kənar,
Ürək sirrini möbidə açdılar,
Birinci sözə başladı Səlm o gün,
Üzündən həyanı yudu büsbütün.
Dedi qasidə: – Durmadan çıx yola,
Küləkdən iti çap atı dördnala.
Şahın qəsrinə çatcaq et ehtiram,
Fəriduna bizdən yetir son salam.
Daha sonra söylə ki, ey hökmran,
İki dünyada qorxmalı Tanrıdan!
Yüz il bir qoca gənclik axtara,
Ağarmış saçı bir də olmaz qara.
Əlindən bu dünya bezibdir həmən,
Nə möhkəm tutubsan bu dünyanı sən?
Günəş nur saçan bu qara torpağa
De bir kim səni eyləmişdir ağa?
Bütün işləri tutdun öz xeyrinə,
Əməl etmədin xaliqin əmrinə.
Peşən əyrilik oldu, bir də yalan,
Sən, ey bölgüdə ayrı-seçki salan!
Ağıllı, hünərli üç oğlun ki, var,
Kiçik şəhddir, soncə, biz zəhrimar?
Nədən təkcə İyrəcdə gördün hünər?
Ləyaqətdə ondan kəmik biz məgər?
Birini atıb əjdaha kamına,
Birin qaldırıbsan fələk damına.
Yanında birin etmisən tacdar,
Bir an qoymayırsan gözündən kənar
Neçin biz yanında əziz olmadıq?
Məgər o sənə doğmadır, biz yadıq?
Sənin, ey ədalət sevən hökmdar,
Düşün, işlərində ədalətmi var?
Dəyərsiz başından onun tacı al,
Özündən bütün aləmi razı sal!
Ayır, ver ona ölkədən bir bucaq,



Bizimtək otursun o səndən uzaq.
Əsərsiz qalarsa bu sözlər əgər,
Həya-hörmətin ortalıqdan gedər.
Bütün Çin, Turan elləri atlanar,
Döyüş axtaran pəhləvan rumlular
Bizimlə bərabər hücuma keçər,
Həm İyrəc, həm İran olar dərbədər.
Eşitdikdə möbid bu sərt sözləri,
Öpüb torpağı, bir də döndü geri.
Necə bir qığılcım küləkdən uçar
Yəhər üstünə qondu o namdar.
Fəridun şahın qəsrinə çatdı o,
Şahənşah qəsrinə lap matdı o.
Geniş sahədir, gördü dağdan-dağa,
Bulud qoymayır bürcünə baxmağa.
Önündə böyüklər keşikdə durar,
O qəsr içrə sakin olub hökmdar.
Sağında durar bağlı şirü pələng,
Solunda döyüş filləri, təblü çəng.
"Ayıq ol!" bağırdıqda sərkərdələr,
Deyərdin ki, nərə çəkir şiri-nər.
Düşündü: bu eyvanmı, ya asiman,
Böyük ordu olmuş ona pasiban?
Gedib iş bilən, başlı xidmətçilər
Cahan şahına verdilər tez xəbər:
– Yeni elçi gəlmişdir, ey hökmdar
Başında ağıl, görkəmində vüqar.
Dedi şah: – İcazə verilsin ona.
Qoyantək qədəm şah dərbarına
Fəriduna birdən sataşdı gözü,
Onun görkəmindən qamaşdı gözü,
Saçı sanki gül üstə kafur idi.
Şahın qaməti sərv, üzü nur idi,
Dodaqda təbəssüm, üzündə həya.
Şirindil, açıqsöz, mətin, biriya.
Fəridun yanında ona verdi yer,
Hüzurunda şahın oturdu səfir.

Soruşdu: – Səlamətmidir Səlm, Tur?
Oğul şad olarsa, ata şad olur.
Dedi: – Sən bələdsənmi bu yerlərə?
Danış, yordumu keçdiyin dağ dərə?
Cavab verdi elçi ki: – Ey şəhriyar
Vücudunla olsun cahan bərqərar.
Soruşsan, bu aləmdə hər bir adam
Deyər: mən Fəridun adıyla sağam,
Ləyaqət yoxumdur qulun olmağa,
Gömülsün vücudum qara torpağa.
Yaman bir sifariş gətirdim sənə,
Yazıq elçiyəm, eyb tutma mənə.
İki nankor oğlundan, ey hökmdar.
Mənə izn ver, söyləyim, hər nə var,
Dedi: – Qorxma, könlündə nə var danış!
Şahı etdi mətləblə elçi tanış,
Fəridun eşitdikdə hər bir sözü,
Gəlib cuşa beyni, qızardı gözü.
Dedi elçiyə: – Olma sən üzrxah,
Böyüklər demiş: "Elçidə yox günah".
Əzzəldən bunu hiss edirdim özüm,
Su içmirdi onlardan əsla gözüm.
Verirdi mənə qəlbim hər an xəbər:
Murdar südəmmişdə olmaz hünər.
Gedib söylə məndən o nankorlara,
O Əhrimən üzlü, səfeh korlara:
Mənə oldu bəd fikriniz aşikar,
Sizintək oğuldan nə ummaq olar?
Nəsihətlər beyninizə girmədi,
Ağıldan sizə tanrı pay vermədi
Utandınız nə məndən, nə də tanrıdan,
Sizintək olur həqq yolundan azan.
Saçım var idi bir zaman qapqara,
Boyum sərv idi, surətim aypara.
Mənim qəddimi bir kamantək bükən
Fələk ölməmişdir, həməndir, həmən,
Sizin də edər qəddinizi kaman,



Dolanmaz sizin kamınızca zaman,
Qəsəm yer-göyü xəlq edən Allaha,
O parlaq günəşlə qara torpağa,
Aya, ulduza, tacü təxtə qəsəm,
Sizə mən yamanlıq rəva görmərəm.
Münəccimləri, bir də möbidləri
Yığıb məsləhət etdim, ondan bəri
Çox illər keçir ki, bölünmüş cahan,
Belə məsləhət görmüş onlar, inan!
Xəyanətdən işdə yox idi əsər,
Demişlər ki: "Düz əyrini tez kəsər".
Mən ömrüm boyu qorxmuşam tanrıdan,
Hələ çıxmamışdır dilimdən yalan,
Abad aləmi verdi tanrım mənə,
Çalışdım abad qalsın aləm yenə.
Cahanı gülüstana döndərmişəm,
Gözüm nuru üç oğluma vermişəm.
Bu doğru yolu siz ki, tərk etdiniz,
Yalan, əyri bir yol tutub getdiniz,
Görək, pak bir Allah edərmi qəbul
Ata qarşısında qabarsın oğul?
Belə bir məsəl var unutma bunu:
"Hər nə əkərsən, biçərsən onu".
Şərik çıxdınız divlə, oldu günah,
Ağlınıza üstünlük etdi tamah.
O divdən qaçın, varsa imkanınız,
Yoxsa ki, zavala gedər canınız.
Çatıb vaxt, gərək mən köçəm dünyadan,
Qəzəb vaxtı, kin vaxtı keçmiş, inan!
Üç oğlu olan bir nəcib ixtiyar
Deyir bu həyatın belə hökmü var:
Tamah könlünüzdən silinsə əgər,
Nə torpaq, nə şahlıq sizi küsdürər.
O kəs ki, satır qardaşı torpağa,
Həramzadədir, bil, o kəs, mütləqa...
Eşitcək həmən elçi bu sözləri,
Ədəblə yeri öpdü, döndü geri.

Fəridun yanından düzəldi yola,
Deyərdin: küləklə qaçır qol-qola.

Yola saldı Səlm elçisin şəhriyar,
Düşündü, belə verdi axır qərar:
Çağırdı əziz İyrəci yanına,
Açıb sirrini şərh qıldı ona.
Dedi: – Səlmlə Tur durmuş üzə,
Hücum etmək istər qoşunla bizə.
Beləymiş yəqin taleyi onların,
Həseddir böyük eybi insanların.
Daha başqa bir sirri var mətləbin,
O sirri, oğul, bilməyirsən yəqin...
Məhəbbətlə versən qılınca cavab,
Ağıllı səni saymaz alicənab.
Mənim bir cüt oğlum iki ölkədən
Mənə qarşıdır, anladım indi mən,
Yubanma, əgər istəyirsən zəfər,
Açıb xəzinəni, əzmlə et səfər
Məsəl var: "Əgər etməsən sən nahar,
Şamı cəld həriflər əlindən qapar".
Sənə başqa bir kəs deyildir gərək,
Sənə doğruluq, mərhəmətdir kömək.
O pak qəlbli, mehriban sərvərə
Qulaq verdi İyrəc dikib göz yerə.
Dedi: – Ey ata, ey böyük hökmdar,
Fikir ver, necə gör dönür ruzigar.
Kulək sürətiylə ömür, gün gedər,
Dəyərmi ağıllı çəkə qəm, kədər?
Həyat soldurur lalətək üzləri,
İşıq həsrətində qoyur gözləri.
Bu şirin həyatın əzabdır sonu,
Əzabla gərək tərk edək biz onu.
Qara torpağın altıdır son yataq,
Nə lazım, bu dünya üçün qan udaq?
Elə bir ağac əkməyək biz gərək,
Qan ilə verib su, ədavət dərək.



Qılınc, təxtü tac sahibi hökmran
Görüb çox, görər çox yenə bu cahan.
O şahlar ki, tac qoydu bizdən qabaq
Çoxu təxtinə zülmü bildi dayaq.
Əcəl çatdı, dünyanı tərk etdilər,
Cahanda yaman ad qoyub, getdilər.
Mənə izn ver, söyləyim, şəhriyar,
Pisə qarşı pislikdə mənamı var?
Nə lazım mənə təxti-tac istəmək?
Qoşunsuz gedib, onlara mən gərək
Deyim ki, mənimçin bu aləmdə siz
Qanımdan yaxınsız, canımdan əziz.
Nədir pisliyə sizdəki bu həvəs?
Cahan şahına kin əbəsdir, əbəs.
Bu dünya ki, Cəmşidə tutmuş divan,
Ona bağlamaz bel ağıllı olan.
Görün, oldu Cəmşid necə dərbədər?
Ona qalmadı tacü təxtü kəmər.
Həyatın budur bəhrəsi – mən və siz
Gərək nuş edək zəhrini çarəsiz,
Sözüm onlara etsə təsir əgər,
Ədavət tamam ortalıqdan gedər.
Dedi şah ki: – Onlar savaş axtarar,
Sənin istəyin sülhdür, aşikar.
Gərək bu sözü saxlayım yadda mən:
Ay nur saçar zülmət içrə həmən.
Sənin bu cavabın, ağıllı balam.
Deyir, onlara mehribansan müdam.
Ağıllı canından bezərsə əgər,
Gedib əjdaha ilə dostluq edər.
Zəhərlə əritsə onu əjdaha,
Demək, taleyi böylə görmüş rəva.
Qərarın budursa əgər, ey oğul,
Tədarük görüb, getməyə hazır ol!
Qoşundan ayır bir neçə iş bilən,
Uzaq yolda xidmətçisiz qalma sən!
Yazım mən də bir namə onlar üçün,

Ürək dərdimi şərh edim büsbütün.
Görüm bəlkə bir də səlamət səni,
Gözüm nuru, tez gəl, sevindir məni!

Cahan padişahı oğullarına,
O Rum şahına, Çin salarına
Belə yazdı başdan ki, bir tanrı var,
Həmişə olubdur, olar bərqərar.
Bu bir namədir ki, nəsihət dolu,
Günəş kimi nurlandırar düz yolu,
İki qəhrəman şah, iki qardaşa,
Cahan ziynəti iki gövhər qaşa
Yazır naməni bir qoca hökmdar,
Ona hər cürə sirr olub aşikar,
Qılıncı, ağır gürzü arxa bilən,
Əli zalımı yer üzündən silən,
Gecə zülmətini edən ağ səhər,
Ümidlə açar çox ağır xəznələr.
Asanlıqla hər müşkülü həll edən,
İşıqlı səadət yoluyla gedən
Mənəm ki, gərəkməz mənə təxti-tac,
Nə şöhrət, nə sərvət, nə bacü xərac,
Çox olmuşsa da zəhmətim, istərəm
Üç oğlum daha çəkməsin dərdü qəm.
O qardaş ki, ondan siz inciksiniz,
Tutar o sizi öz canından əziz.
Haçandandı qalmışdı həsrət sizə,
Gəlir verməyə indi zəhmət sizə.
O çıxmaz nəcabət yolundan kənar,
Atıb şahlığı, tək sizi axtarar.
Yəhərlə əvəz etdi öz təxtini,
Sizin qarşınızda sınar bəxtini,
O sizdən kiçikdirsə yaşda əgər,
Böyüklər kiçik qardaşı çox sevər.
Əziz bir qonaqdır, qılın ehtiram,
Alın könlünü, mey için əldə cam!
Xoş üz göstərin bir neçə gün ona,
Verin izn, dönsün ata yurduna!
Möhür vurdu məktuba şahi-cahan,
Çıxıb qəsrdən İyrəc oldu rəvan
Yanınca qoca, gənc on-on beş nəfər,
Yaxın dostlar oldu ona həmsəfər.

Qara fikrə yol vermədən qəlbinə,
Yaxınlaşdı Turan sərhəddinə.
Qoşunla onu pişvaza getdilər,
Qonaq rəsmi ilə qəbul etdilər.
Görüncə kiçik qardaşı mehriban,
Ona verdilər üzdə şadlıq nişan.
O qəlbi təmizdən iki qəlbi dar
Çox üzdən hal-əhval belə tutdular,
Ürəkdə ədavət iki yırtıcı
Apardı sərapərdəyə İyrəci.
Görüb İyrəci, qaldı mat atlılar,
O şahanə təmkin, yenilməz vüqar
Nüfuz eylədi onların qəlbinə,
Bütün eldə insanların qəlbinə,
Baxıb hüsnünə, sandılar bir mələk.
Onu bildilər tacü təxtə bəzək.
Qoşun əhli cüt-cüt düzəldi yola,
Sanardın gedir atlılar qol-qola.
Onu bir görən, min baxıb, doymadı,
Gəzirdi ağızlarda İyrəc adı.
Deyirdi hamı: – Bax, bu tac qoymalı,
Çıxıb təxtə dünyaya nur yaymalı!
Baxıb Səlm uzaqdan qoşun əhlinə,
Qara qəlbi kindən alışdı yenə,
Töküb qaşqabaq, bağrı qanla dolu,
Qərargahına doğru saldı yolu,
Sərapərdəni döndərib xəlvətə,
Oturdu yenə Tur ilə söhbətə.
Dedi Səlm Tura: – Mənə söylə sən,
Qoşun əhli cüt-cüt gedirdi, nədən?
Mərasim yerindən dönərkən məgər

Qoşun əhlinə salmadın sən nəzər?
Gedərkən var idi nizam-intizam,
Qayıtdıqda işlər doyişdi tamam,
Vuruldu deyən ordu şah oğluna,
Hamı yol boyunca baxırdı ona.
Ona çox görürdümsə İranı mən,
Qəmim üstünə qondu qəmlər həmən
Onun görkəmi çaşdırıb ordunu,
Ləyaqətli bir şah bilirlər onu.
Kökündən onu kəsməsək biz, inan,
Bizə təxti tabut edər bir zaman.
Vidalaşdı axşam iki daş ürək,
Düşündü çarə hər biri sübhədək.

Yuxu qaçdı gözdən, işıqlandı şərq,
Günəş aləmi eylədi nura qərq.
Bu idi iki fərsizin niyyəti:
Tez atsınlar üzdən həya, hörməti.
Durub yerlərindən, səhərdir deyə,
Tutub getdilər üz səraperdəyə.
Çadırdan baxıb gördü qardaşları,
Qaçıb gəldi İyrəc onlara sarı.
Çadırda gedib durdular üzbəüz,
Suallarla başlandı söhbət və söz.
Dedi Tur: – Bizdən kiçikdir yaşın,
Nədəndir tapıb tacla ziynət başın?
Kəyan tacü təxtiylə İran sənin,
Mənə türk elində qul olmaq neçin?
Xəzinə sənin, tac sənin, ey cənab,
Böyük qardaşın Rumda çəksin əzab?
Nədən bölgü vaxtı böyük hökmdar
Kiçik oğluna çox verib iqtidar?
Gərək mən qaraldam sənin bəxtini,
Əlindən alam tacını, təxtini.
Nə ordu, nə şahlıq, nə İran qala,
Tutub od, yana ölkə, viran qala.
Qulaq verdi İyrəc danışdıqca Tur,



Dedi: – Sözlərinə cavabım budur.
Böyük qardaşım şahlıq istər əgər,
Soyuqqanlı olsa, murada yetər
Nə İran, nə Xavər, nə Çin istərəm,
Nə şahlıq, nə şöhrət, nə kin istərəm.
Ədavətdədirsə böyüklük əgər,
Böyük halına ağlasın qoy bəşər.
Tutaq ki, ucaldın fələk damına,
Səni torpaq axır çəkir kamına.
Əgər şah idim cümlə İrana mən,
Bugün doymuşam tac ilə təxtdən.
Sizə verdim o taci-təxti tamam,
Nə lazım hədə? Mən sizə qardaşam.
Sizə qarşı könlümdə yox zərrə kin,
Özünüzü nahaqdan incitməyin.
Ölüm istərəm, çəksəniz dərdü qəm,
Nə lazım mənə göz, sizi görməsəm?
Kiçiklik mənə oldu daim şüar,
Tamah, lovğalıqdır hər insana ar.
Eşitcək həmən Tur bu sözləri,
Qızardı qəzəbdən onun gözləri.
Bu sözlər onun könlünə yatmadı,
Həqiqət onun beyninə batmadı.
Acıqla verib kürsüyə bir təkan,
Deyərdin: şikar üstə cummuş qaban.
Qızıl kürsüdən qalxdı birdən-birə,
Ağır kürsünü qaldırıb bir kərə,
Elə çırpdı ki, İyrəcin başına,
Dil açdı, o yalvardı qardaşına,
Dedi: – Qorxmayırsan məgər tanrıdan?
Atandan utan, bircə anlıq dayan!
Nahaqdan, gəl, öldürmə, qardaş, məni,
Tutar qanım axırda, vallah, səni.
Adam öldürənlərdən olma, aman,
Daha məndən iz də tapılmaz, inan!
Uzaq bir bucağında bu aləmin
Gedib işlərəm qul kimi, ol əmin.

Niyə təşnəsən qardaşın qanına?
Niyə od salırsan atan canına?
Bu sözlər ona etməyirdi əsər,
Sanırdı qulağında yellər əsər.
Əl atdı belində iti xəncərə,
Boyandı çadır qanla birdən-birə.
Vurub, doğrayırdı o gül peykəri.
Suvarmışdılar zəhərlə xənceri,
Yıxıldı onun sərv qəddi yerə,
Ucaldı ahı, naləsi göylərə.
Qan axdı, olub ay üzü laləzar,
Cavan getdi dünyadan o şəhriyar.
Onu bəslədin naz ilə, ey cahan,
Niyə vermədin bəs ölümdən aman?
O fil gövdədən tacə layiq başı
Qoyub xənceri, kəsdi öz qardaşı.
Səpib beyninə mişk, kafur, haman.
Qoca şah üçün yolladı ərməğan.
Dedi: – Al, varınsa əgər ehtiyac?
O başdır bu ki, ziynəti oldu tac.

Fəridun yola göz dikib xeyli vaxt,
Şahı arzulardı qoşun, tacü taxt.
Qayıtmaq zamanıydı şahın, məgər
Ata tutmamış macəradan xəbər?
Ona təxt hazırlatdı firuzədən,
Düzüb tacına inci, ləli-Yəmən.
Fəridun qoşunla çıxıb pişvaza,
Baxırdı uzaqlarda qalxan toza.
Yaxınlaşdı, seyrəldi toz, nagəhan
Bir atlı göründü, gözü, bağrı qan.
Qızıl bir tabut basmış o bağrına,
Fələk az qalır naləsindən yana.
Şahın qarşısında gəlib əydi baş,
Gözündən axıtdı üzə qanlı yaş.
Dedi: – Lal ola kaş dilim dünyada,
Bu tabut içində ipək parçada



Kəsilmiş cavan İyrəcin başıdır,
Onun qatili doğma qardaşıdır.
O, tabutu hörmətlə qoydu yerə,
Fəridun inanmırdı bu sözlərə.
Tərəddüdlə əmr eylədi hökmdar,
O tabutu xidmətçilər açdılar.
İpək parçada İyrəcin başını
Görüb, sel kimi tökdü göz yaşını,
O çıxmışdı xoş arzularla yola.
Görün bir nə halda dönürdü dala?
Qəmə, matəmə batdı sərkərdələr,
Təbil susdu, bayrağı endirdilər.
Büründü kəcavə qara, fil qara,
Geyindi ərəb atları zil qara.
Qoşun ağladı, qalxdı ərşə fəğan,
Döyür sinəsinə neçə pəhləvan.
Belə göstərir mehribanlıq fələk,
Bizə verdiyin əldən alsın gərək.
Güman etmə ki, mehribandır zaman,
Demişlər ki: "Gəlməz vecə düz kaman"
Sənə dost olar, düşmən olsan əgər,
Desən dost ona, səndən üz döndərər,
Nəsihət kimi bu sözü et qəbul,
Bu dünyaya bel bağlama, ey oğul.
Qoşun bağrı qan, şah çəkir nalə, ah,
Gəlib İyrəcin bağına çatdı şah.
O bağda ki, şahlar qurardı büsat,
O bağda ki, İyrəc sürərdi həyat,
Fəridun töküb qanlı göz yaşını,
Basıb bağrına İyrəcin başını,
Salıb təxtinə gənc şahın nəzər,
Nə gördü ki: başsız qalıb taci-zər,
Hovuz çevrəsində uca sərv var,
Güləfşan, söyüd, yasəmənlar durar,
İgidlər o bağ içrə yoxdur deyə,
Şahın ahü fəryadı qalxdı göyə.
Atıb pəncə, açdı üzündə yara,

Saçın yoldu, yaxdı bağı odlara.
Alıb qanlı zünnarı, çaldı belə,
Otaqları döndərdi bir-bir külə.
Bütün şadlığa göz yumub bir kərə,
Yaxıb gülşəni, sərvi sərdi yerə,
Basıb bağrına İyrəcin başını,
Tutub üz göyə, tökdü göz yaşını.
– Ədalətlisənsə, ey Allah, əgər,
Bu məsum qurbanıma sal nəzər.
Kəsik başı qarşımdadır gül təkin.
Yemiş cismini şirlər orda yəqin.
Özün tut elə bir divan onlara,
Ömürləri, günləri olsun qara,
Elə dağla ki, bağrını onların,
Yana onlara qəlbi heyvanların.
Budur istəyim səndən, ey Tanrı, mən
Bu dünya evin tərk edib getmədən
Ola İyrəcin nütfəsindən əyan
Qisas almağa güclü bir qəhrəman.
Görüb mən elə bir günü şad olum,
Gedim torpağa, qəmdən azad olum.
Gözündən axıtdı yerə xeyli yaş.
Kənarında ot bitdi, qaldırdı baş.
Saraldı qara torpaq üstə üzü,
Tutuldu onun ağlamaqdan gözü.
Dedi şah insanlara: – Əlvida!
Açıb əl göyə, söylədi: – Ey Xuda!
O gündən ki, dünya olub bərqərar,
Belə ölməmiş xar bir tacidar.
Kəsib başını zülm ilə Əhrimən,
Olub cisminə şirlər ağzı kəfən.
Ucaldı onun naləsi göylərə,
Sanardın coşur nalədən dağ-dərə.
Yasa batdı bir ölkə başdan-başa,
Elin naləsi etdi təsir daşa.
Ürəkdə ağır dərd, dildə fəğan,
Gözü yaşlı idi, hamı bağrı qan.



Şahın matəmində geyinmiş qara,
Yaxırdı hamı canını odlara,

Bu minval ilə keçdi xeyli zaman,
Eşitdi belə bir xəbər hökmran.
Hərəmxanəsində, demə, İyrəcin
Gözəl bir kəniz var imiş – ay təkin.
O şux dilbər idi, yenilməz igid,
Günəş üzlünün adı Mahafərid.
O çox mehribandı cavan şah ilə,
Cavan şahdan idi kəniz hamilə.
Pəri üzlünün sirri oldu əyan,
Fəridunu etdi xəbər şadman.
Ümid ilə köksündə vurdu ürək,
Dedi: – Qalmasın yerdə bu qan gərək.
Zaman çatdı, Mahafərid doğdu qız,
Qızı şah tutardı oğuldan əziz.
Pərəstar ona oldu cümlə cahan,
Çəkirdi Fəridun nazın hər zaman.
Baxanlar deyərdi: – Böyük hökmdar,
Necə İyrəcə oxşayır bu nigar.
Saçı müşk, üzü Zöhrətək dilbərə
Gəlib növbə çatdı ki, getsin ərə.
Pəşəngi qıza namizəd seçdi şah,
– Yetimdir, – dedi, – qoy ər olsun pənah,
İki gənc toysuz verib əl-ələ...
O gündən bir il ötməmişdi hələ
Bir oğlan doğuldu o gülçöhrədən,
Taca, təxtə layiq o tifli həmən
Doğulcaq alıb, dayələr getdilər,
Fəridundan almaq üçün müjdələr.
Dedi möbid: – Ey mehriban hökmdar,
Baxıb İyrəcə, sil könüldən qubar.
Fəridun gülürdü, deyərdin bu an
Verilmiş ona İyrəci doğrudan.
Basıb körpəni bağrına can kimi,
Düşüb səcdəyə coşdu ümman kimi.

Deyirdi: – Mübarək gün olsun bu gün,
Bizə zülm edənlər qırılsın bütün.
Böyük tanrıya şükr idi hər sözü,
Kərəm qıldı xaliq açıldı gözü.
Gözü nur tapan dəmdə o padişah
Yavaşca baxıb körpəyə, çəkdi ah.
Dedi: – Valideyn olsalar pak əgər,
Verər onların nəsli şirin bəhər.
Meyi saf qədəh bəsləmişdir deyə,
Mənuçehr adı verdilər körpəyə.
Basıb bağrına dayəsi dəmbədəm,
Yerə minnət ilə qoyardı qədəm.
Belə bəslənirdi o xeyli zaman,
Ona yetmədi taleyindən ziyan.
Hünərlər ki, lazım gələr şahlara,
Özü öyrədib şah ona bir ara.
Görüncə Fəridun olub şadkam,
Qoşun əhli də yasdan çıxdı tamam,
Qızıl təxti, firuzə tacı baba
Ona bəxşiş etdi, dedi: mərhəba!..
Ərəb atları üstə altun yəhər,
Həm hindi qılınclar qınında gövhər.
Dəbilqə, zirehli geyim, hər nə var,
Bütün tayların bəndini açdılar.
Verib saysız ox, çoxlu çaçi kaman[21],
Neçə-neçə zubin, sipərlə sinan[22].
Xülasə, Fəridun bütün sərvəti,
Demək, bir ömür çəkdiyi zəhməti,
Mənuçehrə layiq görüb büsbütün,
Onu şən görən şah uçardı o gün.
Verdi ona xəzinədə hər nə var,
Xəzinədarına verildi açar.
Qoşunda olan pəhləvanlarına,
Bütün ölkənin qəhrəmanlarına
Buyurdu: hüzurunda dursun tamam,
Hamı hazır idi ala intiqam.
Dedilər: – Sağ ol, ey böyük hökmdar,



Başında tacı daş-qaşa tutdular.
Cahanda böyük bayram oldu o gün,
Qoyunlarla qurdlar seçildi bütün.
Süpəhdar idi Qareni-Kaveqan,
Qabaq səfdə Şiruy ilə Avəqan.
Qoşun hazır oldu hücuma tamam,
Şaha baş əyib ordu, verdi salam.

Bu işdən xəbər tutdu Səlm ilə Tur
Ki, şahənşahın təxtinə düşdü nur,
İki zalimin qəlbi qanla dolu,
Görüncə enişlikdi bəxtin yolu,
Cahan gözlərində göründü məzar,
Oturdu, düşündü iki zülmkar.
Deyib, dinləyib, gəldilər ilqara
Ki, tapsınlar öz dərdlərinə çarə.
Dedilər ki, üzr istəməkçin gərək
Şahın yanına elçini göndərək.
Gəzib axtarıb hər iki hökmdar,
Dilavər, qoçaq bir adam tapdılar,
Ağıllı, hayalı o mərd insana
Dedilər ki, get elçitək İrana!
Kədər, qorxudan pis hala qaldılar,
Ağır xəzinədən qıfıl aldılar.
Yığıb incini, gövhəri, ziyvəri,
Qızıl tac, kəmər, mişk ilə ənbəri,
Neçə-neçə xəzlər, ipək parçalar,
Gözəl tirmə şallar, zərif xalçalar,
Daşındı, qalandı hamı bir yerə,
Neçə qul çatıb onları fillərə,
Sarayda kimə şah edir etibar,
Birər töhfə göndərdilər yadigar.
Salındı səfər işləri səhmana,
Böyük qəfilə aldı yol İrana.
Görülmüşdü tədbir geniş ölçüdə,
Geyindi səfər paltarı elçi də,
Fəriduna göndərdilər bir pəyam

Ki, bizdən şaha çatdır əvvəl solam.
Sağ olsun Fəridun, böyük qəhrəman,
Edib tanrı feyzi onu hökmran.
Başı yüksələ, cismi sağlam ola,
Gələ gün fələkdən də o, kam ala,
İki qardaşıq biz, iki zülmkar,
Ata qarşısında günahkar, xar.
Ürək dağlı, göz yaşlı, ey padişah,
Xəcalətliyik, etmişik çox günah.
Ağıllı adamlar demişlər: əgər
Pis iş tutsa bir kəs, cəzasın çəkər
Əzablar çəkər, qəlbi darda qalar,
Necə qalmışıq biz – iki zülmkar.
Belə yazmış imiş qəzanın əli,
Qəza əmrinə nə əlac etməli?
İki oğlun azmış yolundan yaman,
Yəqin ki, olubsan bizə bədgüman.
Budur arzumuz ki, böyük tacidar
Bağışlar bizi, rəhmli qəlbi var,
Günahı böyük olsa ümman qədər,
Ağıl sahibi cahili əfv edər.
Bunu danmaq olmaz ki, çərxi-fələk,
Verər gah ziyan, göstərər gah kömək.
İkinci, budur üzrümüz: div ki var,
Cinayət törətmək üçün can atar.
Bizi əfv edərsə əgər padişah,
Olar könlümüz şad, tanrıga pənah.
Ricamız budur: Xavərə hökmran
Qoşunla Mənuçehri qılsın rəvan.
Olaq qul, onun xidmətində duraq,
Desə "Öl" ölək, söyləsə "Qal!" – qalaq.
Ədavət kökündən bitib bir ağac.
Yusaq göz yaşıyla, tapar, bil, əlac
Onun zəhmətinə dözək biz gərək,
Böyütdük, xəzinə verək, tac verək.
Keçib gəldi elçi uzaq bir yolu,
Ürək anlaşılmaz söz ilə dolu.



Çatılmışdı çoxlu hədiyyə filə,
Yol aldı şahın qəsrinə qafilə.
Yetişdi xəbər çün Fəridun şaha,
Sevinclə, qururla gəlib dərgaha,
Buyurdu: – Çəkin təxtə atlaz, ipək,
Kəyan tacına həm verilsin bəzək.
Təzə bir qərara da gəlmişdi şah,
O firuzə təxt üstə əyləşdi şah,
Mənuçehr, başda qızıl tac haman,
Oturdu Fəridun ilə yanbayan.
Qızıl gürz əlində, qızıldan kəmər,
Deyərdin: günəşdir, yerə nur səpər.
Olub altuna qərq hər əyan, kübar,
Sağında, solunda çəkib səf durar.
Sağında onun vardı aslan, pələng,
Solunda döyüş filləri rəngbərəng.
Dedi şah Şapura: – Ey pəhləvan,
Çağır elçini! – Çıxdı Şapur haman.
Çatıb elçi, dərgahı gördü bu dəm,
O dərgaha hörmətlə qoydu qədəm.
Fəriduna saldı yaxından nəzər,
Başı, təxti, tacı göyə yüksələr.
Şahın hüzurunda yerə əydi baş,
Öpüb torpağı, baş götürdü yavaş.
Qılıb mərhəmət, elçi gəlmiş deyə,
Oturtdu onu bir qızıl kürsüyə.
Şahənşaha elçi dedi: – Afərin!
Ucalsın göyə təxtü tacın sənin.
Cahan təxtin ilə dönüb gülşənə,
Zaman hökmünü verdi tale sənə.
Hamı bir nəfərtək önündə quluq,
Hamımız sənə bəndə xəlq olmuşuq.
Söz açdı, danışdı iki qanlıdan,
Düzü, əyrini bir-bir etdi bəyan.
Danışdı ağıllı kişi hər nədən,
Fəridun onu dinlədi dinmədən.
– Peşiman olubdur, – dedi, – Səlm,

Mənuçehri dəvət edirlər, odur,
Deyirlər: verək təxtü tacı ona,
Yetə ömrümüz xidmətində sona.
Mənuçehrin olsa qızıl tac, kəmər,
Yəqin ki, atası qanından keçər.
İki bədəməl oğlunun padişah
Bilib fikrini sinədən çəkdi ah.
Tutub elçiyə üz, dedi hökmdar:
– Günəş pərdədə heç tutarmı qərar?
Mənə gizli fikri o nadanların
Günəşdən də aydındır, sən onların
Mənə fikrini bir-bir etdin bəyan,
Cavab istəyirsənsə, sakit dayan!
Cavabım budur o həyasızlara,
O namərd, qudurğan, vəfasızlara:
Bu boş sözlərin varmı heç qiyməti?
Buraxmaq gərəkdir bu söz-söhbəti.
Yuyulmuşmudur əllərindən o qan?
Mənuçehrə siz oldunuz mehriban?
Məni bir daha siz yada salmayın,
Mənuçehr adını dilə almayın.
Divan tutdunuz İyrəcə, indi siz
Mənuçehri məhv etmək istərsiniz,
Yəqin ki, görərsiz camalın onun
Başında dəbilqə, yanında qoşun,
Gələr gürz ilə Kavənin bayrağı,
Yeri şumlayar atların dırnağı.
Qoşun içrə Qaren süpəhdar olar,
Qılınc əldə Şapuru, Nəstuhu var.
Yəmən şahı Sərv ilə Sam pəhləvan
Mənuçehrə olmuş qoşunda həyan.
Qanından göyərmiş ağac İyrəcin,
İçər su yerinə qızıl qan, yəqin.
Bu qan yerdə qalmışsa xeyli zaman,
Zamanə müsaid deyildi, inan.
Vuruşsaydım oğlanlarımla əgər,
Buna yaxşı baxmazdı heç bir nəfər



O düşmən əlilə kəsilmiş ağac
Verib güclü şaxə, tapılmış əlac,
O indi qisas almaq üçün hər an
Döyüş axtarır sanki şiri-jəyan,
Bu sərt sözlərə elçi asdı qulaq,
Mənuçehrə saldı nəzər qorxaraq.
Solub əsdi, qalxdı yerindən haman,
Yəhər üstünə qalxdı o durmadan.
Ağıl sahibi elçi etdi yəqin,
Mənuçehr alar qanını İyrəcin.
O bildi ki, çərxi-fələk tor qurur,
Yaxınlarda düşər tora Səlm, Tur.
Başı sözlə, qəlbi fikirlə dolu,
Külək sürətiylə gedirdi yolu.
Yaxınlaşdı, Xavər göründü gözə[23],
Baxdı sərapərdə qurulmuş düzə.
Nə gördü: çadırdan qurub barigah,
Oturmuş sərapərdədə padişah.
İpək parçadandır çadır sərbəsər,
Qızıl ulduz ətrafına nur səpər.
Çəkilmiş iki padişah xəlvətə.
Çatıb elçi, son qoydu bu söhbətə.
Şahın əmri ilə gedib pərdədar
Dedi elçiyə: – Gəl! – Ona hökmdar
Verib qarşısında ləyaqətli yer,
Dedi: – Gənc şahdan bizə söylə bir.
Nə gördün, eşitdin? Bizə ver xəbər!
Şahənşah qoymuşdumu taci-zər?
Dedilər: – Fəridun şahdan danış,
Olaq ordusu, ölkəsiylə tanış.
Hədir illəti, səncə, çərxi-fələk
Mənuçehrə hər işdə olmuş kömək?
De sərkərdələrdən, de kimdir vəzir?
Hüzurunda kimlər durur müntəzir?
Cavab verdi elçi: – Böyük şəhriyar,
Fəridun sarayı – ətirli bahar.
Qızıl kərpici, torpağı mişk, əbir,

Görən zənn edər bağda, gülşəndədir,
Behiştdir deyərsən uca barigah,
Fələkdir sanarsan gülərüzlü şah.
O eyvan kimi yox cahanda çəmən,
Tapılmaz o meydan kimi bağ görən.
Yaxınlaşdım, eyvana saldım nəzər,
Nə gördüm: başı ulduza yüksələr.
Durar fil bu yanda, digər yanda şir,
Onun təxti üstə cahan yüksəlir.
Qızıl təxtini saxlayırlar fillər,
Önündə qızıl xaltada şiri-nər.
O fillər önündə çalıb kərrənay,
Təbillər salanda cahana haray,
Deyərsən ki, dünya yerindən qopar,
Dəyər bir-birinə cahanda nə var.
Çatınca o şahın hüzuruna mən,
Göründü uca təxti firuzədən.
O təxt üstə şah bir aya oxşayar,
Tacında günəş misli yaqut var.
Saçı qar kimiydi, üzü-lalətək,
Şirindil, mətanətli, nazik ürək,
Cahan qorxar ondan, onu həm sevər,
Deyərsən ki, Cəmşid dirilmiş məgər?
Mənuçehrdə sərvtək var vüqar,
O, Təhmurəsi-Divbənddir, durar.
Şahın sağ yanında oturmuş cavan
Şaha həm ürəkdir, o, həm dil, inan!
Solunda Yəmən şahı Sərv əyləşər,
Önündə durar Qaren, o şiri-nər.
Vəziri Yəmən şahıtək namidar,
Hünər əhli Gərşasb xəzinədar.
İnan desəm xəzinənin yox sayı.
Bu gəlhagəlin yox cahanda tayı.
O mübariz Şiruy oxşar filə,
Durar şah huzurunda Şapur ilə.
Təbil bağlasa fillərə hökmdar,
Hava toz içində yəqin qərq olar.



Döyüşdə gələrsək əgər üz-üzə,
Duzənlik olar dağ, dönər dağ düzə.
Ürəklərdə bir hiss var – intiqam,
Döyüş həsrətiylə yaşarlar müdam.
Nə görmüşdü, tərif edib birbəbir,
Dedi şah Fəridun nələr söyləyir.
İki zalimin qəlbi düşdü dara,
Olub qüssədən üzləri qapqara,
Deyib, dinləyib, bir yol axtardılar,
Nə başlandı söhbət, nə qurtardılar.
Nəhayət, belə söylədi Səlmə Tur:
– Bu sözlər bizimçin hədə-qorxudur.
Aman verməyək südəmər aslana,
İti diş çıxardıb, gələ meydana.
Fəridun tək ustadı olsa əgər,
Hünərsiz dolarmı yaşa bir nəfər?
Nəvə olsa şagird, ustad baba,
Misi altuna döndərər kimiya.
Daha gözləmək, bil, nahaqdır, nahaq,
Tədarük görüb, hərbi biz başlayaq.
O gün atlı göndərdilər hər yerə,
Xəbər çatdı həm Çinə, həm Xavərə,
Bu söhbət yayıldı, obaya, elə,
Qoşun əhli döndü axar bir selə.
Geyindi zireh don bütün atlılar,
İran mülkünə doğru at çapdılar.
Fil üstə iki qanlı – Səlm ilə Tur,
Ürəklərdə kin, yol gedirlər, budur.
İran mülkünə çün yaxın gəldilər,
Fəriduna çatdı hücumdan xəbər.
Mənuçehrə şah əmr verdi belə:
– Çıxart ordunu tez şəhərdən çölə!
Belə bir məsəl də çəkib hökmdar,
Dedi: – Olsa bir gənc əgər bəxtiyar,
Könüllü düşər toruna ov onun,
Düşər arxasınca pələng ovçunun.
Çalış sal işə ağlı, tədbirini,

Şikar et geniş çöllərin şirini.
Unutma biri pislik etsə əgər,
Özü bir gün axır zavala gələr.
Tələs, düşmənin başını tez qopar,
Qızarmış dəmir döyməyin həzzi var,
Mənuçehr getdi qoşunla çölə,
O səkkiz gün orda dayandı hələ.
Fəridun onu saldı şəxsən yola,
Dua etdi ki: – Get, uğurlar ola!
Mənuçehr ona söylədi: – Hökmdar,
Sənə hansı namərd yamanlıq qıyar?
O kəs ki, çəkib taleyi ondan əl,
Onu izləyir hər qədəmdə əcəl.
Mən indi zireh geymişəm, heç zaman
Çıxartmaq nədir kamıma çatmadan?
Gərək od vurub, aləmi yandıram,
Alam hər iki qanlıdan intiqam.
Elə toz qopardam ki, meydanda mən,
Günəş də görünməz o toz pərdədən.
Mənə varmıdır tay gələn orduda?
Kimin cürəti var məni qorxuda?
Dedi Qarenə şah: – Ey qəhrəman,
Şəhərdən çölə et yürüş durmadan!
Düzənlikdə şahçın çadır qurdular
Önündə zəfər bayrağı vurdular.
Yayıldı qoşun sel kimi düzlərə,
Deyərdin: dənizdir, coşur dağ, dərə,
Qaranlıq gecə etdi toz gündüzü,
Elə bil qaraldı tamam göy üzü.
Bütün ölkəyə hay-haray saldılar,
Qulaqlar hayahuydan oldu kar.
Ərəb atları kişnəyir dalbadal,
Təbil çalmağa verməyirdi macal.
Bütün ordugahın iki mil yolu,
Fil idi yolun həm sağı, həm solu.
Birər hər fil üstə qızıl taxt var,
Qızıl içrə gövhər çıraqtək yanar.



Çatılmışdı sursat üç yüz karvana
Ki, üç yüz tərəfdən girə meydana.
Geyindi, zirehləndi hər pəhləvan,
Fəqət gözləyirdi açıqda qalan.
Süpəhdar Qaren, qəzəb, kin ilə
Tam üç yüz min atlı çıxardı çölə.
Hamı mərd igiddi, hamı namdar,
Ağır gürzlər əldə yollandılar.
Bir aslan kimiydi igidlər tamam,
Gedirdi hamı almağa intiqam.
Qabaqda gedir bayrağı Kavənin,
Parıldar qılıncı dilavərlərin.
Çıxıb Narvən cəngəlindən haman
Mənuçehr, Qaren, neçə pəhləvan
Qoşun qarşısından gəlib keçdilər,
Cinahlar üçün dəstələr seçdilər.
Solu etdi Gərşasba tabe tamam,
Sağın başçısıydı Qubad ilə Sam.
Düzüldü qoşun səfbəsəf səhrada,
Mənuçehr Sərv ilə tam ortada.
Görünməzdi, dağdan da baxsaydılar,
Sanardın, qoşun içrə ay parlayar.
Gedir öndə Qaren, gedir öndə Sam,
Siyirmə qılıncdı bir ordu tamam.
Xəbərçi xəbər verdi Səlmə, Tura:
– İrandan hücum başlanıbdır bura.
Qoşunla iki qanlı kəsdi yolu,
İki baş, iki qəlb kinlə dolu.
Qubad dəstəsiylə yetişdi, budur,
Xəbər tutcağın, yel kimi gəldi Tur.
Dedi: – Get, Mənuçehrə peyğam apar,
De: kimdir atan, ey yeni hökmdar?
Belindən gəlib İyrəcin qız əgər,
Sənə kim qılınc verdi, bir də kəmər?
Dedi: – Dinlədim diqqət ilə səni,
Yetirrəm ona bil ki, hər kəlməni.
Fəqət tələsmə boşla bir an kini,

Oturt üz-üzə ağlını, qəlbini.
Düşün bir, nələr gözlənir qarşıdan?
Bu xam söhbətindən özün də utan!
Sizə gecə, gündüz tutub yas əgər,
Qəribə deyil, ağlasa vəhşilər.
Budur, Narvən cəngəlindən Çinə
Süvari igiddir gəlir üstünə.
Görüncə əsir Kavənin bayrağı,
Qılınclar çəkilmiş, parıldar zağı,
Yəqin bağrınız partlayar qorxudan,
Çıxar adınız yadınızdan, inan!
Qubad döndü, gəldi şahın yanına,
Eşitdiklərini yetirdi ona.
Mənuçehr güldü, dedi: – Boşla, eh,
Belə sözləri söylər ancaq səfeh,
Babamdır mənim İyrəc, aləm bilir,
Fəridun adıyla başım yüksəlir.
Döyüşdə gərək toy tutaq onlara
Ki, çıxsın nəcabət, nəsəb aşkara.
Böyük tanrının lütfü olsa kömək,
Macal verməyim düşmənə mən gərək,
Açıb ağzını bir kərə "uf" deyə,
Kəsib başını tez vuram nizəyə.
Buyurdu bəzənsin bütün süfrələr,
Şərab ilə, çəng ilə əyləndilər.

Qaranlıqlaşarkən işıqlı cahan
Yayıldı keşikçi çölə ordudan.
İgid Qaren ordu başında durub,
Yəmən şahı Sərv ilə məclis qurub,
Qoşun içrə hər yanda səs yaydılar:
– Siz ey qəhrəman, şahsevən atlılar,
Gərək biz döyüşlərdə möhkəm olaq,
Ədalətlə, kinlə qana qan alaq.
Bu meydanda bir kəs ölərsə əgər,
Günahsız şəhiddir, behiştə gedər.
Bu Turan, bu Çin ordusundan qıran,



Hünər göstərən hər igid qəhrəman
Çatar pak möbid kimi hörmətə,
Yetər daimi izzətə, şöhrətə.
Bağışlar ona padişah taci-təxt,
Qoşun başçısı zər, böyük Tanrı bəxt
Hamı hazır idi, açılcaq səhər,
O vaxt ki, fələkdən Günəş nur səpər
Neçə pəhləvan, aləmə şur salan,
Ələ gürz, zubinlə, xəncər alan,
Hərə öz yerində durub, səf çəkir,
Biri digərindən önə keçməyir.
İgidlər, şücaətli sərkərdələr
Ədəblə o salara baş əydilər.
Dedilər ki, salara biz bəndəyik,
Şaha xidmətə daim amadəyik.
Nə fərman verərsə, mütiyik ona,
Dönər yer üzu qan dolu ümmana.
Hərə getdi öz xeyməsinə tərəf,
Qisas almağı bildilər şan, şərəf.

Söküldü səhər olcağın dan yeri,
Günəş çıxdı, zülmət çəkildi geri.
Qoşun mərkəzində Mənuçehr şah,
Qılıncla, zirehlə qoyub taskülah,
Fəza qərq olunca polad nizəyə
Gətirdi çölü nərələr lərzəyə
Qoşun mərkəzi, sağ cinah, sol cinah
Düzəldi, necə əmr vermişdi şah.
Su üstə gəmiydi deyən yer üzü,
Deyərdin ki, qərq olmaq istər özü.
Ağır yükləri çatdılar fillərə,
Coşub titrədi Nil kimi dağ, dərə.
Guruldardı fillər belində təbil,
Coşardı, qoşardı qabaq səmtə fil.
Çalındıqda şeypur ilə kərranay
Sanardın ki, dağlar salıbdır haray,
Yerindən qoşun dağ kimi oynadı,

Ucaldı göyə "Gəldi, al!" fəryadı.
Görüncə, biyaban dolu qan axar,
Deyərdin: olub yer üzü laləzar,
Ayağı qana qərq idi fillərin,
Sanardın ki, mərcan sütundur həmin.
Mənuçehrə yar oldu hər an zəfər,
Zəfər tez çalar hər kimi el sevər.
Vuruşma gedirdi, qaraldı hava,
Günəş batdı, aləm geyindi qara.
Girər gündə bir başqa rəngə zaman,
Verər gah şəkər, gah zəhər ərməğan,
Mənuçehr şəbxun vurar indicə
Deyə, yatmadı Səlmi ilə Tur gecə.
Səhər çıxmadı bir nəfər meydana,
İki qanlı xəlvət çəkildi yana

Günorta zamanıydı, Səlm ilə Tur
Ürəklərdə kin, başlarında qürur
Görüşdü yaman gündə tədbir üçün,
Şərik oldu onlar bu fikrə o gün:
Gecə olcağın güclü şəbxun vuraq,
Düzənlikləri qan ilə dolduraq.
Bu işdən zirəklər tutunca xəbər,
Mənuçehrə dərhal xəbər verdilər.
Budur məsləhət ki, Mənuçehr şah
Qoya pusquda lazımınca süpah.
Mənuçehr asınca qulaq onlara,
Duşündü öz ağlıyla tapsın çara.
Dedi Qarenə: – Başçı ol orduya,
Özü yer seçib girməyə pusquya,
Apardı başında otuz min nəfər,
Hamı pəhləvan idi, sahibhünər.
Münasib seçilmişdi pusqu yeri,
Yenilməzdi atlıların hər biri.
Geçə oldu, yüz min süvariylə Tur
Keçib ordugahdan hucuma, budur,
Düşünmüş ki, şəbxun vura düşmənə,



Qıra, ordugaha zəfərlə dönə,
Gəlib, gördü ordu sayıq, huşyar,
Önündə şahın bayrağı bərqərar.
Yox idi əlacı döyüşdən savay,
Çəkib nərə, saldı cahana haray.
Atın dırnağından qopan toz, deyən,
Buluddur, fəzanı tutub qəflətən.
Qılınclar ki, hər an qınından çıxar,
Sanardın bulud içrə şimşək çaxar.
Baxanda deyərdin: hava odlanar,
Yerə düşsə almas kimi, yer yanar.
Polad səslərindən beyin gurladı,
Buludda külək qopdu, od parladı.
Mənuçehr o dəm qalxçağın pusqudan,
Bunu gördü Tur, oldu halı yaman
Atın başını döndərincə geri,
Qonardı qoşun "hay, havar" səsləri.
Dalınca salıb at, Mənuçehr şah
Aman vermədi qanlı tapsın pənah.
Elə nizə vurdu qalın peysərə
Ki, düşdü qılıncı əlindən yerə.
Yəhərdən onu qaldırıb yel kimi,
Yerə vurdu zərb ilə bir fil kimi.
Kəsib başını, tulladı tez yerə,
Bədən qaldı, yem oldu vəhşilərə.
Gəlib ordugahında tutdu qərar,
Görüşdü qoşunla igid hökmdar.

Salıb mişk ilə, ənbər içrə qələm,
Fəriduna bir namə yazdı o dəm.
Birinci: böyük Tanrını etdi yad,
Təmizlik, ədalətlə o almış ad.
Salam ərz qıldı Fəridun şaha,
Dedi: – Tacına, gürzünə mərhəba!
Ədalət, şücaət və din səndə var,
Tutub tac ilə təxt adınla qərar.
Səadət, sədaqət o bəxtindədir.

Bütün közəlliklər o təxtindədir.
Səlamət gəlib çatcağın Turana,
Qoşun çəkdik almaq üçün qan qana.
Vuruşduq gecə-gündüz üç gün yaman,
Bu üç gündə biz yatmadıq bircə an.
Eşitdim ki, istər o şəbxun vura,
Öz acizliyindən bizə tor qura.
Girib arxasında onun pusquya,
Nə çəkmişdi, cızmışdı, verdim suya.
Basıldı, qayıtdı geri, bu zaman,
Salıb at, onu haqladım arxadan.
Kürəkdən vurub nizəni bir kərə.
Yəhərdən alıb, güclə atdım yerə.
Düşüb qaldı o, sanki bir əjdaha,
Kəsib başını, təndən etdim cüda.
Baba, məndən al bu başı ərməğan,
Gərək Səlmə də verməyim mən aman
Necə İyrəcin başın o qanlılar
Kəsib, zərli tabuta qoymuşdular.
Elə bir tabut hazır etdi o da,
Turun başını qoydu o tabuta.
Onu elçiyə verdi məktub ilə,
Atı elçinin sanki döndü yelə.
Fəridunu yad etdi, elçi o dəm,
Utandı, qızardı, gözü oldu nəm
Ki, Çin şahının başı ilə gedim,
Fəriduna nə üzlə təqdim edim?
Oğul hər qədər mənliyin atsa da,
Ona qanlı düşmən kəsilməz ata.
Bağışlanmaz idi oğulda günah,
Qisas aldı ondan cavan padişah,
Gəlib elçi əydi Fəriduna baş,
Yerə qoydu tabutu əldən yavaş.
Fəridun baxıb söylədi: – Ey Xuda
Mənuçehrə qıl bəxtiyarlıq əta!
Bu həngamədən Səlmə çatdı xəbər
Ki, toz-tüstü yerdən aya yüksələr.



O yanda var idi böyük bir qala,
Çatırdı başı göylərə az qala.
Düşündü bu dövran deyil yar ona,
Qala səmtinə istədi yollana.
Başa düşdü Qaren bu fikri məgər
Ki, meydanı tərk eyləsə Səlm əgər,
Kəlani qala səmtinə üz qoyar,
Gərək yol kəsilsin, əgər rumlular
Dənizdə qala içrə yerləşsələr,
Çətin onlara əl tapa bir nəfər,
Qala dağ kimi görsənir dəryada,
Sudan sanki qalxır göyə bir ada.
Dedi: – Ey şahım, məsləhət görsəniz
Böyük bir qoşunla sizin bəndəniz,
O Çin şahının bayrağıyla belə
Üzük möhrünü Turun allam ələ.
Qurub düşmənə yaxşıca bir kələk,
Qala içrə xəlvət gedib yerləşək.
Mənəm, bir də Gərşasb, gecə, bir də biz,
Dilə almayın sirri heç yerdə siz.
Qaralçaq hava, atlanıb atlılar
Dəniz sahilinə gəlib çatdılar.
Vuruşmaq sevən pəhləvanlar təmiz
Dəniz sahilinə tərəf qoydu üz.
Qaren Şiruya söylədi: – İndi sən
Qoşunda göz ol, gizlicə ta ki, mən
Haman bu üzüklə gedib elçitək
Keşikdə durana qurum bir kələk.
Qala üstünə vuracağın bayrağı
Göründükdə rəngli qılınclar zağı,
Qala səmtinə durmadan at salın,
Yetişcək vurun, öldürün, qan alın,
Qoşun qaldı sahildə Şiruy ilə,
Özü getdi, dejbanı tutsun dilə[24].
Gəlib durdu dejban ilə üz-üzə,
Üzük göstərib, başladı o sözə.
Düşündü, daşındı nəfəs dərmədən,

Dedi: – Turu gördüm gələn vaxtda mən,
Buyurdu: tez ol, get, o dejbana de
Ki, bundan belə nə rahatlan, nə ye,
Mənuçehrdən tutmuşuq biz xəbər,
Qala üstünə tez qoşun göndərər.
Hər işdə sənə mən gərək yar olam,
Qala getməsin əldən, huşyar olam.
Üzük qaşına saldı dejban nəzər,
Yalan söz ona etdi yaxşı əsər,
Uyub zahirə, əydi baş sanki qul,
Açıldı qapı, düşmənə verdi yol.
Fikir ver, nə yaxşı demiş söz deyən:
Görər batini könlünü gizləyən.
Mənimlə sənə qulluq olmuş peşə,
Ağılla gərək qol qoyaq hər işə.
Olanlar əgər yaxşıdır, ya yaman,
Fikir söyləyək fərqinə varmadan.
Süpəhdar Qaren o dejban ilə
Durub uz-üzə, tutdu şirin dilə.
Biri sadəlövhdü, biri hiyləgər,
Qarensə başında qurur nəqşələr,
O fürsət gəzib gün boyu durmadan,
Aparmazdı dejban ona heç güman.
Salıb mehrini dost kimi o, yada,
Başın da qala ilə verdi bada.
Qaren al dilə tutdu o sarsağı,
Ucaltdı səhər ay kimi bayrağı.
Çəkib nərə, Şiruya verdi nişan,
Qoşundan onu gördü hər pəhləvan.
Nəzər saldı Şiruy əsən bayrağa,
Cəsarətlə üz qoydu çarpışmağa.
Qala üstünü aldı o qəhrəman,
Enməyən tacı başların oldu qan,
Qaren bir tərəfdə qırır hey qırır,
O yanda Şiruy şir kimi hayqırır.
Qala hər tərəfdən yaxıldı oda,
Göründü dənizdə yanar bir ada.



Günorta çağı olmamışdı haman,
Qala oldu yerlə yeksan taman qan.
Suda gözdən itdi gəmi, həm qala.
Qaraldı Günəş tüstüdən az qala.
Külək qopdu, od şöləsi parladı,
Dilavərlərin nərəsi gurladı.
Günəş məğribə doğru düşdü yola,
Nə səhra göründu, nə möhkəm qala.

Döyüş meydanı Səlm üçün oldu dar,
Qala səmtinə döndü – etsin fərar.
Onu izləyirdi Mənuçehr şah,
Qala içrə ancaq tapardı pənah.
Çapır at, ürəkdə ölüm qorxusu,
Dəniz sahilinə çatıb, gördü: su
Dayandı təəccüblə saldı nəzər,
Onun gəzdiyindən yox idi əsər.
O səhranı gördü meyitlə dolu,
Leş üstə düşüb leş, kəsibdir yolu.
Qovurdu Mənuçehr onu arxadan,
Qəzəbdən gözündə qaralmış cahan.
Elə toz oturmuşdu ki, atlara,
Kəhərlər görünməkdə idi qara.
Mənuçehr çatınca ona arxadan,
Qəzəblə bağırdı: – Xəbis, bir dayan!
Sən, ey öldürən doğma qardaşını,
Çatıbsan taca, gizləmə başını.
Gətirdim sənə başqa cür təxti-tac,
Acı bar verib əkdiyin o ağac.
Bu şahlıq tacından qaçırsan, deyir,
Fəridun sarayda səni gözləyir.
Ağac bəsləyirdin, budur, verdi bar,
Sənindir onun bəhrəsi, al, apar!
Zəhərdir bəhər, sən özün əkmisən,
Şəkərdir əgər, zəhmətin çəkmisən.
Bu sözlərlə mahmızlayıb köhləni,
Gəlib haqladı qan içən düşməni.

Elə bir qılınc vurdu ki, boynuna,
Başı bir yana düşdü, leş bir yana
Bu iş hər kəsə ibrət olsun deyə
Buyurdu: taxılsın o baş nizəyə.
Qoşun əhli gəldi tamam heyrətə,
Dedi afərin bu qola, qüvvətə.
Necə qurd görəndə qoyunlar qaçar,
Döyüşdən elə qaçdılar rumlular.
Tutub üz çölə, dəryaya, dağlara,
Hərə başına axtarırdı çəra.
Var idi ağıllı, həkim bir kişi,
Çox hikmətli sözlər deməkdi işi.
Dedilər: – Səni eylədik biz vəkil,
Mənuçehri tap, tök ona yağlı dil.
Belə söylə ki, bəndəyik biz ona,
Mütiyik şahın cümlə fərmanına,
Bizim bəzimiz sadəcə maldarıq,
Qalanlar dəxi yer əkib şumlarıq.
Bu meydana yoxdur könüllü gələn,
Deyil düşmənin hər əlində ölən.
Biz indi hamı bir quluq şah üçün,
Onun ixtiyarındayıq büsbütün.
Axıtmaq əgər istəsə bir də qan,
Daha qalmamış bizdə tabü tavan.
Bu günahsız başlar gərəksə ona,
Bizə izn versin, gedək yanına.
Nə istərsə, etsin, odur hökmdar,
Günahsızlara, şah çətin ki, qıyar,
O qasid gəlib söylədi bunları,
Onu dinlədi ordunun sərdarı.
Düşündü, ona verdi doğru cavab:
– Mən öz adımı eylərəmmi xərab?
O iş ki, bizə Tanrı bilməz rəva,
O, Əhrimənin felidir, mütləqa.
Əlim varmamış pisliyə heç zaman,
Yamanlıq edən vəhşi divdir, inan!
Tutaq siz mənə kinli düşməndiniz,



Ya da dost kimi yurduma gəldiniz.
Zəfər çaldım, hər şey çıxıb aşkara,
Seçilmiş bu meydanda ağdan qara.
Gedin, dinclik ilə murada çatın,
Çəkin əl döyüşdən, silahı atın.
Şahın çadırından yayıldı xəbər
Ki, ey pəhləvanlar, vuruşmaq yetər!
Ədalətlə zalımlər oldu zəlil,
Nahaq qan axıtmaq igidlik deyil.
Silahı yığıb ordudan rumlular,
Peşəng oğluna verdilər hər nə var
Mənuçehr isə göstərib ehtiram,
Verib onlara layiqincə ənam.
Qala üstə Şiruyu etdi rəvan,
Dedi: – Al yanınca neçə pəhləvan.
Get, axtar yığışdır, gətir hər nə var,
Çalış, qalmasın heç nə gözdən kənar,
Xəzinəni, çatıb fillərə bütün,
Gətir dərbara, töhfə ver şah üçün.
Düzənlikdə dəniztək coşdu qoşun.
Fəridun hüzuruna qoşdu qoşun.
Mənuçehr yaxınlaşdı Təmmişəyə,
Fəridun, onunla görüşsün deyə.
Saraydan göyə qalxdı şeypur səsi,
Yola çıxdı şahla qoşun dəstəsi.
Bütün fillər üstündə firuzə təxt,
Görən söylədi: – Yar olub şaha bəxt
Kəcavə qızıl, örtüyü tirmədən,
Ona ləlü gövhərdi ziynət verən.
Qara bir buludtək qoşunlar haman
Xəzərdən Sari səmtə oldu rəvan.
Yaxınlaşdı şaha gələn ordular,
Fəridun yol üstündə tutdu qərar.
Mənuçehr, şah bayrağın görcəyin,
Dedi orduya: – Yol boyu səf çəkin!
Piyada gedirdi cavan şəhriyar,
O bir gənc idi, görkəmində vüqar.

Baş əydi, dua etdi, öpdü yerin,
Dedi: – Təxtinə, tacına afərin!
Fəridun yanında verib yer ona,
Öpüb oxşadı, basdı öz bağrına.
Tutub üz göyə, seylədi hökmdar:
– Xudaya, ədalətli pərvərdigar!
Deyibsən ki, mən adiləm, mehriban,
Çətin gündə məzlumlara əl tutan.
Ədalət də, hümmət də verdin mənə,
Nə tac? Şanü şövkət də verdin mənə.
Muradımca döndü mənim ruzigar,
Məni indi başqa cahana apar!
Həyatdan daha bezmişəm, ey Xuda,
Rəva görmə artıq qalım dünyada.
Buyurdu Mənuçehrə: – Təxtə otur,
Başa tac qoyub, şah büsatını qur!
Gəlib çıxdı Şiruy, o şiri-nər,
Gətirdi çox xəzinələr, töhfələr.
Nəzər saldı o sərvətə padişah,
Mənuçehrə üz tutdu tez, çəkdi ah,
Dedi: – Bu qənimətləri qeydə al,
Qoşun əhlinə paylayıb, razı sal!
Şah hər nə demişdi, əməl etdilər,
Verildi qoşun əhlinə simü-zər.
Fəridun o gündən pərişan olub,
Deyərdin: xəzandır, gülüstan solub.
Atıb tacü təxtin bütün daşını,
Önündə qoyub üç oğul başını,
Axıtdı gözündən ürək qanını,
Başa vurdu matəmlə dövranını.
Fəridun ölüb getdi, qaldı adı,
Keçib əsrlər, şöhrəti solmadı.
Oğul, yaxşılıq et, təmiz ad qazan,
Görən olmamış yaxşılıqdan ziyan.
Mənuçehr qoydu başa taci-zər,
Belə bağladı ləl qaşlı kəmər.
Fəriduna sərdabə etdi bina,



Bəzək verdi gövhərlə, zərlə ona,
Qoyuldu şahın təxti sərdabəyə,
Tutulmuşdu təxt ləl, firuzəyə.
Cənazə o təxt üstə tutdu qərar,
Başı üstə şahanə tac asdılar.
Necə rəsm idi ehtiram etdilər,
Vidalaşdılar, baş əyib getdilər.
Qapı bağlanıb, daxmada qaldı şah,
O getdi cahandan dodağında ah.
İşin dərdü qəmdir sənin, ey cahan,
Sənə bağlamaz bel ağıllı olan.

## MƏNUÇEHR

Mənuçehr bir həftə çəkdi fəğan,
Saraldı üzü, gözləri tökdü qan.
Bir həftə keçincə, cavan hökmdar
Qoyub tacı, təxtində tutdu qərar.
Gəlib yer üzündən böyüklər tamam,
Ona baş əyib, qıldılar ehtiram.
Başa tac qoyan gün Mənuçehr şah:
– Mənəm, – söylədi, – bu cahana pənah,
Ədalətlə, paklıqla, vicdan ilə,
Şücaətlə, mərdliklə, iman ilə
Bu dünyanı abad edəm mən gərək,
Mənəm təxtdə dövr edən bir fələk.
Mənə yer üzü, həm fələk oldu ram,
Neçə tacdar başını ovlaram.
Mənə həqq əta eyləmiş dinlə fərr,
Gözəl bəxt, parlaq ağıl, həm hünər,
Mənimdir cahanın suyu torpağı,
Mənimdir uca Kavənin bayrağı.
Qılıncım iti, ildırımtək biçər,
Döyüşdə Mənuçehr candan keçər.
Mənəm qaldıran pisliyi ortadan,
Gərək yaxşılıqla bəzənsin cahan.

Qulam tanrıya bu hünərlərlə mən.
Odur şahlara şənü şövkət verən.
Gəlin, ağlayıb xaliqə yalvaraq,
Qoy olsun hər işdə bizə o dayaq.
O vermiş mənə taci-təxti sipah,
Odur hər işimdə həmişə pənah.
Fəridun yoluyla gedək durmadan,
Mənəm bir cavan şaxə, o, bağiban.
Mənim yeddi ölkəmdə bircə nəfər
Atıb dinini çıxsa yoldan əgər,
Rəva görsə məzlumlara zülm, kin,
Səbəb olsa təhqirinə bir kəsin,
Can atsa soyub xalqı, varlanmağa,
Əzilmişlərin haqqını danmağa,
Əzizim də olsa, gözümdən düşər,
Olar düşmənim Əhriməndən betər.
Kim həqqin yolundan çıxarsa, inan,
Cəzasın görər məndən, həm tanrıdan.
Qılınca əl atsam əgər qəhrlə,
Bu ölkə yəqin qərq olar qan-selə.
Bütün pəhləvanlar dedi: – Afərin!
Bu gün hökm-fərman sənindir, sənin.
Babandan sənə yetmiş, ey xeyirxah,
Bu təxt ilə tac, olmusan padişah.
Canın, təxtü tacın zaval görməsin,
Bu möbidlər olsun duaçın sənin.
Mütiyik sənin şah fərmanına,
Könül vermişik əhdü peymanına.
Böyük pəhləvan Sam qalxıb bu an,
Dedi: – Ey ədalət sevən hökmran!
Mən ömrümdə çox görmüşəm şahları,
Ucalmış ədalətlə dərgahları.
Nəsilbənəsil şahsan İrana sən,
Yenilməz, igid ordunun fəxrisən.
Sənə arxadır pak Pərvərdigar,
Yaşa daima qəlbi şən, bəxtiyar.
Babandan mənə yadigar olmusan,



Həyatı həmişə bahar olmusan.
Döyüşlərdə bir qızmış aslan kimi,
Görüşlərdə xurşidi-taban kimi,
Ayağından öpsün cahan, ruzigar,
Bu firuzə təxtində ol bərqərar.
Qılıncınla dünyanı aldın ələ,
Bizə növbə çatmış, çıxaq meydana,
Yaşa eyşü işrətlə bundan belə.
Batırma daha əllərini qana,
İgidlikdə yoxdur tayım dünyada,
Nə qorxum, cahan düşmənim olsa da?
Mənə pəhləvanlıq veribdir baban,
İradənlə indi mənə arxasan.
Ona afərin söylədi hökmdar,
Edildi ayağına gövhər nisar.
Saraydan çıxarkən qürur ilə Sam
Baş əydi ona pəhləvanlar tamam.
Böyük pəhləvan mənzilə qoydu üz
Ömür sürdü alnı açıq, qəlbi düz.
Qədim bir xəbər var ki, dildə gəzər,
Maraqlı olar nəzmə çəksəm əgər.
Qulaq ver, oğul gör ki, bu ruzigar
Böyük Sam ilə oyun oynayar,
Deyirlər: yox imiş Samın övladı.
Verərdi bal ağzında sirkə dadı.
Var idi evində onun bir nigar,
Ona lütf göstərdi Pərvərdigar.
Günəşüzlü dilbər olub hamilə,
Böyük pəhləvan isə ümmid ilə
Yaşardı, onun mehriban dilbəri
Ağır yükdən inlərdi çoxdan bəri.
O günlərdə doğdu qəşəng bir uşaq,
Görənlər deyərdi günəşdir uşaq.
Uşağın üzü nurlu, parlaq idi,
Bütün tükləri qar kimi ağ idi.
Oğul eybəcərdir deyə, dayələr
Sama yeddi gün vermədilər xəbər.

Yataqxanasında onun yeddi gün
Hamı ağlayırdı o körpə üçün.
Sama kim deyəydi: gözəl arvadın
Belə körpə doğmuş ki, batsın adın?
Onun vardı bir dayəsi şir ürək,
Nəhayət, Samın yanına getdi tək.
Dedi: – Qəhrəman Sama yüz afərin!
Zəlil olsun hər yerdə düşmənlərin.
Evində sənin, bil ki, ey namidar,
Bir oğlan doğubdur gülüzlü nigar.
Gümüştək var əndamı, gültək üzü,
Vücudunda yox zərrə nöqsan izi.
Tükü qartək ağdır fəqət, aşikar,
Belə istəmiş pak Pərvərdigar.
Eşitcək bunu təxtdən qalxaraq,
Hərəmxanaya Sam basdı ayaq.
Görüncə ki, ağdır tükü oğlunun,
Ümidi kəsildi cahandan onun.
Göyə üz tutub, ağladı zar-zar,
Dedi: – Ey ədalətli Pərvərdigar!
İradəndir hər şeydən üstün sənin,
Bizə xoşdur, ey tanrı, hər istəyin.
Tutaq ki, böyük bir günah etmişəm,
Yaman işlərin ardıca getmişəm,
Ulu Tanrıya bu verirmi əsas:
Bu yolla ala bəndəsindən qisas?
Bu rüsvayçılıq canıma od salır,
Ürək çırpınır, qollarım sustalır,
Gəlib pəhləvanlar tutarsa soraq,
Necə söyləyim eybəcərdir uşaq?
Deməzlərmi bu körpə divdir məgər?
Pələngdi, ya cindi, deyildir bəşər.
Gərək onda İranı tərk eyləyim,
Bu yurda, elə əlvida söyləyim.
Dedi: bir uşaq ki, doğulmuşsa zal[25],
Onun qanını tanrı etmiş həlal.
Belə verdi fərman: – Onu tez alın,



Bu eldən uzaqlarda itkin salın!
Var idi bir Əlborzguh adlı dağ,
Günəşlə yaxın, kənd-şəhərdən uzaq,
O yerdə ki, qurmuşdu Simurğ yuva[26],
Atıldı dağa o günahsız çağa.
Qoyub körpəni, tez geri döndülər,
Belə zülmə insan dözərmi məgər?
Uşaq pəhləvan oğlu olsa belə,
Qaranı, ağı seçməyirdi hələ.
Ata zülm edib südəmər körpəyə,
Atıldı uşaq eybəcərdir deyə,
Əgər vəhşi heyvanları anlasan,
Olur onlar öz nəslinə mehriban.
Südüylə bala bəsləyən vəhşi şir,
Basıb bağrına körpəni söyləyir:
– Ürək qanımı sən yesən də əgər,
Bu minnət deyil, məncə, zərrə qədər,
Mənə sən ürək, həm də gözsən, bala,
Ürək getsə, mümkünmü can sağ qala?
Bala quşlar ac qalmasınlar deyə,
Qanad açdı Simurğ, qalxdı göyə.
Nə gördü: quru yerdə bir körpə var,
Gözündən dəniztək yağış çağlayar.
Beşikdir qaya, dayə torpaq ona,
O çılpaqdı, süd doymamış ağzına.
Qara torpaq əndamını dövrələr!
Fəzadan Günəş başına od ələr.
Pələnglər ata kaş olaydı ona,
Atılmazdı qızmar dağın qoynuna.
Enib gəldi Simurğ göydən yerə,
Daş üstündən aldı onu şəhpərə.
Uçub getdi Əlborza quş durmadan,
O yerlərdə qurmuşdu çoxdan məkan,
Düşündü ki, fəryadı etməz əsər,
Onu körpə quşlar didib də yeyər,
Fəqət Tanrı o körpəyə oldu yar,
Gərək sağ qalaydı, bunun sirri var,

Necə körpə Simurğ baxdı ona,
Gözündən axan qətrə-qətrə qana.
Baxıb gül camalına mat qaldılar,
Könüldən ona mehr də saldılar.
Qonaq süd yerinə əmir qan deyə,
Zərif ov tutub, verdi quş körpəyə.
Rəvayət edibdir bu sirri açan:
Belə keçdi dövran xeyli zaman,
O körpə ətə doldu, gəldi cana,
Zaman gəldi ki, döndü bir aslana.
Yayıldı onun şöhrəti hər elə,
Yaman, yaxşı sözlər alındı dilə.
Görənlər sanardı onu şiri-nər,
Gəlib Sama da çatdı ondan xəbər.
O günlərdə yatdı, yuxu gördü Sam:
Ərəb cinsli at üstə hindu qulam
Gəlib müjdə verdi ki, ey pəhləvan,
Sənin doğma oğlundur o növcavan.
Oyandı, çağırtdırdı möbidləri,
Edib sirrini dillərin əzbəri,
Dedi: – Söyləyin, indi mən nə edim?
Onu tərk edim, ya dalınca gedim?
Onu dinlədi həm qoca, həm cavan,
Hamı söylədi: – Ey böyük pəhləvan,
Düzənlikdə, dağlarda aslan, pələng,
Dənizdə olan hər balıq, hər nəhəng, –
Hamı körpəsini sevər, bəsləyər,
Nə olsa, böyük Tanrıya şükr edər.
Sən isə günah bir işə batmısan,
Günahsız olan körpəni atmısan.
Gedib Tanrıdan indi üzr istə sən,
Hər işdə odur doğru yol göstərən.
Gecə olcağın Samı tutdu yuxu,
Ürəkdə fikir, iztirab, arizu,
Yuxu gördü, Əlborz dağından haman,
Uca bayraq altında bir novcavan
Gəlir, arxasınca böyük bir qoşun,



Saçar ay kimi nur camalı onun.
Sağında bir ağ saçlı möbid gəlir,
Solunda ağıllı, zəkalı dəbir.
Biri gəldi Sama tərəf, əydi baş,
Dil açdı, danışdı, səsində təlaş
Dedi: – Ey yolundan dönən qəhrəman,
Utanmazmısan, söylə, sən Tanrıdan?
Quş olmuş sənin oğluna dayə, bil,
Sənə pəhləvan adı layiq deyil.
Saçın ağlığı bir günahsa əgər,
Saçın, saqqalın ağ deyildir məgər?
Sən öz xaliqindən küsürsən, yəqin,
Girir gündə bir rəngə cismin sənin.
Oyandıqda Samı boğurdu kədər,
Deyərdin ki, düşmüş tora şiri-nər.
Ayıldı, dedi: – Toplaşın, başçılar,
Hazır oldu sərkərdələr harda var.
O dağ səmtinə üz tutub, çapdı at,
Atılmışlara vermiş o dağ həyat.
Nə gördü: ucalmış o dağ göylərə,
Çəkər sanki ulduzları dağ yerə.
Uca bir qaya baş çəkib yüksələr,
Fələkdən ona yetməz əsla zərər.
Hesabsız ağac – ud, səndəl, çinar
Verib baş-başa, göylərə boylanar.
O daş bürcə bir də nəzər saldı Sam,
Qoşun heybətindən üzüldü tamam.
O bir qəsr idi, qülləsi asiman,
Nə zəhmətdən idi, nə torpaq-sudan.
Yol axtardı keçsin, fəqət yol hanı?
Bu yerlər salır dəhşətə insanı.
Böyük Tanrıya afərin söylədi,
Qoyub torpağa üz, dua eylədi.
Dedi: – Ey ilahi, bu aləmdə sən
Günəşdən də, Aydan da yüksəkdəsən.
Bu oğlan mənim öz balamsa əgər,
Vücudunda yox Əhrimənden əsər,

Bağışla günah işləmiş bəndəni,
Böyüksən, bu qəmdən xilas et məni.
Xitab etdi Simurğ Sam oğluna:
– Uşaqkən atıldın dağın qoynuna,
Atan Sam imiş, o, böyük pəhləvan,
Tanışdır onun şöhrətiylə cahan,
Gəlibdir, bu dağda oğul axtarır,
Sənin izzətin, hörmətin ondadır.
Belə məsləhətdir, səni indi mən
Ona çatdırım, etiraz etməsən.
Dedi Zal Simurğa: – Ey mehriban,
Əlimdən məgər bezmisən, dayəcan?
Əzizdir gözümdə yuvan qəsrdən,
Qanadlarını verməerəm tacə mən.
Cavab verdi Simurğ: – Xamsan hələ,
Deyilsən tanış tac ilə, təxt ilə.
Kəyan taçi-təxtini görsən, inan,
Yuvan da yadından çıxar, bil, haman.
Sənə bir vəsiyyət edim mən gərək,
Özünlə apar şəhpərimdən lələk.
Dara düşmüş olsan əgər bir zaman,
Deyən olsa haqqında yaxşı, yaman,
Lələkdən qopar zərrəcə, at oda,
Gələrəm o dəmdə sənə imdada.
Qanad sayəsində səni bəslədim,
Gözümdə balamtək əzizsən dedim.
Çağırsan, səni mən alıb şəhpərə,
Gətirrəm geri mən həmin bu yerə.
Unutma, oğul, mehriban dayəni,
Mənim könlüm heç vaxt unutmaz səni.
Dedi: – Ol ürəkli!- Onu aldı quş,
Bulud arxasında qanad çaldı quş,
Qoyanda ata qarşısında yerə,
Çatırdı onun ağ saçı dizlərə.
O, fil cüssəliydi üzü növbahar,
Görüb Sam onu ağladı zar-zar.
Təşəkkürlə Simurğa baş əydi Sam



Dedi afərin, göstərib ehtiram.
Ayaqdan başa süzdü öz oğlunu,
Görüb tac ilə təxtə layiq onu.
Samın qəlbi cənnət kimi oldu şən,
Dedi: – Afərin, ey oğul, indi sən
Mənə bir oğul kimi ol mehriban,
Unut keçmişi, sev məni, ey cavan,
Mənəm tanrının ən kiçik bəndəsi,
Sən isə mənə xaliqin töhfəsi,
Qəbul etdim artıq, geri verməyəm,
Sevib candan artıq, sənə can deyəm.
Samın əmri ilə Zala dostları
Geyindirdilər pəhləvan paltarı.
O, dağdan enib gəldi ki, yüksələ,
Ola dağ kimi arxa şahla elə.
Qoşun pişvaza çıxdı gəldikdə Sam,
Sevinclə önündə baş əydi tamam.
Vuruldu təbil, gurladı kərrənay,
Qızıl zəng səsləndi, hindi dəray[27].
Ürəkdən çəkib nərələr atlılar,
Gözaydın dedi sərbəsər atlılar.
Gecə çəkdi bayraq, qaraldı hava,
Ağ üzdən qara pərdə saldı hava.
O çöldə düşərgə salıb qaldılar,
Yatıb, dincəlib, xoş nəfəs aldılar.
Günəş ağ ipəkdən quranda çadır
Qoşun qalxdı, yükləndi at, həm qatır
Şəhər səmtinə oldu ordu rəvan,
Qoşunla bərabər cavan pəhləvan.

Şaha verdilər müjdə: – Ey hökmdar
Gəlib Sam dağdan, olub bəxtiyar.
Mənuçehr bu müjdədən oldu şad,
Qılıb tanrını afərinlərlə yad,
Dedi qəhrəman Nuzərə şəhriyar:
– Samın yanına göndərilsin çapar.
Ona şah adından yetirsin salam,

Desin bəxtiyar olmağınla şadam.
Gəlib-şahı görsün böyük pəhləvan,
Onu görsə xoşhal olar hökmran.
Çıxıb Zabilistana burdan gedər,
Şaha adəti üzrə xidmət edər.
Gəlib çatdı Nuzər Samın yanına
Sataşdı gözü gənc Sam oğluna,
Düşüb Sam ilə Nuzər atdan, yerə
Qucaqlaşdılar, Sam dedi Nuzərə:
– Səlamətmidir pəhləvanlar və şah?
Dedi: – Tanrıdır bəndəsinə pənah.
Şahın əmrini dinlədi pəhləvan,
Öpüb torpağı, atlanıb durmadan,
Necə söyləmişdi böyük hökmdar
Saray səmtinə çapdı at bəxtiyar.
Mənuçehr bayrağını gördü Sam,
Atından düşüb şaha verdi salam.
Dedi şah: – Atlan! – O mindi haman
O pak qəlbli şahpərəst pəhləvan.
Saray səmtinə birgə yollandılar,
Biri tac alandı, biri tacidar.
Mənuçehr taxta çıxıb şadiman,
Qoyub tacını başına hökmran,
Qaren sağ yanındaydı, sol yanda Sam,
Oturmuşdular hər üçü şadkam.
Gətirdi Zalı məclisə pərdədar,
Görənlər onu mat olub qaldılar.
Əli gürzdə, başda altun papaq
Cavan, barigaha basanda ayaq,
Mənuçehr diqqətlə süzdü onu,
Bəyəndi Samın pəhləvan oğlunu.
Sama üz tutub söylədi şəhriyar:
– Bunu məndən indi əmanət apar!
Toxunma onun könlünə heç zaman,
Onunla çalış, dur, otur mehriban!
Görüb təkcə quş, dağ və bir də yuva,
Bizim işlər ilə deyil aşina.



Ona yaxşı öyrət döyüş rəsmini,
Həm əylənməyi, həm görüş rəsmini,
Bu dəm söhbət açdı Mənuçehrə Sam,
Açıq, gizli, nə var, danışdı tamam.
Niyə Zalı rədd eyləmişdir, – dedi,
Fələk nə oyun işləmişdir, – dedi.
Nə oldu səbəb, atdı öz oğlunu,
Beşik seçdi qəlbi dağın qoynunu.
Necə Zal üçün oldu Simurğ ana,
Adı bir çox illər düşüb dastana.
Gedib Allah əmrilə Əlborza mən,
O yer çox yamandır, bilir hər görən,
Nə gördüm ki: bir dağ dikəlmiş aya,
Sudan yüksəlir göylərə bir qaya.
Uca qəsrtək bir yuva onda var,
Ona tapsa, ancaq bulud yol tapar.
Həmən yerdə Simurğ cavan Zal ilə
Yaratmışdı bir mehriban ailə.
Nəsimi məhəbbət yayardı dağın,
Fərəhləndi könlüm gedincə yaxın.
Dedim Tanrıya: – Ey Xudavənd, sən,
Təmənnasız aləmləri xəlq edən,
Olub qüdrətin hər tərəfdə əyan,
Dolanmaz fələk, əmr qılsan: "Dayan!"
Sənə bir qulam, işlədimsə günah,
Günahkar qula ver qapında pənah!
Sənin lütfünə təkcə bel bağladım,
Yoxumdur mənim başqa bir imdadım,
Bu quş bəsləmiş bəndəni, ey Xuda,
Əziyyətli ömr eyləyib dünyada.
İpək, xəz yerinə geyinmiş lələk,
Yeyər sud yerinə çiy ət vəhşitək.
Mən insafsızı yaxma artıq oda,
Onu ver mənə eybəcər olsa da.
Qəbul oldu Allah yanında duam,
O, əmr etdi ki, qəmdən azad olam.
Qanadlandı Simurğ uçub göylərə,

Başım üstə dövrə vurub bir kərə,
Enib gəldi dağdan buluddur deyən,
Qucağında gördüm cavan Zalı mən.
Sanardım saçır müşkü ənbər cahan,
Sevincdəndimi, yoxsa ki, qorxudan.
Döyündü mənim sinəm içrə ürək,
Yerə qoydu Zalı, sevən dayətək.
Odur, xidmətində durub, hökmdar,
Bütün sirri etdim sənə aşikar.
Hüzura çağırdı cahan sərvəri
Münəccimləri, həm də möbidləri.
Dedi: – Axtarın, sizdə varsa hünər,
Zalın taleyindən verin bir xəbər
Deyin, yuksələrsə məqamı, nədir?
Sözü, söhbəti nə, məramı nədir?
Bu əmri verincə Mənuçehr şah,
Dil açdı, danışdı neçə xeyirxah.
Dedilər Mənuçehrə: – Ey tacidar,
Uzun ömr elə, şadman, bəxtiyar.
Bu oğlan olar bir igid pəhləvan,
Ağıllı, şücaətli, mərd, qəhrəman.
Həmin sözdən oldu şahın qəlbi şad,
Samın könlü də oldu qəmdən azad.
Şah əmr eylədi: – Zala xələt verin
Böyüklər ona söylədi: "Afərin!"
Ərəb atları verdi zər vəznəli,
Bir hindi qılınc da qızıl qəbzəli.
Qızıl sikkə, yaqut, xəz, xalçalar,
Verildi Zala xəzinədə nə var.
Tabaqlarda kafur, müşk, zəfəran,
Zala etdi təqdim qullar haman.
Zirehli geyimlər, polad taskülah,
Ağır gürz, nizə, kaman verdi şah.
Mənuçehr alıb yazdı bir namə də,
O başdan-başa mədh olan namədə
Zala yer üzündən ayırmışdı pay,
Bütün Kabilü Zabilü Hindü May.



Bu yanda dəniz vardı – Dəryayi-Hind,
O yanda dəniz, adı – Dəryayi-Sind,
Bütün Zabilistanı Bosta qədər[28]
Yazıb əhdnamə, Zala verdilər.
Durub söylədi Sam: – Ey hökmran,
Ədalətli, insaflısan, mehriban.
Ucalsın cəlalın Günəşlə Aya,
Sənin kimi şah gəlməmiş dünyaya.
Səxavət, ədalət, ağıl kanısan,
Adınla sənin fəxr edir bu cahan,
Gözündə cahan sərvəti oldu xar,
Adın yox, özün qal bizə yadigar.
Əyildi, öpüb təxti, qalxdı yenə,
Səfər təbli bağlandı fil üstünə.
O gün Zabilistana yollandılar,
Dayandı tamaşaya gənc, ixtiyar.
Gəlib toxtadı Nimruza qafilə[29],
Xəbər verdi salar o yerdən elə.
Bəzəndi behişt bağıtək Sistan,
Gili müşk, torpağı zər, bustan.
Yol üstə səpildi qızıl sikkələr,
Ətirləndi müşk-ənbər ilə şəhər,
Geyinmişdi bayram libası cahan,
Gülüb şənlənirdi qoca, həm cavan,
Bütün adlı-sanlı cavanlar o gün
Axıb gəldilər Samı təbrik üçün,
Dedilər ki, ey pak ürək pəhləvan,
Səadət gətirsin sənə bu cavan.
Sama "afərin" söyləyib başçılar,
Zala qıldılar dürrü gövhər nisar.
Rahatlandı, əyləndi Sam əldə cam,
Sevindirdi bəxşişlə xalqı tamam.
Xələt layiqi gördüyü şəxslər
Ağıllıydı, mərd idi, sahibhünər.
Xələtlə qılıb onları şad Sam,
Verib çoxlarına uca bir məqam,
Yığıb başına dünya görmüşləri,

Açıb söylədi lazımi işləri.
Dedi: – Siz ağıllı və möbidsiniz,
Sizin qəlbinizdir günəşdən təmiz.
Belə hökm vermiş mənə padişah,
Qoşunla səfər başlayım bu sabah.
Gərək Qorqsaranla Mazəndaran
Böyük bir qoşunla tutulsun haman.
Sizinlə qalır – söylədi – tək balam,
Canımdan əziz, qəlbi kövrək balam,
Edir tərk cismim ürəklə canı,
Gözümdən axır qəlbimin al qanı.
Cavan çağlarımda varımdı həvəs,
Ağılsız bir iş tutdum, onda əbəs,
Oğul verdi Tanrı, mən atdım onu,
Peşimanlıq oldu bu əmrin sonu.
Onun canına Tanrımız qıymadı,
Alıb getdi Simurğ, tək qoymadı.
Sevib bəslədi bir uca sərvtək,
Mən atdım, ona bir quş oldu kömək,
Gəlib çatdı bir vaxt ki, xaliq yenə,
Qılıb lütf, qaytardı Zalı mənə.
Tutar can bədəndə onunla qarar,
O, məndən qalır sizlərə yadigar,
Əziz saxlayın, həm nəsihət verin,
Ona yüksəliş yolları göstərin!
Belə söylədi ayrılarkən Zala,
Səxavətli, fərli, mətin ol, bala!
Bütün Zabilistanı bil xaniman,
İtaət edər əmrinə bu cahan.
Budur istəyim – yurdun abad ola,
Bütün dostların xatiri şad ola.
Sənin ixtiyarındadır xəznələr,
Sən asudə olsan, ürək şənlənər.
Sama üz tutub söylədi gənc Zal:
– Gedirsən, tutar könlümü qəm, məlal.
Ayırdın özündən məni bir zaman,
Daha tərk qılma, amandır, aman!



O bədbəxt mənəm ki, anam doğdu xar,
Rəvadır əgər ağlasam zar-zar.
Quşun çəngəli oldu bir vaxt yerim,
Quru torpaq üstə yatıb, qan yedim.
O quşdan da mən indi düşdüm kənar,
Belə bəsləyirmiş məni ruzigar.
Mənə gül deyil, qismət oldu tikən,
Yamanlıqmı etdim Xudavəndə mən?
Dedi Sam – Könlündə nə var, danış!
Boşalt qəlbini sözdən, aşkar danış!
Münəccim verib ulduzundan xəbər,
Böyük bir səadət səni gözləyər.
Olarsan saray sahibi, bil yəqin,
Yanında qoşun, başda tacın sənin.
Fələk hökmünə çarə yoxdur, inan,
Unut qəmləri, ol daha mehriban.
Çalış, topla ətrafına indidən
Ağıllı, igid qəhrəmanları sən.
Çalış, dinlə, hər elmi öyrən, fəqət,
Bilikdən yetər, bil, sənə mənfəət.
Həmişə yedirt xalqı, ver bəxşişi,
Biliklə, ədalətlə tut hər işi.
Bu dəmdə sarayda çalındı təbil,
Yerindən qoşun oynadı sanki sel.
Döyüş əzmi ilə yola çıxdı Sam,
Qoşun əhli cəngavər idi tamam.
Götürdü yanınca cavan oğlunu
Ki, görsün yürüşdə Samı, ordunu.
Davam etdi onlar iki gün yola,
Sanardın iki sərv gedir qol-qola.
Dayandı ata, bağrı döndü qana,
Basıb oğlunu can kimi bağrına.
Buyurdu, qayıtsın o, yoldan geri,
Gülər üzlə, təxt üstü olsun yeri.
Qayıtdı, düşündü, nə etsin ki, Sam
Onunla öyünsün ki, vardır balam.
Gəlib təxtə əyləşdi o qəhrəman,

Qızıl tac qoyub sanki bir hökmran,
Geyindi zireh, gürzü aldı ələ,
Qızıl bir kəmərlə, qızıl tovq ilə,
Çağırdı o, möbidləri dərbara,
Hər işdə edib etibar onlara.
Münəccimlə ruhanilər yanbayan,
Süvari igidlər, neçə pəhləvan
Həmişə onunla bərabərdilər,
Ona məsləhət, rəy söylərdilər.
Bütün işləri öyrənib anladı,
Biliklə bir ulduz kimi parladı.
Hünərlə, biliklə o gənc pəhləvan
Ucaldı, ona valeh oldu cahan.
Dönərdi fələk böylə minval ilə,
Əzizlərdi Samı cavan Zal ilə.

Deyirlər ki, Sam oğlu bir gün səhər
Fikirləşdi: ətrafa etsin səfər.
Götürdü özüylə neçə pəhləvan
Ki, dostluqda vermişdilər imtahan.
O, Hindistana, Dünbərə aldı yol,
Maya, Kabilə, Mərğə həm saldı yol.
Çatıb hər yerə, qurdu məclis, büsat,
Şərab ilə, mütrüblə əyləndi şad.
Açıq bir ürəklə çatıb Kabilə,
Deyərdi, gülərdi xoş əhval ilə.
Var idi igid, varlı bir hökmdar,
Adı Mehrab idi, özü bəxtiyar.
Boyu sərv, üzü gül kimi tazə-tər,
Yerişdə deyərdin ki, kəklik səkər.
Ağılca, ürəkcə o müdrik cavan
Baxımdaydı filc üssəli pəhləvan.
O, Zöhhakın övladlarından idi,
Eli, məskəni Kabilistan idi.
Samın qarşısında qalıb naəlac,
Hər il göndərərdi ona bac, xərac.
Tutunca o, Sam oğlu Zaldan xəbər,



Tədarüklə çıxdı yola bir səhər.
Ərəb atları – tirmədən çulları,
Ağır xəzinəylə həbəş qulları...
Qızıl bir həmayil zəbərcədnişan,
Cəvahirli bir tac edib ərməğan.
Belə bir xəbər çatdı Sam oğluna
Ki, Mehrab qonaq gəlmək istər ona.
Qəbul etdi hörmətlə Mehrabı Zal,
Dedi: – Mənzilimdə qurun cah-cəlal!
Açıb pəhləvanvari bir süfrə də,
Böyüklərlə əyləşdilər süfrədə.
Qədəh verdi saqi ələ dalbadal,
Nəzər saldı Mehraba Sam oğlu Zal.
Onu xoşladı görkəmindən haman,
Ürəkdən sevib, oldu çox mehriban.
Yemək bitdi, qalxdı qonaq süfrədən,
Qonaqçı onu bir də süzdü həmən.
Dedi bir yaxın dostuna Zal-zər,
Bu əndama məxsusdur altun kəmər.
Baxışlar yönəldi bütün Mehraba,
Dedi məclis əhli ona: Mərhəba!
Dedi gəldi sərkərdələrdən biri,
Dedi: – Var evində onun bir pəri.
Gözəllikdə vəsfi cahanı gəzər,
Günəşdir üzü, cismi nurlu səhər.
Sədəfdir vücudu, sədəfdən də ağ,
Boyu sərvdir, çöhrəsi bir çıraq.
Gümüş peykərə müşkdən bir kəmənd
Başından olubdur ayağına bənd.
Yanaq – nar gülü, ləbləri – nardənə,
Bəzənmiş iki narla mərmər sinə.
İki nərgizə oxşayır gözləri,
Qara kirpiyi sanki qarğa pəri[30].
Qələm qaşları – bir çəkilmiş kaman,
Oxu – nazü qəmzə, gözü – ox atan.
Eyibsiz gözəl varsa, təkcə odur,
Onu kim görürsə, inan, məst olur.

Zalın əsdi qəlbi, qızardı üzü,
Tükəndi qərarı, qaraldı gözü.
Gecə əyləşib, hey fikirləşdi Zal,
Yeyib yatmadı, qalmadı onda hal.
Günəş dağ başında göründü səhər,
Bəyaz don geyindi cahan sərbəsər.
Qəbula hazırlaşdı Dastani-Sam,
Düzüldü qoşun vermək üçün salam.
Gəlib durdu sərkərdələr cərgəyə,
Böyüklər qabaqda otursun deyə,
Çadırda oturmuşdu Zabil şahı
Çıxıb gəldi Mehrab – Kabil şahı.
Yaxınlaşdı Mehrab, sərkərdələr
Nizamla durub şaha baş əydilər.
Gedəndə Zalın yanına hökmdar,
Deyərdin ağacdır, verib bollu bar.
Onu görcəyin şad olub pəhləvan.
Qılıb ehtiram, oldu çox mehriban.
Soruşdu ki, məndən nədir istəyin?
Apar təxtü tacım, qılıncım sənin.
Cavab verdi Mehrab: – Ey şəhriyar.
Səadətli, alnıaçıq hökmdar,
Mənim təkcə bir istəyim var, yəqin,
Bu arzu səninçin deyildir çətin.
Evimdə qonaq ol mənə bir kərə,
Ucalt başımı lütf ilə göylərə.
Dedi Zal: – Bu əmrə tapılmaz çara,
Sənin bərigahın hara, mən hara?
Buna Sam icazə verərmi məgər?
Çatarsa mənim şahıma bu xəbər
Ki, biz mey içib, tərdamaq olmuşuq,
Gedib bütpərəstə qonaq olmuşuq,
O, məndən olar daima bədgüman,
Bu təqsiri əfv eyləməz heç zaman.
Səni istərəm görmək hər anda mən,
Bu fikri burax, başqa şey istə sən!
Cavabında Mehrab dedi: – Afərin!
Onu sandı könlündə napak din.



Gedərkən təşəkkür, dua eylədi,
Zalın bəxtinə afərin söylədi.
Ona Samın oğlu baxıb arxadan,
Nə lazımdı vəsfində etdi bəyan.
Yolu, dini ayrıydı, ancaq yenə
Dil açdı cavan Zal onun vəsfinə.
Ona kimsə qoymazdı əsla məhəl,
Kimi gic deyərdi, kimisi dəcəl.
Görüncə, ürəkdən sevir Zal onu,
Edib söhbəti şadü xoşhal onu,
Böyüklər dil açdı onun vəsfinə,
Qızından şahın getdi söhbət yenə
Deyildi: – Gözəllikdə yoxdur tayı,
Camalı xəcalətdə qoymuş ayı
Hünər, qəddü qamət desən, ondadır
Lətafət, ləyaqət desən, ondadır.
Zalın könlünü eşq saldı oda,
Bu od yandırıb ağlı, verdi bada.
Ərəblərdə bir doğruçu pəhləvan
Demiş eşqə dair gözəl dasitan.
Həyatım boyu məskənimdir yəhər,
Fələk gizlədər sirrim olsa əgər.
Nə lazım düşəm eşqə, şeyda olam?
Atıb ağlı, aləmdə rüsva olam?
Verib könlünü büsbütün eşqə Zal,
Onu yordu, sarsıtdı fikrü xəyal.
İçindən yanıb, susdu xeyli zaman.
Fələk öz işindəydi, bir qayda var:
Sevən qəlbdə səbr tutmaz qərar.

Deyirlər ki, Mehrab bir gün səhər
Gülə, sünbülə saldı bağda nəzər.
Baxıb sərv, şümşad salan sayəyə,
Qayıtdı bağından hərəmxanəyə.
Nə gördü ki, Rudabə Sindoxt ilə
Günəştək işıq saçmış o mənzilə.
Bəzənmiş, deyən bağda bir cüt çiçək.
Verir onların ətri ruha bəzək.

Baxıb, qaldı heyran o, Rudabəyə,
"Yaman gözdən, ey tanrı, hifz et!" – deyə.
Nə gördü ki: bir sərvdir ayqabaq,
Qoyub başına müşki-ənbər papaq,
Olub qərq diba ilə gövhərə,
Verilmiş behişt hüsnü o dilbərə.
Gövhər saçdı Sindoxt innabdan[31],
Soruşdu nəvazişlə Mehrabdan:
– Necə keçdi vaxtın bu gün, söylə, gəl?
Görüm üstünə qalxmasın xain əl.
Bizə Samın ağsaçlısından danış,
Olubmu yuva əhli təxtlə tanış?
O, insanlığa vərdiş etmişmi heç?
Böyüklər gedən yolla getmişmi heç?
Cavab verdi Mehrab: – Ey dilbərim,
Güləndamlı sərvim, ayüzlü pərim!
Bu aləmdə yoxdur elə pəhləvan
Ki, Zali-zərə tən tutulsun, inan!
Nə eyvanda var eylə nəqşü nigar,
Nə meydanda vardır elə namidar.
O filcüssəli, şirürəkli cavan,
Səxavət də dəryaları andıran
Çıxar təxtə, ətrafa daş-qaş səpər,
Döyüş vaxtı meydanda leş, baş səpər.
Üzü qarşısında solar ərğəvan,
Ağılca o müdrikdir, yaşca cavan
Qəzəbləndiyi vaxt dönər timsaha,
Yəhərdə olar qorxulu əjdaha.
Saçın ağlığı bir bəzəkdir ona,
Könüllər vurulmazmı Sam oğluna?
Eşitdikdə Rudabə bunca sözü,
Coşub qəlbi, gültək qızardı üzü,
Zalın eşqi ilə olub biqərar,
Yeyib yatmağı tərk qıldı nigar,
Məhəbbət olub ağlının afəti,
Dəyişdi onun xülqü, xasiyyəti.



Qızın xidmətində olan beş kəniz
Tutardı onu canlarından əziz.
Hamı türk idi, işgüzar, mehriban,
Sədaqətdə vermişdilər imtahan.
Dedi: – Ey ağıllı kənizlər, bu gün
Demək istərəm sirrimi büsbütün.
Dedi: – Siz mənimlə ki, sirdaşsınız,
Qəmimdə, sevincimdə yoldaşsınız.
Sizi istərəm daima bəxtiyar.
Məni dinləyin, söyləyim aşikar.
Coşar eşqdən bir dəniztək ürək,
Çıxar göylərə ahım, ağlar fələk.
Könül verdiyim yar – Sam oğludur
Yuxumda belə fikrü zikrim odur.
Onun eşqi ilə könül qəmdədir,
Xəyalı mənim odlu sinəmdədir.
Deyin: – indi bu dərdə dərman nədir?
Mənə siz verən əhdü-peyman nədir?
Gəlin, axtarın dərdimə bir çara
Ki, canım qəmü qüssədən qurtara...
Dedilər ki, sən qızların şahısan,
Xanımlar başının şərəf tacısan,
Tutub şöhrətin Çinlə Hindistanı,
Gözəllər içində sənə tay hanı?
Boyun – sərvi bağ içrə gözdən salar,
Üzün qarşısında Günəş mat qalar.
Üzündə sənin qalmamışmı həya,
Atan hörmətini verirsən zaya?
Bir oğlan ki, atmış dağa Sam onu,
Nə üzlə açırsan ona qoynunu?
Onu dağda quş bəsləmişdir deyə,
Görənlər deyər: oxşayır vəhşiyə...
Cahanı tutub hüsnünün şöhrəti,
Olub surətin evlərin ziynəti.
Ər olmaq üçün sən kimi dilbərə
Günəş də enər, bil ki, göydən yerə.
Eşitdikdə Rudabə bu sözləri,

Alovlandı qəlbi, əsib dizləri.
Acıqla bağırdı ki, bəsdir daha,
Dözə bilmirəm mən belə izaha.
Qəzəbdən saraldı, bozardı üzü,
Çatıldı qaşı, qanla doldu gözü,
Dedi: – Mən nə məna verim boş sözə?
Əbəsdir, qulaq asmağım da sizə.
Nə qeysər gərəkdir, nə fəğfuri – Çin[32],
Na tac sahibi şahi – İranzəmin.
Mənim sevdiyim Zal – Sam oğludur,
O, aslanbiləkli, ucaboyludur.
Qoca ya cavan, mehribanımdır o,
Gözüm nuru, cismimdə canımdır o.
Könül vermişəm mən ona görmədən,
Mənəm vəsfini dinləməklə sevən.
Üzə yox, tükə yox, ona aşiqəm,
Hünər sahibi aslana aşiqəm.
Kənizlər onun dərdini dinlədi,
Ürək ağrıdı, ah çəkib inlədi.
Dedilər ki, biz qulluğunda varıq,
Kənizik sənə, dayəyik, dildarıq.
İtaətdəyik biz, nə əmr eyləsən,
Xeyirdir, səlahdır, nə sən söyləsən
Biri söylədi: – Sərv boylu gözəl,
Bu sirrə gərək tapmasın kimsə əl
Gərəkdirsə, çadu edək birsayaq,
Bütün gözləri sehrlə bağlayaq.
Edək görməyə əzm o dərgahı biz,
Aya çatdıraq qəhrəman şahı biz.
Dodağı gülümsündü Rudabənin,
Ona gəldi xoş sözləri dayənin.
Dedi: – Tapmış olsan bu dərdə əlaç,
Elə bil əkirsən cavan bir ağac
Ki, yaqut olar şaxəsində bəhər,
Onun sayəsində canım dincələr.

Durub dayə ayrıldı Rudabədən,
Əlac arxasınca düzəldi həmən.



Kənizlər verib özlərinə bəzək,
Düzüb zülfünə hər biri gül-çiçək,
Burub ətir zülfə, boyaq rüxsara,
Gedib çatdılar hər beşi Rudbara.
Yazın ilk ayıydı, o çay sahili
Zalın ordugahıydı, həm mənzili.
Gülüzlü kənizlər bura gəldilər,
Çayın sahilində çiçək dərdilər.
Uca taxtdan gördü Zal onları,
Dedi: – Kimdir o gül xiridarları?
Cavab verdilər: – Ey böyük pəhləvan,
Yəqindir ki, Mehrab, o qəhrəman,
Belə əmr edib ki, kənizlər bu gün
Çiçək toplasınlar böyük qəs rüçün.
Qulundan kaman, ox tələb etdi Zal,
Pəriüzlülər səmtinə getdi Zal.
Piyada gedib, axtarırdı şikar,
Baxıb gördü: bir quş çaya baş vurar.
Yaya ox qoyub gülyanaqlı qulam,
Kamanı Zala verdi, Dəstani - Sam.
Həmin anda quş qalxdı birdən sudan,
Nişan aldı, atdı oxu pəhləvan.
Uçan quş yerə düşdü bir daş kimi,
Qan axdı, qızardı su daş-qaş kimi.
Qula söylədi Zal: – Özünü yetir,
Şikarı o taydan alıb da gətir!
Qayıqla zirək türk çaydan keçib,
Kənizlər önündə o taydan keçib,
Gedərkən ona söylədi bir kəniz:
– Bizə bir deyin ki, görək kimsiniz?
Bu fil cüssəli, şir biləkli cavan
Hara şahıdır, kimdir əldə kaman?
Ox atmaqla heyran edibdir məni,
Ona yox bəla, olsa min düşməni.
Dedi qul: – O şirpəncə Sam oğludur,
Bütün ölkənin padişahı odur.
Bu dünyanı başdan-başa gəzsələr,
Tapılmaz onun misli sahibhünər.

Qula söylədi dayə: – Gəl, az danış,
Kifayətdir, oldum onunla tanış.
Sarayında var Mehrabın bir sənəm,
Deyildir şahından sənin heç də kəm
Boyu sərvdir, cismi şəffaf, büllur.
Başında, deyən müşkdən tac durur,
Gözü vəhşi nərgiz, qaş isə kaman,
Gümüşdən qələm burnu vardır, inan!
Xəsis qəlbitək dilbərin ağzı dar,
Saçı həlqə-həlqə topuqda durar,
Üzü tər çiçəkdir, xumardır gözü,
Teli müşkdür lalə açmış üzü.
Dodaqlarına dəyməmişdir nəfəs,
Edər aləmə tək onun hüsnü bəs.
Sözə başladı birbəbir dayələr,
Öyüb durdu Rudabəni beş nəfər.
Hamı istəyirdi Zalı bəxtiyar,
Ona qismət olsun o nazlı nigar.
Belə söylədi qul ki – Düşdüm başa,
Gözəldir günəş ayla çıxsa qoşa.
Üzümdən mənim gəlməyir, doğrusu,
Güman etmirəm ki, gələr arxa su.
Qadından qaça bir dilavər əgər,
Asanlıqla öz sirrini gizlədər.
Qız heç olmayaydı əzəldən gərək,
Ağır sözdən əsla yeməzdi kötək.
Bir erkək qızıl quş açıb da qanad
Oturdu yumurtalar üstündə şad,
Dedi ciftinə: – Beylə yatsam əgər,
Bu yatmaqla cücə çıxartsam əgər,
Deməк, qadirəm ki, yumurta qoyam,
Ata olduğum halda, övlad doğam.
Qayıtdı gülər üzlə, şadlıqla qul,
Onu Zal sevinc ilə etdi qəbul.
Dedi: – Nə demişlər, gülürsən belə,
Ağartma dişini, tez ol, şərh elə!
Danışdı, qulu dinlədi pəhləvan,



Sevincdən Zalın könlü oldu cavan.
Dedi Reydəkə: – Ey ayüzlü qulam,
Pərəstarlara məndən ərz et səlam.
De, tərk etməsinlər hələ gülşəni,
Gülə artırım ta gövhər xərməni.
"Alıb xəzinədən gövhər, simü-zər,
Zəri-dibadan beş xələt kəsdilər.
Dedi: – Çatdırın tez pərəstarlara,
Bu sirri fəqət açmayın əğyara.
Gərək qəsrə doğru dönüb getmədən
Sifariş verim gizli o yarə mən.
Beş ayüzlü qul getdi o sahilə,
Şirin sözlə, qiymətli ənam ilə.
Verib onlara töhfə, ləlü gövhər,
Dedilər nə xahiş edir Zali-zər,
Pərəstar dedi ayqabaqlı qula:
Çətindir ki, bu sirr gizlin qala.
İki şəxs arasında söz sirr olar,
Üçüncü nəfər bilsə, məhşər qopar.
Demə sirr ona ki, bilir dörd nəfər,
Desən bircə söz – kainatı gəzər.
Xəbər ver təmiz duyğulu şahına,
Desin sirrini, sirdaş olluq ona,
Pərəstar belə söylədi astadan:
Tora düşdü bu erkək aslan yaman,
Çatarlar muradına Rudabəylə Zal,
İşin əvvəlində gəlir yaxşı fal.
Geri döndü Zal ilə xəzinədar
Ki, şah eyləmişdi ona etibar.
Pərəstar nə ki, söyləmişdi ona,
Dedi birbəbir gizli Sam oğluna,
Gülüstana yollandı başda xəyal
O kabilli dilbər ümidilə Zal.
Gülüzlü pərilər onu gördülər,
Önündə ədəblə baş endirdilər.
Pərəstarlara söylədi pəhləvan:
– Deyin, çox gözəlmi o sərvi-rəvan?

Dili, görkəmi, ağlı, xasiyyəti,
Nədir ruhları oxşayan adəti?
Mənimlə səmimi olun, düz deyin,
Yalan söyləyib, əyri yol getməyin.
Sizi doğru söz çatdırar qiymətə,
Olar doğruçu layiq hər hörmətə.
Yalan çıxsa bir kəlmə dildən əgər,
Bilin, sinəniz üstə fillər gəzər.
Qızardı, bozardı gülüzlü pəri,
Zalın qarşısında tez öpdü yeri,
Dedi: – Bu cahanda hələ bir ana
Oğul doğmayıb sən kimi mərdana.
Boyun, görkəmin Sama oxşar sənin,
Onuntək təmizqəlb, ağıllı, mətin.
Hanı sən kimi, ey igid pəhləvan,
Bir aslanbilək, qəddi sərvi-rəvan?
Üzündən damır qətrələr, tərmi bu?
Saçır ətir, müşk ilə ənbərmi bu?
O Rudabədir, bir ayüzlü nigar,
Boyu sərvdir, rəngi var, ətri var.
Vücudu lətafətdə gül, həm səmən,
Bir əndamı var ki, Süheyli-Yəmən[33].
Kəməndtək hörülmüş uzun zülfü var,
Gümüş qədd boyunca hörük sallanar.
Saçı müşkü ənbər, özü tər çiçək,
Vücuduna zümrüdlə yaqut bəzək.
Qara bir zirehdir deyərsən teli,
Eşib halqa-halqa təbiət əli,
Var on barmağı – saf gümüşdən qələm,
Yazıb hüsnü təsvirinə yüz rəqəm.
Çəkəmməz bu hüsnu Çinin rəssamı,
Onun qarşısında sönər ilhamı.
Danışdı pərəstar ilə pəhləvan
Yaxın dost kimi, çox şirin, mehriban.
Dedi: – İndi artıq duşun bir çara,
Görüşmək üçün sən bizə yol ara!
Onun eşqi könlümdə salmış məkan,



Onun vəslidir arzum ancaq, inan.
Pərəstar ded: – İznin olsun gərək,
O sərvi-rəvan qəsrinə biz gedək.
Cahan pəhləvandan ona söz açaq,
Boyu, görkəmi, vəsfinə başlayaq.
Onu ram edək sözlə, söhbətlə biz,
O dilbər bizi dinləyər, şübhəsiz.
Əgər razı olsa böyük pəhləvan,
Kəmənd əldə qəsrə gəlib alsa yan,
Kəməndi atıb bürcə qalxar azad,
Quzu ovlamaqdan olar şir şad.
Gözəllər gedib, Zal döndü geri,
Olub şad, atdı bütün qəmləri.

Kənizlər çatıb qəsrə axşam çağı,
Hərənin əlində iki gül tağı,
Bunu gördü dərban, qopardı haray,
Səsindən onun titrəyirdi saray:
Dedi: – Siz nə vaxt çıxmısız qəsrdən?
Gedərkən sizi görmədim mən nədən?
Gözəllər tutuldu durub yan-yana,
Cavab gəzdilər qəlbi dar dərbana.
Dedilər: – Bu gün başqa bir gün deyil,
Div olsun bizim yolda, mümkün deyil.
Yaz olmuş, gərək bolluca gül dərək,
Gedib gülşənə, şaxə sünbül dərək.
Cavab verdi dərban ki: – Bir iş də var,
Unutsaq onu biz, böyük səhv olar.
Hələ gəlməmiş Kabilə Zali-zər,
Sərapərdəsinə bizim şah gedər.
Görürsüzmü Mehrab çıxıb qəsrdən,
Odur, atlanıb getmək istər həmən,
Sizi əldə gül görsə o qəhrəman,
Verərsiz quru torpaq üstündə can.
Sənəmlər keçib getdilər eyvana,
Xanım qızla əyləşdilər yan-yana.
Cəvahirləri ortaya qoydular,

Sual verdi Rudabə tez biqərar:
– Deyin, Samın oğluyla nə etdiniz?
O şan-şövkəti gördünüz orda siz?
Pəriüzlərin hər beşi durmadan
Dedi: – Ey ayüzlü sənəm, o cavan
Gözəl bir igiddir, boyu sərvtək,
Var onda şahənşaha məxsus ürək.
Boyu, rəngi, ətri, – hamı yerbəyer,
Beli incə, enlikürək, sanki şir.
Var aslan kimi onda pəncə, bilək,
Odur, şah fərasətli, möbidürək.
Bütün tükləri ağdır, eybi budur,
Ona ar sayılmaz bu xırda qüsur.
Onun ağ saçını görənlər deyər:
Bəzər ərğəvanı gümüşdən sipər,
Çətin ki, onun vəsfinə söz tapar,
Əyar tut sən öz eşqini birsayaq!
Səninlə görüş vədi verdik ona,
Həmin şərt ilə yetdi söhbət sona.
Sən indi qonaq barəsində düşün,
Qayıtsaq, nədir, söylə, axır sözün?
Pərəstarlara söylədi nazlı qız:
– Nə oldu, dəyişdi belə rəyiniz?
O Zal ki, ona quş pərəstar idi,
Pərişan qoca, saçları qar idi,
Görüşdükdə oldu gülü-ərğəvan,
Gözəl, sərvqədd, laləüz, pəhləvan?
Yanında məni siz dilə saldınız?
Bu tərif üçün də ənam aldınız?
Dodaqda təbəssüm dedi bu sözü,
Utancaqlığından qızardı üzü.
Pərəstar dedi: – Bəsdir, ey aycamal,
Qonağı qəbul qeydinə indi qal.
Nəsib etdi tanrı sənə istəyin,
Xeyirlə sona varsın eşqin sənin.
Gülüstan kimi bir evi var idi,
Şəkillər, naxışlarla gülzar idi,



O dilbər özü durdu tavustək,
Bəzəkli evə verdi başqa bəzək.
O gözlərdi candan əziz bir qonaq,
Gətirdi neçə saf qızıldan tabaq.
Surahilərə tökdü köhnə şərab,
Suyu şərbətin oldu xalis gülab.
Qədəhlər qızıldı cavahirnişan,
Səpildi yerə müşk, ənbər haman.
Düzüb ortaya yasəmən, sünbülü,
Bənövşə, qızılgüllə nərgiz gülü.
Günəşüz qızın mənzilindən o gün
Ətir çulğadı kainatı bütün.
Günəş gözdən itdi, hava oldu tar,
Otaq bağlanıb, gizlədildi açar,
Pərəstar yetişdi Zalın yanına
Ki, işlər düzəlmiş, zirək olsana!
Cavan tez yola düşdü qəsrə sarı,
Belə axtarar, rəsmdir, yar yarı.
Qaragöz, gülüzlü dama çıxdı tək,
Baxırdı yola o, uca sərvtək.
Uzaqdan göründükdə Sam oğlu Zal,
Hazırlaşdı pişvazına aycamal.
Qoşa ləli açdı, çağırdı haman
Ki, xoş gəlmisən, xoş bizə, ey cavan.
Hər işdə sənə Tanrı olsun kömək,
Ayağının altına düşsün fələk.
Gülüstanı tərk elədin sərvtək,
Piyada çadırdan bura gəlməyin
Ayaqlarına oldu zəhmət yəqin.
Sam oğlu eşitdikdə bu sözləri,
Baxıb gördü ayuzlü şux dilbəri.
Dam üstü onun nuru ilə dolub,
Gili, torpağı inci, yaqut olub.
Cavabın belə verdi o dilbərin:
– Fələkdən sənin hüsnünə afərin.
Nə vaxtdır, gecə yatmayıb, ey nigar,
Göyə əl açıb, eylədim ahü-zar

Ki, bəlkə böyük Tanrımız bir kərə
Yuxumda camalın mənə göstərə.
Şadam ki, eşitdim xoş avazını,
Şirin sözlərini, zərif nazını.
Səninlə görüşmək üçün yol ara,
Sən o damda, mən yerdəyəm, qıl çara!
Zalı dinlədikdə gülüzlü pəri,
Əl atdı başından aça zülfləri.
Uca sərvdən açdı o bir kəmənd,
Bəşər müşkdən eşməmişdir kəmənd
Mənim sözlərimdə, bilin, yox yalan,
Saçı müşk idi, sanki bir cüt ilan.
Hörülmüşdü zəncir kimi yan-yana,
Sürüşdü buxaqdan qoşa püstana.
Topuqlarına ucları oldu bənd,
Yerə salladı saçlarından kəmənd.
Dedi: – Aç kəyan pəncəsi, şir əli,
İradə kəməndiylə bağla beli.
Saçımdan yapış, qalx, kəmənd yoxsa da,
Sənə saçlarım da, canım da fəda.
Ayuzlu nigara tərəf baxdı Zal,
Onu valeh etdi o saç, o camal,
Dedi: – Yox, bunu etmərəm heç zaman,
Qaranlıq olar gündüzüm də, inan!
Bu bir qəsddir canıma, ey nigar,
Həzin bağrıma sanki bir ox batar.
Hörüklərdən öpdü nəvazişlə Zal,
Fərəhləndi bu busədən məhcamal.
Qulundan kəmənd aldı, halqa edib,
Atıb bürcə, bir an sükuta gedib,
Kəmənd halqası bürcə çatdı haman,
Dama qalxdı yerdən igid, qəhrəman.
Dam üstündə görçək o şiri-nəri
Önündə baş əydi gülüzlü pəri.
Zal ilə verib əl-ələ gülüzar
Elə getdilər, sanki sərxoşdular,
Sarındı qolu Zalın o dilbərə,



Damından uca qəsrin endi yerə.
O zərli, bəzəkli evə gəldilər,
O şahanə məclisdə dincəldilər.
O ev bir behiştdi, dolu nur ilə,
Oturmuşdu Zal üzbəüz hur ilə.
Zal heyrandı o gülyanaq afətə,
Şəvə saçlara, sərvtək qamətə.
Boyunbağı, güşvarəsi, qolbağı,
Olub gövhərə qərq cənnət bağı.
Yanaqlar səmən içrə tər lalətək,
Saçı halqa-halqa eşilmiş ipək.
Oturmuş sevincək o dilbərlə Zal,
Var onda şahənşaha məxsus kamal.
Həmayil qılınc asmış o pəhləvan,
Başında tacı ləlü yaqutdan.
Öpüb bir-birini qucaqlaşdılar,
Fəqət etmədi guru aslan şikar.
Sam oğlu dedi: – Ey ayüzlü pəri,
Boyu sərvtək, hurilər sərvəri,
Mənuçehr tutsa bu işdən xəbər,
Yəqin ki, bizə manеə göstərər.
Atam Sam – Neyrəm gələr dəhşətə,
Salar etirazla məni zəhmətə.
Fəqət, bil, əziz tutmaram canı mən,
Keçib başü candan, geyinsəm kəfən,
Böyük tanrıya içmişəm and, inan,
Mən öz əhdimi qırmayam heç zaman.
Gedib xaliqə diz çöküb yalvarım,
Bir abid kimi yaş töküb yalvarım
Ki, şah ilə Samın aça qəlbini,
Yuyub rədd edə hər küdurət kini.
Əgər həqqə çatsa ünüm, fəryadım,
Olarsan mənim sevgili arvadım.
Dilə gəldi Rudabə ki, mən daha
Bir and içmişəm pak olan Allaha.
Bu peymanıma tanrı olsun həkəm:
Mən ömrüm boyu başqasın sevməyəm.

Ər olsun mənə Zali-zər pəhləvan,
Olaq bir-birinə əziz, mehriban.
Məhəbbətləri artdı andan-ana,
Ağıl getdi, düşdü həvəs meydana.
Gecə keçdi, geydi bəyaz dan yeri,
Saraydan ucaldı təbil səsləri.
Günəş aydan ayrıldı olcaq səhər,
Qılıb tərk Rudabəni Zali-zər.
Yerə enmək üçün kəmənd atdı Zal,
Düşüb getdi, könlündə min xoş xəyal.
Sanırdı özünü o gün bəxtiyar,
O ilkin şirin busələrdən xumar.

Günəş qalxdı dağ arxasından göyə
Bütün pəhləvanlar durub cərgəyə,
Ədəblə hamı Zala verdi salam,
Salam bitsə də, məclis etdi davam.
Çağırtdırdı xidmətçini Zali-zər,
Dedi: – Gəlsin əyan, sərkərdələr!
Hazır oldu möbidlər ilə vəzir,
İgid pəhləvanlar, ağıllı dəbir.
Zalın dövrəsində halay vurdular,
Qızıl təxtə əyləşdi o namidar.
Söz açdı iti dillə Dəstani-Sam,
Dodaqda təbəssüm, özü şadkam.
Əzəl başdan o xaliqi etdi yad
Ki, bundan ola möbidin könlü şad.
Dedi: – Pak, adil, böyükdür Xuda,
Ümid də ona bağlıdır, qorxu da.
Günah qorxudur, həqsə ümmid verir,
Cahanda nə varsa onun əmridir.
Önündə çökər diz məkanla zaman,
Onun vəsfinə bizdə varmı tavan?
Günəşlə Ayı gəzdirəndir Xuda,
Bizə doğru yol göstərəndir Xuda.
Odur bu gözəl kainatı quran,
İki aləm içrə odur hökmran.



Hamı bağlıdır ondakı təqdirə,
Qarışqa ayaq basmaz onsuz yerə.
Yaratmış o gündə ki, lövhü qələm[34],
Olub-olmalı əmrə çəkmiş rəqəm.
Tək – artım verə bilməyir dünyada,
Odur, hər şeyi cüt yaratmış Xuda.
Əzəl başdan aləmdə qanun budur,
Bu göydən gələn sözlə təsdiq olur.
Bəşərdir bütün aləmin ziynəti,
Bütün varlığın ondadır qiyməti.
Bu cüt-cüt həyat olmasaydı əgər,
Necə qüdrətin göstərərdi bəşər?
Gəlin, həqq verən əmri rəhbər tutaq.
Subaylıq şəriətcə olmuş yasaq.
Xüsusən, böyük nəsldən bir cavan,
Subay qalsa, ondan çəkər el ziyan.
Cavan pəhləvan evlənərsə əgər,
Olarsa bir övladı, ləzzət görər,
Əcəl çatdığı vaxt verər can rahat,
Övladı da başlar yeni bir həyat.
Ad aləmdə övladla baqi olur,
Deyərlər: bu Sam ya ki, Zal oğludur.
Oğulla tapar ziynəti tacü təxt,
Ad ondan gedərsə, qalar bunda bəxt.
Olub indi bunlar mənim dastanım
Hə güllər açıbdır mənim bustanım?
Məni tərk edibdir ağılla səbir
Deyin: bəs bu dərdə əlacım nədir?
Deməzdim, məni boğmasaydı kədər,
Başımdan ağıl uçmasaydı əgər.
Mənə Mehrabın qəsridir qibləgah,
Tapıb torpağında bu könlüm pənah.
Edib könlümü ram Sindoxt qızı,
Deyin, nə olar, sizcə Samın sözü
İcazə verərmi Mənuçehr şah?
Və ya eşqi adlandırar bir günah?
Böyük, ya kiçik, hər kişi evlənər,

Nə dindən, nə adətdən üz döndərər
Kişi arvad, arvadsa ər axtarar,
Ağıllı adamlar bunu bilməz ar.
Nədir fikri bu barədə möbidin?
Nədir rəyiniz, aşkara şərh edin!
Nə möbid ona bir cavab söylədi,
Nə də məclis əhli ona söz dedi.
Yəqindi ki, şah kinlidir Mehraba.
Ona şah Zöhhak olubdur baba.
Açıq istəməzdi desin bir nəfər
Ki, bir yerdə tutmaz bal ilə zəhər.
Görüncə ki, bir kimsə vermir cavab,
Dedi Zal ki: – Yoxdur daha məndə tab,
Mənə bəllidir susmağın illəti,
Yəqin ar bilirsiz bu söz-söhbəti,
İradə olarsa birində əgər,
O hər töhmətə mərdlik ilə dözər.
Mənə siz bu işdə kömək etsəniz,
Çətin vaxtda həm dadıma yetsəniz,
Mən ollam sizinlə elə mehriban
Ki, mislin hələ görməmişdir cahan.
Olar etdiyim yaxşılıq, xoş əməl,
Sizə qarşı bir kimsə qaldırmaz əl.
Açıldı dili sanki möbidlərin;
– Muradınca olsun bu dünya sənin!
Önündə sənin biz kiçik bir quluq,
Təəccübdən ancaq belə susmuşuq.
Bilirsən ki, Mehrab pis insan deyil,
Böyükdür, igiddir, fəqət bədəsil.
Ərəb mülkünə olsa da hökmdar,
Canında onun əjdaha qanı var.
Əgər etiraz etməsə padişah,
Onunla qohumluq deyildir günah.
Budur məsləhət, Sama bir namə yaz,
Ağıllı igidsən, fikirləş bir az!
Sənin ağlın üstündü bizdən yəqin,
Düşüncən iti, güclüdür məntiqin



Mənuçehrə qoy namə yazsın özü,
Görək nə olar hökmdarın sözü.
Mənuçehr Samı sevir can qədər,
Çətin ki, onun rəyini rədd edər.
Zal əmr eylədi, gəldi namə yazan,
Ürəkdə nə vardı, dedi pəhləvan.
Dedi: – Sama əvvəldə yazsın salam,
Ümid ilə, vəsf ilə etsin tamam,
Yazılsın əzəl xətdə Allah adı,
O olmuş bütün aləmin ustadı.
O, şadlıq verəndir, o quvvət verən,
Ay, ulduzla əflakə ziynət verən.
Ulu tanrıdan Sama min afərin,
Qılınc, gürz, covşən sənindir, sənin,
Vuruş meydanında tufan qaldıran,
Buluddan qılınc ilə qan aldıran.
Qızıl tac, kəmər bəxş edən əlləri,
Oturdan qızıl təxtə Zali-zəri.
İgiddir, hər işdə hünər göstərər,
Onun qüdrətiylə hünər yüksələr.
Mənəm o böyük qəhrəmanın qulu,
Bu can, bu ürək sevgisiylə dolu.
Necə mən doğuldum, o bilsin gərək,
Mənə nə cəfa qıldı çərxi-fələk,
İpək, xəz içində yatarkən atam,
Sanırdım ki, Simurğa mən övladam
Acından yedim hər nə quş ovladı,
Sayıldım o vəhşi quşun övladı.
Külək döydü, yandı, soyuldu dərim,
Dolub tozla, torpaq ilə gözlərim,
Mənə Samın oğlu verilmişdi ad.
Yuva sakini – mən, o, təxt üstə şad.
Belə istəyirmiş xuda, neyləmək?
Onun istəyiylə dönürmüş fələk.
Dişiylə polad əzsə bir pəhləvan,
Səsindən pələng bağrı da olsa qan,
Poladdan belə möhkəm olsa dişi,

Dönər xaliqin əmri ilə işi.
Düşübdür işim bir elə müşkülə,
Açıb söyləmək olmaz heç vəch, ilə.
Atam pəhləvan, şiri-nərdir əgər,
Yəqin ki, mənim dərdimi dinləyər,
Mehrabın qızı bağrımı qan edib,
Məni eşq odunda o büryan edib.
Gecə ulduz olmuş mənim sirdaşım,
Vurar dalğa dərya kimi göz yaşım.
Elə bir hala qalmışam qüssədən,
Bil, ağlar mənim halıma hər yetən.
Məni yandırıb yaxsa da dərdü qəm,
Rəva görməsən, atmaram bir qədəm.
Nədir indi əmrin, cahanpəhləvan?
Ağır gündə imdadıma çat, aman!
Sipəhbod atam əhdi pozmaz, yəqin[35],
Bu işdə mənə mane olmaz, yəqin
Ki, Mehrab şahın qızın mən alım,
Öz eşqimlə də dinə sadiq qalım.
Məni qaytaran gündə Əlborzdən
Camaat önündə qılıb əhd sən,
Dedin: – Çıxmaram qarşı bir arzuna;
O əhdi bugün bir yada salsana.
Bir elçi tapıb, yel kimi at çapan,
İki atla Kabildən oldu rəvan.
Buyurdu: – Bir at axsayıb qalsa, bil,
Dayanmaq sənə heç də lazım deyil.
İkinci ata min də, sürət götür,
Samın yanına tez özünü yetir.
Çapıb getdi elçi, küləkdən betər,
Polad oldu altındakı gön yəhər.
Gəlib Qorqsarana çatdı haman,
Uzaqdan onu gördü Sam pəhləvan
Ki, bir dağ döşündə gəzib şahsevar,
Ürək dostlarıyla edirdi şikar.
Belə söylədi qəmküsar dostlara,
Yanınca çapan işgüzar dostlara:



– Bir atlı gəlir, məncə kabillidir,
Yaman at çapır, bəlkə zabillidir.
Yəqin Zal onu göndərib, elçidir,
Soruşmaq gərək, bəlkə bir şey bilir?
Bu anda gəlib elçi də toxdadı.
Samı görcəyin tərk qıldı atı,
Duşub torpağı öpdu təmkin ilə,
Böyük tanrı ismin gətirdi dilə.
Alıb naməni, Sam verdi sual,
Dedi elçi nə xahiş etmişdi Zal.
Enib dağ döşündən bəri gəldilər,
Açıb naməni Sam, saldı nəzər.
Oxudu, nə yazmışdı başdan-başa,
Təəccübdən az qaldı ağlı çaşa.
Bu mətləb onun könlünə yatmadı,
Düşündü ki, fərsiz çıxıb övladı.
Dedi: – Gövhəri qəlp olan bir adam
Büruzə verər qəlpliyini müdam.
Verib vəhşi bir quş ona tərbiyə,
Odur ki, düşüb beylə bir sevgiyə.
Şikardan evə döndü qəlbi dolu,
Fikirlə, xəyalla gedərkən yolu
Deyirdi: – Onu rədd qılsam əgər,
Desəm ağlını yığ başa birtəhər,
Böyüklər yanında itər hörmətim,
Deyərlər ki, əhdə əməl etmədim.
Əgər söyləsəm: səndədir ixtiyar,
Könül hər nəyi sevsə, dadlı olar,
Bu quş yavrusuyla o divzadədən
Doğulsa uşaq, div olar mən bilən.
Fikirləşdi, iş bir yerə çatmadı,
Uzandı, fəqət bircə an yatmadı...

O gün Sam durunca yerindən səhər,
Çağırtdırdı möbidləri, gəldilər,
Söz açdı, buyurdu ki, ulduz sayan
Desin bəlkə nə göstərir asiman?

Böyük zülmdür, birləşə, doğrusu,
Bu iki cavan, sanki atəşlə su.
Fəridun Zöhhakı birdən tapar,
Qiyamət günündə qiyamət qopar.
Fələkdən bu əmrə cavab axtarın,
Edin sirrini faş ulduzların.
Bütün gün boyu neçə ulduz sayan
Səmalarda bu sirrə gəzdi nişan,
Göründü münəccimlərə aşikar:
İki düşmənin vəsli dostluq doğar,
Münəccim gəlib Sama verdi xəbər:
– Ey altunkəmər pəhləvan, müjdələr,
Sevişmişsə Zal ilə Mehrab qızı,
Belə göstərir onların ulduzu
Ki, evlənsələr bu iki novcavan,
Gələr ərsəyə bir igid pəhləvan,
Qılıncla səmanı yerə saldırar,
Şahın təxtini göylərə qaldırar.
O, bədxahların rişəsini kəsər,
O qoymaz qala vəhşi divdən əsər,
Olar məhv Səksar, Mazəndaran,
Ağır gürzünə baş əyər bu cahan.
Nə kin, nə küdurət qalar, nə savaş,
Qoyar yasdığa xalq asudə baş.
Ona söykənər cümlə iranlılar,
Onunla edər nəsliniz iftixar.
At üstündə meydana girsə əgər,
Pələnglər atın dırnağından öpər,
Edər dövrünün şahını bəxtiyar,
Onunla şahın tacı rövnəq tapar.
Münəccim sözünü edincə tamam,
Təşəkkürlər etdi gülər üzlə Sam.
Verib onlara bolluca simü-zər,
Samın könlünü tərk qıldı kədər.
Zalın elçisinə dedi: – İndi gəl!
Oturdu, danışdı fərəhli, gözəl,
Dedi: – Get, dilimdən başa sal Zalı,



Bu arzu deyildi dilə almalı,
Fəqət bağlanan əhdi mən qırmadım,
Onun eşqinə qarşı mən durmadım,
Gecə tərk edib də bu meydanı mən
İranşəhrə doğru alıb yol həmən,
Biləm rəyini padişahın gərək,
Nədir əmri şahın bu işdə görək.
Qızıldan, gümüşdən verib bir qədər,
Dedi elçiyə: – Vaxt ötürmə hədər!
O getdi, səfər fikrinə düşdü Sam,
Samı şən görüb el sevindi tamam.
Əsir eyləyib min nəfər qorqsar,
Qolubağlı saldı yola, etdi xar.
Qaranlıq gecə vaxt olunca yarı
Çölə çapdılar atlılar atları.
İranşəhrə ordu çəkib pəhləvan,
İgidlər diyarına oldu rəvan.
Zalın yanına elçi gəldi çapar,
Onu xoş xəbərlə edib bəxtiyar,
Görüncə fələk istəyincə dönər,
Səna söylədi tanrıya Zali-zər.
Olub xalqına qayğıkeş, mehriban,
Barındırdı yoxsulları pəhləvan.

Şirindil, zirək bir qadın var idi
Ki, bu eşqdən o xəbərdar idi.
Sifariş alıb gah Rudabədən,
Zala çatdırardı o dildadədən.
Olanda Zalın peyğamı hər zaman,
Qadından bilərdi o sərvi-rəvan.
Çağırdı onu Zal tez öz yanına,
Açıb mətləbi, şərh qıldı ona;
Dedi: – Tez o dildara çatdır xəbər,
De ki, Sam babamdan gəlib namələr.
Çətin gündə çox etmisən ahü-zar,
Olarsan bu tezliklə şən, bəxtiyar.
Gəlib Sam yanından geri elçimiz,

Atam razıdır, evlənək indi biz.
Danışdı qadınla o xeyli zaman,
Xəbərdən qadın da şad oldu haman,
Çevik namə yazdı, ona verdi Zal,
Yarın yanına elçi göndərdi Zal.
Qadın yel kimi çatdı Rudabəyə,
Xeyirdir xəbər, müjdəmi ver deyə,
Pəriüz ona verdi çoxlu dirəm,
Oturtdu qızıl kürsü üstündə həm.
Çıxartdı böyük bir ləçək mücrüdən,
Deyərdi "çıraqdır yanır" hər görən.
Ləçək zərdi, yaqut idi sərbəsər,
Düzülmüş qızıl üstə dürrü gövhər.
Üzük verdi bir cüt o dilbər pəri,
Sanardın fələkdə yanır Müştəri.
Dedi: – Bunları Zala çatdır ənam,
Yetir məndən o qəhrəmana salam.
Çıxanda qadın hücrədən eyvana,
Nəzər saldı diqqətlə Sindoxt ona.
Qızardı qadın qorxudan pul kimi,
Düşüb torpağı öpdü bir qul kimi.
O, Sindoxtu saldı yaman həycana,
– Tez ol söylə, kimsən? – Bağırdı ona.
Ayaq açmısan hücrəyə sən yaman,
Keçirsən önümdən məhəl qoymadan.
Cavab verdi: – Dəllallıq olmuş peşəm,
Çörəkdir səbəb, bu günə düşmüşəm.
Bəzək şeyləri məndən alsın deyə,
Çağırmışdı Rudabə bu hücrəyə.
Gətirdim naxışla dolu çəpkəni,
Cavahirnişan bir qızıl həlqəni,
Cavab verdi Sindoxt: – Tez onları
Mənə göstər, aç könlümü, ay qarı!
Dedi: – Aldı Rudabə o şeyləri,
Yenə istəmişdir bəzək ol pəri.
Dedi: – Onda göstər mənə pulları,
Qəzəb atəşim azca sönsün barı.
Dedi: – Verrnədi pul ay üzlü gözəl,



Sabah gəl dedi, sən də çək məndən əl
Qarı söyləyənlər yalandır deyə,
Hazırlaşdı Sindoxt onu döyməyə
Əl atdı, onu axtara-axtara
Çıxardı düzü, əyrini aşkara.
Gözündə qəzəb atəşi parladı,
Üzü üstə sərdi yerə arvadı.
Gözünə dəyincə o faxir libas,
Başa düşdü: Rüdabədəndir əsas.
Evi xəlvət etdi ana bağrı qan,
Fikirdən, xəyaldan başında duman.
Çağırdı qızı, əyləşib diz-dizə,
Acıqdan ana pəncə atdı üzə,
İki nərgizindən süzüb jaləni,
Yudu göz yaşıyla qoşa laləni[37]
Tutub üz dedi nazlı Rudabəyə
Ki, göydən yerə alçalırsan niyə?
De, bir yaxşılıq varmıdır, ey nigar,
Sənə etməyim gizli ya aşikar?
Niyə bivəfa olmusan, ey gözəl?
Nə sirrin var isə, mənə söylə gəl.
Bu arvad niyə hey gəlir, hey gedir,
Onu kim sənin yanına göndərir?
De, söz vermisən hansı bir oğlana
Ki, şalla üzük göndərirsən ona?
Keçən dövrdə bir ərəb tacidar
Qoyubdur bizə ad, şərəf yadigar.
Verirsən bada bu təmiz adı, kaş
Doğaydım səni doğduğum yerdə daş.
Eşitdikcə Rudabə bu sözləri,
Dikildi həyadan yerə gözləri.
Verib gözlərindən iki çeşmə baş,
Axıtdı yanaqlarına qanlı yaş.
Dedi: – Mehribanım, ağıllı ana,
Məni eşq dərdi gətirmiş cana,
Məni kaş sən doğmayaydın belə,
Alınmazdı yaxşı-yamanım dilə.
Gəlib qaldı Kabildə Zal pəhləvan,

Onun eşqidir bağrımı yandıran.
Bu dunya mənim könlümə dar gəlir,
Gecə-gündüz ahım göyə yüksəlir.
Bil, onsuz məni məhv edər dərdü qəm,
Onun bir tükün aləmə vermərəm.
Görüşdük onunla bu eyvanda biz,
Verib almışıq əhdü peyman da biz,
Samın yanına elçi də göndərib,
Zala Sam müsbət cavab da verib,
Verib elçiyə Sam yaxşı ənam,
Eşitdim nə yazmış cavabında Sam.
Sənin döydüyün binəva bu qadın
Ki, yoldun saçını, yerə tulladın,
Gətirmişdi namə, mən o naməyə
O ənamı verdim savabdır deyə.
Bu söz saldı Sindoxtu özgə hala,
O istərdi Rudabə getsin Zala,
Dedi: – Bir belə iş deyildir asan,
Cahanda hanı Zal kimi pəhləvan?
İgiddir, cavan pəhləvi oğludur,
Ağıllı, zəkalı, nəcib soyludur.
Hünər çoxdur, ancaq ki, bir eybi var,
Bu eybin önündə hünər xar olar.
Mənuçehr tutsa bu işdən xəbər,
Edər Kabilistanı zirü zəbər.
Cahandan kəsilsin deyə nəslimiz,
Silər Kabili yer üzündən təmiz.
O birtəhər yola saldı arvadı
Ki, guya əsil mətləbi qanmadı.
O bildi ki, Zal eşqi Rudabəni
Edib məst, almaz saya kimsəni.
Gəlib yatdı ağlar, könüldə kədər,
Bütün cismini sanki əzmişdilər.

Çıxıb qəsrdən gəldi Mehrab şad,
Edərdi Zalı hər zaman yaxşı yad.
Çatıb gördü, Sindoxt – o dilbər yatıb,



Pərişan, solğun, mükəddər yatıb.
– Nə olmuş, – dedi, – gəl, mənə söylə sən?
Solub gül yanağın, bikefsən nədən?
Cavab verdi Mehraba o gül üzar:
– Bu könlümdə dağlar qədər qüssə var.
Bu ali saray, bu ağır xəzinələr,
Ərəb atları, üstü zərduz yəhər,
Bu qullar ki, Allah sanarlar səni,
Bu təxt ilə tacın ki, yox düşməni,
Bu gül çöhrə, bu sərv qamət, bu can,
Bu elmü iradə, bu namü nişan,
Bu dövlət, bu şövkət var ikən belə,
Bizi saldı tale yaman müşkülə.
Qorxuram gedə şənü şövkət bada,
Nə ki, yığmışıq qismət olsun yada
Quru bir tabutda gedək biz yerə,
Ümid baxçamız da zəhər bar verə.
Əkib bəslədik zəhmət ilə ağac,
Dedik, qoy ola ziynəti-təxti-tac.
Boy atdı göyə, sayə saldı yerə,
Qara torpağa düşdü birdən-birə.
Bu imiş demək taleyin son işi,
Deyildir əbəs könlümün təşvişi.
Cavab verdi Sindoxta Mehrab ki, sən,
Yeni söz deyil, tutmusan köhnədən.
Əzəldən vəfasız qurulmuş cahan,
Ona bağlamaz bel ağıllı olan.
Biri gəldimi, digəri tez köçər,
Bu bir körpüdür, hər yaranmış keçər.
Cavabında Sindoxt dedi: – Mən deyən
Məsəldir, yozur başqa cür hər yetən.
Bu xoşbəxt möbid, o, söz ustadı
Ağac rəmzi ilə demiş övladı
Ağıllı misalla təzə söz dedim,
Sipəhbod fikir vermədi, nə edim?
Kədərlə əyildi o sərvin başı,
Yudu gül yanağlarını göz yaşı.

Eşit Samın oğlu bizə tor qurub,
O, Rudabənin beynini doldurub.
Yaxıb könlünü eşq ilə odlara,
Biz indi gərək axtaraq bir çara.
Nəsihətlərim etmir əsla əsər,
Xəyaldan qızın canını dərd üzər.
Eşitdikdə Mehrab haman bu sözü,
Əl atdı qılınca, qızardı gözü,
Bədən əsdi, oldu üzü zəfəran,
Ciyər qanla doldu, ürək oldu qan.
Qanından, dedi, indi Rudabənin
Qızıl don geyər yer üzü, bil, yəqin,
Bir anda ki, Sindoxt gördü bunu,
İki qolla qucdu onun boynunu.
Dedi: – Gör, kənizin nə söylər sənə
Qızışma, bir anlıq qulaq ver mənə!
Məni dinlə, sonra nə istərsən et,
İradə, ağıl göstərən yolla get!
O dartındı, Sindoxtu saldı yerə,
Deyərdin dönübdür o qızmış şirə,
Gərək qız uşağı doğan gündə sən,
Kəsəydim onun başını, adətən.
Pozub adəti, mən ona qıymadım,
Kəsildi bəla başıma övladım.
Uşaq ki, ata adətindən dönər,
Deyərlər haramzadədir, bihünər.
Canımdan, adımdan belə qorxuram,
Niyə qoymayırsan alım intiqam?
Mənuçehrlə Sam əgər bilsələr,
Bizə bir büsat qurmağa gəlsələr,
Göyə sovrular Kabilin torpağı,
Məhv olan elin, ölkənin novrağı.
Xəbər verdi Sindoxt: – Ey qəhrəman,
Bu haqda danışma belə heç zaman,
Nə qorxu, nə təşviş, nə fikrə dəyər,
Tutubdur igid Sam işdən xəbər,
Odur, Qorqsaranı da tərk edib,



Bu sirri bilib, razıdır ki, gedib.
Cavab verdi Sindoxta Mehrab belə:
– Yalan sözlə tutma məni sən dilə.
Mənim beynimə batmayır bu kələk
Ki, torpağa etsin itaət külək.
Yəqin eyləsəm, çəkmərəm bir ziyan,
Bu işdən kədərlənmərəm heç zaman.
Kim Əhvazdan Qəndəhara qədər
Sam ilə qohumluqdan eylər həzər?
Cavab verdi Sindoxt ki: – Başım tacı,
Deyildim yalan söhbətin möhtacı,
Mənəm qəmli gündə sənin həmdəmin,
Yaxar bağrımı odlara hər qəmin.
Sözüm doğrudur, mənsə, çoxdan hələ,
Güman eyləyirdim ki, olsun belə.
Bu iş baş tutarsa, qəribə deyil,
Neçə hadisə göstərim qoy dəlil.
Fəridun Yəmən sərvinə oldu şah,
Belə bir yolu seçdi o xeyirxah.
Yad ilə qohumluq edərsən əgər,
Olar düşmənin qüssədən xuncigər.
Xitab etdi Mehrab ona: – Durma, get,
Qızı tez yanımda mənim hazır et!
Ürəkdən acıq hissi keçsin deyə,
Dilə tutdu Mehrabı əhd etməyə.
O Sindoxta söz verdi ki: – Sən inan,
Qızın görməz əsla əlimdən ziyan.
Ağır söz desək biz ona, bil yəqin,
Bizə qarşı bağlar Mənuçehr kin.
Qoyarmı səlamət səni ya məni,
Cahanda edər xar Rudabəni
Önündə onun əydi Sindoxt baş,
Ana qəlbini tərk qıldı təlaş.
Gülər getdi versin qıza xoş xəbər,
Deyərdin: üzündə açılmış səhər.
Dedi: – Müjdə ver ki, atan, ey gözəl,
Götürmüş səninlə döyüşməkdən əl.

Bəzək tərkini qıl, geyin sadə, get,
Atan qarşısında əyil, səcdə et!
Ona verdi Rudabə aydın cavab:
– Niyə mən çəkim boş yerə iztirab.
Mənə yar ikən Samın oğlu, ana.
Niyə gizlədim, vermişəm söz ona.
Ata qarşısında duran o nigar,
Deyərdin: çiçəkdir, açıb novbahar,
O parlaq günəşdi, saray şərq idi,
Vücudu qızıl, yaquta qərq idi.
Qızıl hüsnünə qaldı Mehrab mat,
Ürəkdə böyük tanrını etdi yad.
Dedi: – Ağlın harda qalıb, ey dəcəl,
Yararmı nəcibzadəyə bu əməl
Ki, olsun pəri yar Əhrimənə?
Nə tac, nə üzük qismət olsun sənə!
Eşitdikdə Rudabə bu sözləri,
Saraldı üzü, titrədi dizləri.
Qara kirpiyilə qapandı gözü,
Kədərdən boğazda ilişdi sözü.
Ata qəlbi kinlə, qəzəblə dolu,
O, qızmış pələngtək gedirdi yolu,
Yönəldi evinə o vurğun gözəl,
Qızılgül yanaqları solğun gözəl.
Bilib Tanrını hər ikisi pənah, –
Həm ayüzlü dilbər, həm o padişah.

Xəbərçi Mənuçehrə verdi xəbər
Ki, Sam oğlu Mehrabla dostluq edər.
Deyirlər ki, Zal eşqə düşmüş yaman,
İki düşmən olmuş qohum, mehriban.
Mənuçehr, ariflərin sərvəri,
Hüzura çağırtdırdı möbidləri.
Söz açdı, dedi onlara şəhriyar:
– Bizimlə yaman başlayır ruzigar.
Pələng, şir çəngindən İranı mən
Ağılla, döyüşlə çıxartdım dünən.



Cahanda Fəridun əliylə əgər,
Xilas oldu Zöhhak şərindən bəşər,
Bu gün qorxuram, o kəsilmiş ağac
Yeni şaxə versin, nədir bəs əlac?
Olarmı ağılsız bir eşq ilə Zal
Yaratsın zəlil düşmənə cah-cəlal?
Zal evlənsə Mehrab qızıyla əgər,
Doğulsa bir oğlan, olar şiri-nər.
İti bir qılınc sanki qından çıxar
Kəsər, doğrayar, leş, leş üstə yıxar.
Ana səmtinə azca meyl eyləsə,
Bizə qarşı bir kinli söz söyləsə,
İranda qopar mütləqa şurüşər.
Tutar təxt ilə tacı biganələr.
Hamı bir ağızdan deyib afərin,
Bəyəndi ağızdan çıxan sözlərin,
Dedilər: – Sənin ağlın, ey hökmdar,
Bizim ağlımızdan çox üstün durar.
Sən o yolla get ki, ağıl göstərər,
Ağıl əjdahanı belə xar edər.
Hüzura tələb etdi şah, Nuzəri,
Böyüklərlə birlikdə o sərvəri,
Dedi: – Samı, get, qarşıla yolda sən,
Soruş, gör, nə olmuş, dönüb cəbhədən?
Əməl eyləsin söylə fərmanıma,
Yol üstü o gəlsin mənim yanıma!
Şahın oğlu qalxıb bir an durmadan,
Yola düşdü öz dostlarıyla haman.
Döyüş filləri üstə əyan, kübar
İgid Samı pişvaza yollandılar.
Cahanpəhləvan Sam eşitcək bunu,
Qəbula hazırlaşdı şah oğlunu.
Ata elçisi Nuzəri-namidar
Samın qarşısında tutunca qərar,
Çalındı onun şəninə nay, təbil,
Bəzəndi kəcavə, yedəkləndi fil;
Mənuçehr peyğamını aldı Sam,

Dedi Nuzərə: – Bu görüşdən şadam,
Mənə hər nə əmr eyləmiş hökmdar,
İtaət edib, eylərəm can nisar.
Açıb süfrə, cam aldı onlar ələ,
Mənuçehr adı gəldi ilkin dilə.
Samın, Nuzərin adına keçdilər,
Daha bir neçə sağlığa içdilər.
Gecə keçdi işrətdə, söhbətdə şən,
Səhərdi, Günəş parladı Şərqdən,
Təbil səsləri verdi köçdən xəbər,
Ərəb atları quş kimi açdı pər.
Şahın əmrinə tez əməl etdilər,
Mənuçehr dərbarına getdilər.
Samın gəlməsindən xəbər tutdu şah,
– Gəlintək bəzənsin – dedi – barigah,
Dəniztək coşub Sari, Amül o gün[38],
Şəhər əhli pişvaza çıxdı bütün,
Yenilməz Sama hörmət olsun deyə,
Tutub əldə zubin, durub cərgəyə
Qoşun çulğamışdı böyük bir düzü,
Bəzənmişdi səhra sarı, qırmızı.
Təbil, sinc səsi göylərə yüksəlir,
Xəzinə çəkən yüklü fillər gəlir.
Mənuçehr dərbarına çatdı Sam,
Atından enib şaha verdi salam.
Xoş üzlə ona baxdı şahi-cahan,
Düşüb, torpağı öpdü Sam pəhləvan,
Qoyub başına tacını hökmdar,
Tutub şirmayi təxtin üstə qərar.
Nəvazişlə yer göstərib mehmana,
Oturtdu özüylə onu yan-yana.
Dedi: – Qorqsar ellərindən danış!
O Mazəndaran divlərindən danış!
Döyüşlərdə qalib çıxan pəhləvan,
Belə söylədi: – Ey böyük hökmran!
Həmişə səlamət yaşa, şən yaşa,
Sənə düşmən ox atsa, dəysin daşa.



Gedərkən o divlər olan yurda mən,
Nə divlər, hərə şiri-nərdi, deyən,
Qaçışda var onlarda at sürəti,
Bizimkindən artıq hünər, cürəti,
Deyirlər ki, onlardır "qurdbaşlılar",
Döyüşdə pələngdən belə başladılar.
Mənim gəlməyimdən tutunca xəbər,
Qızışdı elə bil o boş kəllələr.
Şəhərdə bağırtı salıb coşdulr,
Hamı çıxdı sonra şəhərdən kənar.
Vuruşmaq üçün gəldilər meydana,
Qoşun əhli dönmüşdü bir aslana.
Qara gündü, düşdü qoşun təşvişə,
Çəkildik kaha qarşısında döşə.
Qoşun başçısı oxşayırdı divə;
Deyirlər odur şah Səlmə nəvə.
Qoşunsa, qarışqa, çəyirtkə qədər,
Nə səhra, nə dağ, nə dərə görsənər.
O vəhşi qoşun başlayanda hücum
Saraldı igidlər üzü – sanki mum.
Haman yerdə mən ordunu tərk edib,
Ağır gürz ilə tək qabaqda gedib,
Çəkib nərə at üstə aslan kimi,
Yer hərləndi səsdən dəyirman kimi.
Bizim atlılar nərədən coşdular,
Vuruşmaq üçün meydana qoşdular,
Elə etdi Kakuya nərəm əsər,
Tutub gürzümün zərbəsindən xəbər
Bu dəm fil kimi gəldi meydanıma,
Əlində kəmənd qəsd edib canıma,
Kəmənd atdı ki, bəlkə tutsun məni,
Əyildim çevik, rədd edib həmləni,
Kəyani kamanı ona tuşladım,
Polad ox qoyub, atmağa başladım.
Gətirdim atı quş kimi cövlana,
Qəzəblə neçə gürz vurdum ona,
Düşündüm başı zindan olsa belə

Əzilmiş, bütün beyni getmiş yelə.
Nə gördüm ki, tozdan çıxıb fil kimi,
Qılıncla cumur üstümə yel kimi.
Düşündüm görərkən onu, şəhriyar
Ki, bir zərbəsiylə onun dağ uçar.
O çapdı atı, mən durub gözlədim,
Nə yolla görək, mən onu xar edim?
Qürurla yan aldıqda qalxdı əli,
Mən isə yəhərdən atıb çəngəli,
Tutub bel bağından onun şir kimi,
Qopardım yəhərdən onu tir kimi,
Yerə tulladım bu dəmir qolla mən,
Naxış bağladı yerdə cansız bədən,
Görüncə, o meydanda şah oldu xar,
Qoşun əhli üz döndərib qaçdılar.
Qoşun dəstə-dəstə düşüb çöllərə,
Qaçırdı hara gəldi: dağ, çöl, dərə,
Mənuçehr eşitdikdə bu sözləri,
Ucaldı başı, parladı gözləri.
Gecə gündüzü yormuş idi deyə
Çəkildi Günəş dağda dincəlməyə.
Samın söhbətin dinləyib hökmran,
Qurub çal-çağır məclisi-şadman,
Samın sağlığına içib sübhədək,
Bu söhbət gecə ömrün etdi gödək.
Açıldı səhər, dolçağın barigah,
Qəbula hazırlaşdı təxt üstə şah,
Qoşun başçısı Sam – igid pəhləvan
Mənuçehr hüzuruna oldu rəvan.
Sama söylədi padişah: – İndi sən
Götür başçılardan kimi istəsən,
Get Hindistana, Kabilə od qala,
Gərək Mehrabın qəsri viran qala!
Aman vermək olmaz ona heç zaman,
Dönər əjdahaya qalarsa ilan.
O gec-tez bizə qarşı üsyan edər,
Pozar sülhü aləmdə, min qan edər.



Gəz, axtar, tanı kim ona arxadır
Böyükmü, kiçikmi, aman vermə, qır!
Bədəndən ayır başların, at yerə,
Kəsək Zöhhakın nəslini bir kərə.
Mənuçehrə aydın cavab verdi Sam
Ki, şah əmrini mən yerə salmaram,
Öpüb təxtini, möhrünə qoydu üz
Ki, yeni mənimçün əzizdir bu söz,
Çapıb atları yel kimi dördnala,
Haman gün qoşunla düzəldi yola.

Şah ilə Samın verdiyi bu qərar
Zala, Mehraba oldu çün aşikar.
Kədərlə Kabildən ola çıxdı Zal,
Qanad açdı quştək ürəkdə məlal.
Deyirdi: – Atam sanki bir əjdaha,
Nəfəs salsa dünyanı yandırmağa,
Əgər Kabilistana qəsd eyləsə,
Gərək başımı öz əliylə kəsə.
Yetişdi Samın yanına bağrı qan,
Ürəkdə kədər, qəm, başında duman.
Yenilməz Sama gəldi, çatdı xəbər
Ki, oylağına körpə aslan gələr.
Qoşun əhli pişvaza at saldılar,
Ələ padişah bayrağın aldılar.
Hamı yol boyunca durub çəkdi səf,
Baxırdın: qoşundur tamam hər tərəf.
Asıb fillərə rəngli bayraqları:
Yaşıl, qırmızı, lacivərdi, sarı,
Olarkən oğulla ata üzbəüz,
Atından düşüb Zali-zər, çökdü diz,
Ata qarşısında yeri öpdü Zal,
Hal-əhval tutub Sam, verdi sual,
Ərəb atları üstünə qalxaraq,
Deyən, parladı bir dağ üstündə dağ.
Yan aldı ona şanlı sərkərdələr,
Belə söhbətə başladı bir nəfər

Ki, səndən atan incimişdir yaman,
Get, üzr istə ondan, bağışlar, inan.
Cavab verdi: – Qoy incisin, mən şadam,
Əli varsa, öldürsə xoşdur, atam,
Atam ağlını yığsa bir an başa,
Mənim qəlbimi vurmaz əsla daşa,
Acıqla, qəzəblə danışsa əgər,
Cavabım onu ağladar, tərlədər.
Deyib güldülər yol boyu atlılar,
Gəlib Sam dərgahına çatdılar.
Atından enərkən Zala baxdı Sam,
Dedi: – Xeyir ola, gəlməyindən şadam.
Atası önündə cavan pəhləvan
Ədəblə öpüb torpağı, durmadan.
Samın vəsfini ilkin aldı dilə,
Qoşa nərgizindən su səpdi gülə
Ki, ey namidar pəhləvan, şən yaşa,
Ədalətlə, izzətlə ol tən, yaşa.
Qılıncın ki, üstün gələr almasa,
Döyüşdə cahanı batırsın yasa,
Döyüş vaxtı at salcağın cövlana,
Cəsarətlə ordu girər meydana.
Çatarsa yeli gürzünün göylərə,
Səpər pultək ulduzları göy yerə.
Ədalətdə dünyada var şöhrətin,
Ağıldır, zəkadır sənin xilqətin.
Ədalətlə etdin bütün xalqı şad,
Cahan oldu insafın ilə abad.
Mən isə sənin oğlun olsam belə,
O insafdan almadım pay hələ.
Quru yerdə quş bəsləmişdir məni,
Ola bilmərəm bir kəsin düşməni.
Özüm bilmirəm ki, günahım nədir?
Bu dünya mənimçin ələmxanədir.
Atamdır mənim Sami-Neyrəm əgər,
Gərək ki, mənimçin sayılsın hünər
Doğulcaq, məni sən özün tulladın,



Saraydan alıb, dağ-daşa yolladın,
Müsibətlərə saldın öz körpəni,
Yanar odlara atdın onda məni.
Sən Allaha qarşı çıxıb aşkara,
Dedin: – Bu nədən ağ olub, o qara?
Mənə yer-göyün tanrısı oldu yar,
Pərəstarım oldu o pərvərdigar.
Bu gün gürz ilə, tac ilə, təxt ilə,
Xəzinə, qoşunla işıq bəxt ilə,
Sənin əhdi peymanını qırmadan,
Gedib Kabilistanda saldım məkan.
Demişdin ki, incitmərəm mən səni,
Bara çatdırıb əkdiyim tingəni,
De, Mazəndarandan hədiyyən bumu?
Alıb Qorqsarandakı ordunu,
Gəlibsən bu yurdu viran etməyə,
Mənə verdiyin əhdi dandın, niyə?
Budur, mən önündə sənin durmuşam,
Nə fərmanın olsa, boyun burmuşam.
Mişar al, məni kəs əgər istəsən,
Fəqət Kabil haqqında söz açma sən!
Zala diqqət ilə qulaq asdı Sam,
Yəqin etdi ki, doğru söylər tamam.
Dedi: – Doğrudur bu, düşünsən əgər,
Sözün, düzlüyünə dəlalət edər.
Həmişə mən haqsızlıq etdim sənə,
Nə etdim sənə, gəldi xoş düşmənə,
Sənin istəyin təkcə məndən budur?
Darıxma, yerində mətanətlə dur!
Qızışma belə, qoy əlac axtarım,
Suyu bəlkə məcrasına qaytarım.
Yazım şaha bir namə, həqqə pənah,
Apar öz əlinlə şaha ver sabah.
Nə lazım gəlirsə, salım yadına
Ki, çatsın ədalətlə imdadına.
Ümidim budur, həqq özü yar ola,
Bütün arzu, istəklərin var ola.

Gəlib qarşısında oturdu dəbir,
Açıb mətləbi, söylədi birbəbir,
Birinci xuda vəsfini yazdılar
Ki, ölməz, həmişə qalar bərqərar.
Varıq, ya ki, yox, yaxşıyıq, ya yaman,
O tək xaliqə bəndəyik hər zaman,
Yaranmış cahan qüdrətiylə onun,
Fələk dövr edir hikmətiylə onun,
Günəş, ulduz, Ay tanrısı, padişah
Mənuçehrə olsun həmişə pənah.
Döyüşdə yağar heybətindən zəhər,
Ziyafətdəsə Ay kimi nur səpər.
Onun gürzüdür ölkələr fəth edən,
Onun sayəsində yaşar xəlq şən.
Fəridun şahın bayrağın qaldıran,
Pələng kimi meydanda məğrur duran,
Toxunsa əmudun yeli bir dağa,
Atın dırnağından dönər torpağa,
O insaf, o pak qəlb ki, səndə var,
Qoyun qurd ilə bir yeyib, bir yatar,
Verib ömrümü xidmətində başa,
İgidliklə sinnim çatıb altmışa.
Boyanmaqda kafur tozuyla saçım,
Belə oldu aydan, günəşdən tacım.
Sənə xidmət üçün kəmər bağladım,
Döyüşlərdə yüksəldi şənim, adım,
Cilovtökmə, gürz əldə atsaldıran,
Cahanda hanı mən kimi pəhləvan?
Salıb gürzümün zərbəsi qorxuya,
Dönüb qəlbi nər divlərin də suya,
Əgər gəlməsəydim bu dünyaya mən,
Olardımı yağıları məhv edən?
Kəşəfruddan qalxan o əjdaha
Ki, dünyanı döndərdi matəmgaha,
Bütün ölkəyə odlu qurşaq kimi,
Sarınmışdı bir silsilə dağ kimi,
Onun qorxusundan əsərdi cahan,



Gəlib dəhşətə xəlq ağlardı qan,
Nə quşdan olardı fəzada əsər,
Nə də yer üzündə gəzən vəhşilər.
Salınca nəfəs quzğuna bir kərə,
Gələrdi başı üstə göydən yerə.
Axıtdıqda ağzından hər an zəhər,
Dönərdi külə yer üzü sərbəsər.
Nəhəngi dənizdən çəkərdi kənar,
Fəzada üqabı edərdi şikar.
Nə insan, nə aslan, nə quş, nə kədi
Onun pəncəsindən aman görmədi.
Onun şərrini sovmağa ölkədən
Hədərdi ümid gözləmək özgədən.
Ulu Tanrının qüdrəti oldu yar,
Edib qorxunu xatirimdən kənar.
Yaraşmazdı qorxmaq mənim adıma,
Oturdum nəhəng cüssəli atıma,
Ağır gürzü qoydum yəhər qaşına,
Kaman əldə, qalxan çəkib başıma,
İnamla gedirdim elə bil nəhəng,
O, bir od nəfəsliydi, mən odlu çəng,
Hücum əjdahaya edən gündə mən
Uğurlar dilərdi mənə hər yetən.
Çatanda nə gördüm: başı dağ təki.
Kəmənddən uzundu başında tükü.
Dili bir kərəndi, deyən qapqara,
Açıb ağzını, saldı od yollara.
İki göz – iki göldü qanla dolu,
Məni gördü, hiddətlə kəsdi yolu.
Gözümdə geniş bir dənizdi cahan,
Qara tüstüyə çulğanıb asiman.
Səsindən düşüb aləmə vəlvələ,
Dəniz kimi doldu o çöl zəhr ilə.
Bu an nərə vurdum bir aslan kimi,
Qəzəb coşdu qəlbimdə ümman kimi,
Hazırdı əlimdə ox ilə kaman,
Qoyub çilləyə, ağzın aldım nişan.

Tikildikdə ağzındakı bir cəhəng,
Dili sallana qaldı xortumtək.
Alınca ikinci oxumla hədəf,
Tikildi cəhənglərdə digər tərəf.
Üçüncü oxu ağzına ortadan
Vuranda axıb sel kimi gəldi qan.
Cumanda mənim üstümə əjdaha,
Ağır gürzümü qaldırıb bir daha,
Dilimdə böyük tanrının pak adı,
Sürüb üstünə filbiçimli atı,
Başından elə gürz vurdum ki, mən,
Səmadan yerə dağ düşürdü, deyən.
Əzildi başı bir nəhəng fil kimi,
Zəhər axdı, getdi coşan Nil kimi.
O bir zərbəm ilə düşüb verdi can,
Qalandı yerə beyin dağtək, inan.
Kəşəfrud boyandı sarı qırmızı,
Nəfəs aldı, rahat bütün yer üzü.
O dağ başlarında kişi, həm qadın
Təşəkkürlə yad etdilər Sam adın.
Böyük bir bəla idi o əjdaha,
Tamaşaya gəldi bütün el-oba.
Mənə Sami-Yekzəxm ləqəb verdilər[39],
Nisar etdilər başıma zər, gövhər.
Külə döndü əynimdəki covşənim,
Səpildi yerə, qaldı üryan tənim,
Atım üstə yandı zirehli yəhər,
Hələ indi də yançağım inciyər.
O yerlər neçə il bəhər vermədi,
Şorandan savay bitki də görmədi.
Sənə qarşı olduqda baş qaldıran,
Salardım ayaq altına hər zaman.
Atım hansı meydanda dönsə yelə,
Qaçardı o meydandan aslan belə.
Neçə il ötüb keçdi, ey padişah,
Mənə atdır eyvan, yəhər – taxt, ah!
Bütün Qorqsaranla Mazəndaran



Əlimlə sənə tabe oldu, inan!
Yuva-yurdumu salmadım mən yada,
Səni bəxtiyar istədim dünyada.
Budur, indi mən qarşına gəlmişəm.
Bu gürzümlə qarşında baş əymişəm,
Cavanlıq keçib getdi, ey hökmdar,
Əyir qəddimi get-gedə ruzigar.
Mənə bir kəmənd atdı altmış yaşım,
Zaman qarşısında əyildi başım.
Çatıbdır Zala növbə, gürzü kəmər
Ona tapşırılsa, məni şad edər.
Onu bircə arzu salıb təşvişə,
Gəlir aləmin şahına xahişə,
O bir arzudur ki, onu haqq sevər,
Xeyir işlərə tanrı fərman verər.
Bir iş tutmadıq sənsiz, ey padişah,
Qula üzlü olmaq günahdır, günah.
Yəqin ki, eşitmiş böyük hökmdar,
Mənimlə Zalın əhdi peymanı var
Ki, rədd etməyim, olsa hər arzusu,
Bu günlərdə ancaq, sözün doğrusu,
Gözü yaşlı gəldi mənim yanıma,
Onun halı saldı şərər canıma.
Dedi: – Öz əlinlə məni çək dara,
Gedib yaxma sən Kabili odlara.
Onu dağda quş bəsləmişdir deyə
Yayılmış adı hər elə, ölkəyə.
O, Kabildə ayüzlü canan görüb,
Boyu sərv, hüsnü gülüstan görüb,
Edibdir onu eşq divanə, ah!
Qəzəblənmə bu işdən, ey padişah!
Məhəbbət salıbdır onu bir hala,
Görən ağlayır halına az qala.
Günahsız yerə verdiyimçin əzab,
Ona əhdü peymanım olmuş cavab,
Könül arzusuyla gəlir yanına,
Boyun əyməyə şah fərmanına.

Kiçik bir quluntək onu dinlə sən,
Xətadır – ağıl öyrədəm şaha mən.
Bu minval ilə namə oldu tamam,
Alıb Zali-Dəstan onu şadkam,
Günəştək tutub Şərqə üz, getdi tək,
Rahatlanmadı, yatmadı sübhədək.
Soyundu gecə zil qara paltarı,
Üfüq güldü, saçdı şəfəq ağ, sarı.
Atından enib Zal addımladı
Sarayda təbil, kərrənay gurladı.
Əlində Samın naməsi, pəhləvan
Mənuçehr qəsrinə oldu rəvan.

Gedib Kabilə çatdı bu dasitan,
Acıqlandı Mehrab, başında duman,
Tələb etdi Sindoxtu, gəlcək həmən
Qəzəblə gileyləndi Rudabədən.
Dedi: – Məndə yoxdur o taqət, o tab,
Mənuçehr meydanda alsın cavab.
Əlacım budur ki, qızımla səni
Çəkib öldürəm, görmədən düşməni
Ki, bəlkə İran şahı razı qala,
O rahat ola, el-oba kam ala.
Əgər Kabilə Sam bassa ayaq,
Durar gürzünə qarşı hansı qoçaq?
Qulaq verdi Sindoxt bu sözlərə,
Çəkildi yazıq xəlvəti bir yerə,
Ağıllı, zəkalı qadın bir ara,
Oturdu, duşündü: tapılsın çara.
Çara tapdı, əl sinədə gəldi tez,
Cəsarətlə şaha tərəf tutdu üz,
Dedi: – Bir sözüm var, deyim, sən eşit,
Eşit, sonra öz bildiyin yolla get!
Canınçın gərəkdir bu sərvət, bu mal,
Verib malını, canına möhlət al.
Gecə, bil, uzun olsa da hər qədər,
Cahanı qaranlıq yenə tərk edər.



Günəş çeşməsi aləmə nur yayar,
Bədəxşan ləli kimi parlayar.
Cavab verdi Mehrab: – Nağıl söyləmə,
Məni boş məsəllərlə ram eyləmə!
Sözün var, de, qurtar, qoru canını,
Yoxunsa, kəfən gey, töküm qanını!
Dedi: – Tapmışam, mən bilən, bir əlac
Ki, qan tökməyə qalmasın ehtiyac.
Samın yanına yollanım mən gərək,
Ona dil töküm, bəlkə etdi kömək.
Nə lazımsa, şərh eyləyim üz-üzə,
Ağılla nəhayət verim çiy sözə.
Əziyyət mənim, varla dövlət sənin,
Kilidini tapşır mənə xəznənin!
Cavab verdi Mehrab: – Al, bu açar,
Nə qəm, getsə sərvət, bizə can qalar.
Götür qul, kəniz, at, qatır, təxtü tac,
Özünlə apar, müşkülə et əlac!
Xilas eylə oddan gözəl Kabili,
Gərək solmasın gülşənində gülü,
Dilə gəldi Sindoxt: – Ey Şəhriyar,
Tutursan varı, dövləti beylə xar,
Çara tapmağa göndərirsən məni,
Söyüb-incidərsənmi Rudabəni?
Məni sarsıdan da onun fikridir,
Onun barəsində mənə əhd ver!
Mən öz qeydimə qalmıram, sən inan,
Onun dərdidir canıma od vuran.
Verib əhdü peyman Mehrab ona,
Hazırlaşdı Sindoxt yola mərdana.
Gül əndamına geydi diba və zər,
Ağıllı başa düzdü yaqut, gövər,
Xəzinəni açdı ki, etsin nisar,
Qızıl pul götürdü otuz min dinar,
Qızıl tovq boynunda altmış pəri,
Əlində qızıl cam tutub hər biri,
Töküb camlara mişk, kafur, zər,

Zəbərcədlə yaqut, inci, gövhər,
Alıb qoydu qırx dəst faxir libas
Ki, sərraf edərdi gövhərlə qiyas[40]
İki yüz qılınc, qınları simü-zər,
Zəhərlə sulanmış iti dəşnələr.
Tükü qırmızı yüz dəvə aldılar,
O qədər qatır da yola saldılar.
O, şahanə bir tac aldı ələ,
Həmayilə, güşvarə qolbaq ilə.
Uca bir qızıl taxtə sanki fələk
Verib hər cürə gövhər ilə bəzək.
Çatıldı zərif xalçalar dörd filə,
Hazırlaşdı düşsün yola qafilə.

Bitincə bu işlər oturdu haman.
Səfər əzmi qıldı qadın pəhləvan,
İgidlər kimi qoydu rumi papaq,
Qaçmışda külək bir ata qalxaraq,
Qürurla çatıb Sam dərgahına,
Nə ad vermiş idi, nə peyğəm ona.
Yetişcək dedi: – İş bilən bir nəfər
Cahan pəhləvana yetirsin xəbər
Ki, zabilli sərkərdənin yanına
Gəlib elçi Kabildən, istər ona
İgid Mehrabın peyğamın bildirə,
Cahan fatehi Sama baş endirə.
Gedib, Sama verdi xəbər pərdədar.
Dedi Sam: – Gəlsin, ona izn var.
Atından yerə endi Sindoxt o dəm,
Sipəhbod hüzuruna qoydu qədəm.
Öpüb torpağı, göstərib ehtiram,
Yetirdi böyük pəhləvana salam.
Kəniz, qul, qatır, at, hədiyyə nə var,
İki mil boyunca dayanmışdılar.
Dedi: – Töhfədir bunlar, ey pəhləvan.
Görüb onları Sam, çaşdı haman.
Əli sinədə, baş aşağı salıb,



Deyərdin ki, sərxoş xəyala dalıb.
Düşündü: bu var-dövləti göndərən
Nədəndir, qadın elçi seçmiş, görən?
Qəbul eyləsəm bunları mən əgər,
Mənuçehr məndən yəqin inciyər.
Qəbul etməsəm, Zal məndən qaçar,
O, Simurğtək inzivayə uçar.
– Qəbul eyləyin, – söylədi, – bunları!
Hədiyyə gələn filləri, qulları,
Zalın xəznədarına təhvil verib,
Deyin: Kabilistan şahı göndərib.
Pəri üzlü Sindoxt olub şadkam,
Bu işdən yəqin etdi: yumşaldı Sam.
Görüncə qəbul etdi var-dövləti,
Əmin oldu: sönmüş onun hiddəti.
Üç ayüzlü dilbər, onunla gedən,
Uca, sərvqamətli siminbədən,
Qızıl cam əldə tutub hər biri,
Buyurdu: gələ məclisə üç pəri.
Sipəhbod qabağında diz çökdülər,
O üç cam meyi bir yerə tökdülər.
Şərabı içib pəhləvan oldu şən,
Evi etdilər xali biganədən.
Dedi Sama Sindoxt: – Ey pəhləvan,
Qoca söhbətinlə olar növcavan
Hamı səndən öyrəndi elm, hikməti,
Nura çulğayıb qüdrətin zülməti.
İradənlə bağlandı pislik qolu,
Açıldı o gürzünlə haqqın yolu.
Günah işləmiş, səncə, Mehrab əgər,
Ciyər qanını gözlərindən tökər.
Məgər Kabil əhlində vardır günah
Ki, fərman verib məhvinə padişah?
Gözü xalqımın daima səndədir,
Ayaq torpağındır, sənə bəndədir
Təlaş etmə qan tökməyə sən bir az
Ki, xaliq belə işləri xoşlamaz

Dedi Sam ona: – Var sualım sənə
Bəhanə gətirmə, cavab ver mənə.
Kənizsənmi Mehraba sən, ya əyal?
Necə oldu, söylə, qızı gördü Zal?
Qızın görkəmi qamətindən danış,
Kamal, mərifət, ismətindən danış!
Çavab verdi Sindoxt: – Ey pəhləvan
İgidlər içində yeganə olan...
Varımdır mənim də evim, eyvanım,
Xəzinəm, elim, şöhrətim, həm şanım.
Əmin et məni əhdü peyman ilə,
Deyim doğru söz pak vicdan ilə.
Nə çox Kabilistanda sərvət desən.
Köçürdüm bütün Zabilistana mən,
Nə istərsə könlün, buna ol əmin,
Muradınca saz eylərəm mətləbin.
Onun tez əlini ələ aldı Sam,
Qılıb əhd, göstərdi çox ehtiram.
Eşitdikdə Sindoxt ondan qəsəm,
Düşündü, nolar, hər şeyi düz desəm.
Öpüb torpağı, durdu təmkin ilə,
Ürəkdə nə vardı gətirdi dilə:
– Mənəm, – söylədi, – Zöhhakın övladı
Ürəkcə təmiz Mehrabın arvadı.
Zalın can fəda etdiyi şux sənəm
Ki, Rudabədir, bil, anası mənəm.
Qaranlıq gecə tez çəkilsin deyə,
Bütün nəslimiz əl açıbdır göyə,
Dua eylərik, yalvarıb Allaha,
Sənə, həm yerin tanrısı padişaha.
Nədir Kabil haqqında fikrin sənin,
De, kimdir sənə dost, kim düşmənin?
Tutaq, biz günahkarıq, həm bəd – əsil
Bu şahlıq bizə bəlkə layiq deyil.
Önünda, budur, durmuşam indi mən,
Vur, öldür məni, et əsir, istəsən.
Günahsızların qəlbinə vurma dağ.



Yaman gündə kabilliyə ol dayaq.
Eşitdikdə bu sözləri pəhləvan,
Gözündə qadın oldu bir qəhrəman,
Boyu sərv, üzü gül, beli ney qələm,
Ağıllıydı kəklik yerişli sənəm.
Cavab verdi ki: – Andıma sən inan,
Pozulmaz bu peyman versəm də can.
O Kabil, o sən, o sənin ailən,
Səlamət qalın, ömr edin qəlbi şən,
Əqidəmcə, Zal gəzsə bir qız, o da
Ləyaqətcə Rudabədir dünyada.
Bizimçin yad olsa belə əsliniz,
Olub təxti-tac sahibi nəsliniz.
Nə etmək? Bu dünya qurulmuş belə,
Vuruşmaq deyil mümkün Allah ilə,
Biri yüksələrsə, biri alçalar,
Biri varlıdır, digəri ac qalar.
Biri nemət içrə yaşar hər zaman,
Biri ehtiyacdan yaşar bağrı qan.
Ürək ağrısıyla yazıb namə mən,
Şahənşaha göndərdim, axır, dünən,
Mənuçehr dərbarına Zali-zər
Gedərkən, deyərdin ki, qartal süzər.
Yəhər üstə qalxıb, yəhər görmədi,
Atının nalı sanki yer görmədi.
Zala padişah versə müsbət cavab,
Gülər, fəxr edər ki, edibdir savab,
Könül verdi quş yavrusu bir gülə,
Batıb göz yaşında ayağı gilə,
Sevən bir igidlə sevən bir gəlin
Qabıqdan çıxırlarsa, ar etməyin!
Qızı bircə yol, barı, göstər mənə,
Nədir xahişin, söylə, verrəm sənə!
Dedi Sama Sindoxt: – Ey pəhləvan,
Kənizinə lütf eyləsən har zaman,
Mənim qəsrimə at sürərsən əgər,
Sevincdən başım göylərə yüksələr,

Gəlibdir deyə Kabilə şəhriyar,
Edər xidmətində hamı can nisar.
Gülüb söylədi Sam: – heç etmə qəm,
Çağırsan qonaq, etiraz etmərəm.
Gülər gördü Sindoxt Samı o gün,
Silinmiş deyə kin-küdurət bütün,
Dedi qasidə: – Kabilə get çapar,
Nigarandır, Mehraba müjdə apar!
De: pis fikr üçün könlünə vermə yol,
Qonağı qəbul etməyə hazır ol!
Özüm də bir az sonra bu namədən.
Yəqin, ordayam, yolda dincəlmədən.
İkinci gün oldu, açıldı səhər,
Fəzada Günəş olcağın cilvəgər,
Oyandıqda izzətli Sindoxt, düz
O salar dərgahına qoydu üz.
Dolub şən səs ilə Samın dərgahı,
Ona verdilər ad – xanımlar şahı.
Sama, gəldi, baş əydi, verdi salam,
O xeyli danışdı, qulaq asdı Sam,
Dedi: – Ver icazə, dönüm Kabilə,
Görüşmək üçün şah Mehrab ilə.
Əziz bir qonaqçın tədarük görüm,
Bu peymanı damadıma göstərim.
Dedi Sam: – Sənə yaxşı yol, get, çalış,
Nə gördünsə, Mehraba bir- bir danış!
Dəyərli xələtlər alıb biçdilər,
Cəvahirlərin yaxşısın seçdilər.
Samın vardı Kabildə qəsri, bağı,
Əkin yerləri, ovlağı, otlağı.
Bağışlandı Sindoxta onlar belə,
Verib dost kimi əhd ilə əl-ələ,
– Qızın oğlumundur, – dedi pəhləvan,
Qoy ağgünlü olsun o bir cüt cavan.
İki yüz igid atlı qoşdu ona,
Dedi: – İndi get, ey dilavər ana!
Gedib Kabilistanda rahat yaşa,



Bütün ömrunü qorxusuz vur başa.
Solan ay üzü oldu bir laləzar,
Sevinclə yola düşdü o gülüzar.

Gedib verdilər şəhriyara xəbər
Ki, Samın yanından gəlib Zali-zər.
O sərkərdələr pişvaza çıxdılar
Ki, onlarla şahlıq edər iftixar.
Yaxınlaşdı Zal şah dərbarına,
Ona verdilər yol şahın yanına.
Gəlib şah önündə düşüb torpağa,
Öpüb torpağı, şaha qıldı dua.
Üzü qaldı torpaqda xeyli zaman,
Onu şah dindirdi çox mehriban,
Dedi: – Torpağı gül üzündən silin,
Yuyun mişk ilə surətin, kakilin!
Gəlib tutdu təxtin önündə qərar,
Sual etdi ondan böyük hökmdar,
Dedi şah: – Söylə, qoçaq pəhləvan
Səni yordumu yolda bu toz, duman?
Dedi: – Şah sağ olsun, çətinlik nədir?
Yolunda bizə zəhmət əyləncədir.
Samın yazdığı naməni aldı şah.
Sevindi ürəkdən, gülüb qah-qah,
Bilib mətləbi, verdi xoş bir cavab:
– Veribsən yəqin könlünə çox əzab.
Bu məktubda hər mətləbi tam yazıb,
Ürək ağrısıyla qoca Sam yazıb.
Bu iş gəlməyirsə, deyim xoş mənə,
Fəqət, istərəm yardım etmək sənə,
Budursa əgər, ey cavan, istəyin,
Qəm etmə, murada çatarsan, yəqin.
Bir az əylənib, ver rahatlıq cana.
Salım işləri yaxşıca sahmana.
Qızıl süfrəni açdı xidmətçilər,
Oturdu Mənuçehrlə Zali-zər,
Buyurdu: böyüklər yığılsın tamam,

Şahın süfrəsində yeyilsin təam.
Qonaqlar yığıldı, yeyib durdular.
Gedib, mey-məzə məclisi qurdular,
Şərabı içib Zal, olub keyfi çağ,
Qızıldan cilovlu ata qalxaraq,
Gedib gəzdi, etdi gecə gündüzü,
Düşündü, danışdı özüylə özü.
Gecə mənzilə döndü sakit, yavaş,
Cahan fatehi şahə endirdi baş.
Mənuçehr ona "afərin" söylədi,
Gedib xəlvəti Zalı vəsf eylədi.

Xəbər verdi möbidlərə şəhriyar,
Münəccim, həkim, xacə toplandılar.
Dedi: – Ziyc alın, öyrənin bir zaman[41].
Nə yol göstərir bu işə asiman.
Nədir ulduzun hökmü, sirri deyə
Hamı getdi əmrə əməl etməyə,
Ələ aldılar ziyci-rumi tamam,
Edildi: bütün işlər üç gün davam,
Munəccimlər ulduzdan aldı hesab,
Belə verdilər padişaha cavab:
– Bizi ulduzun sirri etdi əmin,
Suyu saf çıxar bu yeni çeşmənin,
Sam oğluyla Mehrab qızından, inan,
Gələr ərsəyə bir qoçaq pəhləvan.
Həyatı, kamalı, kücü, qüdrəti
Olar şahlığın, ölkənin şöhrəti,
Uca boylu, enli kürək, şiri-nər,
O həm rəzmə, həm bəzmə ziynət verər[42].
Döyüşdə atı tərləsə bircə an,
Rəqibin olar qorxudan bağrı qan.
Uçuşda atı qartala güc gələr,
O çox şahların başına kül ələr.
Uca qəddi, ağlı, polad qolları,
Kəməndlə şikar eylər aslanları.
Qılıncı fəzanı yarar, qan edər,



Suya od vurub, guru büryan edər.
Olar şəhriyarın kəmərbəstəsi,
İgidlərin İranda sərkərdəsi.

Dedi onlara şah: – Olun huşyar,
Bu söhbətləri açmağın vaxtı var,
Bu gün Zal dərbarda olsun – dedi,
Söz ilə onu yoxlamaq istədi.
Buyurdu. – Müəmmalı söz söyləyin,
Suallar verin, imtahan eyləyin!
Gəlib Zalla möbidlər oyləşdilər
Ki, onlarda vardı ağıl, həm hünər,
Birinci: Zala verdi möbid sual
Ki, hazırcavab idi, sahibkamal,
– Çəməndə – dedi – on iki sərv var,
Gözəl, tərtəzə, görkəmində vüqar.
Otuz qol verib, hər biri bu rəqəm
Ki, farsidə olmaz nə artıq, nə kəm.
Dedi başqa möbid ki: – Ey qəhrəman,
İki köhlən at var küləktək qaçan.
Biri onların qır kimi qapqara,
Biri saf büllur, nurlu bir aypara.
Qovar bu onu, o bunu durmadan,
Fəqət haqlamaz bir-birin heç zaman,
Üçüncü dedi: – Yol gedir şəhriyar,
Onun arxasında otuz atlı var.
Sayanda görərsən, biri kəm gələr,
Otuzdur, görərsən yetirsən nəzər.
Dedi digəri: – Var belə bir çəmən,
Yaşıldır, gözəldir deyər hər görən,
Görərsən, əlində oraq bir nəfər,
Çəməndə üzündən həyanı silər,
Biçər otları, həm quru, həm yaşı,
Ayılmaz bu işdən bir an da başı.
Beşinci soruşdu: – İki sərv var,
Qamıştək dənizdən göyə boylanar.
O quş hansı quşdur ki, məskən edər,

Birində gecə, digərində səhər?
Uçanda bunun yarpağı qovrular,
Ona qoncağın mişk ətri saçar.
İki sərvdən tazətərdir biri,
Həmişə saralıb, solar digəri.
Dedi başqası: – Görmüşəm dağda mən,
Gözəl qəsr var, dövrəsi bağ, çəmən.
Haman qəsrdən hey adamlar gedər.
Şoranlıq biyabanı abad edər.
Binalar tikərlər, qurub dəstgah,
Kimisi olar qul, kimi padişah.
Yaşarlar o qəsri yada salmadan,
Söz açmazlar ondan uzun bir zaman,
Qopar nagahan güclü bir zəlzələ,
Verər onların dudmanın yelə.
Bu dəmdə o qəsri hamı arzular,
Tükənməz və sonsuz olar arzular.
Bu alimlərə, gəl, açıq söylə, Zal,
Nə məna verir söylənən hər sual?
Müəmmaları şərh qılsan əgər,
Qara torpaq ağlınla mişkə dönər,

Bir anlıq xəyala dalıb Zali-zər,
Fikirləşdi söz tapmağa müxtəsər,
Verilmiş sualları saldı yada,
Dil açdı, cavab versin hər ustada:
– On iki ağacdan – dedi – başlayaq
Ki, var hər biri üstə otuz budaq.
Bir ildə on iki yeni ay olar,
Necə təxtə çıxmış yeni hökmdar?
Otuz gün olar hər ayın müddəti,
Zamanın əzəldən budur adəti,
Deyim iki at barədə fikrimi,
Mənimçin bu aydındı şimşək kimi.
Zamanda iki vaxt var: ağ, qara,
Biri digərini qovar aşkara,
Ağ at gündüz olmuş, qara at gecə,



Görün bir fələk vaxt hesablar necə?
Üçüncü sualdır otuz atlıdan
Ki, şahın yanından ötər, hər zaman,
Sayarsan otuzdan biri əskilər,
Dubarə sayanda otuz düz gələr.
Deyil mətləbin məğzi bundan savay
Ki, naqis olar bir gecə bəzən ay.
Sizə şərh edim indi bu nüktəni,
İki sərvdə var quşun məskəni.
Quzu bürcünü al Tərazuyacan,
Qaranlıqlara gizlənər bu cahan.
Balıq bürcünə doğru çün dövr edər,
Qaranlıq cahanı tutar sərbəsər.
Bu çərxin iki sərvdir qolları,
Biri yamyaşıldır, biri sapsarı,
Uçan quş Günəşdir, fəzada uçar,
O qorxu, ümid mənbəyi nur saçar.
Deyim dağ başında olan qəsrdən,
O baqi cahandır, sona yetməyən,
Şoranlıq – bu beş günlük evdir əziz
Ki, nemətdəyik, həm də zəhmətdə biz.
Nəfəs ki, çəkirsən, hesaba alar,
O həm bəsləyər, həm də gücdən salar.
Nəhayət, qopar bir külək, zəlzələ,
Düşər nagahan aləmə vəlvələ.
Şoranlıqda biz qoyduğumuz əmək
Qalar, dağdakı qəsrə dönmək gərək.
Biz əkdiksə, bir başqası bar yeyər,
O da biz gedən yolla, axır, gedər.
Əzəldən budur məğzi söz-söhbətin,
Dəyişməzdir adətləri xilqətin.
Qoyarsaq əgər yaxşı ad yadigar,
Onunla edər nəslimiz iftixar.
Tamahkar, xəsis ömr sürsək əgər,
Ölərkən bizə xalq lənət edər.
Sayılsaq da sahib neçə qəsrə biz,
Sonu bir çadırdır fəqət bəhrəmiz.

Bizi basdıranda qara torpağa
Əzab, qorxu, zillət dönər bir dağa,
O çöldə əlində oraq bir kişi
Quru-yaş otu biçmək olmuş işi,
Biçər qarşısına çıxan hər nə var,
O söz dinləməz, min də yalvarsalar.
Otuq biz, biçinçi o, dövri-zaman,
Nəvə ya baba – anlamaz otçalan.
O baxmaz, qoca ya cavandır şikar,
Əlinə keçən hər ovu parçalar.
Bu qanunu dünyada qoymuş fələk,
Doğulmuş olan bir gün ölsün gərək.
Gələnlər gedər, qaydadır hər zaman,
Əcəl heç kəsə verməmişdir aman.
Zalı təsdiq etdi bütün barigah,
Ürəkdən sevindi Mənuçehr şah.
Onun ağlına məclis heyran idi,
Mənuçehr uca səslə "əhsən" dedi.
Verildi o gün məclisə bir bəzək,
İşıqlandı bədr ilə sanki fələk.
Qaranlıq çöküncə içildi şərab,
İçənlər başı oldu meydən xarab.
Gecə olduğun carçı verdi xəbər,
Qonaqlar durub təkbətək getdilər.
Böyük pəhləvanlar verib qol-qola,
Gülər üzlə, sərxoş düzəldi yola.
Günəş dağ dalından çıxınca yavaş,
Yataqdan saray əhli qaldırdı baş.
Kəmər bağladı sanki bir şiri-nər,
Qədəm qoydu şah qəsrinə Zali-zər.
O gəldi Mənuçehrdan izn ala,
Ata xidmətinə düşə tez yola.
Dedi: – Ey nəcabətdə tək hökmdar,
Atam Samı könlüm yaman arzular,
Öpüb təxtinin torpağından, budur,
Üzündən, tacından gözüm tapdı nur,
Dedi şah: – Ey novcavan pəhləvan,



Tələsmə, nolub? Bircə gün də dayan!
Səni tərpədir eşqi Rudabənin
Yadında deyil Samü Zabil sənin,
Buyurdu, yeni bir büsat qurdular,
Saray meydanında təbil vurdular,
Gedib pəhləvanlar hamı şadman,
Tutub əldə nizə, əmud, ox, kaman,
Kaman çilləsinə oxu çatdılar,
Döyüşdə olantək nişan atdılar,
Qılınc, nizə, gürz, oxla hər pəhləvan
Sınaqçın müəyyən şey aldı nişan.
Böyük bir ağac vardı meydanda tək,
Yaşın bilsə-bilsə, bilərdi fələk.
Kamana bir ox qoydu Sam oğlu Zal,
Ata çəkdi məhmiz, səsləndi: "Al!"
Deşildi bir oxla ağac ortadan,
Bağırdı hamı: "Ay sağ ol, ox atan!"
Dübarə gətirdi atı cövlana,
At üstündə dönmüşdü bir aslana.
Haman nöqtəni aldı bir də nişan,
Deşikdən uçub getdi ox sarpmadan.
Başa çəkdi zubin vuranlar sipər,
O meydanı əldə sapan gəzdilər.
Gətirdi sipər türk Ridək Zala,
Dikəldi at üstə çapıb dördnala,
Kamanı atıb, aldı zubin ələ,
Şikar axtarırdı o zubin ilə.
Vurub gil kimi əzdi üç qalxanı,
Sipərlərlə dolmuş görüb meydanı,
Dedi şah: – Ey pəhləvanlar, deyin,
İçinizdə ona tay varmı? Deyin!
O zubinlə ox qüdrətini görən,
Olardımı meydanına tək girən?
Hamı pəhləvanlar silah çəkdilər,
Ürəkdə acıq, dildə ah çəkdilər.
Çapıb atları saldılar meydana,
Qılınc, nizə əldə çapıb hər yana,

Yaxınlaşdılar, onları gördü Zal,
Atını o toz səmtinə sürdü Zal.
Baxıb gördü, kimdir qabaqda gələn,
Özündə hünər, güc, şücaət bilən?
Çıxıb toz içindən necə bir nəhəng,
Kəmərbəndinə şir kimi saldı çəng
Yəhərdən qopardı, onu etdi xar,
Ona ordu da, şah da mat qaldılar,
Dedi pəhləvanlar verib səs-səsə:
Müyəssər deyil bu hünər heç kəsə.
Kim istər onunla girə meydana,
Bu başdan desin: "Gey qara, ey ana"
Doğulmaz belə pəhləvan bir daha,
Deyil pəhləvan, oxşayır timsaha.
Nə xoşbəxtdir Sami-Neyrəm, qoyar
Cahanda belə bir oğul yadigar.
Ona "afərinlər" dedi padişah,
Baş əydi önündə bütün barigah.
Böyüklər qoyub tac, beldə kəmər,
Şahın qəsrinə şənliyə gəldilər.
Mənuçehr hazırlatdı yaxşı ənam,
Baxanlar ona oldu heyran tamam.
Qızıl tac gövhərnişan təxt, kəmər,
Həmayil, qızıl tovq, dürrü gövhər,
Cəvahir dolu neçə qiymətli cam,
Neçə qul, kəniz, verildi onam.
Bütün toplanan şeyləri şəhriyar,
Zala verdi bəxşiş, dedi: – Al, apar!

Samın naməsinə cavab yazdı şah,
Şirin dillə duzlu xitab yazdı şah:
Sən, ey adlı-sanlı igid pəhləvan,
Hər işdə bir aslan kimi qəhrəman,
Döyüşdə, görüşdə, gözəllikdə tək,
Sənə tay olan görməmişdir fələk.
Qoçaq pəhləvan Zal oğlun ki, var,
O səndən cahanda qalar yadigar.



Gəlib çatdı, bildim nədir arzusu,
Nədir xahişi, həm nədir qorxusu.
Sənin istəyincə, olub mehriban,
Dedim: kama çatsın cavan pəhləvan.
Bu işdə azadsan, dedim, büsbütün.
Onunla keçirdik neçə dadlı gün,
Pələngi şikar eyləyən şir əgər
Törətsə bir övlad, olar şiri-nər.
Yola saldım, indi gəlir, könlü şad,
Kor olsun gözü, kim ona baxsa yad!
Sevinclə, uğurla yola çıxdı Zal,
Yanında igidlər, başında cəlal.
Dedi qasidə; – Get, Sama ver xəbər,
De: şahın yanından qayıtdım gülər.
Rəvan etdi bir atlı tez Kabilə
Ki, bölsün sevincini Mehrab ilə.
Desin: Zal gəlir, yoldadır şadman,
Onu razı salmış yola hökmran.
Səbirsiz onu gözlərəm indi mən,
Nə lazımsa var, yox kəsir heç nədən,
Sevindi o gün Kabilistan şahı
Ki, damadıdır Zabilistan şahı.
Elə bil ona can nisar etdilər,
Cahan oldu toy məclisi sərbəsər.
Çağ idi damağı, gülürdu üzü,
Ayaq altını görməyirdi gözü.
Çaqırdı o, Sindoxtu öz yanına,
Ürək sözlərini danışdı ona,
Dedi: – Sevgilim, ey ağıllı qadın,
İradənlə sən zülməti qovladın.
Cahanda elə bir işə qatdın əl,
Sənə şah da "əhsən" deyər, ey gözəl!
Xeyirlə işi başladın, ey sona,
Çalış, indi yetsin xeyirlə sona.
Verilmiş kilidi sənə xəznənin,
Bu təxt ilə tac da sənindir, sənin.
Sən ağlınla son qoymusan qorxuya,

Get, indi sevinclə hazırlaş toya!
Qulaq verdi diqqətlə Sindoxt ona,
Durub gəldi Rudabənin yanına.
Dedi: – Müjdəmi ver, gəlir yolda Zal,
Nə lazımdır, etmiş, yaxındır vüsal,
Düşüb eşqə, eyş-işrəti atmısan,
Nə istərdin, indi ona çatmısan.
Cavab verdi Rudabə: – Ey şah qadın,
Düşüb dillərə hər tərəfdə adın.
Qoyub üz ayaq basdığın hər yerə,
Sözündən sənin çıxmaram bir kərə.
Sənə yetməsin cövrü Əhrimənin,
Nəsibin fərəh, şadlıq olsun sənin,
Ana qucdu Rudabəni bir daha,
Durub getdi, versin bəzək dərgaha,
Behişt ziynəti verdi eyvanlara,
Gülab, mişk, ənbər səpib onlara.
Qızıl məcməyi qoydu o bir başa,
Zəbərcəd naxışlıydı başdan-başa.
Qızıl kürsülər düzdü bir eyvana,
Bəzək verdi Çin adətiylə ona.
Tutulmuşdu o kürsülər gövhərə,
Naxışlar vurulmuşdu gövhərlərə.
Uca təxt ki, yaqut idi payəsi,
Kəyandan alınmışdı sərmayəsi,
Bir eyvan, deyən, Farsdı, Əhvaz, Rey,
Qoyulmuşdu çalğı, düzülmuşdü mey.
Gül ətri, libaslar alıb rəngbərəng,
Bəzəndirdi Rudabəni huritək.
Bütün Kabilistan bəzəndi o gün,
Gülə, rəngə, ətrə büründü bütün.
Yığıldı o gün Kabilin elləri,
Zərü zivərə tutdular filləri.
Oturdu fil üstündə sazəndələr,
Başa qoydular şah kimi taci-zər.
Qızıl, mişk, ud etmək üçün nisar



Hamı yol boyu səf çəkib durdular,
Su üstdə qayıq, göydəki quş kimi
Çapan Zal bir an da dincəldimi?
Gəlib çatmasından yox idi xəbər,
Odur, pişvaza çıxmadı bir nəfər.
Sarayda qopub nagahan qilüqal,
Dedilər: – Səfərdən, budur, döndü Zal.
Görüncə onu oldu Sam şadman,
Öpüb, bağrına basdı xeyli zaman.
Enib torpağı öpdü, verdi salam,
Danışdı görüb, bildiyini tamam.
Çıxıb təxtə, əyləşdi Sam Zal ilə,
Gülər üzlə, vəcd ilə, xoş hal ilə.
Yada saldı, Sindoxt deyən sözləri,
Dodağı gülüb, parladı gözləri.
Dedi: – Elçi gəldi bizə, toxtadı,
Qadındı gələn elçi, Sindoxt adı,
Tələb etdi, and iç, əməl eylədim,
Yamanlıq sizə etmərəm söylədim.
O hər nə dedi yaxşılıqla mənə,
Qəbul eylədim, çıxmadım əksinə.
Birinci – o parlaq ayı Kabilin
Bizə, Zabilistanə gəlsin gəlin.
İkinci – gedək onlara biz qonaq,
Bütün dərdlərə onda dərman qoyaq.
Gəlib indi qasid belə söyləyir:
– Gəlin, Kabilistan sizi gözləyir.
Cavabın nədir? – Söyləyək qasidə,
Gedib şah Mehrabı agah edə.
Zalın sinəsində döyündü ürək,
Sevincdən qızardı üzü lalətək.
Dedi: – Söz sənindir, böyük pəhləvan,
Əgər məsləhətdir, daha durmadan
Qoşunla bərabər gedək Kabilə,
Müsahib olaq orda Mehrab ilə.
Bu dəmdə dönüb oğluna baxdı Sam,
Nədir bildi Zalın sözündə məram.

O söhbət ki, Rudabədən getməyir,
Cahan pəhləvan söz hesab etməyir.
Buyurdu: çalınsın təbil, zəng, nay,
Açılsın, çatılsın bu pərdəsaray.
Qoçaq bir igid dəydi fövrən ata,
Tələsdi ki, Mehrab şaha çata.
Dedi: – Hazır ol, Sami-Neyrəm gəlir[44],
Qoşun, fil alıb, Zali-zər həm gəlir,
Gəlib çatdı qasid çapar Kabilə,
Onun müjdəsi tez yayıldı elə.
Sevindi elə Kabilistan şahı
Ki, damad olur Zabilistan şahı.
Ona sanki canlar nisar etdilər,
Cahan oldu bir toyxana sərbəsər.

Təbil, sinc çaldırdı Mehrab o gün,
Qoşun çəkdi səf, doldu meydan bütün.
Çalır fillər üstündə sazəndələr,
Cahan oldu cənnət, gülü tazə tər.
Büründü ipək bayrağa yer üzü,
Hamı ağ, sarı, göy, yaşıl, qırmızı.
Salıb aləmə səs təbil, nayi çəng,
Çəkib nərə şeypur, səsləndi zəng,
Deyərdin, ki məhşər qopub dünyada,
Qiyamətdir, işrət günü olsa da,
Gedirdi fərəhlə, göründükdə Sam,
Atından enib verdi Mehrab salam,
Onun boynunu qucdu Sami-səvar,
Soruşdu: – Necə dövr edir ruzigar?
Açıb səpdi Mehrab söz gövhərin.
Dedi Sama, Zali-zərə afərin!
Oturdu at üstə üzündə vüqar,
Neçə dağ başında hilal boylanar.
Zalın başına qoydu bir taci-zər,
Düzülmüşdü tac üstə ləli gövhər,
Fərəhlə durub Kabilə getdilər,
Olub-keçmişi bir də yad etdilər,
Şəhər çulğalandı xoş avaz ilə,
Təbil, cəngü ney, bərbətü saz ilə.
Sanardın cahan başqa bir rəng alır,
Çölün vəhşi heyvanları əl çalır.
Yalı, quyruğu atların, yoxlasan,
Görərdin ki, tər mişkdir, zəfəran,
Saraydan çölə qoydu Sindoxt qədəm,
Kəmərbəstə üç yüz kənizlə o dəm,
Əlində tutub hər biri cami-zər,
Cama doldurub mişk, ənbər, gövhər,
Deyib "afərin" Sama üç yüz pəri.
Nisar etdilər cam ilə gövhəri.
O məclisdə hazır olanlar o, gün
Daşın atdı, yoxsulluğun büsbütün.
Gülüb Sam sual etdi Sindoxtdən;
Ki, Rudabəni gizlədirsən nədən?
Cavab verdi Sindoxt: – hanı töhfəniz?
Boş əllə günəş görmək istərsiniz?
Dedi Sam Sindoxtə: – Sən, ey xanım.
Nə istərsən, hazırdır, hətta canım,
Dedi: – Zərnaxışlı evə gəl, gedək,
Tək orda oturmuş bizim tər çiçək,
Görüncə o ay üzlünü pəhləvan
Donub qaldı heyrətdə xeyli zaman.
Nə söz tapdı hüsnünü vəsf etməyə,
Nə gəldi ayağı çıxıb getməyə.
Bura gəldi Mehrab ilə Zali-zər,
Elin adətiylə kəbin kəsdilər,
Qız oğlanla bir təxtdə tutdu qərar,
Əqiqlə zəbərcəd edildi nisar
Ayın başına qoydular əfsəri[45],
Şahın tacına düzdülər gövhəri.
Ələ aldı Mehrab dəftər o dəm,
Oxundu o dəftərdə xeyli rəqəm.
Dedi: – Gənclərindir bu dövlət, bu var,
Onu dinləyənlər də mat qaldılar.
Gəlib məclisə başlayıb toy-düyün,
Qədəh əldə mey içdilər yeddi gün.
Saraydan çıxarkən bağa getdilər,

Üç həftə tamam keyfi saz etdilər.
Böyüklər hamı əl qoyub sinəyə,
Sarayda düzülmüşdülər cərgəyə.
Keçib çal-çağırda, ay oldu tamam,
Edib Sistana əzm, atlandı Sam.
Təbil, fil, qoşun Zal ilə pəhləvan
Gedərkən rikabından ötdü zaman.
Kəcavə qoyuldu belinə filin,
Oturdu içində ayüzlü gəlin.
Düşərkən yola Sistana qafilə
Gəlib çatdı Sindoxt Mehrab ilə.
Gedirlərdi xoşhal, hamı mehriban,
Çalıb oynayırdı bütün karivan.
Deyib güldülər, yetdi mənzil sona,
Səlamət gəlib çatdılar Sistana.
Böyük bir qonaqlıq düzəltmişdi Sam,
Bu məclis davam etdi üç gün tamam.
Vidalaşdı Sindoxt Mehrab ilə,
O qaldı, bu döndü yenə Kabilə.
Verib şahlığı Sami-Neyrəm Zala,
Qoşunla hazırlaşdı çıxsın yola,
Zəfər bayrağıyla qoşun çəkdi səf,
Üzü Qorqsarana – qərbə tərəf.
Dedi: – Tez gedim mən şahamsa əgər,
Ürəkdən bizi sevməyir yerlilər.
Verəndə Mənuçehr o ölkəni,
Dedi: – Saxla, ye, hakim etdim səni!
O torpaqdakı bədəsillər ki var,
Bir az boş buraxsan, qiyam qaldırar.
Məni qorxudur, bir də Mazəndaran,
O yerdə nə çoxdur qoçaq pəhləvan.
Yerində oturdu Samın Zali-zər,
İşi meydi, məclisdi şamü səhər.

Gəlib keçdi günlər bu minval ilə,
O gülüzlü dilbər olub hamilə,
Solub, qaldı pəjmürdə bir tər çiçək,



Qəmə, möhnətə batdı o şad ürək.
Gün ötdükcə sustaldı can ağrıdan,
Saraldı yanaqlar necə zəfəran.
Sual verdi Sindoxt ki: – Eycan bala,
Nə olmuş, düşübsən belə bir hala?
Cavab verdi Rudabə: – Şamü səhər
İniltim, fəğanım göyə yüksələr.
Çatıb vaxt-vədəm, inan, ey ana,
Gətirmiş məni bu ağır yük cana,
Dolubdur deyən qarnıma daş, dəmir,
Dizim açılmaq, bükülmək istəmir.
Onun halı gün-gündən oldu xərab,
Nə yatdı, nə dincəldi, çəkdi əzab.
Nəhayət, o huşsuz sərildi yerə,
Ucaldı ana naləsi göylərə.
Saçın yoldu, Sindoxt, etdi fəqan,
Atıb pəncə rüxsarına, tökdü qan.
Bu qəmli xəbər çatdı Zali-zərə
Ki, azadə sərvin yıxılmış yerə.
Gəlib gördü Rudabəni Zali-zər,
Gözü yaşlı, bağrı dolu qəm, kədər.
Lələk düşdü birdən onun yadına,
Gülüb dedi Sindoxta: – Qorxma, ana!
Tələb etdi, manqalda od verdilər,
Lələkdən oda tutdu o bir qədər,
Qara bir buludtək göründü o quş,
Gətirdi ağır xəstəyə qurtuluş.
Onun yağmuru dürr-mərcan idi,
Nə mərcan, hər cansıza can idi.
Deyib "afərin", Zal ona əydi baş,
Dil açdı onun vəsfinə gözdə yaş.
Sual etdi Simurğ: – Bu qəm nədir?
Ey aslan, gözündən axan nəm nədir?
Bu ay üzlü siminbədəndən, inan,
Gələr ərsəyə şir kimi pəhləvan,
Ayaq torpağından öpər şiri-nər,
Başından bulud qorxa-qorxa ötər.

Pələng bağrını nərəsi çatladar,
Dağa pəncə atsa, yerindən uçar.
Onun gürzünə hər boyun endirən,
Uca qəddini, qollarını görən,
Olar xar bir nərəsindən, yəqin,
Yarar zəhmi bağrını düşmənlərin.
Ağılca o Sami-Nəriman olar,
Qəzəblənsə, bir qızmış aslan olar.
Boyu sərv olar, qüvvəti fil qədər,
Uçar atdığı xeşt iki mil qədər.[46]
Doğulmaz o adi yol ilə, inan,
Budur tanrının hikməti, pəhləvan!
Tez ol, bir iti zağlı xəncər gətir,
Ağıllı-kamallı dilavər gətir,
Şərabla bu ay üzlünü məst elə
Ki, nə qorxu-hürkü, nə ağrı bilə.
Rəhim boşluğunu yarın dilbərin,
Gərək duymaya ağrısın xəncərin.
O gül üzlünün, qorxma, axsa qanı,
Rəhimdən alıb qaldırın aslanı.
Cəsarətli ol, qorxmaz ol, aç gözün,
Yarılmış yeri, iynə al, tik özün!
Südə, mişkə, döy, qatgilən bu otu,
Qurut kölgədə, ta alınsın odu.
Yarılmış yerə sürt onu, et çara,
Görərsən, haman gün bitişmiş yara.
Sənə şəhpərimdən verim bir lələk,
Yara üstünə çək ki, etsin kömək.
Bu sözlərlə xoşhal olub, razı get,
Gedib Tanrıya şükr ilə səcdə et.
Bu şahanə sərvi o vermiş sənə
Ki, hər gün doğa bir günəş bəxtinə.
Bu işdən kədərlənmə, ey bəxtiyar.
Veribdir cavan şaxəniz yaxşı bar.
Qopardı qolundan yenə bir lələk,
Yerə atdı, uçdu necə bir mələk.
Götürdü onu, basdı Zal bağrına.



Gəlib etdi nə söyləmişdi ona.
Yanırdı bu əhvala cümlə cahan,
Hamı qəm əsiri, hamı bağrı qan.
Qan ağlardı Sindoxt yaman qorxaraq,
Deyərdi: – Böyürdən çıxarmı uşaq?
Hazır oldu bir möbid əldən iti,
Edib meylə məst ayüzlü bütü,
Böyürdən yarıb, ağrısız, dilbəri,
Rəhimdə uşaqdan tutub əlləri,
Səlamət kənara çıxartdı onu,
Cahan qaldı heyran, eşitcək bunu,
Uşaq, nə uşaq? Sanki aslan idi,
Boyu sərv, üzü mahi-taban idi.
Baxan qaldı heyran belə körpəyə,
Deyildir uşaq, körpə fildir deyə,
Yarılmış yeri əlbəəl tikdilər,
Yara üstə dərman, lələk çəkdilər.
Yatırdı gecə-gündüz o gənc ana,
Şərab eyləmişdi yaman kar ona.
Nəhayət, oyandı o sərvi-rəvan,
Danışdıqda Sindoxt ilə mehriban,
Hamı söylədi: "Şükr, pərvərdigar".
Edib başına dürr-gövhər nisar.
Gətirdi ona körpəni dayələr,
Sevincdən ucaldı başı dağ qədər.
Baxıb körpəyə güldü sərvi-rəvan,
Onun çöhrəsindəydi şahlıq əyan.
Dedi: – Qəm, kədər bitdi, rəstəm degər[47],
Odur, körpəyə Rüstəm ad verdilər.
O süd dadmamış aslanı ölçdülər,
Boyunca, enincə ipək biçdilər.
İpəkdən tikildi o boyda uşaq,
Ona sərf edildi ipək bir qucaq.
Səmurun tükü ilə doldurdular,
Günəş, Zöhrə nəqşi ona vurdular..,
Asıb nizəni qoltuğundan bəri,
Əmudla cilovdan tutub əlləri,

Oturdub kəhər bir ata kuklanı,
Tutuldu nökərlərlə dörd bir yanı.
Bu tərtib ilə yetdi işlər sona,
Salıb hər işi yaxşıca sahmana.
Verildi müsafirlərə pul-para,
Alıb elçilər, dəydilər atlara.
Gedib pəhləvan Sama çatdı xəbər,
Əli gürzdə kukla Rüstəm gələr.
Gülüstanda bayram tutuldu o gün,
Nə Zabil, nə Kabil, biyaban bütün
Bəzəndi, şərab axdı, ney gurladı,
Hərə bir tərəfdə çalıb çağladı.
En-arqac kimi birləşib izdiham,
Oturmuşdu bir yerdə şahla qulam.
Bu dəm südəmər Rüstəmin surəti
Verildi Sama, Sam həmin surəti.
Alıb baxdı, biz-biz olub tükləri,
Dedi: – Doğrudur, var mənə bənzəri.
Əgər nisficə olsa körpə bunun,
Buludlar başından öpər oğlumun.
Tələb etdi, qasid də gəldi o dəm,
Ona muştuluq verdi saysız dirəm.
Buyurdu, sarayda təbil vurdular,
Günəş misli parlaq büsat qurdular,
Şərab istədi, başladı çal-çağır.
Dirəm səpdi, varlandı hər bir fağır,
Verildi belə bir qonaqlıq elə,
Tamaşaya durdu Günəş, Ay belə.
Zalın naməsinə cavab yazdı Sam,
Sətirlər bəzəkli behiştdi tamam.
Birinci, böyük Tanrını etdi yad
Ki, lütfüylə etmiş onu könlüşad.
Belə yazdı vəsfində Zali-zərin.
Bar olsun qılınc, gürz vuran əllərin,
İpək olsa da gördüyüm bu bala,
Onun oxşarı var mənə, həm Zala,
Onu hifz edin, necə, gözdə bəbək,



Yanından belə ötməsin bəd külək.
Gecə-gündüz əl açmışam göylərə,
Rica etmişəm Tanrıdan min kərə,
Görə gözlərim hər qədər ki, sağam,
Belindən gələ dünyaya bir çağam
Bu gün çatmışıq məqsədə sən və mən,
Onu görməsin çox bizə xəlq edən.
Zalın yanına gəldi qasid çapar,
Verib naməni şad, üzündə vüqar.
Samın sözlərin dinlədi Zali-zər,
Dedi: – Yaxşı söz pak ürəkdən gələr.
Sevindi, salıb meylini körpəyə,
Başı iftixarla ucaldı göyə.
Dolandı bu minval ilə ruzigar,
Keçincə zaman oldu sirr aşikar,
Verib Rüstəmə gündə on dayə süd,
Gücə, hümmətə oldu sərmayə süd,
O vaxt çatdı ki, əyləşə süfrəyə,
Çörək, ət çatışmazdı Rüstəm yeyə
Yavanlığı gündə beş heyvan idi,
Belə iştahaya el heyran idi.
Onun səkkizə çatdı bir gün yaşı,
Uca sərv ilə tən dayandı başı.
Camalı bir ulduz kimi parladı,
Bütün aləmi gəzdi Rüstəm adı.
O qamət, o görkəm, o hümmət, şüur.
Deyərdin ki, Sam pəhləvandır, durur.
Gəlib qəhrəman Sama ratdı xəbər
Ki, Zal oğlu Rüstəm olub şiri-nər.
Belə şir kimi pəhləvan bir uşaq
Cahanda ola – verməmişlər soraq.
Gedib körpəni görmək eşqiylə Sam
Nə yerdə, nə göydə tapırdı aram,
O, salarına tapşırıb ordunu,
Alıb yanına bir neçə dostunu,
Məhəbbət onu çəkdi Dəstan sarı,
Yeritdi qoşun Zabilistan sarı.

Xəbər tutdu Zal, əmr edib ləşkərə,
Qoşundan qaraldı bütün dağ, dərə.
Özü, bir də Mehrab, iki pəhləvan,
Samı pişvaza oldu dərhal rəvan.
Vuruldu tasa mehrə, qopdu səda,
İki ordu birləşdi o səhrada.
Qoşun tutdu dağdan-dağa bir düzü,
Göründü fəza göy, qara yer üzü.
Filin nərəsi, atların şeyhəsi,
Neçə mil yola çatdı heyvan səsi.
Vuruldu böyük bir filə min bəzək,
Çatıldı ona bir qızıl təxt tək.
Oturtdu qızıl təxtə Zal oğlunu,
O fil gövdəli, o pələng qollunu.
Başında qızıl tac, belində kəmər,
Əlində ağır gürz, döşündə sipər,
Uzaqdan Samın gəldiyin sezdilər,
Qoşun əhlini cərgəyə düzdülər.
Piyada olub rəsmü adab ilə,
Qabaq çərgədə Zal Mehrab ilə,
Samın qarşısında əyib baş həmən,
Dedi bir ağızdan ki: "Xoş gəlmisən!"
Görüncə fil üstə bala aslanı
Üzü güldü Samın, duruldu qanı.
Fil üstə gətirtdi yaxın Rüstəmi,
Görüb təxtü tacı, o yal-yöndəmi,
Ona söylədi: – Afərin, pəhləvan,
Yaşa, aslanım, qal həmişə cavan.
Öpüb təxtini Rüstəm o sərvərin,
Dedi: – Ey baba, şəninə afərin!
Cahanpəhləvan, daima şən yaşa,
Mənəm şaxə, bil, rişə sənsən, yaşa!
Babam Sam önündə kiçik bir qulam,
Yeyib yatmaram, mən rahatlanmaram,
Yəhərdir, dəbilqə, zireh istəyim,
Ox atmaq, nişan almaq əyləncəyim.
Üzünə necə oxşayır da üzüm,



Sənindir bu canım, sənindir gözüm.
Deyib bunları, endi fildən yerə,
Əlindən tutub Sam onun bir kərə,
Üzündən, gözündən öpüb mehriban,
Fil üstə təbil susdu xeyli zaman.
Saray səmtinə qoydular üz hamı,
Davam etdirib yol boyu bayramı,
Sarayda qızıl təxtə əyləşdilər,
Yeyib içdilər, dil şirin, üz gülər,
Bir ay etdilər eyşü nuşu peşə,
Həvəs göstərən olmadı bir işə
Şərab içdilər, çaldılar cəng, rud,
Oxurdu hərə növbə ilə sürud[48].
Zalın təxti mərkəzdə tutmuş qərar,
Yanında əmud əldə Rüstəm durar.
Önündə qoca Sam, üzündə vüqar,
Başında hüma cıqqalı tacı var.
Xüda namını dildə qılmış rəvan,
Olub Rüstəmə valeh o pəhləvan.
Bilək, arxa, yal, yöndəm aslan kimi,
Beli ney qələm, sinə meydan kimi
O, baldır cəhətdəndi at gövdəli,
O aslan ürəkli, pələng qüvvəli,
Belə hüsnü, ağlı, kamalı olan,
Belə pəhləvan görməmişdi cahan.
Dedi: – Camları qaldırın, mey içək,
Silinsin kədər, qəlblər açsın çiçək!
Zala söylədi: – Yüz nəsildən bəri
Nişan kimsə verməz dolan elləri,
Görən yox doğulsun böyürdən uşaq,
Bü tədbirin ustadıdır çox qoçaq.
Bizə tanrı Simurğu verdi kömək,
Ona min kərə afərin söyləyək.
Bu dünyaya hər kəs ki, gəlmiş, gedər,
Biri pöhrələnər, biri köhnələr.
İçib badəni, oldular məst, şad,
Qoyub Rüstəmi, etdilər Zalı yad.

Mey içməkdə Mehrab ifrat edib,
Olub məst, keçmişləri yad edib,
Deyərdi: – Yanımda nədir Zal, Sam?
Mənuçehrdən mən belə qorxmuram.
Mənəm, Rüstəm ilə qılınc, bir də at
Adım gəlsə quşlar salarlar qanad.
Verib Zöhhakın dininə rövnağı,
Ayğımla müşk eylərəm torpağı.
Olub məst Mehrab – haman bildilər,
Doyunca ona Samla Zal güldülər.
Yeni ay başında gəlib mehr mah,
Oturdu zaman taxtına, oldu şah.
O gün Sam hazırlaşdı, çıxdı yola,
Yola salmağa verdi rüsxət Zala.
Fil üstündə Rüstəm, üzündə təlaş,
Babası yanınca gedirdi yavaş.
Zala üz tutub Sam dedi: – Ey oğul,
Həyatın boyunca ədalətli ol!
Havadar olarkən də sən şahlara,
Yenə öz kamalınla haqqı ara,
Bütün il boyu pisliyə açma əl,
Xuda əmrinə eylə hər gün əməl!
Hələ bir kəsə qalmamışdır cahan,
İkiüzlülükdən saqın hər zaman!
Atandan, oğul, bir nəsihət eşit,
Götür addımı doğru, düz yolla get!
Nədəndirsə, könlüm pərişan olub,
Əcəl şərbətiylə piyaləm dolub.
İki oğluna seylədi: – Əlvida!
Mənim sözlərimi unutmazsız, ha!
Qopardı təbil barigahda haray.
Çalındı fil üstündə də kərrənay.
Könüldə böyük arzular, dildə söz,
Sipəhbod qoşunla tutub qərbə üz,
Gedirdi onunla iki övladı,
Gözü yaşlı, dildə, könüldə adı.
İki gün onunla gedib döndülər,



Samın qarşısında uzaqdı səfər.
O yollandı bir yana, bu bir yana.
Başında qoşun gəldi Zal Sistana.
Oturtdu önündə igid Rüstəmi.
Gecə-gündüz oldu onun həmdəmi.

Deyirlər ki, dostlarla bir gün səhər
Çəməndə doyunca şərab içdilər.
Zilə qalxdı, düşdü bəmə saz-avaz,
Dilavərlərin könlü şən keyfi saz,
Süzüb ləl kimi mey büllur camlara,
İçib sağlığa, vermədilər ara.
Tutub Rüstəmə üz, dedi Zali-zər:
– Oğul, səndə vardır günəştək hünər.
İgid dostların könlünü al ələ,
Xələtlər verib, onları şad elə!
Ata əmrini tutdu Rüstəm əziz,
Xələt verdi, at verdi, həm qul, kəniz.
Hamı aldı Rüstəm əlindən ənam,
Alan getdi, məclis boşaldı tamam.
Cahan pəhləvan Zal yatsın deyə
Qururla yol aldı hərəmxanəyə
Təhəmtən onun ardınca qalxaraq[49],
Qaçıb getdi, xidmətçi açdı yataq.
Uzandı, yatıb doymamışdı hələ
Ki, düşdü bütün ətrafa vəlvələ.
Qırıb bəndi sərkərdənin Ağ fili,
Cumub hey qovurdu bütün bir eli.
Qızıb, hər kəsə yetdi xortum atar,
Bütün məhləni eyləmiş tarü-mar.
Təhəmtən yerindən səsə sıçradı,
Dedi: – Kim qoparmış bu ah-fəryadı?
Nə olmuş? Onu xalq saldı başa,
İgidlik vücudunda gəldi cuşa.
Qaçıb Zal vuran gürzü aldı ələ,
Filə sarı addımladı əzm ilə.
Sarayda olan yaşlı xidmətçilər

Yolu kəsdi, bundan tutunca xəbər.
Dedilər: – Sənə yol verək biz neçə?
Atan sağ buraxmaz yataq bu gecə.
Qaranlıq gecə, bəndsiz vəhşi fil,
Buraxmaq səni, bil, ağıldan deyil.
Saray xadimi söylədi: – Sən hələ
Uşaqsan, sataşma o qızmış filə
Bu sözdən acıqlandı Rüstəm yaman,
Vurub yumruğu peysərinə haman,
Atıldı başı top kimi meydana,
Qəzəblə Təhəmtən dönüncə yana.
Önündən onun qaçdı xidmətçilər
Qapı səmtinə cumdu o şiri-nər.
Vurub gürzü, zənciri tökdü yerə,
Elə zərbə layiqdi o əllərə.
Ağır gürz əlində çıxınca çölə,
Başı kin dolu döndü sanki yelə.
O qızmış filin səmtinə qoydu üz,
Sanardın, coşub dalğalı bir dəniz.
Nə gördü ki: bir canlı dağdır, qoşur,
Basanda ayaq torpağa yer coşur.
Qaçır pəhləvanlar önündən onun,
Necə ki, qaçar qurd görəndə qoyun.
Çəkib şir kimi nərə gənc pəhləvan,
Hücum eylədi Ağ filə qorxmadan.
Coşan fil, önündə görüb Rüstəmi
Onun üstünə cumdu bir dağ kimi.
Yetirsin deyə pəhləvana ziyan,
Uzatmışdı xortumunu fil bu an,
Təhəmtən elə gürz ilə vurdu ki,
O dağ boyda heyvan büküldü iki.
İşi bitdi bir zərbə ilə onun,
Yıxıldı, sanardın, uçur Bisütun.
Qara torpaq üstündə fil verdi can,
Qayıtdı geri – yatmağa pəhləvan.
Yatırdı, günəş nazlı qızlar kimi,
Çıxıb nura qərq eylədi aləmi.



Zala çatdı Rüstəm işindən xəbər
Filin üstünə getmiş o şiri-nər.
Elə gürz vurmuş o canlı dağa,
Çıxıb canı, düşmüş o dağ torpağa.
Dedilər bu qovğa nədən başlamış,
Olub Zali-zər mətləb ilə tanış,
Dedi: – Çox heyuf! Fil gözəl fil idi,
Gözümdə mənim dalğalı Nil idi.
O bir həmlə ilə əzib düşməni,
Döyüşlərdə qalib çıxartmış məni.
Mənə fil qazandırsa da min zəfər,
Təhəmtən yanında deyil tük qədər.
O gənci hüzura tələb etdi Zal,
Üzündən, gözündən öpüb dalbadal,
Dedi: – Körpə aslansan, ey şiri-nər!
Cəsarətlisən, var qolunda hünər.
Uşaqsan hələ, yox sənə tay duran,
İgidlik, zəka boy-buxunda, inan!
Belə bir işə var sənin qüdrətin,
Tutar bil, cahanı adın, şöhrətin,
Səfər qıl Səpənd adlanan bir dağa,
Nəriman babanın qanın almağa.
Buludda dağın zirvəsi gizlənər,
Qanad sındırar şahin uçsa əgər.
Dağın başına dörd ağac yol olar,
Çəmənlik sulu yerdir, eldən kənar.
Eni zirvənin dörd ağacdır tamam,
Hesabsızdır heyvanı, saysız adam.
Bağı, bağçası var, geniş tarlalar,
Görən, bir belə yer daha harda var?
Əlindən gəlir xalqının hər peşə,
Özü hoqq yaratmış belə bir guşə.
Dağa bir cığır var, haman bu yola
Gözətçi tikilmiş uca bir qala.
Nəriman kimi yoxdu bir qəhrəman,
Fəridunun əmriylə o bir zaman
Qoşunla qala üstə qıldı səfər,

Qazansın deyə bu səfərdə zəfər
Döyüşdə gecə-gündüz o pəhləvan,
Nə tədbir tökdü, pozuldu haman
Nəhayət, dığırlatdılar bir qaya,
Nərimanın ömrünü verdi zaya,
Qoşun qaldı başsız, qayıtdı geri,
Fərudun şahın tökdü qan gözləri.
Gəlib Sama çatdı uğursuz xəbər
Ki, ölmüş Nəriman, pozulmuş səfər.
Ata matəmində qopardı fəğan,
Gözündə üzə sel kimi axdı qan.
Bütün həftəni yas tutub, ağladı,
Qoşun topladı, sel kimi çağladı.
Çölü çulğadı atlı başdan-başa,
Qala üstünə çapdılar birbaşa.
Neçə ay, neçə il gəzib yatmadı,
Qala bürcünə sarı yol tapmadı.
Nə dərvazədən çıxdı kimsə çölə,
Nə bir kəs bayırdan qovuşdu elə.
Qapı aylar, illərlə bağlansa da.
Kəsir hiss olunmazdı heç bir zada.
Nəhayət, ümidsiz geri döndü Sam,
Nəriman üçün almadan intiqam.
Oğul indi fürsət düşübdür ələ,
Mənim qurduğum hiylə, tədbir ilə,
Tanışlıq belə vermədən sarvana,
Qoşul o dağa yol alan karvana
Səpənd dağına qoy qədəm gizlicə,
O yolsuzları qır, tükət bir gecə.
Adın el içində tanınmır hələ,
Bu getməklə dillərdə dastan elə!
Təhəmtən dedi: – Tabeyəm əmrinə,
Zəfər müjdəsi tez yetirrəm sənə
Dedi Zal: – Dinlə məni, ey gözüm!
Qulağında qalsın gərək hər sözüm.
Geyin sariban paltarı əynüvə,
De gəlsin örüşdən qatarla dəvə.



Yükü karvanın, bil duz olsun gərək,
Tanınma saribantək ovsarı çək!
O yerlərdə vardır duza ehtiyac,
Duz orda əzizdir, nə ki təxti-tac.
Dağa tək yolu bağlamışdır qala,
Gərək xalq illərlə duzsuz qala.
Yükün duzdur, onlar eşitsə əgər,
Böyüklər əl üstə səni gəzdirər.
Bu tədbiri Rüstəm dəxi xoşladı,
Səfər əzmi ilə işə başladı.
Edib gürzünü duz yükündə nəhan,
Geyindi necə sadə bir sariban.
Qohum – əqrabadan neçə namidar,
Onunla bərabər hazırlaşdılar.
Geyindi hamı sariban paltarı,
Silah anbarı oldu duz tayları.
Gülüb qurduğu hiyləyə pəhləvan.
Yan aldı Səpənd dağına karivan.
Keşikçi uzaqdan görüb onları,
Qaçıb getdi el başçısına sarı.
Dedi: – Lap yaxınlıqda karvan gəlir,
O karvan ilə çoxlu sarban gəlir.
Yükü karvanın da duz olsun gərək,
Özün elçi göndər, xəbər tut görək!
Qala başçısı istədi bir nəfər,
Dedi: – Qaç, gətir karvandan xəbər.
Fikir ver, nədir yükləri, yaxşı bil,
Yubanma, dayanmaq məqamı deyil!
Enib elçi dağdan əsən yel kimi,
Tapıb karvanın başçısı Rüstəmi,
Dedi: – Qafilə başçısı sənmisən?
Nədir yüklərin? Söylə gizlətmədən!
Məni başçımız göndərib elçitək,
Nədir yükləriz, öyrənim mən gərək.
Təhəmtən cavab söylədi mehriban:
– Get, el başçısına de, ey novcəvan!
Yükü karvanın sadə duzdur təmiz,

Sizə biz qonağıq, qəbul etsəniz.
Qala səmtinə elçi döndərdi üz,
Böyük başçının yanına getdi düz.
Dedi: – Xoş xəbərlə qayıtdım geri
Ki, duzdur gələn karvanın yükləri.
Xəbərdən qala başçısı oldu şad,
– Xörəklər, – dedi, – çox şükür, tapdı dad.
Duza həsrət idi qala neçə ay,
Açılsın, – dedi, – darvaza taybatay!
Cahanpəhləvan tutdu bundan xəbər,
Dağı qalxaraq şadiman gəldilər.
Yaxınlaşdı dərvazaya pəhləvan,
Qəbul etdilər karvanı mehriban,
Təhəmtən rəisin gəlib yanına,
Baş əydi, dua eylədi canına.
Hədiyyə gətirdi ona çoxlu duz,
Duzu, vədə verdi ki, satsın ucuz.
Qala başçısı söylədi: – Çox sağ ol!
Həmişə günəş, ay kimi parlaq ol!
Hanı sən kimi qəlbi saf bir adam?
Səni kördüyümçün ürəkdən şadam.
Bazar səmtinə oldu Rüstəm rəvan,
Onunla bərabər bütün karivan.
Böyüklü-kiçikli bütün varlılar,
Gəlib Rüstəmi dövrəyə aldılar.
Kimi verdi paltar, kimi simü-zər,
Duz aldı hərə ehtiyacı qədər.
Qaraldı hava, Rüstəmi-namidar
İgidlərlə hərbə hazırlaşdılar,
Təhəmtən qala bürcünə qoydu üz,
Dalınca dilavərlər əllərdə gürz,
Qala başçısı tutdu bundan xəbər,
Hücum etdi, Rüstəmlə üzləşdilər.
Təhəmtən elə vurdu ki, gürz ilə,
Başı partladı, beyni getdi yelə.
Qala əhli bundan xəbər tutdu çün
Döyüş meydanına atıldı bütün,



Qılınclar yarıb bağrını zülmətin,
Axan qan qızartdı yeri ləl təkin.
Vuruşma qızıb, axdı qan çöllərə,
Sanardın şəfəq çökdü göydən yerə.
Təhəmtən qılınc, gürz, kəmənd işlədir,
Vurur, düşməni yerlə-yeksan edir.
Üfüqdən Günəş boylananda səhər
Yox idi silah qaldıran bir nəfər.
Çoxu aldığı zərbədən verdi can,
Qalanlar qaçıb çıxdılar ortadan.
Gəzib hər yeri pəhləvanlar o gün,
Tapıldı qaçanlar, qırıldı bütün.
Gəzirdi qala içrə Rüstəm özü,
Uca daş binaya sataşdı gözü.
Mühəndis binanı necə qaldırıb,
Dəmirdən ona bir qapı saldırıb,
Vurub gürzlə Rüstəmi-namidar
Dəmir qapını eylədi tarü-mar.
Girib gördü gümbəz göyə yüksəlir,
O anbar dolu saf qızıl sikkədir.
Təhəmtən baxıb burdakı sərvətə,
Dodağın gəmirdi düşüb heyrətə.
Çağırdı gələ pəhləvanlar yaxın,
Dedi: – Siz vara, sərvətə bir baxın!
Yəqindir ki, mədəndə zər qalmamış,
Dənizlər dibində gövhər qalmamış.
Yığıblar, vurublar bütün anbara,
Bu sərvət müyəssər deyil şahlara.
Oturdu, qələm aldı Rüstəm ələ.
Zala yazdı bir namə təfsil ilə.

Birinci ulu Tanrıdan başladı
Ki, hər namənin ziynətidi adı.
Fələklər yaratmaqda ustad olan
Yaratmış qarışqa, yaratmış ilan.
Yaratmış Günəş, Ay, – budur sənəti,
Ucaltmış fələk tağını qüdrəti.

Böyük Tanrıdan afərinlər ola
O Zabil pələngi yenilməz Zala.
Odur daim İrana arxa duran,
Odur Kavə bayrağını qaldıran.
Odur şahlara bəxş edən təxti-tac,
Günəş, Ay kimi əmri tapmış rəvac,
Alıb əmr, gəldim Sepənd dağına,
Bu dağ qaldırıb baş fələk dağına.
Dağa yüksəlib, keçmədim qülləni,
Qala başçısı dəvət etdi məni.
Necə söyləmişdin, elə eylədim,
Asan yolla gəldi elə məqsədim.
Yanımda igidlər, qaranlıq geçə,
Qala üstə basqın edib gizlicə,
Qırıb, qatladıq biz Sepənd əhlini,
Çıxartdıq ürəkdən közərmiş kini.
Səlamət qalan görmədik biz hələ,
Ağır bir xəzinə keçirdik ələ.
Ərinmiş gümüş, saf qızıl tağ vurur,
Sanarsan, önündə uca dağ durur.
Əgər vursalar xarvara vəznini,
Keçər, məncə, bu vəzn beş yüz mini.
Libas, fərş var, – hər qədər istəsən,
Nə lazım siyahı, özün istəsən.
Əgər aylar ilə mühasib saya,
Bu sərvət, bu dövlət alınmaz saya.
Mənə indi bildir: nədir fərmanın?
Çağ olsun damağın, səlamət canın!
Küləkdən iti elçi düşdü yola,
Çatıb naməni etdi təqdim Zala.
Ata baxdı, gördü nə yazmış oğul,
Sevincək dedi: – Afərin, çox sağ ol!
Ürəkdən elə şad idi pəhləvan,
Sanardın ki, olmuş dübarə cavan.
Yazıb Rüstəmin naməsinə cavab,
Ona mehribanlıqla etdi xitab:
Birinci: böyük Tanrıya afərin!



İkinci: – dedi, – çatdı namən sənin.
Zəfər müjdəsindən elə şad idim,
Mənə xoşdu ki, canı qurban edim.
Ləyaqətli oğlum, belə bir zəfər
Sənin kimi mərdin əlindən gələr.
Yaxıb düşmənin canını odda sən,
Nərimanı qəbr içrə şad etmisən.
Bu məktubu alçaq yığış, düş yola,
Fərağında qoyma könül qan ola!
Qənimətləri yükləməkçin yenə
Neçə min dəvə yolladım mən sənə.
Yükü yüklə, düşsün qatarlar yola.
Bir od vur ki, yansın, kül olsun qala.
Zalın naməsi Rüstəmə yetcəyn,
Sevindi, alovlandı qəlbində kin.
Yığışdırdı qiymətli şey hər nə var:
Möhür, tac, qılınc, şal, ipək parçalar,
Neçə-neçə şahanə gövhər kəmər,
Hesaba, saya sığmayan simü-zər.
Seçib yüklədi, düşdü karvan yola,
Qızıldan, gümüşdən boşaldı qala.
Bir od vurdu Rüstəm Sepənd dağına
Ki, yüksəldi tüstü fələk tağına.
Qayıtdı o yerdən geri şadiman,
Başı yüksək, alnıaçıq qəhrəman,
Zala müjdə çatdı ki, Rüstəm gəlir,
Zəfərlə, qənimətlə bahəm gəlir.
Dedi: – Pişvaza hazır olsun şəhər,
Gəlintək bəzəndi küçə, məhlələr.
Yürüş başladı, gurladı kərrənay,
Təbil, sinc, şeypur saldı haray.
Əziz oğlunu görməyə Zali-zər
Gedirdi, yanında neçə namivər.
Təhəmtən çatıb gördü Zali-zəri,
Enib, torpağa düşdü, öpdü yeri.
Ata oğlunun boynuna saldı qol,
Qızılla, cəvahirlə örtüldü yol.

Gəlib çatdılar Samın eyvanına.
Gözü yolda Rudabənin yanına.
Ana açdı qol oğlunu qucmağa,
Ədəblə oğul qoydu üz torpağa.
Üzündən, gözündən öpdü Rüstəmin,
Dedi: – Qəddinə can da qurban sənin,
Sama müjdə çatsın deyə durmadan,
Alıb namə yazdı cahanpəhləvan.
Ağıl sahibi Zal haman namədə
Çalışdı olub keçmişi şərh edə.
Hədiyyə seçib Sam üçün bir qatar,
Dedi qasidə: – Namə ilə apar!
Alıb naməni Sami-Neyrəm haman,
Çiçəktək açıldı üzü şadiman.
Qonaqlıq düzəltdi yığıb dostları,
O məclis xatırlatdı şən gülzarı,
Neçə dəfə Rüstəm adı çəkdi Sam,
Dolub, hey boşaldı o məclisdə cam.
Ona yaxşı müjdə gətirmiş deyə,
Xələt verdi, at verdi Sam elçiyə.
Zalın bir cavab yazdı məktubuna,
Əyilməz, yenilməz, əziz oğluna.
Dedi: – Bu təəccüblü olmaz əgər,
Hünər göstərə bir cavan şiri-nər
Əgər bir ağıl sahibi şir tutan
Ala körpə bir şiri göz açmadan.
Adamlar içində edə tərbiyə,
Ana şir döşündən o süd əmməyə.
Həmən körpə aslan çıxanda dişi,
Çıxar üzə onda ata vərdişi.
Uşaq yaşda Rüstəmdəki bu hünər
Ata irsidir, bəxş edib Zali-zər,
O gəzdikdə əldə qılınc meydanı
Cılız tülküyə döndərər aslanı.
Möhür basdı o naməyə pəhləvan,
Alıb elçi Sistana oldu rəvan.
O məktubu elçi yetirdi Zala,
Sevincdən durub oynadı az qala.



Üzü güldü Zalın, açıldı bahar,
Cavan oğlu ilə edib iftixar,
Ümid bağladı xalq o şiri-nərə,
Onun şöhrəti sığmadı göylərə.

Yaşı yüz iyirmi olunca haman,
Mənuçehr bildi köçür dünyadan.
Çağırdı münəccimləri hökmdar,
Ona göylərin sirrini açdılar.
Xəbər verdilər: – Başına qıl çara!
Gərək şah təxti geyinsin qara.
Səfər vaxtı çatmış, hazırlaş yola,
Çalış həqq yanında məqamın ola!
Buraxma əlindən bu gün fürsəti,
Ölüm heç kəsə verməyir möhləti.
Çün alimləri dinlədi padişah,
– Bəzənsin, – dedi, – başqa cür barigah.
Çağırdı dəbirlərlə möbidləri,
Açıldı ürəkdə olan sirləri.
Tələb eylədi Nuzəri yanına,
Verib yaxşı-yaxşı nəsihət ona:
– Bu şahlıq, – dedi, – puç bir əfsanədir,
Bu gün sən, sabah şah biganədir.
Gəlib çatmışam yüz iyirmi yaşa,
Ağır günləri vurmuşam mən başa,
Muradımca keçmiş mənim günlərim,
Əlimlə olub xar düşmənlərim.
Fəridun yolu getmişəm hər zaman,
Dönüb xeyrimə mütləqa hər ziyan.
Rəzil Səlmi, Turu yerə çalmışam,
Babam İyrəcin qanını almışam.
Əlimlə yox oldu mənim fitnə, şər,
Qala qaldırıb çoxlu, tikdim şəhər,
Bu gün sanki mən yoxmuşam dünyada,
Olub keçmişi kimsə salmaz yada
Həyat bir ağacdır, ölümsə bəhər
Gülü, yarpağı, bil, zəhərdir, zəhər,
O zəhmət, o zillət ki, çəkdim bütün,

Bu şahlıq, bu dövlət sənindir bu gün.
Tutaq bir ömür eyşü işrətdəsən,
Yenə bir qonaqsan bu dünyada sən.
Gedərsən, qalar bircə ad yadigar,
Yaşar yaxşı ad ötsə də ruzigar.
Çalış, yaxşılıqla çəkilsin adın,
Təmiz dinin olsun, təmiz övladın.
Nə haqq söyləmişsə, əməl eylə sən,
Nicata çatar haqq yoluyla gedən.
Yeni hakimi gözlər indi cahan,
O Musadır, olmuş rəsuli-zəman.
Yaxınlarda baş qaldırar Şərqdən,
Ona pis göz ilə, çalış, baxma sən.
Onun dini haqq dinidir, et qəbul,
Nə peymanı varsa, ona tabe ol!
Tək Allah yolundan çəkilmə, aman,
Bu haqq yoldadır yaxşılıq həm yaman.
Hücum eylər İrana türk ordusu,
Olar taci-təxtin böyük qorxusu,
Çətin bir yolu getməyə hazır ol,
Çalış, gah quzu, gah da qurd ol, oğul!
Sənə qorxu Turan tərəfdən gələr,
Pəşəng oğlu axır səni öldürər.
Sam ilə Zalı tut əziz dunyada,
Çətin gündə onlar yetər imdada.
O körpə ki, Zalın belindən gəlib,
Bir aslan kimi boy atıb, yüksəlib,
Sənin düşmənindən yəqin öc alar,
Əlində onun düşmən aciz qalar.
Dedi bunları, gözlərin bağladı,
Başı üstə Nuzər durub ağladı.
Nə ömründə dərd bildi o, nə azar,
Nə xəstə yatıb eylədi ahu-zar.
Yumub közlərini Mənuçehr şah,
Solub rəngi, çəkdi ürəkdən bir ah.
O şanlı, şərəfli, böyük hökmdar
Ölüb getdi, qaldı sözü yadigar.



## NUZƏRİN PADŞAHLIĞI

Ata yasını verdi Nuzər yola,
Ucaldı tacı göylərə az qala.
Mənuçehr qəsrində qurdu qəbul.
Hörmətlə atanı yad etdi oğul.
Dedi: – Tanrının kölgəsi – şah gərək,
Kimin ehtiyacı var, etsin kömək.
Bir az keçdi, şah azdı yoldan təmiz,
Açıb zülm əli, oldu bir rəhmsiz.
Bütün ölkədə başladı ah-fəqan,
Yeni şah dünyaya ağlatdı qan.
Ata rəsminə çəkdi birdən qələm,
Qılıb alimə, möbidə min sitəm,
Şah ikən qul oldu pula, sərvətə,
Salıb mərd insanları zillətə,
Rəiyyət cana doydu axır, tamam,
Şaha qarşı hər yanda qopdu qiyam.
Düşub qorxuya naxələf hökmdar,
Dedi: – Sam bəladan məni qurtarar,
Bu vaxtlarda Mazəndarandaydı Sam,
Ona yazdı Nuzər belə bir pəyam:
Günəşlə Zühəl, Marsı xəlq eyləyən,
Qarışqa, balıq həm filə can verən,
O xaliq ki, bilməz çətinlik nədir,
Onun qüdrəti müşkülü həll edir.
Bu aləmdə nə varsa, az, ya ki, çox,
Onun qüdrətində bunun fərqi yox.
Günəşlə Ayın xaliqindən səna
Mənuçehr şahın əziz ruhuna.
O şanlı, şərəfli böyük hökmdar,
Ölüb getdi, qaldı sözü yadigar.
Yenilməz Sama afərin ol qədər
Ki, göydən düşər torpağa qətrələr,
Cahan görmüş o pəhləvana salam,
O baş qaldırıb asimana, salam.
Sağ olsun canı daima, könlü şad,

Qəmü qüssədən, hər bəladan azad.
Cahanpəhləvanın açıqdır gözü,
Bilir gizli, aşkar gedən hər sözü,
O dəmdə ki, şah gözlərin bağladı,
Dilindəydi Sami-Nəriman adı.
Dedi: – hər işində ona arxalan,
O həm şahpərəstdir, həmi pəhləvan.
Sevib ölkəni saxlayan da odur,
Şah öz şahlığıyla ona borcludur.
Düşübdür bu gün ölkəyə vəlvələ,
Olub-olmazı xəlq alıbdır ələ,
Əgər gürz ilə çatmasan dadıma,
Dönər səltənət təxti tabutuma.
Alıb naməni Sami-Neyrəm həmən,
Ötürdü yanıqlı bir ah sinədən,
Səhər dan sökəndə xoruz açdı dil,
Samın əmri ilə çalındı təbil.
Qoşunla yola çıxdı o pəhləvan,
İran mülkünə doğru oldu rəvan.
Böyüklər Samın yanına getdilər,
Ona dərdlərini bəyan etdilər.
Dedilər ki, Nuzər – cavan tacidar,
Ata rəsmini pozdu o zülmkar.
Əlindən onun ölkə viran olub,
Dönüb taleyi, bəxti qətran olub.
Azıb ağlını, çıxdı yoldan tamam,
Kəsib lütfünü xaliq ondan tamam.
Budur arzumuz, Sam – igid pəhləvan
Çıxıb təxtə, olsun bizə hökmran.
Sam İranı düşməndən etmiş azad,
Ədalətlə dunyanı qılsın abad.
Ona qul olub, əhdü peyman edək,
Yolunda əziz canı qurban edək.
Dedi onlara Sam: – Düşünsək bir az,
Belə bir işi tanrı da xoşlamaz!
Bu Nuzər kimi bir kəyani nəjad[50]
Oturmuş kəmər beldə, təxt üstə şad.



Qoyub tac, mən şah olum ölkədə,
Bunu Sam qəbul eyləməz, ölsə də.
Elə bir adam yox cahanda yəqin,
Ürəkdə bu cür arzunu bəsləsin.
Mənuçehr şahdan olan qız belə
Otursaydı bu təxtdə tac ilə,
Bilin, torpağında olardı üzüm,
Onun xidmətində durardım özüm,
Atası yolundan dönübdürsə şah,
Yaxınlarda o işləmişsə günah,
Dəmir elə paslanmamışdır hələ
Cilalanmasında düşək müşkülə.
Onu mən gərək qaytarım düz yola,
Sevə xalqını, mehriban şah ola.
Siz öz keçmişinizdən dönün, bir daha,
İtaət edin, baş əyin padişaha.
Sizi yoxsa əfv etməz Allahınız,
Nə də mərhəmətli olar şahınız.
Bu dünyada zülmü alovlandırar,
O dünyada da od sizi yandırar.
Böyüklər peşiman olub birbəbir,
Dedilər ki, şah əmri həqq əmridir.
Gəlib dərbara çatdı Sami-səvar, [51]
Qəbul eylədikdə onu şəhriyar,
Oturtdu özüylə Samı yan-yana.
Dil açdı, dedi afərinlər ona.
Edib Nuzər hər mətləbi aşikar,
Dedi ordu, kütlə nə iş tutdular.
Belə söylədi Sam: – Ey padişah!
Sənə daima şadlıq olsun pənah!
Qoşundan əgər incimiş hökmüdar,
Bu məlumdu ki, qulda təqsir olar.
Edib xeyirxahlıq cahanpəhləvan,
Qocalmış cahan oldu bir də cavan,
Böyüklər gəlib üzr üçün dərgaha,
Müti oldular başla, canla şaha,
Cəlal ilə Nuzər çıxıb təxtinə,

Ömür sürdü asudə, xoşbəxt yenə.
Onun xidmətində belə qaldı Sam,
Şaha doğru yol göstərirdi müdam.
Sözü yaxşılıqdan salıb hər zaman,
Nəsihət verirdi şaha pəhləvan.
Fəridunu, Huşəngi yad eylədi,
Mənuçehrdən çox misal söylədi.
O hər nə dedi, şah etdi qəbul,
Atıb zülmü, tutdu yenə doğru yol.
Ədalət olub ölkədə bərqərar,
Rəiyyətlə şah mehriban oldular.
Fəlakətli yoldan qayıtmış şaha
Nəsihət yeri qalmamışdı daha.
Şahın xələtiylə yola çıxdı Sam,
Ona təxt ilə tac verildi ənam.
Ötüb keçdi günlər, fəqət heç zaman
Fələk Nuzərə olmadı mehriban.

Gəlib çatdı Turana bir gün xəbər:
Mənuçehr şah öldü, dəfn etdilər.
Onun oğlu Nuzər olub hökmdar,
Edibdir bütün ölkəni tarümar.
Eşitcək bunu türk şahı Pəşəng,
Dedi: – Vaxtıdır etsəm İranda cəng.
Gətirdi babası Turu yadına,
Bir ah çəkdi ki, düşdu od canına.
Yığıb başına neçə sərkərdəni,
Mənuçehr şah olduğu ölkəni
Ələ almaq üçün Pəşəng hökmdar
Xəbər verdi, gəldi bütün başçılar.
Gəlib çatdı Gərsivəzü Bariman,
Həm Ərcasbü Gülbad kimi qəhrəman.
İti pəncəli Niysə də var idi,
Pəşənk ordusunda o, salar idi.
Cahanpəhləvan, oğlu Əfrasiyab,
Xəbərdar olunca o verdi cavab,
Dedi: – Səlm ilə Turu bir yad edin!



Gərək qalmaya pərdə altında kin.
Kimin qızmamış beyni, idrakı var,
Həqiqət ona görsənər aşikar.
Bilərlər ki, iranlılar bərmələ
Bizim başımıza olublar bəla.
Qisas vaxtı çatmışdır artıq, bilin,
Gözünüzdən axan qanı üzdən silin!
Bu sözdən elə coşdu Əfrasiyab,
Yeyib yatmadı, qalmadı onda tab.
Hazırlaşdı, qəlbi dolu kin ilə,
Pəşəngin önündə danışdı belə:
– Mənəm şirlər ilə girən meydana,
Rəqibəm mən İran salarına
Qılınc qaldıraydı əgər Zadişəm,
Çatardımı Gərşasipə təxti-Cəm?
Qoyardı qədəm əzm ilə meydana,
Yəqin şah olardı bütün İrana.
O şey ki, əmanət qoyubdur babam,
Gərək düşmənindən alam intiqam.
Gərək mən qılıncı qınından çəkəm,
Qiyam eyləyəm, çarpışam, qan tökəm.
Nəzər saldı Əfrasiyaba Pəşəng,
Düşündü: durur qarşısında pələng.
Biləkdən, döşündən şirə oxşayar,
Qolunda onun fil qədər qüvvə var.
Qılıncdan itidir kəsərli dili,
Dəniztək səxavətlidir ver əli.
Dedi: – Çək qılıncı, götür ordunu,
Gedib viran eylə İran yurdunu!
O şahın ki, layiqli bir oğlu var,
Qürurla o şah ərşə baş qaldırar.
Ata ölsə də, ömrü yetməz sona,
Odur ki, oğul ad veriblər ona.
Bu sözdən hamı meydana atdı can,
Xəbər çatdı İğrirəsə nagahan.
Böyük qorxu çökdü onun canına,
Fikirli yönəldi şahın yanına,

Dedi: – Ey ağıllı, hünərli ata,
Bütün türklər içrə dəyərli ata.
Mənuçehr ölübdürsə, iranlılar
Deyil binəva, Sami-Neyrəm ki, var,
Unutma ki, Gərşasb, Qaren kimi
Nə çox pəhləvanları var mən kimi.
Bilirsən, qoca qurd necə bir zaman
Nə Səlmə, nə də Tura verdi aman.
Turan padişahı – babam Zadişəm,
Başı çərxə yüksəldi, öyrənmişəm.
Olub keçmişi salmamışdır yada,
Ədavət nədir, bilməmiş dünyada.
Hücum eyləsək biz, xətadır, xəta!
Düşər ölkə çaxnaşmaya, bil, ata!
Pəşəng, oğluna baxdı, verdi cavab:
– Yenilməz nəhəngdir, bil, Əfrasiyab,
Döyüşlərdə bir erkək aslandır o,
Gücü fil gücü, mərdi-meydandır o.
Bü hərbi yürüşdə ona yoldaş ol!
Verib lazımi məsləhət, sirdaş ol!
Baba qanını istəməzsə nəvə,
Haram bir toxumdur, düşübdür evə.
Bulud ağlayıb seyrələndə duman,
Yağış çölləri doyduranda sudan,
Döşər fərşini ot geniş çöllərə,
Olar atların otlağı dağ-dərə.
Yaşıl sünbülə qərq olanda cahan,
Çadır qurmalı çöldə hər qəhrəman.
Baxıb şadlanın tər çiçək sünbülə,
Qoşunla hücum başlayın Amülə!
Dehistanı, Qorqanı viran edin!
Axar çayları qanla əlvan edin!
O yerdən Mənuçehr də bir zaman
Hücum eyləyib, Tura ağlatdı qan.
Döyüş vaxtı Gərşasbı axtarın!
İgid Qarenin dövrəsini sarın!
İran onlar ilə bugün fəxr edər,



Həlak etsəniz onları siz əgər,
Bu işdən baban ruhu razı qalar,
Bu, düşmənlərin canına od salar.
Dedi şah İğrirəsə: – Sən inan.
Axar sel kimi, mən desəm, arxda qan,

Göy otlar edərkən çölü laləzar
Turanlı igidlər yola çıxdılar.
Hazır oldu Turanla Çin ordusu,
Əli gürzlü Xavərzəmin ordusu.
Deyərdin qoşunla dolub yer üzü,
Dönüb Nuzərin bəxtinin də üzü.
Yaxınlaşdılar Ceyhuna türklər,
Mənuçehrin oğluna çatdı xəbər.
Çıxardı qoşun qarşıya hökmdar,
Saraydan biyabana yollandılar.
Sipəhdar Qaren – igid pəhləvan
Qoşunla Dehistana oldu rəvan.
Dalınca onun şah Nuzər özü
Gedir, dillərin əzbəri hər sözü,
Dehistana gəldi yaxın ordular.
Toz içrə günəş çöhrəsi oldu tar.
Hasar qarşısında salıb ordugah,
Sərapərdə qurdurdu şövkətli şah.
Dehistanda başlanmamışdı savaş,
Bu vaxt bir yeni hadisə verdi baş.
İran mülkünə keçmiş Əfrasiyab
İki pəhləvanı edib intixab,
Biri Şəmasasdı, biri Xəzrəvan,
Ayırdı neçə dəstələr ordudan,
İgid atlı verdi otuz min nəfər,
Qılınc vurmada hər biri şiri-nər.
Ürəkdə Sama qarşı kin, atlılar
Üzü Zabilistana at çapdılar.
"Ölüb Sami-Neyrəm" – Yayıldı xəbər,
Ona yas tutub, dəfn edər Zali-zər.
Bu sözlərdən Əfrasiyab oldu şad,

Dedi: – Düşmənə yaxşı bəxt oldu yad.
Yetişdi Dehistanın ətrafına,
Quruldu sərapərdə şah oğluna.
Sayın ordunun istəsəydin əgər,
Deyim, bilin, dörd yüz kərə min nəfər.
Baxanda sanardın coşub dağ, dərə,
Çəyirtkə, qarışqa dolub çöllərə.
İgidlər ki, Nuzərlə gərmiş sinə,
Çatırdı sayı təkcə yüz qırx minə.
Bunu gördü Əfrasiyab gizlicə,
Dedi qasidə: – Düş yola bu gecə.
Alıb namə yazdı Pəşəngə belə:
Mən axtardığım şey düşübdür ələ,
Sərər Nuzəri ordusuyla yerə.
Hücum eyləsə ordumuz bir kərə,
Samı görmərik bir daha davada,
Ölüb getdi şah xidmətindən o da,
Ona Zali-zər tikdirir məqbərə,
Çətin ki, vuruşmaq ona əl verə.
Mənim qorxum ondandı təkcə müdam,
O getdi, İrandan alaq intiqam.
Şəmasas yəqin Zabilistandadır,
Samın təxti-tacı da ki, ondadır,
İşi görməyə mövqeyində çalış,
Ağıl sahibi dostu dinlə, danış!
İşə vaxtı çatdıqda, əl qatmayan,
Verib fürsəti fövtə, çəkmiş ziyan.
Alıb naməni qasid, açdı qanad,
Günəş taclı şah yanına çapdı at!

Dağın zirvəsində ağardıqda dan
Dehistana çatdı keşik ordudan,
Qoşunlar arasında yollar belə
Doluydu silah ilə, sursat ilə.
Bu dəm gəldi bir türk, adı Bariman,
Deyərdi: ayıq ol, ayıq, ey yatan!
Yaxından gəlib sezdi ordugahı,



Sərapərdədə gördü Nuzər şahı.
Gedib türk salarının yanına,
Xəbər verdi gördüklərindən ona.
Dedi sonra şahzadəyə: – Biz gərək
Nə vaxta qədər boş-bikar girlənək?
Şahım izn versə mənə, şir kimi
Bu meydanda yüksəldərəm qədrimi.
Dadan zərbəmi söyləyər: – Bariman,
Odur, varsa dünyada bir pəhləvan.
Dilə gəldi İğrirəs, o xeyirxah,
Dedi: – Bariman ortadan çıxsa, ah!
Qoşun əhli ruhdan düşər, xar olar,
Döyüşdə zəfər yolları bağlanar.
Bir adi adam meydana yollayaq,
Həlak olsa dərdə dözək bir sayaq.
Pəşəng oğluna gəldi bu sözlər ar,
Üzündən yağırdı onun zəhrimar.
Qəzəblə dedi: – Durma sən, Bariman,
Zireh tez geyin, al ələ ox, kaman!
Sənindir bu meydanda ancaq zəfər.
Nə ağlar, nə matəm tutar bir nəfər,
Gəlib meydana çatcağın Bariman,
Vurub Qarenə nərə o qəhrəman,
Dedi: – Nuzərin ordusunda əgər,
Hərif var mənə, göndərin bir nəfər!
Nəzər saldı Qaren dilavərlərə,
Tapa dövtələb, meydana göndərə,
Saçı ağ Qubaddan savay, müxtəsər,
Cavab vermədi Qarenə bir nəfər.
Kədərləndi Qaren, çatıldı qaşı,
Demək, getmək istər böyük qardaşı.
Qəzəbdən gözündən yaş axdı onun,
Dedi: – Varmı xeyri belə ordunun?
Vardı minlər ilə özündən deyən,
Qoca bir kişi göndərim hərbə mən?
Böyük qardaşından da o incidi,
Qoşun qarşısında Qubada dedi:

– Ötüb sinnin artıq, deyilsən cavan,
Döyüşməz qocaldıqda bir pəhləvan,
Qoşun içrə vardır böyük hörmətin,
Şaha göstərir yol sözün, söhbətin,
Boyansa qana ağ saçın ləltək,
Zəfərdən gərək büsbütün əl üzək..
Bu meydanda məğlub olar ordumuz,
Keçər düşmənin cənginə yurdumuz.
Qubad sonra tutdu üzün Qarenə,
Dedi: – İndi də sən qulaq ver mənə!
Ölümdür həyatın sonu, qardaşım,
Dəbilqə geyinməzsəm, heçdir başım.
Gətirdim belə bir günü mən yada,
Mənuçehrdən sonra düşdüm oda.
Yol almaz göyə ölmədən bir nəfər,
Ölümdür bir ovçu, şikarı bəşər.
İki ordu coşsa əgər bir zaman,
Qılınc zərbəsindən düşər qəhrəman,
Qalar cisim meydanda, qurd-quş yeyər,
Başı nizədə göylərə yüksələr.
Görərsən yataqda biri verdi can.
Ölüm heç kəsə verməmişdir aman.
Əgər mən bu dünyanı tərk eyləsəm,
Yerimdə igid qardaşım var, nə qəm?
Mənə tikdirər ali bir məqbərə,
Tutar sağlığımdan əziz min kərə.
Yuyar mişk, kafur, gülabla məni,
Olar məqbərə cismimin məskəni.
Salamat qal, ey qardaşım, əlvida!
Ağılla, kamalla yaşa dünyada!
Bu sözlərla aldı ələ nizəni,
Gəzişdi bir aslan kimi ərsəni.
Qubada belə söylədi Bariman:
– Səni cəngimə yaxşı salmış zaman.
Məgər canına qəsd edib ruzigar?
Bu yaşda səni göndəribdir şikar?
Belə söylədi Barimana Qubad:



– Uzun bir ömür sürmüşəm mən azad.
Hər insan doğulmuş ki, bir gün ölə,
Gecikməz əcəl bircə an da belə.
Bu sözlə gətirda atı cövlana,
Rahat bir ürəklə girib meydana,
Səhər gün çıxandan qüruba qədər
Vurub bu ona, o buna zərbələr,
Nəhayət, qazandı zəfər Bariman,
Gəlib meydana şir kimi, qorxmadan
Qubada hücum etdi zubin ilə,
Dağıtdı kəmərgahını kin ilə.
Atından yıxıldı qoca qəhrəman,
O aslan ürəkli igid verdi can.
Gedir Bariman çöhrəsində qürur,
Pəşəng oğlunun qarşısında durur.
Elə bir xələt aldı ki, heç zaman
Onun mislini olmamışdı alan.
Qubad öldü, Qaren görüncə bunu,
Hücuma apardı bütün ordunu,
Ucaldı iki ordudan gurhagur,
Sanardın ki, dünya yerindən qopur,
Qılınclar ki, almaz kimi parladı,
Dönüb lələ, qandan əpir bağladı.
Toz içrə, deyərdin ki, şimşək çaxır,
Günəşdən suya zərli tellər axır.
Təbil nərəsindən fəza oldu kar,
Qılınclar axan qanda qərq oldular.
Qaren hansı səmtə səyirdərdi at,
Qılıncı açardı fəzada qanad,
Sanardın ki, almazdı, mərcan səpər,
Nə mərcan, yerə kin ilə can səpər.
Sataşdıqda Əfrasiyabın gözü
Qoşunla ona qarşı gəldi özü.
Ürək kin dolu, üz-üzə durdular,
Batınca Günəş hey qılınc vurdular.
Gecə oldu, Qaren çıxıb ərsədən,
Dehistanə gəldi qoşunla həmən.

Gəlib Nuzəri gördü o pəhləvan,
Əziz qardaşından ötru bağrı qan.
Doyunca yuxu yatmayan padişah
Görüb Qareni, ağlayıb, çəkdi ah.
Dedi: – Sam öləndən bəri mən hələ
Ürək ağrısı çəkməmişdim belə.
Qubadın əziz ruhu saçsın ziya,
Yaşa, nail ol daima arzuya!
Döyüşdə ölüm çatdımı, biz heçik,
Qəbirdir cahanda bizə son beşik.
Cavab verdi Qaren: – Doğuldum ki, mən
Ölüncə geri dönməyim cəbhədən.
Fəridun qoyubdur başıma papaq,
Gərək İyrəcin intiqamın alaq.
O gündən ki, aldım qılıncı ələ,
Belimdən kəmər açmadım mən hələ.
Ölübsə ağıllı, igid qardaşım,
Çəkər bu bəlanı mənim də başım,
Yaşa, şəhriyarım, döyüşdə bu gün
Peşəng oğlunu darda qoyduq bütün.
Ağır itkilər verdi, batdı qana,
Gətirdi yeni dəstələr meydana.
Öküzbaşlı gürz ilə görçək məni
Yaxın gəldi Turanın Əhriməni.
Salınca onun çöhrəsinə nəzər,
Nə gördüm, gözüm gözlərində gəzər,
Məni etdi cadu ilə biqərar,
İşıqlı gözümdə cahan oldu tar.
Gün axşam olunca qaraldı cahan,
Qolum qalxmadı vurmağa, sən inan!
Deyərdin: bu anda qiyamət qopur,
Qara torpağın altına qan hopur.
Qoşun toz qopardı, qaraldı gecə,
Qayıtdım döyüşdən, budur, indicə.
Gecə ordular yaxşı dincəldilər,
Açılcaq səhər, meydana gəldilər.
Kəyan rəsmi ilə vuruşsun deyə,



Düzülmüşdu iranlılar cərgəyə.
Baxıb gördü amadədir bir tərəf,
Təbil vurdu Əfrasiyab, çəkdi səf,
Elə toz qoparmışdı ki, atlılar,
Sanardın, Günəş zülmətə qərq olar.
Ucaldı iki ordudan vurhavur,
Tarazlaşdı səhradakı dağ, çuxur.
Sarındı qoşun bir-birinə elə
Ki, qan sel kimi axdı, getdi çölə.
Hücum eyləyəndə Qaren hər yana,
Boyardı tozu, torpağı al qana.
Hara at səyirdərdi Əfrasiyab,
Axardı çölə qan seli bihesab.
İki səmtdən nizə qalxdı göyə,
Elə vurdular nizəni nizəyə,
Sarınmış, deyən, bir-birinə ilan,
Vuruşmaz belə, rəsmdir, şah olan.
Günəş batdı, çökdü qaranlıq yerə,
Pəşəng oğlu göstərdi zor Nuzərə,
Yorulmuş, əzilmişdi iranlılar,
Döyüşdən çəkilməzdi turanlılar,
O əlacsız meydanı tərk etdilər,
O səhrada dincəlməyə getdilər.
Daha Nuzərin gülməyirdi üzü,
Bilirdi sönüb bəxtinin ulduzu.
Təbil səsləri susdu, Nuzər bu dəm
Dedi: – Gəlməli Tus ilə Güstəhəm.
Dodaqlarda ah, qəlblərdə fəqan,
Hüzura yetişdi iki pəhləvan,
Töküb göz yaşı, sinədən çəkd ah,
Ürək dərdini söylədi padişah.
Cigər qan dolu, qüssədən çəkdi dad,
Ata sözlərini birər etdi yad.
Demişdi Mənuçehr ona, bil yəqin,
Hücum eylər İrana Turanla Çin.
Olarsan o dəm qüssədən bağrı qan,
Döyüşdə yetər orduna çox ziyan.

Şahın sözləri doğrulur birbəbir,
Mənə düşmən hər yerdə üstün gəlir.
Görən olmamışdı keçəndə hələ
Ki, türklər çıxartsın qoşun bir belə.
Siz indi olun Parsa doğru rəvan.
Çıxardın hərəmxanəni ortadan.
Alın, yollanın Zavəkuhə sarı,
Siz Əlborzdə gizlədin onları!
Qoşundan xəbərsiz çıxın tez yola,
Bizə üz veribdir təzə bir bəla.
Qoşun əhli tutsa bu işdən xəbər,
Döyüşdə tamamilə ruhdan düşər,
Fəridun çırağı sönür aşikar,
Gedin, saxlayın bir-iki yadigar,
Sizi bir daha görməyimdir çətin,
Bilin qədrini bir gecə fürsətin,
Gecə-gündüz, hər anda hüşyar olun!
Cahan işlərindən xəbərdar olun!
Qoşundan əgər pis xəbər alsalar,
Şahənşahlığın qüdrəti sarsılar,
Siz həddindən artıq kədərlənməyin,
Fələkdən nəsibi budur taleyin.
Birini salar qiylü qalə zaman,
Biri əyləşər başda tac şadiman.
Ölüb öldürüldün, deyil bir məgər?,
Döyüşdə ölənlər asan can verər.
Sona çatdı şahın nəsihətləri
Hüzurda duranlar öpəndə yeri.
İki pəhləvanı basıb bağrına,
Gözündən yaş axdı yanaqlarına.

İki gün qoşun əhli dincəldilər,
Günəş boylananda üçüncü səhər
Şahın meyli yoxdu döyüş başlana,
Əlacsız qalıb çıxdı o, meydana.
Qiyas eyləyəndə iki ordunu,
Onu bir dəniz bil, axar çay bunu.



Çalındı təbil, gurladı kərrənay,
Ucaldı sərapərdədən hay-haray,
Şahın dərgahından çıxan atlılar
Dəbilqə qoyub, qol-qola çatdılar.
O yandan da Əfrasiyab ordusu
Yada salmadan istirahət, yuxu,
Qoşun səflərin sahmana saldılar,
Qılınc, nizə, zubin ələ aldılar.
Ağır gürzlər əldə bənzər dağa,
Zirehli qoşun başladı coşmağa,
İki çay arasında səf çəkdilər,
Görünməzdi dağ, axtaraydın əgər,
Qaren mərkəzində durub ordunun,
Bütün cəbhəyə şahla oldu sütun.
Sağa başçı Nəstuh, Şapur idi,
Təlimansa sol səmtə məmur idi.
Səhərdən ikində çağına qədər
Dəniz, dağ, dərə görmədi bir nəfər.
Sanardın qılınclar qürurla enir,
Ağır atlar altında sızlardı yer.
Salınca yerə nizələr kölgə düz,
Şahın ordusuna xətər verdi üz.
Qarabəxt idi çünki iranlılar,
Döyüşdə zəfər çaldı turanlılar.
Qoşun sağ cinahdan pozuldu həmən,
Dönüb qaçdı bir çoxları cəbhədən.
O dəmdə ki, Şapuru öldürdülər,
Deyərdin ki iranlılar öldülər.
Vuruşqan o turanlılar nagahan
Dehistana üz qoydular ordudan.
Gecə-gündüz orda gedirdi savaş,
Neçə vaxt iki ordu etdi təlaş.
Hasar oldu çün məskəni Nuzərin,
Alındı hasara yolu türklərin
Durub gözləməkdən çəkirdi əzab,
Suvariləri düzdü Əfrasiyab,
Kəruxanə verdi ki, ey namidar,

Qalıbsan igid Viysədən yadigar.
Götür ordunu, vaxtı etmə hədər,
Kəsə yolla Parsa yetiş birtəhər.
Bil, iranlılar orda saxlar köçü,
Yəqin atlılar yolda haqlar köçü.
Gəlib Qarenə çatdı bundan xəbər
Ki, Əfrasiyab Parsa şəbxun edər.
Qəzəbdən onun düşdü od canına,
Pələngtək gəlib Nuzərin yanına,
Dedi: – Bu Turanşah nə namərd imiş,
İran şahına gör o nə eyləmiş?
Böyük bir qoşun göndərib gizlicə,
Divan tutmaq istər köməksiz köçə.
Hərəm əhlini qılsa türklər əsir,
Bizim ordu məğlub olar, ey əmir!
Necə gəzdirək onda başda papaq?
Kəruxan dalınca gərək at çapaq.
Uanında yemək var, axar çeşməz var,
Sənin varlığınla qoşun ruhlanar.
Sıxılma, dayan bir zaman, çəkmə ah,
Yenilməz, mətin olmalı padişah.
Gedim onları haqlayım mən gərək.
Əzilsin yarı yolda düşmən gərək.
Dedi şah: – Bu fikrin əbəsdir, əbəs,
Səni orduda bəs kim etsin əvəz?
Təbil səslənib, banlayanda xoruz
Köçün ardınca getdi Küstəhm, Tus.
Köçə tez çatarlar, buna ol əmin,
Nə lazımsa, onlar edərlər yəqin.
Bir anlıq qəmü qüssədən keçdilər,
Açıb süfrə, birlikdə mey içdilər.
Gedib Qarenin mənzilinə o dəm,
Bulud kimi toplandı gözlərdə nəm,
Deyib, dinləyib hər sözü aşikar,
Nəhayət, verildi belə bir qərar:
Bu gün Parsa doğru gərək yollanaq,
Bu yerdə dayanmaq nahaqdır, nahaq.



İranlı qadınlar ki, o yerdədir,
Olarlarsa düşmən əlində əsir,
Qalarmı daha bizdə səbrü qərar?
Qılınc kim vurar, nizə kim qaldırar?
Qaren pəhləvanları tutdu dilə,
Qərarlaşdı Şiduşla, Kəşvad ilə.
Gecə çün yarı oldu, iranlılar
Səfər əzmi ilə hazırlandılar.
Qala daxilində igid Kəjdəhəm
İgidlər yanında dayanmış o dəm.
Təbil, fil, qoşunla yol üstə haman,
Qala xaricində durub Bariman.
O idi yaxan Qarenin canını,
O idi Qubadın tökən qanını,
Görüncə onu, döndü bir aslana,
Macal vermədi əl aça Barimana.
Onu nizə ilə elə vurdu ki,
Qırıldı beli ortadan tən iki.
Qoşun matəmə batdı başdan-başa,
Qoyub qaçdılar bir çoxu dağ-daşa.
Gecə vaxtı Qaren çıxıb ortadan,
Dalınca qoşun Parsa oldu rəvan.

Xəbər tutdu Nuzər ki, Qaren gedib,
Dalınca hasarı o da tərk edib,
Çapıb getdi bəlkə yaman gün ötə,
Fələk salmaya başını zillətə.
Gəlib çatdı Əfrasiyaba xəbər
Ki, Nuzər düşübdür daha dərbədər.
Qoşun toplayıb getdi bəlkə çata,
Bir aslan kimi çəkdi məhmiz ata.
Gəlib haqladı çün İran şahını,
Qaçan düşmənin aldı meydanını.
Çalışdı ki, şahla gələ üz-üzə,
Başın tacidarın bədəndən üzə.
Qaçıb qovdular, sübh olunca gecə,
Bilən olmadı sübh açıldı necə?

Asıldı fəzadan gunəş telləri,
Çapıb gəzdi Əfrasiyab Nuzəri.
Cahan toz içində qaraldı bütün,
Ələ keçdi axırda Nuzər o gün.
Yanınca qoşun min iki yüz nəfər,
Pənahdah gəzirdi şah, amma hədər.
Hey at çapdılar, hey yol axtardılar,
Yenə oldular min bəlaya düçar.
Nəzər sal, fələk, gör, nə işlər edir?
Elə bir qoşun oldu şahla əsir.
Fələk işlərini düşünsən bir az,
Olan yox qəzanın əlindən xilas.
O gah qaldırar, təxt verər, tac verər,
O gah da səni torpağa endirər.
O, dostdurmu, düşmənmidir, tapmadıq,
Verər gah sənə xalis iç, gah qabıq.
Ucaldarsa da başını göylərə,
Yəqin bil, səni çırpacaqdır yerə.
Dedi sonra Əfrasiyab orduya:
– Gedin, baş çəkin dağda hər pusquya,
Görün, hardadır Qaren, o pəhləvan!
Aman verməyin ki, çıxa ortadan.
Ona söylədidar ki, o filbədən
Dehistana gedibdir axşam ikən.
Bu işdən kədərləndi Əfrasiyab,
Yeyib yatmadı, çəkdi çox iztirab
Ki, Qaren səlamət çıxıb ortadan,
Fikirdən qaraldı gözündə cahan.
Dedi Viysəyə: – Şanlı sərkərdəsən,
Oğul qanını qoyma gəl yerdə sən,
Qaren qurtarıb, başlasa bir də cəng,
Önündə onun tab gətirməz pələng.
Döyüşkən bir ordu götür, durmadan
Onu izlə, çat, zərbə vur arxadan!

Turan ordusundan seçib dəstələr,
Yola düşdü Viysə açılcaq səhər.



Hələ Qarenə çatmadan qəlbi çak
Gördü əziz oğlu olubdur həlak.
Turan ordusundan neçə pəhləvan
Ölübdür, onunla düşüb yanbayan.
Yatıb bayrağı, parçalanmışdı kus,
Kəfən lalə rəngində, üz səndərus[52].
Xəbər çatdı çün Qarenə Viysdən,
Onu izləyən kinli sərkərdədən.
Neçə atlı qıldı rəvan Zabıla,
Özü günçıxan səmtə düşdü yola.
Oğul dərdi ilə olub bağrı qan,
İgid Viysə də Parsa oldu rəvan.
Qaren Parsdan çıxdı, dönsun geri,
Göründü solunda Turan ləşkəri.
Toz içrə qara bayraq oldu əyan,
Qabaqda qoşun başçısı pəhləvan,
Döyüş axtarırmış hər iki tərəf,
İgidlər durub döş-döşə, çəkdi səf.
Ucaldı qoşundan səsi Viysənin.
Ki, getmiş bada təxti-tacın sənin
Bütün ölkəni biz keçirdik ələ,
Salıb ordumuz aləmə vəlvələ.
Hara sən qaçırsan, mənə söylə bir,
O dəmdə ki, şahın olubdur əsir?
Dedi: – Qarenəm mən, bunu yaxşı bil,
Bu tufan, bu sel heç dizimdən deyil!
Dehistanı tərk etmədim qorxudan,
Hanı pəhləvan oğlun, o Bariman?
Qisas aldım ondan, vurub nizəni
Dalınca gərək göndərim mən səni,
Qopardı hər iki qoşun toz-duman,
Nə Ay görsənirdi, nə də asiman.
Savaş qopdu, dəydi ləşkər ləşkərə
Axar çay kimi qan töküldü yerə.
Qaren Viysənin üstünə sürdü at,
Deyərdin qaçan Viysə açmış qanad,
Edib Viysə can qorxusundan fərar,

Qırıldı o meydanda çox namidar.
O gün Viysənin bəxti oldu qara,
Qarendən qaçıb axtarırdı çara,
Gəlib verdi Əfrasiyaba xəbər,
Ürəkdə oğul dərdi, üzdə kədər.

Qoşunlar ki, Ərmandan oldu rəvan[53]
Axıtmaq üçün Zabilistanda qan,
Şəmasas Ceyhun çayın adladı,
Üzü Sistana doğru çapdı atı.
Xəzərvan, başında otuz min nəfər,
Hamı adlı-sanlı igid türklər
Qılınc beldə, gürz əldə, şən, bəxtiyar,
Gəlib Hiyrmənd şəhrinə çatdılar
Gurabdaydı Zal, Sam üçün bağrı qan,
Qəbir tikdirirdi ona pəhləvan.
Şəhər içrə Mehrab qalmışdı tək,
Açıq gözlü idi o, parlaq ürək.
Bir elçi çağırdı igid, qəhrəman,
Şəmasas hüzuruna oldu rəvan.
Gedib elçi çatdıqda verdi səlam,
Dedi: – Göndərib şah Mehrab pəyam.
Deyir ki, Turanşah uca bəxt ilə,
Sağ olsun görüm, tac ilə, təxt ilə!
Ərəb şahı Zöhhak olubdur babam,
Elə zənn etmə bugün mən şadam.
Qohumluqla mən can satın almışam,
Əlacsız qalıb, bunca alçalmışam.
Mənəm Zabilistanda bir hökmdar,
Əlimdə varımdır böyük ixtiyar,
Ölüb Sam, matəmdədir Zali-zər,
Gah ağlar ona, gah da tərif edər!
Olur şad könlüm o tökdükcə yaş,
Üzün görməyəydim onun bir də kaş.
Böyük pəhləvan, bir sözüm var sənə,
Qəbul eyləyib, ver də möhlət mənə,
Qoy Əfrasiyab yanına bir nəfər



Adam göndərim – başlı, sahibhünər,
Ona sirrimi bir-bir etsin bəyan,
Çıxar onda sözgəzdirən ortadan.
Hədiyyə ona göndərim simü-zər,
Əlavə görüm, şah nələr istəyər?
Desə: gəl mənim yanıma, bil yəqin,
Qul ollam önündə uca təxtinin.
Verərdim ona şahlığı, ölkəni,
Bu sonsuz kədər tərk edərdi məni.
Sənə pisliyim yetməz, ey pəhləvan,
Varım, dövlətim də sənindir, inan!
Şəmasası tutdu belə al dilə,
Girişdi işə başqa tədbir ilə.
Zalın yanına göndərib bir çapar,
Dedi: – Quş kimi, uç tez xəbər apar!
Zala söylə: işlər yamandır, yaman,
Bir an da gecikmə, amandır, aman!
İki pəhləvan çəngə hazır gəlir,
Bu türk ordusu sanki qızmış bəbir.
İki yolla hirməndə çatmış səhər,
Pul ilə dayandırmışam birtəhər.
Gələrkən keciksən əgər bircə an,
Çatar kamına düşmən, ey pəhləvan!
Çapar çatdı, Dəstanə verdi xəbər,
Olub bağrı atəş kimi şöləvər,
Döyüşkən bir ordu alıb durmadan,
Qoçaq Mehraba sarı oldu rəvan.
Gəlib gördü: Mehrab möhkəm durur,
Başında ağıl, görkəmində qürur.
Düşündü: – Nə mənası var qorxmağın?
Xəzərvan ilə bir ovuc torpağın
Yanımda mənim fərqi yoxdur dedi,
Bir az dincəlib, yaxşı içdi, yedi.
Dedi Mehraba: – Ey ağıllı kişi,
Gözəl sahmana salmısan hər işi.
Gecə vaxtıdır, indi qoy mən gedim,
Bir əl gəzdirim onlara, qan edim.

Verim düşmənə gəlməyimdən xəbər,
Qəzəb yoxsa, bağrımda tüğyan edər.
Qoluna keçirdi ağır bir kaman,
Cida boyda bir ox götürdü haman.
Baxıb, pəhləvanın yerin bəllədi,
Atınca, fələk "afərin" söylədi.
Nişan aldı, üç ox atıb üç yerl
Ucaldı ünü düşmənin göylərə.
Yığıldı qoşun əhli olcaq səhər,
Gəlib oxlara saldı hər kəs nəzər,
Dedilər: – Bu oxlar onundur, onun,
Belə qüdrəti yoxdur özgə qolun
Günəş boylanıb, aləmə səpdi nur,
Qopardı təbil nərəsi gurhagur.
Kərənay, nağara, iri zənglər
Çalındı, səs ilə ayıldı şəhər.
Sərapərdəni Zal çatdı filə,
Şəhərdən bir ordu çıxardı çölə
Qoşunlar gəlib durdular üz-üzə,
Toza döndü dağlar, yayıldı düzə.
Xəzərvan əl atdı əmud-qalxana,
Çilovtökmə çapdı atın meydana.
Zalın sinəsindən elə vurdu ki,
Zireh xırçalandı, bölündü iki.
Geri döndü meydandan o namidar,
Dalınca onun kabilistanlılar,
Zireh əyninə geydi Zali-delir[54].
Deyərdin, dönüb meydana gəldi şir,
Əlində Samın gürzü o pəhləvan,
Başında qəzəb atəşi, bağrı qan.
Xəzərvan əyildi yəhər qaşına,
Zalın gürzü endi onun başına,
Olub zərbəsindən dəbilqə xəmir,
Axıb qan, pələng cildinə döndü yer,
Yıxıldı Xəzərvan yerə tir kimi,
Səyirtdi atı Zali-zər şir kimi,
Bağırdı ki: – Gəlsin, Şəmasas hanı?



O gizləndi, dondu damarda qanı.
Toz içrə şikar axtaran Zali-zər
Qılınc əldə, Gülbada saldı nəzər,
Zalın gürzünə çün sataşdı gözü,
Çalışdı ki, qaçsın, itirsin izi,
Kamanda bir ox çilləyə qoydu Zal.
Atıb, söylədi: – Gəldi, Gülbad, al!
Gedib ox dağıtdı kəmərbəndini,
Polad zəncirin qırdı hər bəndini.
Tikildi belindən yəhər qaşına,
Oturdu qoşun Gülbadın yasına.
Sərildi yerə çün igid pəhləvan,
Saraldı Şəmasas üzü qorxudan.
Ürək qalmadı onda çarpışmağa,
Çevirdi atın başını qaçmağa.
Qovur düşməni zabilistanlılar,
Gedirdi qabaq səfdə Zali-səvar.
Döyüş meydanında qoyub leşləri,
Hücuma gələnlər qaçırdı geri.
Şəmasas o dəmdə ki, çıxdı düzə,
Nə gördü ki: Qaren gəlir üz-üzə.
O ki, öldürüb Viysənin oğlunu,
Dağıtmışdı, qırmışdı bir ordunu.
Qoşun qarşısında qoşun çəkdi səf,
Şəmasasla Qaren – hərə bir tərəf.
Qaren bildi, kimlərdir onlar belə,
Yenə Zabilistanda düşmüş çölə
Döyüş təbli çaldırdı, kəsdi yolu,
İşə düşdü nər pəhləvanlar qolu.
O yorğun, o əzgin düşən ordudan
Göyə qalxdı bir həmlədə toz, duman,
Şəmasas gördü xarabdır işi,
Əkildi, yanınca beş-altı kişi.
Turan mülkünə üz tutub çapdı at,
Ölümdən çətinliklə tapdı nicat,
Turan şahına gəldi, çatdı xəbər
Ki, başsız qalıb yerdə sərkərdələr.

Tutaşdı oda qəlbi, çəkdi fəqan,
Gözündən yanaqlarına axdı qan.
Qəzəblə bağırdı: – O Nuzər hanı?
Verin Viysəyə, tam halaldır qanı.
Gərək öldürəm şahı, yoxdur çaram.
Yeni bir ədavət odu yandıram.
Dedi cəllada: – Çək onu meydana,
Kəsib başını qərq elə al qana!
Bu fərmanı Nuzər bilib, çəkdi ah,
Həyatından əl üzdü o padişah.
Çığırla-bağırla böyük izdiham,
Bir ordu gedib Nuzər üstə tamam,
Tutub, bağlayıb nazənin qolları,
Şahı çəkdilər əjdahaya sarı.
Çıxardıb onu zülm ilə xeymədən,
Ayağı yalın, xar, çılpaqbədən.
Onu görçək Əfrasiyab, açdı dil,
Gətirdi babası kinindən dəlil.
Açıb Səlm ilə Turdan dasitan,
Nə şahdan utandı, nə də tanrıdan.
– Sənə bu cəzalar da azdır hələ
Dedi, bir qılınc aldı kinlə ələ,
Qəzəblə elə zərbə vurdu ona,
Bədən bir yana düşdü, baş bir yana,
Mənuçehr şahın ümidi olan
Oğul öldü, həm qaldı şahsız İran.
Başında ağıl, huş varınsa əgər,
Geyinmə tamah paltarı sən hədər,
Sənintək görüb təxti-tac çoxları,
Oxu qəmli dastanları sən barı!
Tutaq, yüksəlib, arzuna çatmısan,
Demək, arzu, istək daşın atmısan.
Qara torpağa bağladın bel neçin?
O torpaq səni ölmüş istər yəqin.
Əlinlə yəhərlənsə də asiman,
Yerin altıdır son məkanın, inan!
Əsirlər gəlib qarşıda durdu xar,



Aman istəyib etdilər ahü-zar.
Bunu gördü İğrirəs oldu məlul,
Bu zülmü edə bilməyirdi qəbul.
Düşündü ki, bunlarda yox bir günah,
Niyə öldürür bunları padişah?
O iqdam edib, xeyirxah bir işə,
Gəlib yalvara-yalvara xahişə,
Dedi: – Bunların yox əlində silah,
Vuruşmaz, döyüşməzlər, ey padişah!
Əsir boynunu vurmağın xoş deyil.
Eniş var bu yüksəlmək ardınca, bil!
Günahsızların girmə can qəsdinə
Qolu bağlı ver onları sən mənə.
Edim onları həbs bir dağda mən,
Keşikçi qoyum, gözləsinlər həmən,
Qoy etsin hamı Sarıdə ahü zar, [55]
Saqın qan axıtmaqdan, ey hökmdar.
Qulaq asdı diqqətlə Əfrasiyab,
Gəlib rəhmə, kamınça verdi cavab,
Dedi: – Onları Sariyə göndərin!
Çəkin zəncirə, çox əziyyət verin!
Bu fərmanı verdi, düzəldi yola,
Qoşunla çapırdı atı dördnala.
Qovub atları tərləyə-tərləyə.
Dehistandan o gəldi, çatdı Reyə.
Kəyan tacını aldı, qoydu başa,
İran təxti çatdı o qəlbi daşa.

Xəbər çatdı Qostəhmə, Tusa o gün
Ki, şahlıq büsatı pozulmuş bütün.
Qılıncla kəsilmiş başı Nuzərin
Tacı düşmənə çatmış o sərvərin.
Üzə əl atıb, saçların yoldular,
İran mülkünü çulğadı ahü-zar,
Yaxa açdı sərkərdələr gözdə qan,
Ucaldı göyə ölkədə ah-aman;
Tutub Zabilistana üz, getdilər,

"Şahım, vay" deyə, ahü-zar etdilər.
Zala çatdılar sinədə dərdü qəm,
Yanaqlarda qan, başda kül, gözdə nəm,
Dedilər: – Sən ey qəhrəman, tacidar,
Bizə şahımızdan əziz yadigar,
Başın yerdə axtarmasın tac barı,
Şahın qanı islatdı torpaqları.
Bu yerlərdə bitki göyərsə əgər,
Günəş qarşısında yerə baş əyər,
Ata matəmində necə bir uşaq,
Gözü yaşlıyıq, sən bizə dayaq!
Mənuçehrdən tək o idi nişan,
Ona baş əyirdi, bilirsən, cahan.
Qılıncla kəsildi başı, oldu xar,
Onun matəmində cahan ağlayar.
Qılınclar qınından çəkilsin gərək,
Qana qan alaq, çoxlu qurban verək.
Fələk də əza saxlamışdır, inan,
Yerə indi qan yağdırar asiman.
Gəlin göz dolu siz də qan ağlayın,
Atın bu libası, qara bağlayın!
Şahın matəmində gərək hər kəsin
Gözündə yaş olsun da, qəlbində kin.
Bu sözdən hamı ağladı zar-zar,
Deyərdin tutub od, alovlandılar.
Qəsəm yad edib Zal dedi: – Həşrədək
Qılıncı qına qoymayım mən gərək.
Yəhər taxtım olsun əlimdə yaraq,
İti nizəm ancaq mənə bir dayaq.
Üzəngimdən heç vaxt ayaq üzməyim,
Dəbilqə qoyum, başda tac gəzməyim.
Nədir, bilməyim, istirahət, yuxu?
Gözümdən axa sel kimi qanlı su.
Şahın ruhuna həqq-pərvərdigar
Əzizlər məqamında versin qərar.
Sizə həm budur istəyim dünyada:
Böyük tanrımız səbr qılsın əta.



Bizi ölmək üçün doğubdur ana.
Kimin qüdrəti var bu əmri dana?
İgidlər qisas almağa getdilər,
Saridə əsirlər tutunca xəbər,
Turan şahının qorxusundan tamam
Yeyib yatmağı bildi onlar haram.
Sifariş gəlib çatdı İğrirəsə
Ki, sən xeyirxahsan bu gün hər kəsə.
Ölümdən bizə sən veribsən nicat,
Quluq biz, sənindir bu can, bu həyat.
Bilirsən, durur Zabilistanda Zal,
Durur Kabilistan şahında cədal,
Bu torpaqda Bərzinlə Qaren durar,
Bu meydanda Xərrad, Keşvad var.
Qırılsa hamı, bir nəfər qalsa da,
Bil, İranı verməzlər onlar yada.
İgidlər hücum etsələr, siz bilin,
Oyar nizə ilə gözün düşmənin.
Düşər qorxu Əfrasiyab canına,
Susar onda məhbusların qanına.
Tacı başda qalsın deyə zülmkar
Günahsızların boynunu vurdurar.
Ümid indi qalmışdır İğrirəsə,
Bizi həbsdən o xilas eyləsə,
Dağıllıq cahanda hərə bir yana,
Həmişə duaçı olub biz ona,
Gedib vəsfini şahlara söylərik,
Açıb tanrıya əl, dua eylərik.
Belə verdi İğrirəs onda cavab:
– Bu cür eyləsəm, mütləq, Əfrasiyab
Məni aşkara düşmən adlandırar,
Olub Əhrimən, aləmi yandırar.
Gərək başqa bir yol düşünsün başım
Ki, məndə günah görməsin qardaşım.
Qisas almara əzm edən Zali-zər
Qoşunla olarsa bizə həmləvər,
Gəlib Sariyə çatsa Dastani-Sam[56],

Ona tapşırardım sizi mən tamam,
Özüm Amülü tərk edərdim naçar
Ki, guya döyüşdən mən etdim fərar.
Bu sözlərdən iranlılar oldu şad,
Qoyub torpağa üz, edib həqqi yad
Əsirlər bir anda çıxartdı qərar,
Yola saldılar Saridən bir çapar,
Uzaq bir yolu at çapıb dördnala,
Əsirlər dilindən yetirsin Zala,
Desin: tanrı lütfü bizə oldu yar,
Həyan çıxdı İğrirəs, o namidar.
Qılıb əhdu peyman biz o sərvərə,
Onunla sözü qoymuşuq bir yerə,
İrandan hücuma keçən vaxt Zal
Gəlib Saridə qaldıra qiylu qal.
Zal İğrirəsə zor gəlibdir deyə,
Qılıb Amüli tərk, qaçsın Reyə.
Qoy olsun bu İğrirəsə bir əsas,
Olaq əjdaha pəncəsindən xilas.
Gəlib Zabilistana çatdı çapar,
Zala söylədi mətləbi, hər nə var.
Çağırdı dilavərləri Zali-zər,
Əsirlər nə istərdi verdi xəbər.
Dedi: – Ey böyük qəhrəmanlar ki, siz,
Döyüşdə pələngə bərabərsiniz.
Deyin, kimdə vardır elə bir ürək,
Vuruşsun bu meydanda mərdanə tək.
Həmin anda Kəşvad qoyub əl döşə,
Dedi: – Hazıram mən bu müşkül işə.
Dedi Zal ona: – Afərin, afərin!
Sevinc ilə keçsin sənin günlərin
Qoyub Amülə üz igid pəhləvan,
Qoşun Zabilistandan oldu rəvan,
Xəbər tutdu İğrirəs, o xeyirxah
Ki, Zal Amülə göndəribdir süpah.
Təbil vurdu, ordu çəkildi geri,
Əsirlərsə Saridə qaldı diri.



Gəlib Sariyə çatdı Kəşvad çün
O məzlumları azad etdi o gün.
Birər at verib onlara pəhləvan,
Hamı Zabilistana oldu rəvan.
Samın oğluna gəldi, çatdı xəbər
Ki, Kəşvad səfərdən zəfərlə dönər.
Verib qasidə geydiyi paltarı,
Barındırdı ehsanla yoxsulları.
Qədəm basdı Kəşvad çün Zabilə,
Qucaqlaşdı o, qəhrəman Zal ilə.
Görüncə əsirlər gəlib, Zali-zər
Salıb onların halına bir nəzər,
Pələng pəncəsində qalanlardılar,
Gəlib riqqətə ağladı namidar.
Yenə yadına düşdü Nuzər, o şah
Başa kül töküb ağladı, çəkdi ah.
Şəhərdə çox hörmət edib onlara,
Köçürtdü gözəl qəsrə, eyvanlara...
Necə Nuzərin sağlığında yenə
Hərə çatdı öz tacına, təxtinə.
Elə bir büsat qurdu Dəstan o gün
El, ordu ənamdan barındı bütün.
Reyə çatdı İğrirəs – o xeyrxah,
Onun işlərindən xəbər tutdu şah
Dedi: – Bu nə işdir ki, əl atmısan,
Mənim şəhdimə sən zəhər qatmısan,
Dedim: onları öldür, ey qardaşım,
Demək, sən qədər işləmirdi başım?
Öz ağlınlamı bu işi etmisən?
Mənim əmrimin ziddinə getmisən?
Nə lazım ağıl, elm cəngavərə?
Gərək atsın heysiyyəti bir kərə.
Ağılsız gərək beyni cəngavərin,
Ağıllı olan başda axtarma kin!
Cavab verdi Əfrasiyaba belə:
Otur indi bir anlığa fikr elə!
Əlindən yamanlıq gəlirsə əgər,

Burax pisliyi, tanrıdan et həzər.
Görüb çoxları sən kimi taci-təxt,
Kimə yar olub daim iqbal, bəxt?
Dayanmışdı odla zəka üz-üzə,
Çətindi dözə o ağıllı sözə.
Dəli fil kimi coşdu Əfrasiyab,
Qılınca əl atmaqla verdi cavab.
Belindən onun vurdu, böldü yarı,
Qanıyla boyandı çölün daşları.
Bu işdən xəbər tutdu Zal pəhləvan
Ki, İğrirəsə div tutubdur divan.
Dedi: – Bəxti dönmüşdür indi onun,
Gərək təxti-tacı ola sərnigün.
Səfər təbli döydürdü çün Zali-zər,
Qoşun toplayıb, gəldi sərkərdələr,
Yola düşdü Parsa tərəf durmadan
Ürəkdə qəzəb atəşi qəhrəman.
Yayıldı qoşun dəryadan-dəryaya,
Tozu pərdə çəkdi Günəşlə Aya.
Tez Əfrasiyaba yetişdi xəbər:
Sam oğlu alıb ordu, Parsa gələr.
Çıxardı qoşun Reydə, Xarə tərəf,
İnadla vuruşma üçün çəkdi səf.
Vuruşmaqda idi qabaq dəstələr,
Deyərdin: ona yer üzü dar gələr.
Çox idi ölən hər iki ordudan,
Neçə pəhləvan şir kimi verdi can.

## ZƏV TƏHMASİBİN PADŞAHLIĞI

Yığıb Zal əyanları bir gecə,
Danışdı ki, Əfrasiyabla necə
Vuruşmuş onun pəhləvan dostları,
Döyüş dostları, qəhrəman dostları.
Deyirdi ki, bu, doğrudur, pəhləvan
Olar bəxt ilə, güclə xalqa həyan.



Bizə bir nəfər şahnəsəb şah gərək,
Ötən sözlərə yaxşı məna verək.
Deyərlər: gəmiysə əgər ordular,
Onun yelkəni şah təxti olar.
Şah övladı Göstəhm ilə Tus əgər
Qoçaqdırsalar da, yox onlarda fər.
Heyf yaraşmaz onlara taci-təxt,
Gərək padişahda ola nurlu bəxt.
Gərək tanrı fərri ona yar ola,
Təxti də bütün aləmə nur sala.
Fəridun soyundan çox axtardılar
Uca təxtə layiq olan hökmdar,
O, Təhmasibin oğlu Zəvdi fəqət,
Başında ağıl vardı, həm mərifət.
Qoşunla Qaren, möbid, həm mərzban,
Bamin, Gərzbandan keçib, durmadan[57]
Apardı Zəvə bir belə müjdəni
Ki, gözlər İran taci-təxti səni.
Bütün ordu, başda sipəhdar Zal
Sənə təxti-tacı biliblər həlal.
Qaren söylədi, Zəv onu dinlədi,
Nə lazımdı, möbidlər açdı, dedi.
Qarenlə Zalın yanına gəldi Zəv,
Kəyan tacını qoydu, yüksəldi Zəv,
Yeni şahı təbrikə Zal açdı dil,
Çıxıb təxtə Zəv, şahlıq etdi beş il,
Qocaydı, çatırdı yaşı həştada,
Ədalətlə dövran sürüb dünyada,
– Haramdır, – dedi, – orduya pis əməl,
Ulu tanrıdan üzmədi bir an əl.
Basıb-kəsməyə, həbsə yol vermədi,
Beş il bir kəsi bir kəs öldürmədi.
Qəhətlik fəqət aləmə vurdu od,
Nə sünbül göyərdi, nə də bitdi ot.
Yağış yağmadı, döndü torpaq daşa,
Satıldı qızılla çörək baş-başa.
Qoşunlar durub üz-üzə səkkiz ay,
Nə hay gəldi bundan, nə ondan haray.

Nə baş verdi meydanda bir gün savaş,
Nə sərkərdə etdi, nə ordu təlaş.
Elə işləri saldı aclıq dara,
Pozuldu qoşunlar, kəsildi çara.
Düşündü, daşındı hamı bir kərə,
Günahkar bizik, qətrə düşməz yerə
Yayıldı bu sözlər geniş ölçüdə,
Zəvin yanına gəldi bir elçi də
Dedi: – İndi ki, ömrümüz dünyada
Gedir yüz məşəqqətlə hər gün bada,
Gəlin torpaq üstündə az qan tökək,
Bu düşmənçilikdən tamam əl çəkək.
Usanmışdı sərkərdələr hərbdən,
Çörəksiz necə çarpışar hərb edən?
İki ordu gəldi belə sazişə:
Ki, qan tökməyi etməsinlər peşə.
Hərə öz yerini tutub dünyada,
Olub keçmişi salmasınlar yada.
Dedilər: – Pikənd dəryasından tutaq
Turan mülkünə həm yaxın, həm uzaq,
Xütəndən belə Çinədək hər yerə,
Sunurlar çəkib verdilər türklərə[58]
Turan paytaxtı elə bir şəhər
Seçildi ki, əl atmasın Zali zər.
Elə qurdu sərhəddi iranlılar,
Hücum etməsin bir də turanlılar.
Qoşun aldı, Parsa tərəf getdi Zəv,
Qocaydı, cahanı cavan etdi Zəv.
Qoyub Zabilistana üz Zali-zər,
Götürdü hərə qismətindən bəhər.
Bulud kişnədi, dağda yağdı yağış,
Vuruldu yerə gül-çiçəkdən naxış,
Gəlintək bəzəndi dübarə cavan,
Bulaqdan su axdı, bağ oldu cahan.
Adamlar pələngə dönərsə əgər,
Cinayət üzündən zəmanə dönər.
Çağırdı Zal əyanları, getdilər,
Ulu tanrıya min dua etdilər,



Qəhətlik itib, gəldi bolluq ili,
Demək, tanrı qurtardı dardan eli,
Qurub el-oba məclis, əyləndi şən,
Silindi ədavətlə kin qəlbdən,
Bu minvalla keçdi beş il ruzigar,
Bilən olmadı qəm, kədər, ahü-zar,
Yenə döndü iranlının bəxti, ah!
Vəfat etdi Zəv – rəhmdil padişah.

## GƏRŞASBIN PADŞAHLIĞI

Zəvin vardı bir oğlu adabə yad,
Ona şah vermişdi Gərşasb ad.
Oturdu Kəyan təxtinə o cavan,
Başa tac qoyub, oldu bir hökmran.
Ata barigahında tutdu qərar,
Cahan tapdı rövnəq, yetişdi bahar
Belə keçdi bir müddət axşam-səhər,
Bəla şaxəsi verdi kinli bəhər.
Xəbər çatdı Turana ki, Zəv ölüb,
İran təxtini boş, sahibsiz bilib,
Reyin Xarına gəldi Əfrasiyab,
Quru ya su olsun, keçib çaphaçap,
Pəşəngin yanında bir insan belə
Nəvaziş görən olmamışdı hələ...
Pəşənk tutmuş İğrirəsin yasını,
Unutmuşdu taci-təxt dünyasını.
Məhəl qoymadı oğluna bir ara,
O parlaq qılınc pasdan oldu qara.
Gedib aylar, illər boyu elçilər,
Rica etdilər, vermədi bir səmər.
Deyirdi: – Əgər işləsəydi başın,
Dayağındı, İğrirəs, öz qardaşın.
Yaxıb qardaşın qanını sən elə,
O quş bəslyəndən qaçırsan belə.
Səninlə mənim tutmaz əsla sözüm,
Səni görməyə yoxdur, anla, gözüm!

Yayıldı bütün aləmə bu səda:
İran şahının təxti getmiş bada.
Pəşəngin adından gəlib verdilər
Şahın oğlu Əfrasiyaba xəbər:
Keçib Ceyhunu ordun ilə tələs,
Macal vermə, təxtə çıxa başqa kəs!
Qoşun yığdı Əfrasiyab durmadan
Səpəncabdan həm də Rudabdan,
Deyərdin: olub asiman yer üzü,
Qılınclar olubdur onun ulduzu.
Xəbər tutdu bundan İran elləri,
Gəlir şahlığın təxtinə müştəri.
Dedilər Zala: – Nə yatıb qalmısan,
Cahanı asanca ələ almısan?
O gündən ki, qoydu səni, getdi Sam,
Hələ olmadıq bircə gün şadkam.
Keçib Ceyhunu bir qoşun ki, inan,
Tozundan Günəş də olubdur nihan.
Əlindən gəlirsə duşün bir çara
Ki, düşmən yaxındır, düşub iş dara.
Belə söylədi onlara Zali-zər:
– O gün ki, belə bağladım mən kəmər,
Vuruşda mənə olmayıb tay hələ,
O gürzü, qılıncı ki, aldım ələ,
Qədəm basdım hər hansı bir meydana,
Hamı pəhləvanlar bələndi qana.
Vuruşdum gecə-gündüz hər yerdə mən,
Qocaldım da, düşdüm yaman dərdə mən.
Kamana dönüb pəhləvan peykərim,
Daha parlamaz kabili xəncərim.
Olub Rüstəmim indi sərvi-rəvan,
Rəvadır qoya tac, ola pəhləvan.
Gedin cəngi bir at tapın siz barı,
Ona tab gətirməz ərəb atları.
Özüm fil kimi bir at axtarmışam,
Soraqlaşmışam, hər yerə varmışam,
Tapılsa çağırram onu yanıma,
Şərik eylərəm qəmli dastanıma.
Hərif istəyir Zadişəm anını,
Hünərlə ala düşmənin canını.
Eşitdi İran xalqı bu sözləri,
Ürəklər açıldı, gülüb üzləri,
Bilib Rüstəmi ölkəyə bir pənah,
Kimi at gəzirdi, kimisi silah.
Dedi Rüstəmə Zal: – Ey filbəldən,
Başı iftixarla göyə yüksələn.
Önündə sənin çox çətin iş durar,
Bu gündən yuxun, işrətin sarsınar.
Döyüşmək sənə tezdir, oğlum, hələ,
Nə etmək ki, işlər düşüb əngələ?
Dodağın qoxar süd, uşaqsan, demək,
Bu yaşda fərəh, naz istər ürək.
Necə göndərim mən səni meydana,
O türklərlə ki, təşnədirlər qana?
Cavabın nədir? Ey oğul, de mənə!
Səadət, şücaət yar olsun sənə!
Dedi Zala Rüstəm: – Qulaq as, atam!
Eyibdir mənə işrətə baş qatam
Bu cüssə, bu pəncə, bu qollarla mən
Olum nazpərvərdə? Yol vermə sən!
Döyüş vaxtı olsa mənə dünya dar.
Mənə yar olar bəxt, pərvərdigar.
Döyüşdə əgər istəsəm qan tökəm.
Görərsən, tayım yox, hünərdə təkəm
Əlimdə qılınc, bir buluddur ki, var
Su rəngindədir, coşsa, qan yağdırar.
Salar aləmə od onun cövhəri,
Əzər, doğrayar, məhv edər filləri.
Mənə bir uca dağ kimi at gərək.
Düşərmi belə at kəməndə görək?
Əmud istərəm mən ağırlıqda dağ,
Turandan bura kim basarsa ayaq
Əzəm başını gürz ilə, xar edəm.
İran mülkünə basmasınlar qədəm.

Qoşun qoymayıb yer üzündə qıram.
Döyüş meydanında mən od yağdıram.
Onun söhbətindən fərəhləndi Zal,
Sevincdən qanadlandı, şənləndi Zal.
Dedi: – Zabilistandakı ilxılar
Gərək Kabilistanda tutsun qərar.
Hər at Rüstəmin qarşısından keçib,
Dağından, dedilər, filan şah seçib.
Hər hansı atı saxlayıb pəhləvan,
Əlini belinə basınca haman,
Gücündən qırıldı beli tən yarı,
Təhəmtən belə yoxladı atları,
Nə gördü ki: bir yorğa madyan gedir,
Geniş sağrılı, sinədən sanki şir,
Qulaqlar iti xəncərə oxşayar,
Döşü, sağrısı kök, bel incə, hamar
Dalınca özü boyda dayça gedər,
Döşü, sağrısı diqqəti cəlb edər.
Qara göz kəhər, quyruğu bir cida,
Dönər dırnağı dəydiyi yer oda.
Gözəl xalları var, deyər hər baxan
Qızıl küllə ziynət tapıb zəfəran.
Nəzər saldı Rüstəm həmin madyana,
O dayça, deyən, fil göründü ona.
Ayırsın deyə dayçanı ilxıdan,
Kəməndə əl atdı o dəm pəhləvan.
Qoca ilxıçı söylədi: – Ey ağa,
Təlaş etmə özgə atın tutmağa!
Kimindir bu at? – Döndü Rüstəm geri
Ki, yox sağrısında hələ dağ yeri?
Cavab verdi: – Rəxş adlanır bu kəhər,
"Bir od parçasıdır" – görənlər deyər,
Həmişə sahibsiz onu görmüşük,
Ona Rüstəmin Rəxşi ad vermişik.
Yəhərlənməli vaxtıdır – üçyaşar,
Böyüklər onun arxasınca qoşar.
Anası görüncə kəmənd gəzdirən,



Bir aslan kimi həmlə eylər həmən.
Ona atdı Rüstəm kəyani kəmənd,
Başında kəhər dayçanın oldu bənd.
Anası hücum etdi bir şir kimin,
Dişiylə qoparsın başın Rüstəmin,
Çəkib nərə Rüstəm – o gənc qəhrəman,
Çaşıb qaldı madyan yerində haman.
Vurub yumruğu madyanın boynuna,
Bu yumruq elə təsir etdi ona,
Düşüb qalxdı, döndərdi Rüstəmdən üz,
Dönüb ilxıya sarı yollandı düz.
Kəməndə verib güclə Rüstəm təkan,
Önündə atı ram gördü haman.
Qolunda bütün qüvvəsin topladı,
Belindən basıb, yoxlayanda atı.
Nə gördü? Beli heç də qatlanmayır,
Ağırlıq nədir, sanki heç qanmayır.
Sevindi ürəkdən, dedi: – Afərin,
Sən oldun sevimli atı Rüstəmin.
Qocadan soruşdu: – Atı kim satır?
Nədir qiyməti, de, kimə pul çatır?
Dedi ilxıçı: – Rüstəm isən əgər,
Apar, gəz İran mülkünü sərbəsər,
İran mülküdür qiyməti dayçanın,
Onu min, havadarı ol İranın!
Bu sözdən dodağı qaçıb Rüstəmin,
Dedi: – Çox şükür, Tanrı, oldum əmin.
Yəhər qoydu gülrəngə min zövq ilə,
Döyüş əzmi qıldı böyük şövq ilə.
Nə gördü: atın var gücü, qeyrəti,
Ürəkli, dözümlü, ayaqdan iti.
Ata bəd nəzər dəyməsin, gizlicə
Üzərlik salardı oda hər gecə.
Bilirdi: gücü ölçülərsə əgər,
Belində gücü var iki fil qədər.
Çapanda sanarsan ki, ceyran qaçar,
Bu atdır ki, yerdən onu qaldırar.

Zalın könlü gülşən kimi oldu şad
Ki, Rüstəm tapıb Rəxş adında bir at.
Bugündən sabah dərdini çəkmədən
O, simü-zəri payladı xəznədən.
Qoşun hər tərəfdən gəlib dalbadal,
Tədarük başa çatdı, əmr etdi Zal.
Çalındı təbil, gurladı kərrənay,
Filə bağlı zənglər qopardı haray.
Məgər Zabilistanda məhşər olub?
Dərə, dağ, düzənlik qoşunla dolub.
Durub Rüstəm öndə üzündə vüqar,
Dalında çəkib pəhləvanlar hasar,
Döyürlər yürüş təblini gurhagur,
Dəniztək coşur ordu, dünya qopur.
Baharda gülə qərq olanda cahan
Qoşun Zabilistandan oldu rəvan.
Çatıb Zaldan Əfrasiyaba xəbər,
Yeyib yatmadı, çəkdi möhnət, kədər.
Gətirdi Rey ətrafına ordunu,
Suyu, otlağı valeh etdi onu.
İran ordusu gəlməz idi sana,
Ötüb çölləri gəlirdi meydana,
İki ordu artıq yaxınlaşdılar,
Zali-zər çağırdı gələ başçılar
Dedi: – Sizdə vardır ağıl, həm hünər,
Həyatı bilən, yaşlı sərkərdələr!
Böyüklük, səadət yolunda bütün
Belə bir qoşun hazır etdim bu gün.
Şahın təxti boşdur ki, iş axsayır,
Bu ordu məgər orduya oxşayır?
Zəv əyləşdi şah təxtinə bir zaman,
Deyərdin: təzə don geyindi cahan.
Bizə indi bir şahnəsəb şah gərək,
Ona tac verib, təxtə əyləşdirək.
Gərək şah ola ölkədə hökm edən,
Nədir qiyməti, olsa başsız bədən?
Mənə verdi möbid nişan bir zaman



Ləyaqətli bir şah, bəxti cavan.
Fəridun nəsəbli, adı Keyqubad,
Ağıllı, fərasətli, qüvvəli, şad.

Tutub üz, dedi Zali-zər Rüstəmə:
– Götür gürzü, atlan, daha gözləmə
Qoşundan ayır bir bölük atlı sən,
Get Əlbürzə yolda nəfəs dərmədən.
Çatıb Keyqubada salam ərz elə,
Yubanma ki, işlər düşər müşkülə!
Gecə-gündüz at çap, uzaqdırsa yol,
İki həftə ötcək, çalış, burda ol!
De: – Ordu səni şahlığa istəyir,
Verib təxtə ziynət, səni gözləyir.
Kəyan tacı layiqdir ancaq sənə,
Şahım, çat dada, sahib ol ölkənə.
Təhəmtən ədəblə baş əydi Zala,
Külək sürətiylə düzəldi yola.
Yol üstə var idi keşikdə duran
Turan ordusu, çatcağın pəhləvan
Öküz kəlləli gürzü aldı ələ,
Qopardı o meydanda bir vəlvələ.
O pusqu quranlar olub tarümar,
Əzilmiş, döyülmüş qoyub qaçdılar.
Gözü yaşlı, bağrı dolu qan, kədər,
Apardılar Əfrasiyaba xəbər.
Nə olmuşdu nəql etdilər birbəbir,
Acıqlandı Əfrasiyab sanki şir.
Kolun adlı bir pəhləvan var idi,
O türklər içində bir əyyar idi.
Çağırdı, dedi: – Çoxlu atlı götür,
Dağın döngəsinə özünü yetir!
Sayıq ol bu işdə, sən huşyar ol,
Kəsib döngəni, düşmənə vermə yol!
Döyüşdə zirəkdir, bil, iranlılar,
Keşikdə qoşun gördü şəbxun vurar.
Çölə çıxdı şahın yanından Kolun,

Bələdçi qabaqda tutub dağ yolun,
Yeganə yolu onlara bağladı,
Yolu qızmış aslanlara bağladı.
Bu yandansa Rüstəm çapır, hey çapır,
İran şahına çatmağa can atır.
Qalan dəmdə Əlbürzə bir mil yolu,
Çəmən gördü güllə, çiçəklə dolu.
Ağaclar boy atmış, axar çeşmələr,
Keçərkən su təşnələr içər burda.
Kənarında su arxının təxt var,
Səpiblər gülab, müşk-ənbər qoxar.
O təxt üstə bir aycamallı cavan
Oturmuş, ağaclar ona sayəban.
Cavan burda şahanə məclis qurub,
Behişt kimi gülzarə ziynət vurub.
Görüncə ki, yoldan ötür pəhləvan.
Ona kölgəlikdən dedilər: – Dayan!
Səni göndərib tanrı mehman bizə,
Düş atdan, əziz bir qonaqsan bizə.
Otur, şadlıq ilə qədəh dolduraq,
Böyük namivər naminə mey vuraq.
Təhəmtən təşəkkürlə verdi cavab:
– Səxavətlisiz, həm də alicənab.
Mən Əlbürzə ancaq gərək tez çatım,
O dağda böyük bir işə əl qatım,
Nə badə? Mənə yatmaq olmuş haram,
Gərək çox çətinlikləri qaldıram.
İran təxti şahsız qalıbdır bu gün,
Mey içmək haramdır mənə büsbütün.
Mənə Keyqubaddan verin bir xəbər,
Görən varmı sizdən onu bir nəfər?
Dilavərlərin başçısı açdı dil:
– Tanışdır mənə Keyqubad, yaxşı bil!
Düş atdan, otur, ye bizimlə çörək,
Bu məclisdə bir gül camalın görək.
Qubaddan sənə söyləyək birbəbir,
Onun görkəmi, ya nişanı nədir.



Çəkilcək Qubad adı, birdən-birə
Təhəmtən atından atıldı yerə.
Gəlib arx kənarına o namidar,
Haman kölgəlikdə tutunca qərar
Oturtdu onu təxtə bir novcavan,
Verib əl-ələ Rüstəm ilə haman,
Şərab ilə doldurdu öz camını,
Edib zikr azadələr namını.
Uzatdı o dəm Rüstəmə başqa cam,
Dedi: – Ey igid pəhləvan, xoşməram,
Deyirsən: mənə ver Qubaddan nişan,
Sənə bu adı kim demiş, ey cavan?
Dedi: – Zali-zərdən gətirdim pəyam,
Gərək ərz edim Keyqubada salam.
Veriblər İran təxtinə min bəzək,
Deyirlər bizə şah o olsun gərək!
Atam pəhləvandır, mənə taci-sər,
Deyirlər onun adına Zali-zər,
Mənə söylədi: – Durma, Əlbürzə çap,
Dilavər Qubadı o yerlərdə tap!
Ona müjdə ver ki, İran şahısan,
Dayanma, gecikmə, fəqət bircə an!
Bütün pəhləvanlar səni istəyir,
Bəzənmiş bir ölkə səni gözləyir.
Mənə, ey cavan, versən ondan nişan,
Elə bil məni şah edibsən, inan
Danışdıqca Rüstəm, cavan dinlədi,
Gülüb, sonra: – Ey pəhləvan, bil, – dedi,
Mən, o Keyqubadam, bunu yaxşı bil,
İran şahıyıq biz nəsilbənəsil.
Eşitdikdə Rüstəm bunu, əydi baş,
Qızıl təxti tərk eyləyincə yavaş,
Dedi; – Ey olan şahlara padişah,
Böyük xalqa aləmdə arxa, pənah,
İran təxti kamınca olsun sənin,
Kəməndində qalsın əsir düşmənin,
Otur şah təxtində asudə, şən,

Başını uca tut səadətlə sən!
Cahanpəhləvan Zali-zərdən sənə
Salam söyləmək tapşırılmış mənə.
Cahan şahı rüxsət verərsə əgər,
Bu qul, tapşırılmışları ərz edər,
Qubad Rüstəmi dinlədi, qaldı mat,
Onun hər sözündə görürdü səbat.
Təhəmtən dil açdı, səna eylədi,
Zalın peyqamını ona söylədi.
Maraqla Qubad dinlədi Rüstəmi,
Onun qəlbi çırpındı bir quş kimi.
Şərabla dolu cam alıb hökmran,
İçib söylədi: – Sən sağ ol, pəhləvan!
Təhəmtən dəxi mey töküb camına,
Başa çəkdi şahənşahın namına.
*Telindən ucaldı sazın zilü bəm,*
O gün, şənlik oldu, yoxa çıxdı qəm.
Açıb söylədi Rüstəmə Keyqubad:
– Yatıb bir yuxu görmüşəm könlüşad
Ki, ağ şahin uçdu İrandan qoşa,
Günəş kimi bir tac tutub baş-baş,
Uçub gəldilər, çatdılar qarşıma,
O parlaq tacı qoydular başıma.
Oyandım, ümidlə yaşardım hələ,
O ağ şahin, o parlayan tac ilə.
Görürsən, bu şahanə məclis ki, var,
O röya çin olmuşdur, ey namidar.
Təhəmtən, o ağ şahin olmuş məgər,
Gətirmiş mənə təxti-tacdan xəbər?
Belə söylədi Rüstəm: – Ey hökmdar,
Peyğəmbərlik etmiş yuxun aşikar.
Dur, indi İran mülkünə biz gedək,
Bir ölkə, bir el bizdən istər kömək.
Gətirdi igidlər onunçun bir at,
Şah əyləşdi, at açdı quştək qanad,
Qubad şah gedirdi İrana sarı,
Dalınca çapırdı onun dostları.



Gecə-gündüz at çapdı, axır, budur,
Çatıb bir yerə, gördü ki, pusqudur.
Xəbər tutdu işdən dilavər Kolun,
Çapıb qarşısında dayandı onun.
Önündə görüb düşməni Keyqubad,
Döyüşmək üçün meydana sürdü at.
Təhəmtən dedi: – Şəhriyarım, dayan!
Vuruşmaq yaraşmaz şaha heç zaman!
Bu Rəxşimlə, gürzümlə, nizəmlə mən
Qırım onları qoy, aman vermədən.
Ata çəkdi məhmiz, əli nizədə,
Yerə sərdi bir atlı hər zərbədə,
Kolun gördü Rüstəm dönüb aslana,
Cumub üstünə, nizə atdı ona.
Döşündə olub Rüstəmin nizə bənd,
Dağıldı ağır zərbədən sinəbənd.
Təhəmtən tutub nizəsindən onun,
Belə cürətə qaldı heyran Kolun.
Alıb nizəni Rüstəmi-namidar,
Bağırdı, sanardın ki, göy gurlayar,
Yəhərdən üzüb nizədə düşməni,
Küpündən yerə sancdı o nizəni.
Deyən, quşdu şişə taxılmış Kolun.
Bu halda onu seyr edincə qoşun,
Dağıldı bütün dəstə birdən-birə,
Dönük bəxt ilə düşdülər çöllərə.
Bütün dəstə üz çevirdi Turana,
Qaçırdı hərə qorxudan bir yana.
Təhəmtən zəfərlə keçib pusqudan,
Daqın başına çapdı at durmadan.
Bu yer bir səfalı çəmənzar idi,
Suyu saf, təmiz çeşmələr var idi.
Qubad Rüstəm ilə bura gəldilər,
Düşüb atdan, asudə dincəldilər.
Günəş batdı, çökdü qaranlıq gecə,
Təhəmtən alıb xurcunu gizlicə,
Çıxartdı o şahanə paltarları,

Qubaddan xəbərsiz, gecə tən yarı.
Gətirmişdi o, şah üçün tac, əsa,
Şaha şah deməzlər tacı olmasa,
Nə lazımdı amadə etdi tamam,
Şaha gəldi, verdi ədəblə salam.
– Dayanma, – dedi, – dur, dəyiş paltarın,
Libas artırar şənini şahların.
Geyincək Zalın yanına gəldilər,
Deyən olmadı: necə keçdi səfər?
Qurub məsləhət məclisi yeddi gün
O məclisdə möbidlər oldu bütün.
Başa çatdı həftə, gəlib Keyqubad
Qoyub tac, şah təxtinə çıxdı şad.

## KEYQUBADIN PADŞAHLIĞI

Tutub şirmayi təxtin üstə qərar
Cavahirnişan tac ilə şəhriyar.
Gəlib şahı təbrikə sərkərdələr,
Döyüşkən Qaren, pəhləvan Zali-zər,
O Kəşvad, Xərrad, Bərzin yenə
Nisar etdi gövhər şahın təxtinə.
Böyüklər Qubadı başa saldılar,
Şah Əfrasiyabın hücum qəsdi var,
Dedi: – Ordu keçsin hücuma sabah,
Qopub səs-səda, titrədi barigah.
Silahlandı Rüstəm, geyindi elə
Görənlər deyirdi o bənzər filə.
Çəkib səf, dayanmışdı iranlılar,
Qılınc əldə qan tökməyə intizar.
Bir əldəydi Mehrab, Kabilxuda, [59]
Digər əldə Kəjdəhm dönmüş oda.
Qaren, bir də Kəşvad, – iki namidar
Qoşun mərkəzində tuturdu qərar.
Dayanmış Qubad ilə Zal arxada,
Sanki külək durmuş müqabil oda.



Budur Kaviyan bayrağı yüksəlir,
Cahan qırmızı, göy, sarı rəngdədir,
Olub yer üzü sanki Çin dəryası,
O meydan – gəmi, ordular – dalğası.
Qoşun söykəmiş qalxanı qalxana
Qaranlıqdır baxarsan hər bir yana.
Çəkilmiş qılınclarda parlardı zağ,
Deyərdin: yanır çöldə yüz min çırağ.
Bu həngamədə Qaren aslan kimi,
Çəkib nərə, püskürdü vulkan kimi.
Hücum eylədi düşmənə sanki şir,
O meydan gəzən mərd, o, qorxmaz dəlir,
O həmlə edir gah sola, gah sağa,
Hara çatdı, istər qisas almağa.
Qılınc, nizə, gürz ilə o, sanki şir
Turan ordusundan qırır, hey qırır,
Qalanmış o meydanda leş dağ qədər,
Gəlib təngə turanlı sərkərdələr.
Şəmasası gördü, bu dəm pəhləvan
Yara almış aslantək eylər fəqan...
Başından vurub biçdi sanki xiyar.
Dedi: – Al, Qarendən payındır, apar!
Uçundu Şəmasas həman zərbədən,
Yerə dağ kimi aşdı atdan bədən.
Belə iş tutubdur fələk hər zaman,
Qoca çərx gah ox olur, gah kaman.

Durub baxdı Rüstəm igid Qarenə
Ki, görsün vuruşmaq nədir, zərbə nə?
Soruşdu atasından o nagahan:
– Mənə söylə sən, ey cahanpəhləvan!
Şah Əfrasiyab, o rəzil hökmdar
Döyüş vaxtı hansı tərəfdə durar?
Nə geymiş, onun bayrağı hardadır?
O bayraq ki, parlar, məgər ordadır!
Mən ondan bugün istərəm kam alam,
O namərdi dartıb, üz üstə salam.

Dedi Zal: – Oğlum, mənə as qulaq,
Özündən çıxıb, coşma sən bu sayaq!
Döyüşdə o türk əjdahadır, oğul,
Hücum eyləsə bir bəladır, oğul!
Qara xoftanı var, qara bayrağı,
Dəmirdən dəbilqə, dəmir qolçağı...
Qorun ondan, oğlum, amandır, aman!
O həm bəxtiyardır, həmi qəhrəman.
Düşündü, ona verdi Rüstəm cavab,
Dedi: – Çəkmə məndən yana iztirab,
Mənə arxadır haqq pərvərdigar,
Ürək, qol, qılıncım məni saxlayar.
Qəzəblə salıb Rəxşini cövlana,
Haray saldı şeypur səsi hər yana,
Görüncə ki, meydan gəzir bir uşaq,
Aşıb daşdı Əfrasiyabda maraq.
Dedi türklərə: – Kimdir o əjdaha?
Qırıb bəndini, həmlə eylər şaha?
Nədir, söyləyin, bu cavanın adı?
Dedi bir nəfər: – Bu Zalın övladı,
Samın gürzü ilə girib meydana,
Gəlib ad qazansın, ona baxsana!
Əsər etdi Əfrasiyaba bu söz,
Yarıb səfləri, qoydu meydana üz.
Deyərdin: dəniz çuğlayıb aləmi,
Vurub dalğa, saldı çölə bir gəmi.
Onu gördü Rüstəm, səyirtdi atı, .
Ağır gürzünü boynuna qovzadı.
Ona lap yaxınlaşdı, aldırmadan
Yəhər qaşına qoydu gürzü haman,
Əl atdı, kəmərbəndini tutdu bərk,
Yəhərdən onu qaldırıb sərçətək
Qubada hədiyyə aparsın deyə,
Birinci döyüşdən götürdü göyə.
Ağırdı bədəncə çox Əfrasiyab,
Belə siqlətə toqqada yoxdu-tab,
Qırıldı, yerə düşdü şahzadə xar,



Onu dövrəyə aldılar atlılar.
Təhəmtən əlindən xilas oldu şah,
Təəssüflə Rüstəm ötürdü bir ah.
Dedi: – Toqqa namərdə etdi kömək,
Döşündən onu mən tutaydım gərək.
Şaha müjdə çatdı ki, Rüstəm gedib,
Qoşun mərkəzində nə bidad edib,
Çatıb türklərin şahına pəhləvan,
Çıxıbdır Turan bayrağı ortadan.
Kəmərdən tutub, şahı çırpmış yerə,
Çatıb türklərin naləsi göylərə.
Yerindən Qubad yel kimi qalxdı tez,
Qoşun coşdu, sanki qabardı dəniz.
"Tutun! Qoymayın!" səsləri gurladı,
Qılınc, nizə qından çıxıb parladı,
Deyərdin: bulud gəldi, qan yağdırar,
Narınca o şəngərf ilə rəng vurar[60]
Qopub atlılardan elə toz, duman
Yer altı qat olmuş, səkkiz asiman[61]
Ölən var idi min yüz altmış nəfər,
O bir həmlədə hər biri şiri-nər.
Qırıb çatdı iranlılar türkləri,
Tutub Damğana üz, çəkildi geri.
Qaçıb Ceyhunu keçdi turanlılar,
Təcavüz edən ordu məğlub olar...
Sözü çox, əli boş, nə taqət, nə tab,
Pəşəngin huzurunda Əfrasiyab
Dayandı, dedi: – Ey ulu padişah,
Bu vurhavura səndə oldu günah.
Qırıb şah ikən əhdi, peymanı sən,
Sələflər belə etməmişlər nədən?
Dedin İyrəcin övladı qalmamış,
Yalandır, zəhər padizəhr olmamış[62],
Biri əksilər, digəri yüksələr,
Cahan padişahsız qalarmı məgər?
Qubad gəldi, qoydu tacı başına,
Ədavət də çıxdı sənin qarşına.

Doğub Sam nəsli yeni şiri-nər,
Ona Rüstəm adı verib Zali-zər.
Nəhəng idi meydanda o namidar,
Deyərdin: nəfəs versə, aləm yanar.
Çapıb etdi yeksan dağ ilə düzü,
Qılıncla, əmudla qırırdı bizi.
Bizim orduya saldı bir vəlvələ,
Ona tay görən olmamışdır hələ.
Görüb bayrağımı, çapıb qarşıma,
Ağır gürzü basdı yəhər qaşına,
At üstündən aldı məni şiri-nər,
Deyərdin: çəkim yoxdu milçək qədər,
Qırıldı qayış, toqqa birdən-birə,
Əlindən üzü üstə dəydim yerə.
Elə güclü aslan tapılmaz, inan,
Ayaq yerdə, baş göydə bir pəhləvan,
Nə yaxşı alıb dövrəmi atlılar,
O dağ qarşısından məni dartdılar.
Bilirsən ki, var məndə güc, həm ürək,
Döyüşdə əlimdən qan ağlar fələk.
Əlində onun bir zəif milçəyəm,
Elə qorxuram, az qalır qəşş edəm.
Gücü fil gücüydü, o şirpəncəli
Ağılsız, biliksizdi, qorxmaz dəli...
At üstündə dönmüşdü qızmış filə,
Öküzbaşlı bir gürzü almış ələ.
Neçə min əmudla bizim ordular
Onun başına dalbadal vurdular.
Sanardın, dəmirdəndir, etməz əsər,
O daşdan, poladdan yaranmış məgər?
Önündə pələngmi, dənizmi, deməz,
Fil olsun, şir olsun, həzər eyləməz.
Çapıb sağ-sola, axtarırdı şikar,
Oyuncaq bilir hərbi o, aşikar.
Əgər Samda olsaydı bu güc, inan,
Yəqin bizdə qoymazdı bir pəhləvan,
Əlacın sənin sülhə qalmış fəqət,



Vuruşmaq, ədavət deyil məsləhət.
O yer ki, Fəridun bölüb bir zaman,
Babam Tura vermişdi, onlar haman
O torpaqları verdilər də mənə,
Nə lazımdı bu kin, küdurət sənə?
Bilirsən, eşitmək nə, görmək nədir?
Eşitdiklərin sanma əfsanədir.
Bugün gül açıbsa gülüstanda, dər!
Sabah onda güllükdən olmaz əsər.
Bugünkü işi sən bu gün gör, bitir!
Bu gün nəqd olan iş sabah nisyədir.
İran hərbini sən sanırdın oyun,
Uduzdu yaman bu oyunda qoşun.
O zərlə bəzənmiş yəhərlər hanı?
Hanı zər dəbilqə, o zər qalxanı?
Hanı zər cilovlu ərəb atları?
Qını zər qılınclar qalaydı, barı!
Deyil təkcə bunlar, neçə pəhləvan
Qubadın önündə düşüb verdi can.
Ölüb getdi Kolbad ilə Bariman
Ki, tapmazdı şir əllərindən aman.
Xəzərvanə bir gürz elə çaldı Zal,
Əzib cismini, torpağa saldı Zal.
Şəmasas idi orduya bir pənah,
Onu Qaren öldürdü meydanda, ah!
Necə mən sayım? Bəlkə yüz min nəfər,
Daha çox bu davada ölmüş hədər.
Basıldıq, bu oldu hər işdən yaman,
Sağalmaz bu rüsvayçılıq heç zaman.
Mənim də əlimdən çıxıbdır xəta,
Mən İğrirəsi öldürərkən, ata,
Cavanlıqdı, kamımca idi zaman,
Bugünkü günü gözləməzdim, inan!
Budur qarşıma çıxdı dönməz yağı,
Hər iranlının ayrıca bayrağı.
Mənə yaxşı dərs verdi iranlılar,
Salıb at döşündə qovub etdi xar.

Unut keçmişi, indi ancaq çalış.
Hələ gec deyil, Keyqubadla barış!
Yenə başqa bir fikrə düşsən əgər,
Qoşun toplayıb dörd tərəfdən gələr,
Günəş kimi Rüstəm bu yandan durar,
Onunla vuruşmaq gücü kimdə var?
Gələr başqa bir yanda Qaren özü,
O bilməz nədir məğlub olmaq sözü.
Üçüncü: qızıl taclı Kəşvad hələ
O vaxt gəldi, etdi hücum Amülə.
Görərsən ki, dördüncü Mehrab gələr,
Qubada, Zala məsləhətlər verər.

Qulaq verdi Əfrasiyaba yavaş,
Turan şahı mat qaldı, gözlərdə yaş.
Ağıllı adam seçdilər bir nəfər,
Nəzakətli, hörmətli, sahibhünər.
Dedi: yaxşı bir namə yazdı dəbir,
Vuruldu bəzək naməyə cürbəcür,
Günəşlə ayın tanrısı namına
Odur xəlq edən, bəndəyik biz ona,
Fəriduna rəhmət böyük Tanrıdan,
Onun nütfəsi bizlərə verdi can.
Əgər təxt ilə tac üçün İrəcə
Yamanlıq edib Tur, indi neçə
Gərək biz haman barədə söz açaq?
Qohumluqda düşmənçilikdən qaçaq!
Tutub İyrəcin qanını bir əsas
Mənuçehr aldı doyunca qisas.
Fəridun verib düzlüyə hümməti,
Ədalətlə bölmüşdü hər qisməti,
Gəlin, biz o əmrə itaət edək,
Böyüklər yolundan geri dönməyək.
O vaxtlarda Ceyhun sərhədd idi,
Bütün Mavəra-Nəhrə bir sədd idi.
Bizim yurdumuzdu, hələ sağdı şah,
Bu sərhəddə salmazdı İyrəc tamah.



Verib İyrəcə şah İran mülkünü,
Dedi: saxla asudə can mülkünü.
Bu yoldan dönüb, hərbə girsək, inan,
Bizimçin dönər dar məzara cahan.
Kəsər lütfünü, qan tökülsə, xuda,
Bəhər görmərik hər iki dünyada.
Fəridun bu dünyanı bir vaxt necə
Bölüb verdi Səlmə, Tura, İyrəcə,
Bölək eyləcə, qəm nədir, bilməyək,
Dəyərmi, bu dünya üçün qəm yeyək?
Qocaldıq tutaq, saç dönüb, oldu qar.
Qan etdi daşı, torpağı laləzar,
Nəhayət, bunun varmı bir bəhrəsi?
Ölüm gözləyir aqibət hər kəsi.
Qara torpaq altında yatdıqda biz
Libası olar hər kəsin sadə bez.
Ağıllı olan ömrü bu dünyada
Tamah, dərdü qəmlə verərmi bada?
Əgər Keyqubad razı olsa buna,
Ədalətdən o etməsə imtina,
Daha salmarıq Ceyhunu biz yada,
Çayı adlamaz heç bir iranlı da.
Gələn dostluq ilə, salamla gələr
Olar xalq şad, yüksələr ölkələr..,
Şahın möhrünü naməyə vurdular,
İran mülkünə getdi qasid, çapar.
Alıb naməni, tez şaha verdilər,
Açıb söz, misallar da göstərdilər.
Düşündu, belə söylədi padişah:
– Məgər baş verib bizdən əvvəl günah?
Birinci: Turandan xəta baş verib,
Tur, İyrəc kimi bir şahı öldürüb,
O Əfrasiyabdı, neçə il qabaq.
Çayı adlayıb gəldi əldə yaraq,
Eşitdinmi o, neylədi Nuzərə,
Qəmi sığmaz oldu göy ilə yerə.
Zəka kanı İğrirəsi kin ilə

O öldürdü, vəhşilər etməz belə.
Peşimansınız pis əməldən əgər,
Yeni əhdü peyman verməz zərər.
Mənə kin, tamah hissi biganədir,
Bəsimdir, cahanda payım hər nədir.
Qoy olsun sizin Ceyhunun o üzü,
Doya bəlkə Əfrasiyabın gözü.
Yeni əhdü peymana qol çəkdi şah,
Ədalət bağında ağac əkdi şah.
Çapıb gəldi elçi necə bir pələng,
Alıb Keyqubad naməsini Pəşəng,
Şah əmr etdi, ordu çəkildi dala,
Tozun içrə itdi Günəş az qala.
Gəlib keçdilər yel kimi Ceyhunu,
Xəbər verdilər Keyqubada bunu.
Dedilər ki, düşmən çəkildi geri,
Sevinclə açıldı şahın ləbləri.
Şaha söylədi Rüstəm – o namidar:
– Barışma döyüş vaxtı, ey şəhriyar!
Qabaqlar yox idi barışdan əsər,
Əmudum edib onları sülhsevər.
Belə söylədi Rüstəmə hökmdar:
– Barışdan gözəl bu cahanda nə var?
Fəridun nəvəsi Pəşəng pəhləvan
Gəlib hərbdən təngə, istər aman...
Kimin ağlı vardır başında gərək
Atıb kəcliyi, düzlüyə yol verək.
Bütün Zabilistanı Sində qədər
Sənin adına yazdıq, ey namivər,
Otur Nimruz təxtinə başda tac,
Yaşa bəxtiyar, aləmə şölə saç!
Yenə Kabilistanı ver Mehraba,
Batır nizəni büsbütün zəhraba,
Deyil yer üzü xalq üçün heç də dar,
O yerdə ki şah var, demək, hərb var.
Qoyub Rüstəmin başına taci-zər
Belinə bəzək verdi altun kəmər.



Onu etdi bir ölkəyə hökmran,
Baş əydi, öpüb torpağı pəhləvan.
Daha sonra qəti dedi Keyqubad:
– Zal olmazsa, mən çıxmaram təxtə şad.
Onun bir tükün verməzəm aləmə,
Əziz yadigardır bəni-Adəmə.
Hazırlatdı şahanə bir dəst libas,
Dedi: – qiyməti yoxdu, gövhərşünas,
Kəmər verdi, tac verdi, firuzə cam,
Görən olmamışdı belə bir ənam.
Filə kəcavə çatdı firuzədən,
Elə parlayırdı ki, Nildir, deyən.
Ona asdı zərduz, ipək pərdələr,
Saya, vəznə gəlməz gövhər, simü-zər.
Zala göndərib şah, utandı yenə.
Dedi: yüz belə bəxşiş azdır sənə.
Əcəl versə möhlət mənə, bir zaman
Səni eylərəm sərvətə qərq, inan
Alıb Qarenə, Kivə, həm Koşvada,
İgid Bərzin ilə polad Xərrada
Ləyaqətli xələtlər etdi əta,
Kimi gördü layiq, necə bir ata
Qılınc verdi, qalxan və ya simü-zər,
Kimin xidməti çoxdu – taci kəmər.

O dəm Parsa tutdu üzün şəhriyar
Çox xəzinəyə vardır orda açar.
O vaxtlarda İstəxr paytəxt idi,
O paytəxtdə şah xoşbəxt idi.
Ona üz tutub etdi xalq iftixar,
O idi ləyaqətli bir tacidar.
Kəyan təxtinə şah qoydu ayaq,
Ədalətlə insafı etdi dayaq,
Bu oldu böyüklər yanında sözü:
– Mənimdir sərasər bugün yer üzü.
Əgər milçəyə fil edirsə cəfa,
Dinə, ölkəyə umma ondan vəfa!

Foqət doğruluq istərəm dünyada,
Kəsər əyridən lütfünü Tanrı da.
Elin dərdidir dərdim ancaq mənim,
Xəzinəm sudur, bir də torpaq mənim.
Qoşun, ya rəiyyət, mənə fərqi yox,
Bütün ölkənin xalqı – bir orduyuq.
Sizə tanrı olsun həmişə pənah,
Ağıllı olun, dinc olun, xeyirxah.
Kimin sərvəti var, yeyin, paylayın,
Məni nazü nemətdə xatırlayın!
Kimin süfrəsində tapılmaz çörək,
Kömək gözləsin padişahdan gərək.
Mənim barigahımda, gəlsin, yesin,
Şahın ordusunda "yerim var" desin.
Keçən şahları yaxşı yad eylədi,
Ver ellə cahanı abad eylədi,
Yüz il dünyada şadiman gün sürüb,
Cahanda belə padişah kim görüb?
Onun vardı dörd oğlu, dörd namidar,
Qubaddan idi dünyada yadigar.
Birinciydi Kavus – ağıllı, mətin,
İkinci – Keyarəş, biri – Keypəşin,
Adı Arəş idi kiçik oğlunun,
Yaşarlardı şən sayəsində onun.
Yüz il təxti-tac sahibi oldu düz
O gün gəldi ki, bəxti döndərdi üz.
O bildi ki, çatmışdır ölmək çağı,
Xəzandır, solur ömrünün yarpağı.
Tələb etdi Keykavusu yanına,
Ədalətdən, haqdan danışdı ona.
Dedi: – Köçməyə hazıram indi mən,
Məni yüklə tabuta, çıx təxtə sən!
Deyən, indi Əlbürzdən gəlmişəm,
Bu gün şadman, təxtə yüksəlmişəm,
Biri bəhrəsiz ömr edibsə əgər,
Ağılsızlığından çəkibdir zərər.
Təmiz qəlbli ol, ədalətli sən



Ki, etsin dua canına hər yetən.
Məbada tamah ağlına güc gələ,
Coşub da qılıncı alasan ələ.
Qılınc oynadan şah evlər yıxar.
Tamahkar əlindən xətalar çıxar.
Dedi, aləmi tərk qıldı, qərəz,
Saray oldu bir dar məzarla əvəz.
Qubad dastanı bitdi, versən qulaq,
Sözü şah Kavusdan indi salaq.

## KEYKAVUSUN PADŞAHLIĞI VƏ ONUN MAZƏNDARANA SƏFƏRİ

Cavan bir ağac boy atıb yüksələr,
Fələkdən yetəndə ona bir zərər,
Kökü sustalar, yarpağı tez solar,
Düşər qol-budağı yerə, xar olar.
Qopar rişəsindən qocalmış deyə,
Verər ömrünü bir cavan tingəyə,
Ona bəxş edər hər gülü, yarpağı,
Çıraq kimi nurlar saçan bir bağı.
Əgər yaxşı kökdən bitsə pis budaq,
Qəzəblənmə, ondan uzaq gəz, uzaq!
Qoyanda cahanı ata oğluna,
Açar sirrini bircə-bircə ona.
Batırsa ata adını bir oğul,
O, biganədir, bil, deyildir oğul!
Kim ustadına kəc baxar, kor qalar,
Üz üstə salar nankoru ruzigar.
Bu köhnə evin rəsmi var ki, onun
Tapan olmamış əvvəliylə sonun.
Bu rəsmi yalan bilsə bir kəs əgər,
Dayanmaz bu mənzildə, çox tez köçər
Ata təxti Keykavusa çatdı çün,
Baş əydi ona yer üzü büsbütün.
Baxıb gördü: dolmuş, daşır xəznələr,

– Qulumdur bu aləm – dedi – sərbəsər,
Bəzəkli gülüstanda Kavusi-key
Əlində qədəh nuş edir dadlı mey.
Qızıl təxtin üstə büllurdan paya,
Oturmuşdu, hökmü rəvan dünyaya.
Həmişə yanında neçə pəhləvan,
Deyib dinləyirdi cavan hökmran.
Bu dəm pərdədara gəlib bir nəfər,
Dedi: – Şahım əylənmək istər əgər,
De, Mazəndarandan bura gəlmişəm,
Mənim musiqi çalmaq olmuş peşəm.
Əgər layiq olsa şaha xidmətim,
İcazə verin, xidmətinə yetim.
Eşitcək bunu, yollanıb pərdədar,
Gəlib söylədi: – Ey böyük hökmdar!
Qapında durub xoş sifət bir cavan,
Xoş avazlı ustad bərbətçalan.
Buyurdu: – Onu məclisə, get, gətir!
Çalanlar yanında ona verdi yer,
Alıb köklədi bərbəti nəğməsaz,
Göyə qalxdı Mazəndarani avaz.
Mazəndaranı gəlin, yad edək,
Ana yurdu həmişə abad edək!
Gül ilə, çiçəklə dolur bağları,
Bürünmüş qızıl laləyə dağları.
Havası şəfadır, yeri laləzar,
Nə isti, nə şaxta, həmişə bahar.
Bütün il boyu bağda bülbül ötər,
Çəmənlərdə ceyran gəzər, gül bitər.
Yeyib dincələr daima elləri,
Ətirdir, naxışdır bütün çölləri.
Axar çeşməsində gülab ətri var,
Sudan kim içər, ruhu pərvazlanar.
Payız, qış, bahar, fərqi yox, hər zaman
Olar laləyə qərq Mazəndaran.
Yaşıl çay kənarında, dağda hər ay
Salar il boyu göydə şahin haray.



Bürünmüş bütün ölkə başdan-başa
Zərə, atlasa, inciyə, daş-qaşa.
Sənəmlər qoyar başına taci-zər
İgidlər hamı beldə altun kəmər.
Eşitdikdə Kavus belə sözləri,
Tamahdan bərəldi onun gözləri.
Savaş axtaran qəlbi coşdu onun
Ki, Mazəndarana yeritsin qoşun.
Dedi: – Ey şücaətli sərkərdələr,
Mey içməklə əylənmək artıq yetər!
Peşə etsə tənbəlliyi qəhrəman,
Yorulmaz o əyləncədən heç zaman.
Ağılda, fərasətdə, taledə mən,
Qubad ilə Zöhhak, Cəmşiddən,
Bilin, artığam çox: odur ki, gərək
Hünər göstərəm, çarpışam şirtək.
Böyüklər bu sözdən gəlib heyrətə,
Şərik olmadı kimsə bu söhbətə
Saraldı hamı qorxudan, qaldı çaş,
Necə yeni divlərlə olsun savaş.
Şaha vermədi kimsə düzgün cavab,
Çəkirdi hamı gizli-gizli əzab.
Hamı: Tus, Gudərz, Kəşvad, Giv
Və Xərrad, Qorgin, Röhham, Niv
Baş əydi, dedi: – Biz kiçik qullarıq,
Şahın hər nə fərmanı olsa, varıq.
Ürəkdən hamı dərd çəkib yandılar,
Gedib sonra xəlvətdə toplandılar.
Hamı fikrini söylədi birbəbir,
Məgər bəxt bizdən küsübdür, nədir?
Bu sözlər ki, sərxoş dedi hökmdar,
Ayıldıqda əl çəkməsə, aşikar,
Nə İran, nə bizdən qalar bir əsər,
Gözəl ölkə bərbad olar sərbəsər.
Üzük sahibi, hətta Cəmşid ki var,
Ona tabe idi bütün canlılar,
O Mazəndaran adını çəkmədi,

Vuruşlarda divlərlə qan tökmədi.
Fəridun o idrakla, o elmlə
Düşünməzdi bu haqda bir an belə.
Zor ilə, zor ilə hünorlə əgər,
Müyəssər olaydı bu işdə zəfər,
Mənuçehr iqdam etməzdimi?
Bu qovğa o vaxtlarda bitməzdimi?
Gəlin, axtaraq indi biz bir çara
Ki, bəlkə bəladan İran qurtara.
Dedi Tus: – Ey şanlı sərkərdələr!
Döyüşlərdə çox göstəribsiz hünər.
Yaman yerdə işlər düşübdür düyün,
Onu açmağa birco yol var bugün.
Sam oğlu Zalın yanına bir çapar
Sifarişlə göndərməyə vaxt çatar.
Desin qoy çapar Samın oğlu Zala
Su içsən, əlindən qoyub düş yola.
Şahı bu fikirdən gəlib döndərə,
Ona yaxşı-yaxşı nəsihət vero,
Deyə: Əhrimən felinə uyma gəl!
Xətadır, divin üstə qaldırsan əl!..
Götür-qoy edib, verdilər, aldılar,
Sifarişlə elçi yola saldılar.
Qoyub Nimruza üz, çapıb dördnala
O elçi çatınca baş əydi Zala,
Dedi: – Ey böyük Samdan yadigar,
Məni göndərib bir neçə namidar,
Çıxıbdır bir iş qarşıya çox yaman,
Asan həlli mümkün deyil heç zaman
Deyirlər dada çatmasa Zal əgər,
Hamı məhv olar, ölkə əldən gedər.
Şahı Əhrimən öz dalınca çəkir,
Salıbdır onun beyninə pis fikir.
Sələflər yolundan çıxıbdır tamam,
Keçən şahlara qoymayır ehtiram.
Özündən o dəm vurmağı xoşlayır
Ki, Mazəndarana hücum başlayır.



İnan ki, gecikən əgər bircə an,
Uğursuz işə əl qatar hökmran.
Verər tez bada çəkdiyin zəhməti,
Qubada olan xidməti, hörməti.
Yenilməz bir aslan olub da dünən,
Nələr etdiniz gənc Rüstəmlə sən?
Gözündə şahın yoxdur heç qiyməti,
Görün şahlıq olmuş kimin qisməti!
Eşitdikdə Dəstan bu sözləri[63],
Saraldı üzü, titrədi dizləri,
Düşündü ki, Kavus, şah olsa da,
O isti-soyuq görməmiş dünyada.
O təxtin önündə əgər bir nəfər,
Edib aylar, illərlə ömrün hədər,
Hünər göstərib şir kimi kükrəmiş,
Qılıncı önündə cahan titrəmiş,
Mənəm o, gərək şah bunu anlaya,
Ürək qan olar çıxsa səyim zaya.
Əgər mən təlaş, səy göstərməsəm,
Qələt fikirdən şahı döndərməsəm,
Nə iranpərəst pəhləvanlar, nə şah,
Nə də Tanrıya xoş gedər bu günah,
Gedim, şah məndən öyüd dinləyər,
Nəsihətlərimdən o görməz zərər.
Qulaq asmasa, ondadır ixtiyar,
Qoşunla gedər Rustəmi-namidar.
Fikirdən gecə yatmadı sübhədək,
Günəşdən başa tac qoyanda fələk,
Hazırlaşdı, yollandı şah yanına,
Böyüklər hamı yoldaş oldu ona,
Xəbər çatdı Kəşvada, Tusa, Givə,
Qoçaq Röhhama, Qorginə, həm Nivə,
Yaxınlaşmış, İrana Dəstan gəlir,
Uzaqdan zəfər bayrağı yüksəlir.
Onu pişvaza çıxdı sərkərdələr,
İgid pəhləvanlar, hərə şiri-nər.
Gəlib çatdı Sam oğlu, qurtardı yol,

Onu etdilər ehtiramla qəbul.
Böyük pəhləvanlar salam etdilər,
Onunla şahın yanına getdilər.
Zala söylədi Tus: – Ey qəhrəman!
Ağır zəhmətə sən ki, qatlaşmısan,
Biz iranlı sərkərdələr namına,
Qəbul etmisən zəhməti canına,
Hamı xeyirxahıq sənə birbəbir,
Sənin tacının vəsfi dillərdədir.
Dedi Zal: – Ey şanlı sərkərdələr,
Yaşı bir kəsin ötməmişsə əgər,
Böyükdən nəsihət eşitsin gərək,
Dolansın muradınca çərxi-fələk.
Şahın ehtiyacı böyükdür sözə,
Nəsihətçilik vacib olmuş bizə.
Ağıllı öyüddən qaçırsa boyun,
Peşiman olar başlayanda oyun.
Hamı söylədi: – Biz səninlə varıq,
Nə fərmanın olsa, yerə salmarıq.
Hamı birgə üz qoydu şah yanına,
Onun şanlı, şövkətli astanına,

Gedirdi qabaqda qoca Zali-zər,
Dalınca böyüklər – hamı zərkəmər,
Nəzər saldı Kavusa Dəstani-Sam,
Oturmuş necə təxtdə, o şadkam.
Əli beldədir, başsa getmiş dala,
Zalı görməyir gözləri az qala.
Dedi: – Ey cahanda böyük hökmdar!
Bütün şahların sərvəri şəhriyar!
Sənin təxti-tacın, sənin bəxtinin
Fələk mislini görməmişdir, yəqin.
Zəfərlər qazan, daima şən yaşa,
Ağılla, ədalətlə ol tən, yaşa!
Özüylə onu təxtdə yan-yana
Oturtdu, nəvaziş qılıb şah ona,
Soruşdu: – Uzaq yol yorubmu səni?



Danış, hali et işlərindən məni.
Bütün pəhləvanlar səlamətmidir?
Mənə söylə, Rüstəm dilavər nədir?
Belə söylədi şah Kavusa Zal:
– Cahanda zəfərlə, səadətlə qal!
Hamı sağ-salamat, hamı bəxtiyar,
Sənin təxtinin sayəsində durar.
Keçib mətləbə sonra Dəstani-Sam,
O öz fikrini etdi böylə davam:
– Sən ey bu cahanda olan hökmdar!
Xuda təxt-tacın edə payidar.
Olub səndən əvvəl nə çox padişah,
Belə bir işə salmamışlar tamah.
Neçə vaxt ki, dünyada sağ qalmışam,
Neçə padişahı yola salmışam,
Mənuçehr köçdü geniş dünyadan,
Nə sərvət apardı, nə bir xaniman.
Böyük şahları birbəbir eylə yad,
Nə Zəv şah, nə Nuzər, nə də Keyqubad,
Nə ordu, nə gürzü dayaq etdilər,
Nə Mazəndaran üstünə getdilər.
Ora cadugər divlərin yurdudur,
Daşı, torpağı tilsimdir, cadudur,
Qılınc ilə fəth etmək olmaz onu,
Nə altun qırar, nə bilik cadunu,
Nə də hiylə bu işdə yardım edər,
Ağır zəhmətə, xərcə düşmə hədər!
Belə bir səfərdən xeyir gözləmə,
Bu yolda xətər var, onu izləmə!
Qoşun çəkmək haqqında fikri dəyiş,
Bu fikri sələflər rəva görməmiş.
Kiçik qullarındır bu sərkərdələr,
Sənin əmrinə hər biri baş əyər.
Belə başları vermə gəl sən bada,
Elə bir ağac əkmə bu dünyada
Ki, nifrinlə lənətlə dolsun bara
Yaraşmaz belə bir əməl şahlara.

Dedi şah Kavus ona: – Yaxşı bil,
Sənin sözlərin heç gərəksiz deyil.
Fəqət artığam gücdə, sərvətdə mən
Ağılda Fəridunla Cəmşiddən,
Mənuçehr də Keyqubad da belə
Alanmazdı Mazəndaranı dilə.
Çox üstündür ordum, gücüm, sərvətim,
Qılıncla cahanı tutub, şöhrətim.
Biliklə cahan fəth olunmuş bütün,
Dəmirdən niyə əl çəkək biz bu gün?
Gərək onları mən salım düz yola,
Qılıncımla təxtimə tabe ola.
Gərək bir nəfər orda sağ qoymayam,
Ağır vergilər, cizyələrlə soyam.
Nə cadu, nə divlər məni qorxudar,
Önümdə hamı görsənir xar, zar.
Yəqin ki, sənə tez çatar bu xəbər
Ki, dünyada div qalmamış bir nəfər.
Qal İranda, hökm eylə Rüstəmlə sən,
Sayıq ol, gözün çəkmə bu ölkədən!
Köməkdir mənə haqq Pərvərdigar,
Bil ki, olar divlər əlimdə şikar.
Döyüşdə kömək etməsən də əgər,
Çalışma ki, baş tutmasın bu səfər.
Zala bərk toxundu şahın sözləri,
Acıqdan qızardı onun gözləri,
Dedi: – Padişahsan, biz isə quluq.
Yanırsa ürək, açmağa borcluyuq,
Ədalət və ya zülm görsən rəva,
Sənin öz işindir əta, həm xəta.
Mən öz fikrimi söylədim aşikar,
Daha bir sözüm yoxdur, ey hökmdar!
Əcəl çatdımı, bil, deyil əl çəkən.
Fələk yıxdığın olmamışdır tikən.
Həmişə bu aləmdə xoşbəxt yaşa,
Mənim sözlərim kaş çıxaydı boşa.
İşində peşimançılıq çəkmə, şah,
Sənə məzhəbin, dinin olsun pənah!
Şah ilə görüşdü, bir ah çəkdi Zal,
Onun könlünü çulğamışdı məlal.
Qoyub şah Kavusu çıxdı çölə,
Gözündə qaraldı Günəş, Ay belə.
Qoşuldu Zala Tus, Röhham, Giv,
Böyük ehtiram ilə Gudərz, Niv.
Dedi Giv: – Mən istərəm Tanrıdan,
Daşınsın bu işdən özü hökmüran.
Sənin sözünü saldı Kavus yerə,
Adam saymaram mən onu bir kərə.
Paxıllarla acgözlülərdən saqın,
Sənə gəlməsin kinli düşmən yaxın.
Hara getsək, hər yerdə söz söyləsək,
Səni xeyirlə yad edək biz gərək.
Böyük tanrıdan sonra, bil, təkcə sən
Bu İranın ümmidisən, fəxrisən.
Bizimçin ağır zəhmət etdin qəbul,
Uzaq bu yolu gəldin, əhsən! Sağ ol!
Bütün pəhləvanlar Zalı qucdular,
Yola düşdü Sistana o namidar.

Şahı tərk edib, getdi Zal pəhləvan,
Qoşun hey gəlib, toxtadı anbaan.
Şah əmr etdi Gudərz ilə Tus üçün,
Qoşunla səfər başlasınlar o gün.
Səhər - şah qabaqda, qoşun çəkdi səf,
Yola düşdü Mazəndarana tərəf.
İran mülkünü tapşırıb Miylada,
Nə var xəznədə, taci-təxt olsa da,
Ona söylədi, gəlsə düşmən əgər,
Qılınc əldə çarpış, sənindir zəfər!
Həmişə Zala, Rüstəmə arxalan,
Bu təxtə dayaqdır iki pəhləvan.
Haman gün çalındı təbil, nay, kus,
Alıb ordunu getdi Gudərz, Tus.
Gedirdi qoşun içrə Kavus şah,

Çatıb İspruza, qurub xeyməgah[64],
Doluydu o yer yırtıcı div ilə,
Ayaq basmaz idi ora fil belə.
Döşətdi çadır üstünə zər, ziba,
Şorabın xoş ətriylə doldu hava.
Qoşunda olan hər igid pəhləvan .
Oturmuşdu Kavus ilə yanbayan.
Gecə mey içib, şən busat qurdular,
Yataqdan səhər olcağın durdular.
Dəbilqə başında, belində kəmər
Gəlib şah hüzurunda səf çəkdilər.
Tutub Givə üz, söylədi hökmdar:
– Ayır ordudan min nəfər namidar.
– Ağır gürz əlində sən onlarla get,
O Mazəndaran şəhrini əldə et!
Qoca, ya cavan, kim kəsərsə yolun,
Tutub bağla zəncir ilə əl-qolun!
Yaxıb yandır oldu şəhər, ya ki, kənd.
Gecə-gündüz atdan düşüb, olma bənd.
Gedib divlərə çatdırınca xəbər,
Çalış, qoyma divdən cahanda əsər.
Şaha baş əyib Giv, oldu rəvan,
Seçib ordudan min igid pəhləvan,
Gəlib çatdı Mazəndaran şəhrinə,
Əl atdı ağır gürzə, şəmşirinə,
Nə arvad-uşaq, nə qoca, nə cavan
Tapa bildi qanlı qılıncdan aman.
Qalandı oda, qarət oldu şəhər,
Qılınclardan od yağdı, bir də zəhər.
Şəhər bir behişt idi, bir laləzar,
Bağı, bağçası bir bəzəkli bahar.
Kəniz gördü hər məhlədə min nəfər,
Qulaqlarda sırğa, belində kəmər,
Elə çoxlu qullar ki, gəlməz saya,
Papaq başda, oxşardı üzlər aya.
Hər evdə qızıl dolu xəzinələr,
Qalanmışdı üst-üstə dürrlə-gövhər,



Hesabsızdı orda qoyun, mal-qara,
Deyərdin ki, cənnət çıxıb aşkara.
Gedib elçi Kavusa verdi xəbər:
Çiçəklə gülə qərq olubdur şəhər.
O kəs doğrudan söyləmiş bu sözü:
Behiştdir bu, Mazəndaranın özü.
Məgər bir sənəmxanədir bu şəhər
Ki, Çin atlasıtək çiçəklər bəzər.
Gözəllər bu yerdə birər huridir,
O gül üzlərində behişt nuridir.
Bir həftə belə keçdi, iranlılar
Qırıb tökdülər, çaldılar, hər nə var,
Xəbər çatdı Mazəndaran şahına,
Yanıb bağrı, saçdı şərər ahına.
Yanındaydı şahın bu dəm Sencədiv,
Xəbərdən canında min işkəncə, div
Dedi: – Durma, get, Ağ divə ver xəbər.
Elə get, necə ki, Günəş yol gedər.
De, Mazəndaranı gəlib çapdılar
İrandan gələn vəhşi soyğunçular.
Qabağında Kavus şah ordunun,
Dalınca gedir sel kimi bir qoşun.
Bu gün dadıma çatmasan sən əgər,
Tapılmaz diri ölkədə bir nəfər.
Bu peyqamı Sencə eşitcək haman
Gedib Ağ divə söylədi durmadan.
Dedi Sencəyə: – Olma əsla məlul,
Ümidlə yaşa, bir qədər sakit ol!
Böyük bir qoşunla gəlib indi mən,
Görüm kimdi Mazəndarana gələn?
Gecə bir bulud oldu Ağ div haman,
Qara zənciyə döndu ondan cahan.
Cahan sanki qırdan bir ümman idi,
İşıqlı nə vardısa, pünhan idi.
Büründü qara çadıra göy üzü,
Qara tüstüdən görmədi göz-gözü.
Gecə keçdi tez, banlayanda xoruz,

Gözü kor oyandı o gün Keykavus.
Kor oldu böyük hissəsi ordunun,
Şaşırdı hamı dəhşətindən bunun.
Həlak oldu bir çox igid pəhləvan,
O bədbəxt qoşundan az oldu qalan.
Cahan oldu Kavus gözündə qara.
O idi salan ordunu odlara.
Xəzinə gedib, ordu düşdü əsir,
Dönüb taleyi, oldular dəstgir.
Bu dastan gərək dildə əzbər ola,
Bütün şahlar ondan bir ibrət ala!
Bəlaya düşən şah dedi: – Mən bilən,
Ağıllı vəzir yaxşıdır xəzinədən.
O, bir həftə çəkdi müsibət, kədər,
Onun kor gözü görmədi bir nəfər.
Çəkib nərə, Ağ div dedi: – hökmdar!
Söyüdsənmi, yoxdur budağında bar?
İran, olmaya, dar gəlirdi sənə,
Düşübsən bu Mazəndaran qəsdinə?
Qızıb fil kimi, arxalandın gücə,
Gözündə göründü hamı bir cücə.
Danış, təxti-tacınmı azdı sənin?
Puç ağlın belə yoldan azdı sənin?
O daş başını yardı ki, atmısan,
Demək, indi öz arzuna çatmısan.
Seçib sonra tam on iki min nəfər,
Qılınc əldə, qan təşnəsi divi-nər,
Gözətçi kimi qoydu, iranlılar
Əsarətdə qaldı, hamı oldu xar.
Yığıb pəhləvanlarını bir yerə,
Əsir şir kimi çəkdirib zəncirə,
Yemək verdi bir az, o da nə yemək?
Çətin işdi ondan yeyib ölməmək.
Daha sonra, şah xəznəsində nə var.
Ağır gürz, yaqut tac, guşvar,
Saya gəlməyən sərvəti cəmlədi,
Verib təhvil Ərjəngə sonra dedi:



– Dilimdən mənim söylə sən padişaha,
Eyib tutma Əhrimənə bir daha,
İran pəhləvanları Kavus ilə
Günəş nuru görməz bu gündən belə.
Bəli, qəsdən öldürmədim şahı mən.
O bilsin necə alçalar yüksələn?
Gələ əqlə zillətdə, zəbt etməyə,
Belə yolla bir başqası getməyə.
Onu dinləyib dəydi, Ərjəng ata
Ki, Mazəndaran şahına tez çata.
Gedirdi qoşun, varla, dövlətlə o,
Əsirlərlə, atlarla, ziynətlə o.
Verib onları şaha, döndü geri,
Geniş çöl, uca dağlar idi yeri.

Ciyər xəstə, Kavus şah birtəhər
Çıxardıb uçan quş kimi bir nəfər,
Onu Zabilistana saldı yola,
Salam yolladı Rüstəm ilə Zala.
Dedi: – Gözlərim kordu, bəxtim qara,
Düşüb təxt ilə tac torpaqlara.
Özüm Əhrimən pəncəsində əsir,
Həyatım bağında səmumlar əsir.
Düşəndə sənin sözlərin yadıma,
Öz ahım çatır təkcə fəryadıma.
Ağıllı sözü tutmadım mən dəlil,
Ağılsız bir iş tutdum, oldum zəlil,
Bu gün dadıma yetməsən sən əgər,
İran mülkünə çox ziyanlar dəyər.
Gəlib çatdı qasid Zalın yanına,
Görüb bildiyindən danışdı ona.
O sərvət, o ordu ki, hər namidar,
Deyərdin: çiçəklərdir, açmış bahar.
Necə verdi divlər əlinə fələk,
Nə ki, vardı sildi, süpürdü külək.
Bu sözdən Zalın əndamı titrədi,
Nə düşmən, nə də dosta bir söz dedi.

Onun qəlbi agahdı əvvəlcədən,
Qoyar başını əyri yolla gedən.
Dedi Rüstəmə: – Ey oğul, nə edək?
Qılınclar qınında olubdur gödək.
Bizə taxt candan əzizsə əgər.
Yeyib, gəzmək artıq bizimçin yetər.
Düşüb əjdaha kamına hökmdar,
Bəlaya düçar olmuş iranlılar.
Dayanma, oğul, Rəxşinə qoy yəhər,
Qılıncınla sal aləmə şurü şər.
Bu günçün səni, bil, doğubdur anan,
Bu günçün səni bəsləmişdir zaman,
Bizə gör necə toy tutub Əhrimən?
Haramdır nəfəs alsan asudə sən,
Geyin əyninə indi bəbri-bəyan[65],
Yuxun gəlsə, yatma, mətin ol, dayan!
Sənin nizənin zərbini hər görən,
Deməz, ruhən asudə bir gəncsən,
Dənizlə vuruşsan, dönüb qan olar,
Dağa nərə vursan, bir orman olar.
Çalış, zərbi-dəstindən, ey qəhrəman,
Nə Ağ div, nə Ərjəng tapsın aman!
Aman vermə Mazəndaran şahına,
Ağır gürzü endir onun başına.
Cavab verdi Rüstəm: – Səni anladım,
Fəqət yol uzaqdır, necə tez çatım?
Dedi Zal: – İrandan o şəhrə qədər
İki yol gedir bir-birindən betər.
Biri Kavusun getdiyi yol durar,
İki həftəlik kəsmə bir yol da var.
Əzab ilə, aslanla, divlə dolu,
Çaşar ağlını kim görə bu yolu.
Yaxın yolla getsən, maraqlı olar,
Sənə arxadır pak Pərvərdigar;
Yetər tez başa, olsa da zəhmətin,
Bu yol Rəxş üçün də deyildir çətin.
Mən isə qaranlıq gecə sübhədək
Açam haqq dərgahına əl gərək.
Görüm bir daha ay camalın sənin,
Verə cismimə can vüsalın sənin.
Əgər sən də düşsən divin çənginə,
Bu, haqq əmridir, tabeyik biz yenə,
Böyük Tanrıdır həm yazan, həm pozan,
Çıxan qan damarda dayanmaz bir an.
Hamı istəyir daimi ömr edə,
Fəqət, qaydadır ki, gələnlər gedə.
O kəs ki, böyük adla, sanla gedər,
Cahanı açıq qəlb ilə tərk edər.
Cavab verdi Rüstəm: – Atacan, inan!
Sənin əmrinə tabeyəm hər zaman.
Belə bir iş heç kəs hələ etməmiş,
Cəhənnəm yolunu tutub getməmiş.
Canından əgər bezməmiş bir nəfər
Gedər üz-üzə aslan ilə məgər?
Budur, hazıram, yollanam mən gərək.
Mənə təkcə öz xaliqimdir kömək.
Edib canımı xalq yolunda fəda,
Yaxım cadular bağrını mən oda.
Hər iranlı ki, sağ qalır, qurtaram,
Sağ olduqca canım, bu yolla varam.
Nə Ağ div, nə Ərjəng, nə Səncə qala,
Gərək Bid, Qəndi, Pulad məhv ola!
O tək xaliqə içmişəm mən qəsəm,
Yerə enməyim Rəxşdən bir qədəm.
Gərək orda Ərjəng əlin bağlayım.
Salım boynuna kündəni qapqayım.
Puladın başını vurub bir kərə,
Salım Rəxş dırnağı altda yerə.
O, Bəbri-bəyana tutub peykərin,
Baxıb Zal ona söylədi: – Afərin!
Qoyanda üzəngiyə Rüstəm ayaq,
Nə qəlbi döyündü, nə soldu yanaq.
Gözüyaşlı Rudabə gəldi bu an,
O, oğlu önündə qopardı fəqan.

Dedi Rüstəm: – Ey mehribanım ana!
Öz arzumla mən getmirəm meydana.
Məni öz qəmimlə burax, ağlama!
Əl aç Tanrıya, canıma qıl dua!
Nə etmək, bu imiş mənim qismətim,
Di sağlıqla qal, ey şanım, şöhrətim!
Ata, həm ana qucdular boynunu,
Yola saldılar həsrət ilə onu.
Budur daima ruzigarın işi,
Verər vaxta qiymət ağıllı kişi.
Olursan yaman gün ötən dəmdə şad,
Sanırsan ki, dünya olubdur abad.

Ata xidmətindən Cahanpəhləvan
Çıxıb, məqsədə doğru oldu rəvan.
İki mənzil bir günə qət edir,
Gecəni qatıb gündüzə yol gedir,
İşıqlı gün olsun, qaranlıq gecə,
Bilirdi özü Rəxş getsin necə.
Təamsız, çörəksiz gedirdi belə,
Gəlib çatdı gurla dolu bir çölə.
Görüncə bunu Rəxşi məhmizlədi,
Yaxında olan bir guru izlədi.
Kəmənd əldə, Rüstəm ola, Rəxş ola,
Qoyarmı dönə ov sağa ya sola?
Kəyani kəməndi atıb, sanki şir,
Kəməndə salıb guru etdi əsir.
Çəkib guru, yıxdı yerə durmadan,
Adıb üstünü sanki şiri-jəyan,
Ox ilə kamandan od aldı qoçaq,
Alışdırdı çör-çöplə, qurdu ocaq.
Kəsib guru, soydu onu tərtəmiz,
İti gözdə büryan hazır oldu tez.
Yedi guru, qaldı sümüklər fəqət,
Qazan oddu, süfrə ona cılxa ət.
Bir az otlasın göy çəməndə, deyən,
Durub açdı Rəxşin başından yüyən.



Qamışlıq kənarında qurdu yataq,
O qorxunc yeri sandı xəlvət otaq.
Demə orda şir məskəni var imiş,
Əlindən şirin fil də bizar imiş.
Bir az keçdi, aslan dönərkən geri,
Onun nərəsi titrədirdi yeri.
Nə gördü qamışlıqda bir fil yatıb,
Başı üstə bir at qulağın çatıb.
Dedi: əvvəl-əvvəl atı öldürüm,
Süvariylə sonra hesabı görüm.
Hücum etdi ki, Rəxşi sərsin yerə,
Coşub od kimi Rəxş də bir kərə
Başından onun vurdu bir cüt təpik,
İti dişlə tutdu belindən çevik.
Yerə çırpdı, axdı bulaqtək qanı,
Həlak etdi o yırtıcı heyvanı.
Oyandıqda Rüstəm baxıb dörd yana,
Sataşdı gözü birdən o aslana.
Dedi Rəxşə ki: – Ey sayıqlıqda baş,
Sənə kim demişdi şir ilə tutaş?
Öləydin əgər şir cəngində sən,
Bu şəmşir, dəbilqə, bu covşənlə mən,
Kəməndlə, ağır gürzlə bir nəfər
Edərdimmi Mazəndarana səfər?
Yanımda gəlib kişnəyəydin gərək,
Eşitcək ki, sən istəyirsən kömək,
Qaçardı gözümdən yuxum da, inan!
Tutardım özüm mən o şirə divan.
Günəş dağ dalından ki, qaldırdı baş,
Təhəmtən oyandı, geyindi yavaş,
Yəhər qoydu Rəxşə, onu oxşadı,
Dilindəydi Pərvərdigarın adı.

Gəlib çatdı Rüstəm çətin bir yola,
Fəqət getməliydi, ölə, ya qala.
Su yox, istidir, od tutub çöl yanır,
Atın, atlının varlığı odlanır.

Enib əldə zubin atından yerə,
Təhəmtən piyada düşüb çöllərə,
Ağır dərdinə axtarırdı çara,
Əl açdı göyə, Tanrıya yalvara.
Dedi: – Ey ədalətli xaliq ki sən,
Bu dərdi, əzabı mənə vermisən,
Xoşun varsa, canım yaxılsın oda,
O dünyaya saxla bunu, ey Xuda!
Kömək et mənə, bu yolu tez gedim,
Gedib, şah Kavusu azad edim.
Divin cənginə düşmüş iranlılar,
Nicat ver özün, həqq Pərvərdigar!
Günah işləmiş qullarındır sənin,
Əsiri olublar bir Əhrimənin.
Yanırdı o fil cüssəli pəhləvan,
Susuzluqdan olmuşdu bir natəvan.
Dil ağzında çat-çatdı bərk istidən,
Düşüb qaldı qızmar qum üstə həmən,
Nə gördü, yanından ötür dağ qoçu,
Görüncə şümal sağrılı ağ qoçu,
Fikirləşdi Rüstəm: bu heyvan gərək
Su içsin, susuz neyləyir çöldə tək?
Məgər həqq mənə lütfünü göstərib?
Bu gündə onu yardıma göndərib?
Qılıncı edib sağ əlində dayaq,
Güc ilə ayaq üstə tez qalxaraq,
Bir əldə qılınc, bir əlində kəmənd
Gedirdi, kəməndə edib Rəxşi bənd.
Çatıb bir yerə saxladı qoç ayaq,
Baxıb gördü Rüstəm: axır bir bulaq,
Göyə əl açıb söylədi: – Ey Xuda!
Sənin lütfünə bir dəlildir bu da.
O kəslər ki qapından üz döndərər,
Ağılsızlığından çəkərlər zərər.
Qoç olmuş məgər sahibi bu suyun?
Nə vaxtdan mənə dostdu vəhşi qoyun?
İşin bu cahanda düşərsə dara,



Əl üz bəndədən, həqqdən imdad ara!
Sağ ol, qoç, mənə yaxşı etdin kömək!
Səni hifz eləsin bəladan fələk.
Görüm, otlağında xəzan olmasın,
Bərəndən səni qalxızan olmasın.
Kim oxla, kamanla alar üstünü,
Qırılsın kamanı, qaralsın günü.
Kəfən barəsində düşündükdə mən
Bu fil cüssəmə sən həyat vermisən.
Böyük əjdaha kamına sığmayan
Canım qurda qismət olardı, inan!
Yetən vəhşi heyvan didərdi məni,
Tutardı xəbər Rüstəmin düşməni.
Duası sona çatdı, o şiri-nər
Açıb aldı Rəxşin belindən yəhər,
Yudu çeşmənin saf suyunda atı,
Günəşdir deyən, tükləri parladı.
Özü, Rəxşi içdi doyunca sudan,
Götürdü ələ ov üçün ox, kaman.
Atıb, fil böyüklükdə gur ovladı,
Soyub, qıçların, qarnını tulladı,
Bir od yaxdı, şölə yayıldı düzə,
Çıxardı sudan guru, atdı közə,
Bişirdi, yedi büsbütün bir guru,
Sümüklər atıldı yerə qupquru.
Bulaq başına döndü o bir daha,
Sudan içdi, meyl eylədi yatmağa.
Dedi Rəxşə: – Biz yoldayıq, anla sən,
Nə dostlaş, nə çarpış bir heyvanla sən!
Əgər gəlsə düşmən, məni tez oyat,
Nə divlə, nə aslanla qovğa yarat!
Yuxu tutdu, ağzında qaldı sözü,
Gəzib, otladı Rəxş, ayıqdı gözü...

Göründü gecə vaxtı bir əjdaha
Ki, fil qurtara bilməz ondan yaxa.
O gündən ki, salmışdı məskən çölə.

Qədəm qoymaz idi ora div belə.
Gəlib yatmış gördü cəngavəri,
Yanında bir at var – onun yavəri
Düşündü: nə olmuş ki, bu pəhləvan
Yatır məskənimdə mənim qorxmadan?
Bu yerdən ötüb keçməmiş bir nəfər,
Nə fillər, nə divlər, nə də şiri-nər.
Gələn olsa da, yetməmiş kamına,
Gedibdir hamı əjdaha kamına.
Tutub Rəxşə sarı üz, açdı qanad,
Qaçıb Rüstəmin yanına gəldi at.
Polad dırnağıyla döyürdu yeri,
Səsi titrədirdi onun göyləri.
Təhəmtən oyandı səsə, həycana,
Ağıl hökm elədi: girə meydana.
Nəzərdən keçirdi çölü bir daha,
Qaçıb gözdən itdi bu dəm əjdaha.
Acıqlandı Rəxşə ki, vurram səni,
Niyə sən səbəbsiz oyatdın məni?
Uzandı yenə, yatdı o namidar,
Göründü yenə əjdaha aşikar.
Yanında gəlib Rüstəmin durdu Rəxş,
Bağırdı, yerə hey təpik vurdu Rəxş.
Oyandı, yerindən atıldı yenə,
Boyandı üzü zəfəran rənginə.
Nəzər saldı başdan-başa ol düzə,
Qaranlıqda dəymirdi bir şey gözə.
Dedi mehriban Rəxşə ki, ey dəcəl,
Yaxamdan nə olmuş ki, çəkməzsən əl?
Yatıb dincəlirdim, aman vermədin,
Tutaq tez oyandım, nədir məqsədin?
Əgər bir də hay-küy salıb kişnəsən,
Kəsib başını öz qılıncımla mən,
Piyada gedim bu yolu mən gərək,
Ağır gürz, bəbri-bəyanımla tək.
Uzandı üçüncü kərə pəhləvan,
Yenə yatdı, əynində Vəbri-bəyan.



Çıxıb ortaya əjdaha gurladı,
Nəfəs saldı, ağzından od parladı.
Edib otlağı tərk, şəkləndi at,
O qorxurdu Rüstəm ola narahat;
Onun bağrını çulğadı səksəkə
Ki, Rüstəmdi, həm əjdaha təhlükə.
Anıb Rüstəmi, qıydı öz canına,
Yetirdi özün Rüstəmin yanına.
Coşub gurladı, tapdadı torpağı,
Yeri çat-çat etdi onun dırnağı.
Oyandı, acıqlandı Rüstəm ata,
Hazırlaşdı ki, qılınca əl ata,
İşıqlandı həqq əmri ilə hava,
Daha gizlənə bilmədi əjdaha,
Toranlıqda Rüstəm onu görcəyin,
Əl atdı qılıncın tutub dəstəyin,
Elə gurladı sanki yazda bulud,
Qılıncıyla yandırdı meydanda od
Dedi: – Adını söylə, ey əjdaha!
Əlimlə cahandan gedirsən daha.
Fəqət istəməzdim adın bilmədən
Alım canını bu qılıncımla mən.
Ona əjdaha söylədi: – Ey cavan!
Əlimdən hələ olmamış qurtaran.
Mənim məskənimdir bu səhra tamam,
Gəlib keçməmişdir bu yerdən adam.
Fəzasında şahin qanad açmamış,
Bir ulduz bu yerdə işıq saçmamış,
De kimsən, adın nə, tanıtdır mənə,
Səni kim doğub – saxlasın yas sənə
Cavab verdi: – Mən Rüstəməm, indi bil,
Atam Zal, babam Sami-Neyrəmdi, bil,
Mənəm tək – qoşunla girən meydana,
Cahanda sürən Rəxşini hər yana.
Tutaşdı onunla bu dəm əjdaha,
Macal vermədi söz desin bir daha.
Fikir verdi Rəxş əjdahada güçə,

Salıb cənkinə Tacbəxşi necə?
Qulaqlarını cütlədi durmadan,
Dişiylə tutub əjdahanı haman,
Dağıtdı bir anda onun çiynini,
Baxıb gördü Rüstəm nədir at kini.
Qılınc endirib əjdaha başına,
Axıtdı qanını çölün daşına.
Təhəmtən salıb əjdahaya nəzər,
Dərindən nəfəs dərdi o şiri-nər.
Görüncə: tutub cəmdəyiylə çölü,
Yaranmış o səhra boyu qan gölü,
Təəccüblənib, qərq olub heyrətə,
Dedi: – Şükr Xaliqdəki qüdrətə.
Gəlib çimdi bir də təmiz saf suda,
Dedi: – Tanrı tək qüvvədir dünyada!
Göyə əl açıb söylədi: – Tanrı, sən,
Mənə güc, fərasət, bilik vermisən.
Odur, div nədir, şir nədir, fil nədir?
Susuz çöl nədir, dalğalı Nil nədir?
Az olsun və ya çox mənim düşmənim,
Bilirsən önümdə dayanmaz mənim.

Pərəstiş, dua qurtarınca həmən,
Yəhər qoydu Gülrəngə, taxdı yüyən.
Qürur ilə, qalxdı yəhər üstünə,
Sehirli yol ilə gedirdi yenə.
Uzun bir yolu getdi altında Rəxş,
Günorta yerindən dönəndə Günəş,
O bir mənzilə çatdı, qıldı nəzər,
Ağaclar, yaşıl ot, axar çeşmələr,
O gördü ki, bir çeşmə var saf sulu,
Yanında qızıl cam şərabla dolu.
Çörək üstə büryan edilmiş quzu,
Yanında onun bəkməzi, həm duzu.
Yeyirmiş, içirmiş, demə cadular,
Görüb Rüstəmi-Zalı qeyb oldular.
Atından enib baxdı dörd bir yana,



Təəccüblə həm əppəyə, büryana,
Oturdu, yetirdi nəzər hər şeyə,
Qızıl cam içində olan saf meyə,
Meyin yanında gördü tənbur da var,
Demək, kimsə bu çöldə işrət qurar.
Təhəmtən basıb tənburu sinəyə,
Çalıb çağladı, dərdi coşmuş deyə:
"Bu Rüstəm bir avarədir, yox tayı,
Müsibət, kədərdir cahanda payı.
O hey əjdaha, şir ilə çarpışar,
Qılar aslanı, əjdahanı şikar.
Nə mey camı tutmuş, nə gül iyləmiş,
Ona bunları həqq haram eyləmiş.
Həmişə tutaşmış nəhəng ilə tək,
Dayansın önündə pələnglər gərək..."
Eşitdi saz-avazı Cadu qarı,
Dedi: – Var bunun Rüstəmə oxşarı.
Bəzək verdi ruxsarına tərtəmiz,
Gülə oxşadı ondakı çirkin üz.
Gəlib Rüstəmin yanına naz ilə,
Salam verdi ona xoş avaz ilə.
Təhəmtən bunu görcəyin oldu şad,
Düşündü məni eyləmiş Tanrı yad.
Bu səhrada beylə bir süfrə sərib,
Qızıl camda mey, şux sənəm göndərib,
Nə bilsin: sənəm sandığı cadudur?
Dona girsə də, Əhriməndir durur.
Şərabla dolu camı aldı ələ,
Xuda namını tez gətirdi dilə,
Alınca dilə Tanrının qüdrəti,
Dəyişdi haman cadunun surəti.
Qaraldı üzü, girdi başqa dona,
Təhəmtən çevik döndü, baxdı ona.
Kəməndi açıb atdı tez pəhləvan,
Başından tora düşdü cadu haman.
Dedi: – Doğru söylə görüm, sən nəsən?
Gözümə görün öz qiyafəndə sən!

Nə gördü, kəmənddə bir ifritədir,
Bütün varlığı hiylədir, fitnədir,
Onu bir qılıncla bölüb tən yarı,
Bu zərbəylə qorxutdu caduları,
Yola düşdü, o mənzili etdi tərk,
Bu bir qaydadır: yolçu yolda gərək.
Gedib bir yerə çatdı ki, pəhləvan,
Qaranlıqda qərq olmuş idi cahan.
Sanardın: Günəş göydə bəndə düşüb,
Ay itmişdir, ulduz kəməndə düşub.
Buraxmışdı Rəxşin başını azad,
Keçirdi qaranlıq dərə, dağdan at.
Nəhayət, göründü işıqlı diyar,
Deyən yaşıl xalça idi tarlalar.
Sanardın: cahan bir gəlindir, baxır,
Yaşıllıqlar içrə bulaqlar axır.
Geyim Rüstəm əynində olmuşdu su,
Rahatlıqdı yuxuydu hər arzusu.
Yuyub Gördü bəbri-bəyanı təri,
Çıxardı onu, həm də yaş məğfəri[66].
Günə sərdi onları, verdi yelə,
O istərdi bir az yatıb dincələ.
Götürdü o, Rəxşin başından yüyən,
Buraxdı, dedi: – Tarlada otla sən!
Qurutdu libası geyib əyninə,
Ot üstə o şir tək uzandı yenə.
Yorulmuşdu, tez yatdı o şiri nər,
Özündən, atından belə bixəbər.
Qoruqçu görüncə atı tarlada,
Qaçıb gəldi tez, başladı fəryada.
Görüb Rüstəmi, Rəxşi artdı qəmi,
Ağacla qıçından vurub Rüstəmi.
Təhəmtən oyandı ağır zərbədən,
Qoruqçu bağırdı ki: – Ey Əhrimən,
Niyə salmısan bu atı tarlaya?
Çıxardır elin zəhmətini zaya.
Bu sözdən acıqlandı Rüstəm yaman,



Qulaqlarını tutdu, verdi təkan.
Qopardı yerindən, qoyub ovcuna,
Cavab vermədən bircə söz də ona.
Qoruqçu əlində qulaq, üzdə qan,
Baxıb Rüstəmə, saldı şivən, fəqan.
Ulad adlı vardı igid bir nəfər,
Cavan pəhləvan idi, səhibhünər.
Qoruqçu düzəldi onun yanına,
Əlində qulaqlar boyanmış qana,
Dedi: – Bir kişi var, qara, div kimi,
Yaman qorxuludur onun görkəmi.
Tutub tarlanı sanki bir Əhrimən,
Zirehdə yatan əjdahadır, deyən.
Atın istəyirdim qovam tarladan,
Hələ mən ata, tarlaya çatmadan,
Durub demədən bircə söz də mənə,
Qulaqlarımı üzdü, yatdı yenə.
Bu sözlər elə tutdu ki, Uladı,
Yerindən qığılcım kimi sıçradı.
Düşündü ki, kimdir görən bu kişi?
Niyə işləmişdir bu çirkin işi?
Gəzirdi çəmənlikdə o namidar,
İgidlərlə bahəm edirdi şikar.
Qoruqçu deyən sözləri dinlədi,
Bu ovlaqda aslan izi var dedi.
Qoşunla bərabər dönüb durmadan
Təhəmtən olan səmtə oldu rəvan.
İki pəhləvan oldular üzbəüz,
Təhəmtən yetirdi özün Rəxşə tez.
Minib Rəxşi, aldı qılıncı ələ,
Səsi ildırımtək yayıldı çölə.
Soruşdu Ulad: – Kimsən, ey namidar?
Sənə arxadır hansı bir hökmdar?
Bu yol yırtıcı divlərin yurdudur,
Bu yoldan keçən baş qoyur, qan udur.
Dedi Rüstəm: – Adım buluddur, əgər
Olarsa bulud güclü aslan qədər,

Buluddan qılınc, nizə, zubin yağar,
Hamı başçılar onda başsız qalar.
Mənim adımı sən eşitsən əgər,
Ürək yox, canın da, qanın da əsər.
Məgər bilmədin, bu kəmənd, bu kaman
Kimindir? Mənəm filyıxan pəhləvan.
Səni kim doğubdur – xəbər ver ona,
Tutub yas, kəfən tiksin öz oğluna.
Qoşunla mənim üstümə gəlmisən?
Qozu günbəz üstə çalış saxla sən!
Qılıncı çəkib, qaldırıb başına,
Kəməndi keçirdi yəhər qaşına,
Sürü içrə sanki bir aslan idi,
O meydanda leş – dağ, qan – ümman idi.
Vurub başları tökdü cüt-cüt yerə,
Bölüb atlı ilə atı dörd yerə.
Qana qəltan oldu çölün daşları,
Ayaq altına saldı çox başları.
O səhranı toz tutdu başdan-başa,
Dağıldı qoşun, qoydu üz dağ-daşa.
O meydanı Rüstəm gəzib bənd-bənd
Qolu üstə altmış qulac bir kəmənd,
Yaxın sürdü Ulada Rəxşi necə,
Deyərdin: işıqlı gün oldu gecə.
Kəmənd atdı Rüstəm qəzəblə ona,
İlişdi kəmənd halqası boynuna.
Atından salıb, əllərin bağladı,
Onu at döşündə qayım saxladı:
– Mənimlə, – dedi, – düz danışsan əgər,
Yalan söyləyib, olmasan hiyləgər,
Desən, harda mən axtarım Ağ divi,
Hayanda Pulad, Qındi, Bidin evi,
Desən, Keykavus hansı zindandadır,
O kəs ki, günahlar bütün ondadır,
Açıb haqqı, doğru yolu atmasan,
Mənə əyriliklə yalan satmasan,
Mən o təxti-tac ilə bu yerləri,



Alıb şahi-Mazəndarandan geri,
Səni eylərəm şah bu ölkəyə,
Yalan söz gərək dilinə gəlməyə.
Ulad söylədi: – Bəsləmə kin mənə,
Qulaq ver, deyim bir neçə söz sənə.
Mənim canıma qəsd qılma hədər,
Hər iş, bil, sənin istəyincə gedər.
Mənə təxti-tac vədəsi vermisən,
Sənə göstərim Ağ divi, Bidi mən.
Deyim harda Kavus şah dardadır,
Şəhərbəşəhər, yolbayol hardadır.
O yerdə ki, Kavusi-key saxlanar,
Bu yerdən ora yüz ağac yol olar.
Divin məskənin axtarırsan əgər,
Daha yüz ağac çox çətin yol gedər.
Bu yüzlər arasında var bir quyu,
Dərindir çox, ölçülməz əsla suyu.
İki dağ arasında qorxunc dərə,
Çəkər qartalı asimandan yerə.
Gecə div gələr on iki min nəfər,
Quyu çevrəsində keşikdə gəzər.
Pulad, Qındi sərkərdədir Ağ divə,
Kömək Bid ilə Səncədir Ağ divə.
Boyu, cüssəsi sanki dağdır, durar,
On örkən boyunda döşü, çiyni var.
Bu boyla, buxunla, bu qollarla sən,
Qılınc, nizə, gürz əldə, bir də yüyən
Gedirsən əbəs Ağ divin üstünə,
Bu işdən əl çək düşmədən pis günə!
Çıxar sonra yol daş dolu bir çölə,
O yoldan keçə bilməz ahu belə.
Yolun üstə sonra böyük çay çıxar,
İki mil enində dərin su axar,
Keşik orda hakim olan div çəkər,
Ona vəhşi divlər hamı baş əyər.
Gəlir sonra Bozquş ta Nərminay,
Var üç yüz ağac sahəsi bir saray,

O yerdən şahın məskəninə qədər
Ağaclar boyu bir çətin yol gedər.
Şahın xidmətində üç yüz min səvar,
Hamı at belində keşikdə durar.
Baxarsan, şəhərdə tutub hər yeri
Onun min iki yüz döyüş filləri.
Gücün çatmaz, olsan dəmirdən belə,
Yonar div səni sərt suhan ilə.
Verər orduya həm silah, həm də zər,
Qoşun əhli bilməz nədir qəm, kədər,
Ona güldü Rüstəm, dedi: – Az danış!
Məni sən o yerlərlə etsən tanış,
Görərsən ki, filcüssəli bir nəfər
Necə onları yerlə yeksan edər?
Zəfər göndərən tanrı etsə kömək,
Qılıncım, gücüm, bəxtim ilə gərək
Döyüşdə elə toy tutam onlara,
Bu gürz ilə qan udduram onlara.
Gərək qorxudan partlasın hər sinə,
Qaçanlar minə atları tərsinə.
Sən isə dayanma, uzaqdırsa yol,
Məni şah Kavusa çatdır, tez ol!
Onlar gecəni gündüzə qatdılar.
Gəlib İspiruz dağına çatdılar.
O yerdə ki, Kavus edəndə hücum
Onu divlər əzmişdilər sanki mum.
Qaranlıq gecə vaxtı birdən-birə
Yayıldı dəf, avaz səsi hər yerə.
Oda sanki qərq etdilər dağ-daşı,
Birər şam yaxıldı hər addımbaşı.
Təhəmtən soruşdu: – Nə yerdir bu yer
Onun hər yanından alov yüksəlir?
Cavab verdi: – Mazəndarandır ki, var,
Şəhər əhli yatmaz gecə, tez durar.
O səs yüksələn yerdə vardır bir ev,
Haman evdə sakindir Ərjəng div.
Yatıb ordaca Rüstəmi-namidar,



Günəş doğcağın qalxdı olsun səvar,
Kəməndə çəkib qısqayım Uladı,
Ağac gövdəsində onu bağladı.
Əlində ağır gürz getdi yolu
Başında fikir, qəlbi kinlə dolu.
Atı çapdı Ərjəng olan səmtə düz,
Onun ordusuyla gəlib üzbəüz,
Çəkib nərə, saldı nəzər divlərə,
Səsindən onun titrədi dağ-dərə.
Elə qorxdu Ərjəng bu nərədən,
Sərapərdəni tərk qıldı həmən.
Təhəmtən onun üstünə sürdü at,
Sanardın ki, qartaldır açmış qanad.
Keçirdi divin bir qulağın ələ,
Ayırdı başın zərbi-şəmşir ilə,
Qəzəbdən o dönmüşdü bir aslana,
O qanlı başı tulladı meydana.
İgid Rüstəmi görcəyin, qorxudan
Bütün divlərin bağrı olmuşdu qan.
O divlər unutdu nədir el-oba,
Fərar etdilər, həm oğul, həm baba.
Qılınc vurdu Rüstəm qızan şir kimi,
Salıb torpağa divləri tir kimi.
Zəfərlə qana qərq edib hər yeri,
Qayıtdı yenə İspiruza geri.
Uladı ağacdan açıb pəhləvan,
Oturtdu ağac kölgəsində haman,
Dedi: – Söylə sən, o şəhər hardadır
Ki, Kavusun orda işi dardadır?
Uladın qulağına çatcaq bu söz,
Yerindən durub, tez yola tutdu üz.
Şəhərdə gəlib toxdadı Tacbəxş,
Durub kişnədi Rüstəm altında Rəxş.
Dedi şah Kavus: – Ey iranlılar,
Sona çatmış artıq bu bəd ruzigar.
Yetişdi qulağıma Rəxşin səsi,
Mənə ruh gətirdi onun şeyhəsi.

Turanşah ilə çarpışanda Qubad,
Nədənsə, belə kişnəməzdi bu at.
Dayandı onun qarşısında bu an,
Ağıllı, bilikli, igid pəhləvan
Görüşdükdə Kavus ilə şiri-nər
Onu dövrəyə aldı sərkərdələr.
Onu qucdu Kavus, verdi sual:
– Yoruldunmu yolda, səlamətmi Zal?
Dedi gizlicə: – Cadulardan gərək
Tapıb dalda yer, Rəxşi pünhan edək.
Gedib Ağ divə çatsa birdən xəbər;
Həlak olmuş Ərjəng, ey bixəbər!
Gəlib Kavusa çatdı Rüstəm bugün,
Yığar başına divləri o bütün.
Divin ordusuyla bu aləm dolar,
Bütün hümmətin, zəhmətin məhv olar.
Sən indi divin məskəninə tələs!
Kimə rast gəlsən, qılıncınla kəs!
Sənə yar ola bəlkə pərvərdigar,
Əlinlə düşə torpağa cadular.
Gedərkən yolun həftkuhdan düşər[67],
Görərsən ki, divdir o dağ sərbəsər.
Eşitdim, var orda böyük bir kaha,
Görən istəməzdi görə bir daha.
Döyüş divlərinə salarkən nəzər,
Deyərsən: pələngdir, birər ov gəzər.
Eşit, ordadır, Ağ divin məskəni,
Odur, bu yaman hala salmış məni.
O bu divlərə başçılıq eyləyər,
Onu məhv eləsən, bizimdir zəfər.
Mənim ordumu məhv edən də odur,
Səbəbkar odur, gözlərim oldu kor.
Həkimlər deyən dərdimin dərmanı
Haman Ağ divin beynidir, həm qanı.
Belə söylədi bir ağıllı təbib:
Divin qanını hər kəs əldə edib,
Tökərsə gözə qətrə-qətrə qanı,
Sağaldar o qan kor qalan insanı.
Hazırlaşdı filcüssəli pəhləvan,
Ola Ağ divin məskəninə rəvan.
Dedi: – Sağ qalın siz, gərək mən gedim,
Əlimlə özüm Ağ divi məhv edim.
Yetişsə mənim canıma bir xətər,
Sizin ömrünüz zillət ilə bitər,
Mənə lütf əgər qılsa pərvərdigar,
Döyüşdə mənə taleyim olsa yar,
Yetər sizlərə bir daha təxti-tac,
Şirin bar verər xosrovani ağac[68]
Ata dəydi Rüstəm, yanında Ulad,
Deyərdin uçur Rəxş, açmış qanad.
Böyük əzm ilə keçdi Rüstəm yolu
Zəfər arzusuyla ürəyi dolu.
Çatıb Rəxş ilə Həftkuhə tərəf,
Baxıb gördü: divlər durur səfbəsəf,
Ulada dedi: – Borcluyam mən sənə,
Bu doğru yolu göstəribsən mənə.
Səfərdə çatıb indi son mərhələ,
Nə etmək gərəkdir, mənə faş elə!
Ulad söylədi: – Bir belə qayda var,
Günəş qalxdımı, istidə div yatar.
Əgər istəyirsən döyüşdə zəfər,
Tələsmək bu işdə hədərdir, hədər.
Dayan, gözlə, onda ki, divlər yatar,
Keşikdə qalar sayca az cadular.
Sənə Tanrı yar olsa, çox tez, asan
Zəfərlə dönərsən səfərdən, inan.
Təhəmtən onun fikrini izlədi,
Günorta olunca durub gözlədi.
Günorta çatınca Uladı yenə
Tutub bağladı, mindi Rəxş üstünə.
Qılıncı qınından siyirdi o dəm,
Uca nərə çəkdi ki, mən Rüstəməm,
Hücum etdi şimşək kimi divlərə,
Div isə deyərdi ki, çatmış əcəl,

Şirin candan artıq bu gün çəkdim əl.
Qabıqdan çıxıb, qılçasız, birtəhər
Bunun pəncəsindən qutarsam əgər,
Gərək durmayıb, el gözündən itim,
Bu Mazəndaran mülkünü tərk edim.
İşi Ağ divin darda qalmışdı bərk,
Özünə özü hey verirdi ürək.
Dedi Rüstəm: – Ey Tanrı, səndən mədəd!
Önündə divin dağ kimi çəkdi sədd.
Atıb pəncə bir də o dar peykərə,
Başa qaldırıb, güclə vurdu yerə.
Çəkib xəncəri beldən o şiri-nər,
Divin sinəsindən çıxardı ciyər.
Nə gördü: leş ilə dolubdur kaha,
Kaha qan dolu bir dənizdir daha.
Uladın açıb əl-qolundan kəmənd,
Kəməndi yığıb, tərkinə etdi bənd.
Uladın əlində o qanlı ciyər,
Şahın yanına üz tutub getdilər.
Ulad söylədi Rüstəmə: – Ey cavan!
Qılıncın önündə baş əydi cahan.
Kəməndin bütün cisminə yer salıb,
Onun ağrısı, bil, canımda qalıb,
Unutma ki, verdin mənə vədə sən,
Ümid kəsmərəm verdiyin vədədən.
Cavab verdi Rüstəm ki: – Ulad, inan,
Sənindir sərasər bu Mazəndaran.
Nə arzun ola, verməyə hazıram,
Səni mən gərək şahlığa çatdıram.
Fəqət qarşıda bir mühüm iş də var,
Bizim qarşımızda çətin yol durar.
Bu Mazəndaran şahını biz gərək
Alıb təxtdən torpağa göndərək.
Biçəm divlə caduların başını,
Qana qərq edəm çöllərin daşını,
Buna nail olsam əgər, canımı
Verib, pozmaram əhdu peymanımı.



Dilində bu sözlər igid qəhrəman
Gəlib çatdı Kavus şaha haman.
Dedi: – Ey bilikli, ulu hökmdar,
Yaşa, şən yaşa! Düşmənin oldu xar!
Yıxıb şahi-Mazəndaranın evin,
Qılıncla yarıb bağrını Ağ divin,
Çıxardım onun sinəsindən ciyər,
Buyur bəndəyə: varsa əmrin əgər.
Dedi şah ona afərin min kərə,
Batar tac ilə təxt sənsiz yerə.
Anan ki, doğub sən kimi bir oğul,
Rəvadır, önündə cahan olsa qul.
Nə xoşdur mənim taleyim, doğrudan
Belə şir yıxan bir filim var cavan.
Dedi bir daha Keykavus Rüstəmə:
– Tez ol, xeyirxah qəhrəman, gözləmə.
Damızdır o qandan, xilas et məni,
Açılsın gözüm, ta görüm bir səni.
O qandan alıb, gözlərə çəkdilər,
Sağaldı şahın gözləri müxtəsər.
Qoyub şirmayı təxti, əyləşdi şah,
Tacı asdı təxt üstə Kavus şah,
Çıxıb təxtə Mazəndaranda o gün,
Yanındaydı Rüstəm, igidlər bütün:
Fəriborz, Gudərz, Tus ilə Giv,
Roham ilə Qorgin, Fərhad, Niv,
Qurub çal-cağır bəzmi Kavusi-key,
Bir həftə tamam əylənib, içdi mey.
O bir həftə bitdikdə atlandılar
Butun ordu, sərkərdələr, şəhriyar.
Şahın əmri ilə qoşun çəkdi səf,
Yola düşdu Mazəndarana tərəf.
Ağır gürzləri əllərə-aldılar,
Bütün aləmə sanki od saldılar.
Qılınclardan od düşdü, yandı şəhər,
Kimə çatdılar, basdılar, kəsdilər.
Dedi orduya şah Kavus o gün:

– Qisas aldınız bu şəhərdən bütün.
Qana qan alındı, uzaq getməyin,
Daha bir kəsi siz həlak etməyin!
Tapın siz ağıllı, mətin bir adam
Ki, bilsin sözə, həm sükuta məqam,
Gedə şahi-Mazəndaran yanına,
Nəsihət verə: qıymasın canına!
Sevindirdi Zal oğlunu bu xəbər,
Onunla şərik oldu sərkərdələr.
Dedilər: – Ona yaxşı bir namə yaz,
Qara qəlbinə nur çilənsin bir az.

Qoyub ağ ipək üstə katib qələm,
Yazı verməliydi ümid həm də qəm.
Düşündü gözəl, yazdı o huşiyar,
Pisi, yaxşını eylədi aşikar.
Birinci: Xuda namını etdi yad
Ki, dünya olub qüdrətiylə abad.
Qurub çərxi-gərdun, ağıl göndərib,
Bizə güc, mətanət, məhəbbət verib.
Günəşlə Ayı xəlq edən girdikar
Bizə verdi pis, yaxşıda ixtiyar.
Ədalətli, dindar olarsan əgər,
Sənə hər yetən afərin söyləyər.
O şəxsin ki, pislik olar niyyəti,
Fələklər ona yağdırar lənəti.
Ədalətli olsa əgər hökmdar,
Kim etməz onun əmrinə etibar.
Necə aldı gör Tanrı səndən qisas?
Gəl, indi divə, caduya saxla yas!
Zaman hökmunü bir daha düş başa,
Ağılla düşün, məntiq ilə yaşa!
Bu Mazəndaran təxti-tacında qal,
Fəqət məndən hər işdə sən rüxsət al!
Döyüşdə deyilsən hərif Rüstəmə,
Gətir bac-xəracı, tələb gözləmə!
Əgər səndə şahlıq təmənnası var,



Kiçilmək bu yolda səni qaldırar.
Təkəbbür verər canını, bil, bada,
Sən Ərjəng ilə Ağ divi sal yada!
Xitam verdi məktuba şahın adı,
Çağırdı qılınc oynadan Fərhadı.
Ləyaqətli sərkərdələrdəndi o,
Qırardı öz ağlıyla hər bəndi o.
Dedi: – Al bu məktubu, sən get çapar,
O bəndi qırılmışdı və tez apar!
Şahın əmrinə verdi Fərhad qulaq,
Öpüb torpağı ehtiramla qoçaq,
Çalışdı ki, namə divə tez çata,
Səvar olçağın vurdu mahmiz ata.
Gəlib çatdı, gördü böyük bir şəhər,
Qəribə şəhərdi bu nadir şəhər.
Əhalisi şildi ayaqdan deyən,
At üstə gəzəndi, polad çeynəyən.
Adamlıqla onlar deyildi tanış,
Ləqəb gəzdirirlərdi: "baldırqayış".
Oradaydı Mazəndaranın şahı,
Haman atlılarla dolu dərgahı.
Eşitdi ağıllı bir elçi gəlib,
Onu şah Kavus özü göndərib.
Seçib çoxlu şirpəncəli pəhləvan,
Kobudluqda mahir, ədəb qanmayan,
Dedi: – Elçini pişvaza siz gedin,
Hünər göstərin, elçini xar edin!
Bilin ki, bu gün düşmənə biz gərək
Hünər, həm də divanəlik göstərək.
Onun qarşısında pələngə dönün,
Ağıllı başını itirsin bu gün!
Çatıb elçiyə tökdülər qaşqabaq,
Buna yumdu Fərhad göz bir sayaq.
Əlini onun aldı bir div ələ,
Elə sıxdı, gəldi sümüklər dilə.
Əzab yarsa da Fərhadın bağrını,
Üzə vurmadı qəhrəman ağrını.

Şahın dərbarına gəlib çatdılar,
Xəbər tutdu Kavusdan hökmdar,
Dedi katibə: – Naməni al, oxu!
İpək namədən saçdı bir xoş qoxu.
Xəbər tutdu Rüstəmdən, Ağ divdən həm,
Yaşardı gözü, bağrına çökdü qəm
Dedi öz-özünə: Günəş batsa da,
Gecə el-oba dincəlib yatsa da,
Mənim gözlərimə yuxu qonmadı,
Salar aləmi dərdə Rüstəm adı.
Anıb yandı Ağ divlə Ərjəngi şah.
Pulad, Bid, Qındi üçün çəkdi ah.
Oxundu o namə, çatınca sona
Şahın gözləri qərq idi al qana.

Belə verdi Kavus şaha o cavab:
Əgər şor su olsun, və ya saf şərab,
Mənim şövkətim səndən üstün durar,
Başımda neçə min qoşun, ordu var.
Belə bir qoşun üz qoya hər yana,
Daşı, torpağı qərq edər al qana.
Qoşun göndərim, istəyirsən bu gün,
Sizi xam xəyaldan ayırsın bütün.
Döyüş fillərim min iki yüz olar,
Sənin bir filin yoxdur, ey hökmdar!
Əl atsam İran mülkünə bir kərə
Olar dağ düzənlik, düzənlik dərə.
Basıb kəsdi xeyli özün dartaraq,
Ona asdı diqqətlə Fərhad qulaq.
Cavab aldı çün naməyə, durmadan
Qərargahına oldu şahın rəvan.
Gəlib çatdı, hər sirri faş eylədi,
Eşitdiklərini açıb söylədi.
Dedi: – Onda göylər qədər var qürur,
Baş endirməyir, qəddini dik tutur.
Mənim sözlərimə məhəl qoymadı,
Özündən basıb kəsdi hey, doymadı,



Çağırtdırdı şah Rüstəmi yanına,
Dedi hər nə Fərhad demişdi, ona.
Görüb padişahı belə mehriban,
Onu dinləyib, söylədi pəhləvan:
– Divin yanına yollanım mən özüm,
Qılınc kimi kəssin onu hər sözüm,
Qılıncdan iti namə lazım ona
Ki, şimşək kimi od sala canına.
Bir elçi kimi namə ilə gedim,
Sözümlə onun bağrını qan edim.
Düşündü, cavab verdi Kavus şah:
– Özünsən bu gün taci-təxtə pənah,
Həm elçimsən, həm də cəsarətli fil,
Döyüşdə hərifin, bil, aslan deyil.
Dedi katibə: hazır olsun o dəm
Əlində iti ox kimi bir qələm.
Buyurdu belə yazsın: – Ey anlamaz!
Nə pis iş tutursan, düşün sən bir az!
Çalış, at yekəbaşlığın daşını,
Gəl qapımda əy qul kimi başını!
Qəbul etməsən, hərbə amadə ol!
Coşan sel kimi ordumu et qəbul!
Sənin onda, Ağ div kimi, qarğalar
Yeyər beynini, gözlərini oyar.

Möhür basdı çün naməyə hökmran
Alıb, atlanıb Rüstəmi-dasitan,
Gəlib gürz ilə şah dərgahına,
Verə namə Mazəndaran şahına.
Şaha söylədilər ki, Kavusi-Key,
Nə olmuş, sənə göndərir namə hey?
Bir elçi gəlib sanki şiri – jəyan,
Kəmənd bağlamış tərkinə pəhləvan.
Bir at vardır altında ki at, deyil,
Uçar quş kimi, görkəmi sanki fil.
Eşitcək bunu Şahi-Mazəndaran
Qoşundan ayırdı neçə pəhləvan,

Dedi onlara: – Atlanın, tez gedin.
Yenilməz o aslanı pişvaz edin!
Təhəmtən görüb onları, qalxaraq
Ağacdan qopardı böyük bir budaq.
Tutub əldə zubin kimi, çapdı at,
Qoşun, əhli baxdı ona, qaldı mat.
Çatıb onlara atdı aldı nişan,
Neçə atlı bu zərbədən verdi can.
Biri tutdu, sıxdı əlin Rüstəmin,
Dedi qışqırar ağrısından, yəqin.
O sıxdıqca, Rüstəm baxıb güldü şən,
Donub qaldı bu səhnəni seyr edən;
Gülüb verdi Rüstəm əlinə təkan,
Hərifin əli oldu bir parça qan.
Başından huşu uçdu birdən-birə,
O güc yoxlayan dəydi atdan yerə
Şahın yanına tez qaçıb bir nəfər,
Ona verdi gördüklərindən xəbər,
Vardı kəlahur adlı bir pəhləvan,
Əlindən qan ağlardı Mazəndaran,
Pələng kimi sevməzdi sakit qala,
Təlaş eyləyərdi savaş, qan sala.
Çağırdı onu şah bu dəm yanına,
Deyib çoxlu tərifər ünvanına,
Buyurdu ki, get, elçini qarşıla,
Hünər göstərib, başına ol bəla!
Utandır onu, sən sevindir bizi,
Gözü yaşlı olsun, qızarsın üzü,
Kəlahur aslantək atlandı tez,
Gəlib Rüstəm ilə durub üzbəüz,
Acıqlı pələng kimi o dalbadal
Uzatdı əlin, verdi bir çox sual.
Əlini elə sıxdı ki, Rüstəmin
Göyərdi, deyən, düşdü gücdən yəqin.
Üzə vurmadı, daxilən çəkdi dərd,
Dayandı Günəş kimi parlaq o mərd,
Kəlahurun aldı əlini ələ,



Təhəmtən sıxıb əzdi bir zərb ilə,
İlik qarışdı əldə sümüklərə,
Axıb laxta-laxta töküldü yerə.
Kəlahur qayıtdı, dedi: – hökmdar,
Sənə dərdimi söylərəm aşikar.
Barış düşmən ilə, bacarsan əgər,
Vuruşsan onunla, çəkərsən zərər.
Ona qarşı, bil, səndə yoxdur davam,
Xərac istəsə ver, ola bəlkə ram.
Edək onları xoşluq ilə qəbul,
Açıb xəzinəni, paylayaq çoxlu pul.
Çətin bu işi, biz asan həll edək,
Cana qorxu yetməz yol ilə gedək.
Bu dəmda Təhəmtən gəlib şir kimi,
Önündə dayandı şahın tir kimi.
Ona baxdı Mazəndaran şahı düz,
Oturtdu özüylə onu üzbəüz.
Birinci: tutub şah Kavusdan hal,
Verib ordusu barəsində sual,
Soruşdu: – Bu yollar səni yordumu?
Enişdə, yoxuşda atın durdumu?
Dedi sonra; – Rüstəmmisən, ey cavan?
Bu boyda, buxunda igid pəhləvan!
Cavab verdi ki: – Yox, mənəm sadə qul.
Əgər qulluğa Rüstəm etsə qəbul.
Qələt zənn edirsən ki, mən Rüstəməm,
Onun qarşısında, inan, bir heçəm.
Verib naməni, aldı öz kamını,
Yetirdi ona şah peyğamını.
Danışdı, qılıncdan itiydi dili,
Yıxardı onun hər sözü bir fili.
Baxıb naməyə, dinlədi elçini,
Şah odlandı, coşdu ürəkdə kini.
Dedi Rüstəmə: – Az danış, sus bir az,
Bu sözdən təmənna səmər bağlamaz.
O İran şahənşahıdırsa məgər,
Sanır kn, döyüşdə odur şiri-nər,

Bu Mazəndaranda mənəm hökmdar,
Qızıl təxti-tacım da, ordum da var,
Edirsən məni xidmətinə tələb,
Nə adət buna yol verir, nə ədəb.
Böyük şahların təxtinə dikmə göz.
Düşər yüksələn, lovğalıqdan əl üz!
Yolunla get, İranda ol hökmran,
Başından vurar nizə yoxsa zaman.
Yeritsəm qoşun üstünə mən əgər,
Ayağın başından olar bixəbər.
Özündən əbəs olmusan bədgüman,
Yolu düz get, oynatma əldə kaman.
Gələrsən mənimlə əgər üz-üzə,
Qılıncım qoyar son hər artıq sözə.
Dönüb baxdı diqqətlə Rüstəm şaha,
Qoşun pəhləvanla dolu dərgaha,
Xoşu gəlmədi sözlərindən onun,
Düşündü: cavabı qılıncdır bunun.
Hazırlaşdı, Rüstəm getmək istədi,
Şah: – Elçiyə xələt verilsin dedi.
Qızıl, xələt, at verdilər, almadı,
Kəmər, tac gəldi nəzər salmadı.
O, dərgahı acıqla tərk eylədi:
– Dönübdür bunun taleyi, – söylədi.
Çıxıb getdi Mazəndarandan kənar,
Acı söz qılıncdan kəsərli olar.
Qəzəbdən düşüb sanki od canına,
Gəlib çatdı Kavus şahın yanına.
İran şahına ərz-hal eylədi,
Görüb dinləmişdi nələr, söylədi.
Dedi sonra: – Ey şahım, olma məlul,
Qırıb çatmağa divləri hazır ol!
Onun ordusu, pəhləvanları, bil,
Gözümdə göründü zəlildən zəlil.

Bəyəndi Təhəmtən deyən fikri şah,
Haman gün döyüş əmri aldı sipah.



Sərapərdə köçdü şəhərdən çölə,
Qoşun çöldə döndü axan bir selə.
Yürüş vaxtı qopdu elə toz-duman,
Tozun içrə itdi Günəş, asiman.
Deməzdin nədir çay, dəniz, dağ, dərə,
Atın dırnağı lərzə salmış yerə.
Hücum çəkmiş ordu gedir, hey gedir.
Qoşun bilməyir istirahət nədir?

Yetişdi, nəhayət, qoşun bir yerə,
Xəbər tutdu Kavus, çatıb divlərə,
Dedi Rüstəmə – Zali-zər oğluna
– Birinci: özün Rəxşi sal meydana. –
Buyurdu ki: – Keşvad Qorgin ilə,
Kələ Givü Gudərz, Tus kin ilə,
Sala sahmana ordunu, meydanı,
Silib sazlaya nizəni, qalxanı.
Sərapərdəsin padişahın yenə
Çəkə ordu Mazəndaran dəştinə.
Rəis oldu çün Tusi-Nuzər sağa,
Təbil gurladı, lərzə saldı dağa.
Sola oldu Keşvadla Gudərz əmir,
Qalandı, deyən, dağdı çölda dəmir.
Özü şah mərkəzdə tutdu qərar,
Çəkib sədd qoşun, durdu sanki hasar,
Qabaq səf önündə durub Piltən,
Ona bu iki orduda yoxdu tən.
Çıxıb gəldi Mazəndarandan haman,
Ağır gürz çiynində bir pəhləvan,
Hərif axtaran – adı Cuyan idi,
Gücü, gürzü dillərdə dastan idi.
Onu divlərin şahı saldı yola
Ki, İran şahından gəlib kam ala.
Parıldardı əynindəki covşəni,
Qılıncı yerə saldı od xərməni,
İran ordusuyla durub üzbəüz,
Səsindən onun titrədi dağ və düz.

– Kim istər mənimlə, – dedi, – çarpışa?
Buyursun, kimin ömrü çatmış başa.
Yerindən bir iranlı tərpənmədi,
Damarlarda qan dondu, dil dönmədi.
Tutub orduya üz, dedi şəhriyar:
– Siz, ey pəhləvanlar, susursuz, nə var?
Bu divdən niyə dəhşətə gəldiniz?
Onun nərəsindən qaçıb rənginiz?
Şaha vermədi pəhləvanlar cavab,
Daha qalmamışdı ürəklərdə tab.
Əlində iti nizə Rüstəm, budur,
At üstündə şahın önündə durur.
Deyir: – Şah əgər versə rüxsət mənə,
Müqabil durardım bu Əhrimənə.
Dedi şah: – Get, çarpış, ey namidar,
Bu divdən yaman qorxur iranlılar.
Eşitcək icazə verir hökmran,
Bir aslan kimi Rüstəm oldu rəvan.
Polad nizə əldə girib meydana,
Salıb Rəxşini şir kimi cövlana,
Fil üstündə əldə tutub əjdaha,
Gəzib fil kimi meydanı bir daha,
Dəyərkən ata qalxdı toz göylərə,
Səsindən onun gurladı dağ, dərə.
Dedi Cuyana: – Ey uğursuz, bu gün
Gedir canın əldən quru ad üçün.
Əcəl çəkdi, saldı səni meydana,
Ölərkən bir Allaha yalvarsana.
Gərək ağlasın matəmində anan
Ki, doğmuş sənintək zəhərli ilan.
Cavab verdi Cuyan: – Dayan, az danış!
Qılıncımla yoxsa deyilsən tanış?!
Anan indicə köksünü parçalar,
Qucar covşənin, ərşə şivən salar.
Bu sözlər elə Rüstəmə etdi kar,
Bir aslan kimi qızdı, o namidar
Hücum eylədi Cuyana arxadan,



Belindən alıb nizə ilə nişan,
Elə vurdu ki, parçalandı zireh,
Zirehdə nə qaldı düyüm, kit, nə zeh.
Yəhərdən onu aldı, bir bax işə,
Sanardın ki, quşdur, taxılmış şişə.
Yerə tulladı, ağzına doldu qan,
Səsi çıxmadı, titrədi, verdi can.
Onu gördü Mazəndaran divləri,
Tutuldu həmən qorxudan dilləri.
Ürəklər qırıq, üzləri sapsarı,
Qoyub qaçmaq istərdi bir çoxları.
Dedi Şahi-Mazəndaran orduya:
– Durun cərgəyə, düşməyin qorxuya!
Hücuma keçin, çarpışın, qan tökün
Bu meydanda qızmış pələnglər təkin.
Təbil gurladı hər iki ordudan,
Fəzanı qaraltdı qopan toz, duman.
Toxundu qılınclar yenə gürzlərə,
Çaxıb şimşək, od yağdı sanki yerə.
Ucaldanda bayraqları rəngbərəng,
Qara, qırmızı göy göründü fələk.
O meydan dönüb oldu qan dəryası,
Qılınc, gürz, ox, nizədən dalğası.
Yağır başlara gürzlər, dağ çökür,
Xəzandır, ağac sanki yarpaq tökür.
İki ordu bir həftə axşam, səhər
Ölüb, öldürüb, çoxlu qan tökdülər.
Ötüb keçdi bir həftə, Kavus şah
Apardı açıq başla həqqə pənah.
Əl açdı göyə, ağladı zar-zar.
Diz üstə çöküb qul kimi hökmdar,
Dedi: – Ey suyu, torpağı xəlq edən,
Tutaşdım, vuruşdum bu divlərlə mən,
Kömək et özün ta ki, qalib gəlim,
Çıxıb təxtə şahlıq edim, yüksəlim,
Dua bitdi, qoydu dəbilqə başa,
Qayıtdı qoşun səmtinə birbaşa.

Çalındı təbil, gurladı kərranay,
Qoşun ağnadı dağ kimi laybalay.
Şahənşah əmr etdi, Giv Tus ilə
Qoşun arxasında gedə kus ilə.
Dua bitdi, qoydu dəbilqə başa,
Qayıtdı qoşun səmtinə birbaşa.
Çalındı təbil, gurladı kərranay,
Qoşun ağnadı dağ kimi laybalay.
Şahənşah əmr etdi, Giv Tus ilə
Qoşun arxasında gedə kus ilə.
O Gudərz ilə Zəngeyi-Şavəran,
O Röhham, Qorgin kimi pəhləvan,
Gərazə qürur ilə qıvraq gedir,
Tutub yeddi gəz əldə bayraq gedir.
Gedir Giv, Bərzin, Xarrad ilə,
Yenilməz, şücaətli Fərhad ilə.
Qoşun mərkəzində Təhəmtən durur,
Yerə su yerinə o qan hopdurur.
Durub sağda Gudərz Keşvad ilə,
Silahla, təbillərlə, sursat ilə.
Bir ac ğurd kimi Giv düşdü yola,
Qırıb düşməni çatdı sağdan sola.
Səhər dan sökəndən qüruba qədər,
O səhranı qan çulğadı sərbəsər.
Ağır gürzlər qalxaraq hey enir,
Vuranlar gəlib rəhmə, bəsdir demir.
Leş üstə düşən leşlə meydan dolur,
Bütün otlar beyinlərlə qərq olub.
Təbil, buq şimşək kimi səslənir,
Tozun arxasında Günəş gizlənir?
Bir ordu çəkib Rüstəm ardınca səf,
Səyirtdi atı padişaha tərəf.
O isə bunu gördü, sarsınmadı,
Dayandı döyüşmək üçün, sınmadı.
Durub div kimi, fil kimi üz-üzə,
Macal yoxdu nə qaçmağa, nə sözə.
Dedi Rüstəm: – Ey tanrı, hifz et məni!
Verib nizədara uca nizəni,



Alıb gürzü, nərə çəkib kükrədi,
Səsindən onun asiman titrədi.
O şah öldürən gürzü saldı işə,
Yıxıb divləri, filləri döş-döşə.
Ölən fillər altında itdi o çöl,
Neçə mil boyunca meyitdi o çöl.
Hücum etdi, nizə alıb dəstinə,
O Mazəndaran şahının üstünə,
Baxıb əldə nizə gələn Rüstəmə
Şahın canına çökdü bir vahimə.
Atıb nizə Rüstəm şahın qəsdinə,
Yamandı kəmərbənd zireh üstünə,
Dönüb oldu bir parça dağ hökmdar,
Bu caduya mat qaldı iranlılar,
Təhəmtən təəccüblə baxdı ona,
Alıb nizə ilə onu boynuna,
Gəlib çatdı Kavusa rövnaq ilə,
Təbil, fil, qoşunlarla, bayraq ilə.
Dedi Rüstəmə: – Ey igid qəhrəman.
Nə oldu, hücumda gecikdin yaman?!
Cavab verdi Rüstəm ki: – Ey hökmdar!
Çətindi döyüş, taleyim oldu yar.
Məni gördü Mazəndaran şahı çün,
Çaşıb heybətindən ağır gürzümün,
Salıb Rəxşi cövlana, çəkdim yüyən,
Vuranda kəmərbəndinə nizə mən,
Düşündüm ki, bu zərbədən xar olar,
Yəhərdən qopub, torpaq üstə qalar.
Budur, döndü qarşımda birdən daşa,
Bu sirri düşə bilmədim mən başa.
Görürsən, dönüb sıldırım bir dağa,
Döyüşdə təlaş etməz əl açmağa.
Onu ordugaha aparsaq əgər,
Güman ki, çıxar daşdan o cadugər.
Yığıldı qoşundan hamı zorlular,
Ona hər tərəfdən təkan vurdular,
Yox idi yerindən daşı qaldıran,
İçində daşın – şahi-Mazəndaran.

Bunu gördü Rüstəm, gəlib birbaşa
Əl atdı özü o dəbərməz daşa.
Elə qıs-qıvraq götürdü onu
Ki, saldı bu iş heyrətə ordunu.
Yola düşdü çiynində dağ, pəhləvan.
Qoşun əhli ardınca oldu rəvan.
Səpib Rüstəmin zər ayaqlarına,
Oxundu xudavəndə həmdü səna.
Sərapərdəyə çatdı çiynində daş,
İran şahına Rüstəm endirdi baş.
Daşı saldı çiynindən o namidar,
Dedi: – Göz olun indi, iranlılar.
Acıqlandı, əmr etdi Rüstəm ona:
– Burax cadunu, gir bayaqkı dona.
Belə qalsa, balta, qılınc, gürz ilə
Toza döndərib, bil, sovurram yelə.
Eşitdi bunu, oldu bir parça meh,
Başında dəbilqə, tonində zireh.
Əlindən tutub, güldü Rüstəm ona,
Gətirdi İran şahının yanına,
Dedi: – Əvvəl olmuşdu bir parça das,
Bu şəklə düşüb baltadan qorxaraq.
Ona şah Kavus saldı nəzər,
Yox idi ləyaqətdən onda əsər.
Əlindən nə çəkmişdi, saldı yada,
Bir ah çəkdi, bağrı tutaşdı oda.
Dedi cəllada: – Al qılıncı ələ,
Onu doğrayıb, parça-parça elə!
Buyurdu: qərargahına tez gedin,
Nəyi varsa qiymətli, tarac edin!
Xəzinə, qızıl taxt, dürrü gövhər,
Silah, at, qızıl tac, altun kəmər
Nə vardı, qoşun başladı yığmağa,
Qənimət qalandıqda döndü dağa.
Verildi qoşun əhlinə simü-zər,
Barındı o kəslər ki, layiqdilər.
O divlər ki, nankordular nemətə,



Bütün xalqı salmışdılar dəhşətə.
Dedi şəhriyar ki, qırın onları,
Halaldır bu nankorların qanları ,
Dönüb gəldi Kavus ibadətgaha,
Dil açdı ibadət üçün Allaha.
Böyük tanrıya göstərib ehtiram,
İbadətdə oldu bir həftə tamam.
Başa verdi çün şah bu həftəni,
Gəlib açdı o, xəznədən cəftəni.
Bu bəxşiş davam eylədi yeddi gün,
Xilas oldu el ehtiyacdan bütün.
Bu işlər görüldü iki həftədə.
Şah istərdi ki, istirahət edə.
Belə verdi fərman ki, məclis qurun,
Qızıl camlara saf şərab doldurun.
Böyüklərlə bir həftə mey içdi şah,
O Mazəndaran şəhrinə köçdü şah.
Ona söylədi Rüstəm: – ey şəhriyar,
Bizə bir çox insanlar olmuşdu yar.
Ulad sayəsində qazandım zəfər,
Bələdçim o idi edərkən səfər.
Ona vədə verdim, çıxarkan yola,
Bu Mazəndaran mülkünə şah ola,
Xələtlə onun könlünü al ələ,
Möhürlə o peymanı təsdiq elə!
Yaz: ömrü boyu əhli-Mazəndaran
Ona əyməli baş, odur hökmran.
Eşitdikdə Kavus bu sözləri,
Sevincdən gülürdü, deyən, gözləri,
Çağırdı hüzura, yığışdı kübar,
Uladdan söz açdı, dedi hökmdar.
Onu qıldı Mazəndaran içrə şah,
Özü Parsa gəldi başında süpah.

İranşəhrə Kavus qoyanda qədəm,
Silinmişdi üzlərdəki qüssə, qəm.
Bəzəndi şəhər, başladı çal-çağır,

Deyərdin ki, göydən yerə nur yağır.
İranda yeni bir Ay etdi zühur,
Cavan şah bütün aləmə saçdı nur.
Çıxıb təxtə xoşhal, dedi hökmdar:
– Xəzinəni pay-püş edin hər nə var!
Xəbər verdi, toplandı sərkərdələr,
Dedi: – Hər birinə verin simü-zər!
Təhəmtən evində quruldu büsat,
Qoşundan gəlib başçılar adbaad,
Ona afərin söylədi hər yetən,
Şahın yanına gəldilər xeyli şən
Başa tac qoyub Rüstami-namidar,
Yanında oturtdu onu hökmdar,
Cahan şahı etdi ona ehtiram,
Hazırlatdı layiqli xələt, ənam.
Qoyun başlı bir təxt cavahirnişan,
Qızıl tac – gövhərləri sayrışan.
Böyük şahlara xas bir dəst libas,
Həmayillə bir tovq o sərdara xas.
Yüz ay üzlu dilbər, qızıldan kəmər,
Qara saçlı, əyni ipək, başda zər,
Qızılla bəzənmiş yüz at, yüz qatır,
Qara tük, cida boy, qara göz qatır.
Yükü şahlara xas tirmə şalı,
Hamı pəhləvi, Çin, Rum, İran malı.
Alıb xəzinədən qızıl yüz kisə,
Daha xatirin hər nədən istəsə,
Yaqut bir cama tökdülər müşki-nab,
Firuzə cama dolduruldu gülab.
Alıb müşkü ənbərlə, udü əbir,
İpək üstə bir namə yazdı dəbir.
Verib naməni Rüstəmə hökmdar,
Yazılmışdı Nimruza dair qərar
Ki, Kavusdan sonra o ölkəyə
İran şahları çıxmasınlar yiyə!
Şah olsun ora Rüstəmi-Zal gərək,
Odur gürzü şəmşirin Allahı tək.



Ona afərin söylədi padişah
Ki, sənsiz bir an olmasın barigah.
Özün şahlara bir igid arxasan,
Şərəf, hörmət ilə yaşa hər zaman,
Əyildi, öpüb təxti o namidar,
Səfər etmək üçün verildi qərar.
Şəhərdən təbil səsləri gurladı
Adamlar üzündə sevinc parladı.
Gedib Rüstəm, əyləşdi Kavus şad,
Ədalətlə dünyanı etsin abad.
Qızıl təxtin üstündə tutsun qərar,
Qazıb zülmə, həm zülmkara məzar.
Qayıtdıqda Mazəndarandan geri,
Verib bəxşiş hər başçıya bir yeri,
Sipəhbodluğu Tusa verdi o dəm[69],
Dedi: – Başçılar içrə ol möhtərəm!
O Gudərzi də eylədi hökmran:
Sahib ol, sənindir, – dedi, – İsfəhan.
Daha sonra şadlıq büsatı qurub,
Murad camına saf şərab doldurub,
Qəmin boynunu vurdu, saldı yerə,
Unutdu ölüm dərdini bir kərə.
Yağışdan yaşıl tarlalar oldu nəm,
Bəzəndi cahan sanki, bağı-İrəm.
Ədalətlə, sülh ilə canlandı xalq,
Nə pislik, nə Əhriməni andı xalq.
Yayıldı bütün aləmə bu xəbər
Ki, Mazəndaranda çalıb şah zəfər.
Hamı bu xəbərdən gəlib heyrətə,
Dedi: – Afərin şahdakı Hümmətə.
Saray qarşısında gəlib durdular,
Hədiyyə verib, etdilər can nisar.
Bəzəndi, deyərdin: behiştdir cahan,
Ədalətlə, nemətlə keçdi zaman.
Başa çatdı Mazəndaran qissəsi,
Gəlir indi Hamavəran hissəsi.

# KAVUSUN HAMAVƏRAN ŞAHI İLƏ MÜHARİBƏSİ

Bir az sonra Kavus verdi qərar,
Çıxıb bir qədər seyr edə hökmdar.
Yol aldı İrandan Çinə, Turana,
Daha sonra etdi səfər Mokrana.
Zireh somtinə ordan oldu rəvan
Qoşun əhli yorğunluğu duymadan.
Xəracla əmirlər ona tutdu üz,
Şirin qarşısında dayanmaz öküz,
Gedib tac ilə, təxt ilə hər yerə,
Gəlib çatdı Kavus şah Bərbərə.
Boyun əymədi Bərbəristan şahı,
Dəyişmiş zaman, gördü İran şahı:
Silah əldə gördükdə bərbərləri,
Üzüldü qədəhdən şahın əlləri.
Yarandı polad nizələrdən meşə,
Günəş düşdü tozdan tamam təşvişə.
Toz içrə görünməzdi fillər belə,
Cilovlarda əllər də batdı gilə.
Qoşun dəstə-dəstə halay vurdular,
Sanardın dənizdə coşub durdular.
Cahan, gördü Gudərz, dönmüş belə,
Kəmərdən ağır gürzü aldı ələ.
Dalınca yola düşdü, min qəhrəman,
Hamı əldə nizə, qılınc, ox, kaman.
Vurub ordunu ortadan yardılar,
Dalınca onun sürdü at hökmdar.
Deyərdin: o meydanda yoxmuş qoşun,
İtib nizədarlar içində tozun.
Görüncə şəhərdə olan yaşlılar
Döyüşdən qaçır bərbəristanlılar,
Gəlib şah Kavusa baş əydilər,
Neco ki, günahkarlar üzr istəyər,
Dedilər: – Sənə biz quluq, padişah!
Xərac vermək üçün gətirdik pənah.



Nə pul, hazırıq, dürrü gövhər verək,
Ayaq torpağından öpək, zər verək.
Qılıb əfv Kavus bərbərləri,
Yeni əhdü peymanla döndü geri.
Təbil, sinc dünyaya saldı haray,
Çalındı sərapərdədə kərrənay.
Qoşun bir daha Mokrana aldı yan,
Üzü Qaf dağı – Qərbə oldu rəvan
Şahın gəlməsindən tutunca xəbər,
Hamı şah pişvazına gəldilər.
Önündə baş əydi böyük başçılar,
Xərac verdilər, etdilər can nisar.
Şaha xalq itaət edibdir deyə
Qoşundan ziyan dəymədi ölkəyə.
Qonaq olmaq üçün Zala hökmran
Qoşun Zabilistana oldu rəvan.
Bir ay Nimruzda qalıb şəhriyar
Şərab içdi, əyləndi, etdi şikar.
Fəqət ömrü az oldu bu günlərin,
Tikan basdı ətrafını güllərin.
Deyirlər sınaqçın yaranmış bəşər,
Bu bir qaydadır, yüksələnlər düşər.
Bütün işləri şah salarkən yola,
Ərəblər səbəb oldu qiylü qala.
Əsilzadə, varlı, böyük bir adam,
Misir, Şam da qaldırdı birdən qiyam.
Dönük çıxdı Kavus şaha o ərəb,
Qul ikən gəlib şahlıq etdi tələb.
Cahan şahına gəldi, çatdı xəbər
Ki, yağı ərəb "mən də şaham" deyər.
Təbil döydürüb, çıxdı Nimruzdan,
Şah alnı açıqdı, qoşun şadman.
Dilavərlər ad qalxana yazdılar,
Qılınclar qınında dayanmazdılar.
Qoşun sahilə doğru oldu rəvan,
Çıxa düşmənin üstünə dəryadan
Deyə, saldı Kavus qayıqlar suya,

Sudan keçmək əmri verib orduya,
Məsafə bu sahildən o sahilə
Azı min ağacdı, əgər ölçülə.
Üç ölkə boyunca üzüb getdilər,
Belə axtararlar cahandan bəhər.
Solu Misr idi, Bərbəristan sağı.
Qalır ortasında zireh torpağı,
Qabaqdaydı Hamavəran dağ təkin,
Böyük ordusu vardı hər ölkənin.
Xəbər tutdu onlar ki, Kavus şah
Zireh dəryasından yeritmiş sipah.
Hamı birləşib, söz qoyub bir yerə,
Qoşunlarla üz qoydular Bərbərə.
Qılınc oynadan bir neçə pəhləvan
O gün Bərbəristana oldu rəvan.
Qoşun doldu səhralara, dağlara,
Cahan at nalından gəlirdi zara,
Tutulmuşdu aslanların oylağı,
Qalıb dırnaq altında gur otlağı.
Dənizdə balıq, dağ döşündə pələng,
Fəzada bulud, qartala gəldi təng,
Tutulmuşdu hər yer, gəzib meydanı
Yol axtardılar qaçmağa, yol hanı?
Gəlib sahilə çıxdı Kavus şah,
Nə gördü: cahanı tutubdur sipah.
Qılınc, cövşənə qərq olub yer üzü,
Deşər nizənin ucları ulduzu.
Tutub aləmi zər dəbilqə, sipər,
Çiyinlərdə saysız-hesabsız təbər[70].
Deyərdin: olub yer üzü asiman,
Qılınclar buluddur, yağış isə qan.
Qaralmış cahan görsənər abinus[71],
Fəzanı dəbilqə edib sindrus[72].
Təbil gurladı, saldı səs dağlara,
Yer aldı atın dırnağından yara.
Təbil çaldırıb Bərbəristanda şah,
Deyən, aləmi etdi bir ordugah.



İran ordusu çaldı şeypur, kus,
Önə çıxdı Qərgin, Fərhad, Tus,
O yandansa Gudərzü Kəşvad gəlib,
İgid Giv, Şiduş, Miylad gəlib,
Suvarmış zəhərdə hamı nizəni,
Cilovtökmə təqib edir düşməni.
İgidlər yəhər qaşına qoydu baş,
Çaraqhaçaraq düşdü, qopdu savaş.
Sanardın: daşa hey poladdır dəyir.
Yerə göy enir, kainat titrəyir.
Hücum etdi mərkəzdə Kavus şah,
Qovmuşdu həmən bir-birinə sipah.
Cahanı qaranlıqda qərq etdi toz,
Göründü o tozda Günəş, Ay da boz
Fəzadan yerə qan yağıb jalətək,
Qızartdı daşı, torpağı lalətək.
Polad nizənin saçdı atəş gözü,
Deyən, qanlı dərya idi yer üzü.
Elə vurdu iranlılar, üç qoşun
Pərakəndə düşdü, itirdi huşun.
Birinci sipəhdari-Hamavəran
Atıb gürzü, şəmşiri, çəkdi fəqan.
Bilincə, dönüb tərsinə ruzigar,
Aman istəyib söylədi: – Hökmdar!
Bizə yol ver, Hamavərana gedək,
Xərac istəsən, verməyə əhd edək.
Verək şah Kavusa bacü-xərac
Silah, at, xəzinə, kəmər, təxti-tac.
Bu şərt ilə ki, şah qan tökməsin,
Bizə qarşı heç vaxt qoşun çəkməsin.
Eşitdikdə Kavus bu sözləri,
Cavab verdi ki: – Razıyam, dön geri!
Gedin, siz bilin ki, himayəmdəsiz,
Mənim tacıma, təxtimə bəndəsiz.

Bu oldu şaha elçinin son sözü
Ki, var şahımın pərdədə bir qızı.

Gözəl qaməti sərvi gözdən salar,
Başında qara mişkdən tacı var.
Uca qəddinə zülfüdür bir kəmənd,
Dili şəkər olmuş, dodaqları qənd.
Gözəllikdə təkdir o dilbər nigar,
Camalı günəşdir, inan, parlayar,
Ona layiq ər sənsən, ey padişah,
Ki, xoşdur ola yar şah ilə mah.
Döyündü şahın sinəsində ürək,
Dedi: – Bəxtimi yoxlayım mən gərək!
Haman anda sözdən işə keçdi şah,
Ağıllı, mətin bir kişi seçdi şah.
Bilikliydi, başlıydı, həm pəhləvan,
Onu qıldı Hamavərana rəvan.
Dedi: – Get, şirin dillə yaxşı danış,
Onu et mənimlə yaxından tanış!
De ki, bu cahanda kimin ağlı var,
Qohum olmağımla edər iftixar.
Tacım nur veribdir Günəşlə Aya,
Olub şirmayi təxtimə Yer paya,
Mənim sayəmə kim gətirməz pənah,
Çırağı sönər, olsa da padişah.
Səninlə qohum olmağa mayiləm.
Odur ki, günahına çəkdim qələm.
Eşitdim ki, var pərdədə bir qızın,
Mənim bürcümə layiq o ulduzun,
Təmiz nəsildəndir özü, saf, təmiz,
Bu ellər tutar xatirini əziz.
Qubad oğlu damadın olsa əgər,
Yəqin bil: Günəş də sənə baş əyər!
Tutub elçi üz şah dərgahına,
Gəlib çatdı Hamavəran şahına.
Dil açdı, edə məqsədini ayan,
Danışdı nəzakətlə, çox mehriban,
Ona verdi Kavus şahdan salam,
Açıb söylədi mətləbini tamam.
Onu dinlədi şahi-Hamavəran,



Acıqdan gözündə qaraldı cahan.
Dedi: – Padişahdır o, bu, doğrudur,
Döyüşlərdə qalib çıxan da odur,
Gözüm nuru aləmdə var bir qızım
Ki, candan mənimçün əzizdir qızım.
Əgər elçini qaytarıb, yox desəm,
Döyüşdə gərək qarşısında əsəm.
Bu dərdə gərək göz yumub, səbr edim,
Ürəkdə qəzəb hissini gizlədim.
Dedi: – Ey şirindilli, bu arzunu,
Düşünsən, nə var əvvəli, nə sonu.
İki ən əziz şey ki, istər şahım,
Üçüncü yoxumdur, biri Allahım.
Varım, dövlətim çoxdur, ancaq ki, mən
Qızımla yaşardım bu dünyada şən.
Qızım getsə, canım gedər, vallahı,
Demək, canımı istər İran şahı.
Aparsın, onundur qızım, həm də can,
Sözündən onun çıxmaram heç zaman.
Qəmə batdı, Sudabəni istədi.
Ona şah Kavusdan çox dedi.
Dedi: – O böyük tacidardan bu gün
Ki, dünyada şahlıq onundur bütün.
Bir elçi gəlib xoş kəlam, namidar,
Əlində "Avesta" kimi namə var.
Budur istəyi: zəhr edə kamımı,
Əlimdən ala səbrü aramımı.
Nədir fikrin, aç, söylə, bu barədə
Ki, dərd də sənindir, qızım, çarə də!
Cavab verdi Sudabə ki, yox çara,
Bugün möhtacıq biz elə qəmxara.
Bütün yer üzündə odur şəhriyar,
Böyük tacidarlardan o bac alar.
Qohum olmaq istər səninlə əgər,
Sevinmək gərəkdir, nədir bu kədər?
Eşitcək bunu, bildi o hökmdar
Ki, Sudabənin bu işə meyli var.

Şahın elçisinə dedi: – Hazır ol!
Onu sədri-məclisdə etdi qəbul.
Öz adətləri üzrə əhd eylədi.
Budur dinimiz, rəsmimiz, söylədi.
Bir həftə tamam şahi-Hamavəran
Böyüklərlə gördü hazırlıq haman.
Şahın qəlbi qəmlə dolu bir dəniz,
Verib qırx kəcavəylə üç yüz kəniz,
Min at, min qatır, min dəvə seçdilər,
Çatıb onlara tirmə, şal, simü-zər,
Kəcavədə əyləşdi o aycamal,
Önüncə, dalınca o sərvət, o mal.
Düzülmüş qoşun tutdu çöllə, düzü,
Sanardın ki, lalə açıb yer üzü.
Gəlib şah Kavusa çatdı gəlin,
Əziz cah-cəlallı gözəl nazənin...
Qara müşk ziynət verib gül üzə,
Salıb sırğatək qoşa sünbül üzə.
İki ləli xəndan, iki gözdə nəm,
İki qaş sütunu gümüş bir qələm.
Görüb hüsnünü şah Sudabənin,
Dedi: – Xaliqin şəninə afərin!
Yığıb məclisə, başbilən harda var,
Hazır etdi möbidləri hökmdar.
Bilib arzusun şah, Sudabənin,
Necə rəsm idi, kəsdirildi kəbin.

Yanıb şahi-Hamavəran odlara,
Ürək dərdinə axtarırdı çara.
Bir həftə belə keçdi, bir gün səhər
Şahın yanına elçilər gəldilər.
Dedilər ki, minnət qoyub canıma,
Buyursun, qonaq şah eyvanıma.
Ucaltsa mənim başımı hökmran,
Sevincə olar qərq Hamavəran.
Qonaqlıq adıyla quranda tələ
O istərdi Kavusu salsın ələ.



Bu yolla əgər hiyləsi tutsa baş,
Qızı verməz, illərlə etməz təlaş.
Onun fikrini duydu Sudabə tez
Ki, yox bu qonaqlıqda dostluqdan iz.
Dedi şah Kavusa: – Yaxşı düşün,
Sənin yoxdur Hamavəranda işin.
Qonaqlıq adıyla qurarlar tələ,
Keçərsən asanlıqla çox tez ələ.
Mənimçindir ancaq bu söhbət, bu söz,
Mənim halıma rəhm elə, getmə, döz!
Məhəl qoymadı şah Sudabəyə,
Düşündü, əsassız düşüb şübhəyə,
Götürdü özüylə neçə pəhləvan,
Səhər oldu Hamavərana rəvan.
Şəha adlanan bir şəhər var idi
Ki, şənlik yeri, xoş çəmənzar idi.
Ora köçdü Hamavəran sərvəri,
Bəzəndirdi cənnət kimi hər yeri.
Çatanda Şəha şəhrinə hökmdar,
Sakinləri torpağa baş qoydular.
Yeri ənbərə, müşkə qərq etdilər,
Səpildi bütün yollara zər, gövhər,
Hər addımda sazəndələr dəstəsi,
Göyə qalxdı mahnı səsi, saz səsi.
Onu görcəyin şahi-Hamavəran
Böyüklərlə pişvaza oldu rəvan.
Şahın eyvanından qapıya qədər
Səpilmişdi dürr ilə yaqutü zər.
Qızıl cam içində neçə şux pəri,
Şahın başına səpdi müşk, ənbəri.
Qoyub qəsrdə bir qızıl təxt şah,
O təxt üstə əyləşdi xoşbəxt şah.
Bir həftə tamam eylədi eyşü nuş,
Keçirdi İran şahının vaxtı xoş.
Kiçiklər kimi şahi-Hamavəran
Onun xidmətindəydi hazır hər an.
Deyərdin: bir ordu qabıqdan çıxar

Xoş, asudə əylənsin iranlılar.
Bu yolla xatircəm yeyib yatdılar,
İnamsızlığın daşını atdılar.
Fəqət tor qurulmuşdu xeyli qabaq,
Tor içrə əsir idi çoxdan qonaq.
Gedib Bərbəristana çatdı xəbər
Ki, Hamavəran ilə həmrəydilər.
Gecə vaxtı şeypur, təbil çaldılar,
Şahın üstünü qəflətən aldılar.
Qoşun Bərbəristandan etdi hücum,
Qohum canına qəsd qıldı qohum.
Tutuldu nəfəs çəkmədən Keykavus,
Əsir oldu Gudərz ilə Givü Tus.
Ağıllı adamlar demişlər belə:
Həqiqət budur, sən dəxi dərk elə,
Qohumla qanın bir deyilsə əgər,
Əmin olma, ondan çəkərsən zərər!
Qanıbir qohumlar da bəzən olur
Ki, qəlbi sənə qarşı kinlə dolur.
Deyilsənsə pis-yaxşısıyla tanış,
Qohum olduğun şəxslə az danış!
Bəşər çiy süd əmmiş, inanma ona,
Görərsən ki, gündə girir bir dona!
Belə hal olur ki, oğul yüksəlir,
Həsəddən ata qəlbini qurd dəlir.
Bu murdar cahan rəsminə sal nəzər,
Külək hardan əssə ora tez dönər.
Sən Hamavəran şahına ver fikir,
Xəyanətlə Kavusu etdi əsir.
Buludlar içində başı gizlənən,
Dəniz ortasından göyə yüksələn,
Uca bir dağın qülləsində haman
Qala var idi, şahi-Hamavəran
Ora aldı, göndərdi Keykavusu,
Qolu bağlı Gudərzi, Givi, Tusu.
Qalan adlı-sanlı adamlar daha
Qala yoldaşı oldu Kavus şaha.



Qoşundan ayırdı igid min nəfər,
Qala dövrəsində keşik çəkdilər.
Sərapərdəsi oldu şahın talan,
Böyüklər qənimət götürdü kalan.
Kəcavə bəzəndi ipək örtülü,
İki dəstə arvad ləçək örtülü,
Gətirmək üçün getdi Sudabəni,
Ayaq altına salmağa pərdəni.
Nəzər saldı Sudabə arvadlara,
Əl atdı öz əynindəki paltara.
Yolub müşk saçları verdi yelə,
Qızartdı yanaqlarını qan ilə,
Dedi: – Nə pis iş tutdu namərd atam?
Gedərmi bu alçaqlığa mərd adam?
Tutandı, tutaydı döyüşdə onu,
Yəhər təxti idi, zirehsə donu.
O meydandakı Giv, Gudərz, Tus,
Çalanda təbil bağrıqan oldunuz.
Sarayda qızıl təxtin üstündə siz
Xəyanətlə dostluq əlin kəsdiniz.
Axıtdı gözündən üzə qanlı yaş,
Dedi: – Siz hamı itsiniz qəlbi daş!
Mən ölsəm də, Kavusdan ayrılmaram,
Qəbirdə belə mən ona qəmxaram.
Tutub Kavusu çəkdiniz zəncirə,
Mənim də kəsin başımı bir kərə.
Bütün bunları şaha çatdırdılar,
Başında alov, sinədə ağrılar,
Dedi: – Çatdırın şaha Sudabəni,
Qoy olsun onun da qala məskəni!
Onun oldu həmmənzili şəhriyar,
O Kavusa yar oldu, həm qəmküsar.
Alınmış əsir şah, yəqin etdilər,
Qoşunlar köçüb İrana getdilər.
Yayıldı xəbər aləmə nagəhan
Ki, itmiş çəməndən o sərvi-rəvan.
Görüncə qızıl təxt şahsız qalıb,

Hərə tac uğrunda baş qaldırıb,
Ərəblərlə türklər girib meydana,
Qoşun sel kimi qoydu üz İrana.
Tez Əfrasiyab topladı bir qoşun,
Yeyib yatmağa, dincliyə qoydu son.
İrandan ucaldı öl, öldür səsi,
Cahan oldu dava-dalaş səhnəsi.
Ərəblərlə türklər gəlib üz-üzə,
Qan axdı, o səhrada çıxdı dizə.
Ara vermədən getdi üç ay savaş,
Tac alsın deyə çoxları qoydu baş.
Bu dünya vəfasız yaranmış belə,
Keçər ömr gah nazla, gah dərd ilə.
Nəhayət, ölüm hər işə son qoyar,
Pisə, yaxşıya baxmaz, eylər şikar.
Ərəblər bata bilmədi türklərə,
Basıldı qoşun, qoydu üz çöllərə.
İranlı düşüb öz evindən qaçaq,
Qul oldu yada həm böyük, həm uşaq,
İran tapdaq oldu yenə yadlara,
Günü, ruzgarı oldu xalqın qara.
Camaat qoyub Zabilistana üz,
Zalın oğlunun yanına getdi düz.
Dedilər ki, itmişsə Kavus şah,
Bizə bu yaman gündə sənsən pənah,
Heyifdir ki, İran viran ola,
Pələnglərlə şirlər əlində qala!
Bu yer bəsləmiş çox igid pəhləvan,
Bu yerdən idarə olunmuş cahan.
Olub indi dərdü bəla ölkəsi,
İti pəncəli əjdaha ölkəsi.
Pələnglər döşündən süd əmmiş oğul
Belə bir ağır dərdi etməz qəbul.
Düşün bir əlac indi, ey qəhrəman!
Xilas et bizi dərdü qəmdən, aman!
Gözündən axıb Rüstəmin qanlı yaş,
Ürək dərdi, can dərdi qaldırdı baş.



Dedi: – Qövr edibdir sinəmdə yaram,
Qoşunla qisas almağa hazıram.
Mənə olsa məlum şahın yeri,
Çıxarram bütün ölkədən türkləri.
Gəlib çatdı Kavus şahdan xəbər
Ki, zindanda ömrü əzabla keçər.
Yığıb ordu Kabildən o pəhləvan
Mətanətlə meydana oldu rəvan.

Çağırdı sayıq, yolbilən bir adam
Dedi: – Şah Kavusa, get, ver salam.
Qolu güclülərdən seçib bir nəfər,
Dedi: – Eylə Hamavərana səfər.
Yazıb namə Hamavəran şahına
Ki, amadə ol, vay sənin halına!
İran şahına pusqu qurdunmu sən?
Kürəkdən ona zərbə vurdunmu sən?
Döyüşdə xəyanət igidlik deyil,
Pələng hiylə işlətsə, sən tülkü bil!
Ürəkdə ədavət coşub daşsa da,
Döyüş vaxtı mərd hiylə salmaz yada.
Əgər şah Kavusu salsan yola,
Başından sovuşmuş böyük bir bəla.
Bunu etməsən, meydana qoy qədəm,
Gərək yurdunu yerlə yeksan edəm.
Çatıb elçi Hamavəran şahına,
Bəyan etdi peyqamı dərgahına.
Eşitdi o peyqamı, şah oldu mat,
Düşündü: çətindir ki, tapsın nicat,
Gicəldi başı baxcağın naməyə,
Qaraldı gözündə bu aləm deyə
Cavab verdi: – Kavusi-Key heç zaman
Mənim qəhr-pəncəmdə tapmaz aman.
Əgər Bərbəristana bassan qədəm,
Yağar başına gürzlər dəmbədəm.
Səninçin də zindanda boş yer durur,
Əgər mayil olsan, utanma, buyur!

Əgər gəlməyir heyfin öz canına,
Qoşunla gəlim hərbə – meydanına!
Cavabı alıb Rüstəmi-namidar,
Dedi: – Hazır olsun bütün ordular,
Quru yol uzaqdır deyə pəhləvan
Dəniz sahilinə tez oldu rəvan.
Gəmiylə, qayıqla qoşun üç günə
Keçib gəldi Hamavəran üstünə.
Qırıb tökdülər, başlanıldı talan,
Bütün ölkədə sel kimi axdı qan.
Tutunca xəbər şahi-Hamavəran
Ki, Rəxş üstə Rüstəm olubdur rəvan,
Şəhərdən qoşunla çıxınca kənar,
Gözündə işıqlı cahan oldu tar.
Düzüb ordunu həm sola, həm sağa,
Hərif istədi şah çarpışmağa.
Çəkib nərə Rüstəm dedi: – Hazıram,
Özüm təkcə sizdən bir ordu qıram.
Ağır gürz əlində girib meydana,
Bağırdı, salıb Rəxşini cövlana,
Qoşun əhli saldı ona bir nəzər,
Əmud əldə meydanda dağtək gəzər.
Üzüldü ürəklər deyən sinədən,
Dağıldı qoşun qorxusundan həmən,
Görüb Rüstəmi şahi-Hamavəran.
Başında olan bir bölük pəhləvan
Şəhər səmtinə qorxudan qoydu üz,
O meydan qoşundan boşaldı təmiz.
Müşavirlə xəlvətdə əyləşdi şah,
Qoşundan iki novcavan seçdi şah,
Cilov çəkmədən yolboyu bir kərə
Biri Misrə getsin, biri Bərbərə.
Mürəkkəb edib öz ürək qanını,
Birinci yazıb şahlar ünvanını,
Xatırlatdı ki, qonşuyuq, ol ayıq,
Həmişə sevinc dostu, qəm dostuyuq.
Mənimlə bir olsan, dinib-söyləməz,



Mənə Rüstəmin hərbi kar eyləməz.
Bu təklifimi rədd etsən əgər,
Çatar növbə, siz də çəkərsiz zərər.
Alıb naməni, bildi onlar nə var,
Bu yerlərdədir Rüstəmi-namidar.
O şahlarda namə yaratdı maraq,
Bir ordu düzəldib, götürdü yaraq.
Çıxıb qoydu Hamavəran səmtə üz,
Qoşun çoxluğundan dağa döndü düz.
Qoşun tutdu ucsuz-bucaqsız düzü,
Görünməzdi yerdə qarışqa izi.
Bunu gördü Rüstəm, gəlib gizlicə
Dedi qasidə: – Get, şahı gör gecə.
Ona söylə, üç şah üç ölkədən
Çıxarmış qoşun, indi onlarla mən
Vuruşsam, gərək harda çatdım, qıram,
Doğursun bu onlarda kin, qorxuram.
Yetişsin sənin canına bir xətər,
Pis insan əlindən yamanlıq gələr.
Nə lazım mənə təxti bərbərlərin
Əgər bir zərər görsə cismin sənin.
Bu peyqamı elçi alıb durmadan
Gəlib şah Kavusa etdi bəyan.
Qulaq asdı peyqama diqqətlə şah,
Düşündü, təəccüb edib, çəkdi ah,
Dedi: – Rüstəmə söylə: ey pəhləvan,
Mənimçün yaranmış məgər bu cahan?
Fələk hər qədər dövr edir, ol əmin,
Şəkərdə zəhər var, məhəbbətdə kin.
Mənim qeydimə qalma, pərvərdigar
Özü hər bəladan məni saxlayar.
Cəsarətlə sən Rəxşini sal düzə,
Qulaqlarını nizən ilə bəzə.
Qırıb onları, qoyma qalsın diri
Nə gizlində, nə aşikarda biri.
Geri döndü elçi, gəlib yel kimi,
Cavabla tanış eylədi Rustəmi.

Təhəmtən şahın fikrini bildi düz,
Hazırlaşdı, çarpışmağa qoydu üz.

Səhər, bayraq əldə, hər iki tərəf
Durub üz-üzə, ordular çəkdi səf.
Var idi Hamavərdə yüz cəngi fil,
Qoşun sahə tutdu azı iki mil.
İgidlər səsi titrədib yolları,
Yeri lərzəyə saldı at nalları.
Zirehdi cahan sanki başdan-başa,
Geyinmişdi Əlborz covşən başa.
Vurub fillərin üstə bayraqları,
Gül açmış, deyən, qırmızı, göy, sarı.
Təbil aslanın bağrını etdi qan,
Qanad saldı qartal belə qorxudan.
Fəzadan buludlar qaçıb getdilər,
Döyüşsüz dayanmaq hədərdi, hədər,
Təhəmtən qoşunla çölə çıxcağın,
Görüb orduda üç şahın bayrağın,
Dedi: – Dinləyin, ey igidlər, məni,
Döyüşdə yerə qoymayın nizəni!
Ata, atlıya verməyib də aman,
Vurun düşməni öndən, həm arxadan!
Əgər yüz min onlarsa, biz yüz nəfər,
Qoşun çoxluq ilə qazanmaz zəfər...
Döyüş başladı, qanla doldu çəmən,
Neyistanə döndü fəza nizədən.
Dəbilqəli başlar töküldü yerə,
Zirehli geyimlə dolub dağ-dərə.
Təhəmtən özü Rəxşi məhmizlədi,
Qoyub ordunu, şahları izlədi.
O Şam şahının ardınca saldı at,
Kəmənd atdı, şahintək açdı qanad.
Belində kəmənd halqası oldu bənd,
Şaha bir kəmər oldu sanki kəmənd,
Yəhərdən onu top kimi qaldırıb,
Sanardın ki, covqan ilə top vurub,



Yerə tulladı, çatdı Fərhad haman
Çəkib qolların bağladı arxadan.
Dəniz şəklinə saldı qanlar çölü,
Düşüb qaldı meydanda saysız ölü.
Keçib Bərbəristan şahı da girə,
Onu bağlamışdı Gəraz zəncirə.
Yanında olan qırx nəfər pəhləvan
Əsir oldu meydanda at çapmadan.
O meydanda söykəndi çün leş-leşə,
Düşüb şahi-Hamavəran təşvişə,
Dedi Rüstəmə: – Şah Kavusu mən
Azad eylərəm, çəksən əl hərbdən.
Sənindir sərapərdə, taci-kəmər,
Sənindir qızıl tac, dolu xəzinələr.
Qəbul etdi Rüstəm həmin şərtləri,
Üç ordu döyüşdən qayıtdı geri.
Çıxıb həbsdən, gəldi şah Keykavus,
Yanında onun Giv, Gudərz, Tus.
Üç ölkə silahını, şah xəzinəsin.
Qoşun, taci-təxtin, sərapərdəsin
Yığışdırdı Rüstəm, nə gördü o gün,
İran şahınındır – dedi – büsbütün.
Yığışdıqda Kavus köçsün deyə
Kəcavə hazırlatdı Sudabəyə,
Verildi ona bir Günəştək bəzək,
Çəkildi qızıl təxtə Rumi ipək.
Qoyulmuşdu yaqutdan səndəli,
Cəvahirnişandı, qara pərdəli.
Çatıldı gözəl, kükrəyən bir ata,
Başında qızıldan yüyən bir ata.
Yaşıl ud idi üstünün məhcəri,
O məhcərlərə düzdürüb gövhəri,
Dedi: – Gəl, otur, ey gözəl, yaxşı yol!
Oturdu, dedi: – Padişahım, sağ ol!
Şəhərdən gəlib ordugaha qoşun,
Baş əydi, salam etdi şaha qoşun.
Sayı ötdü üç yüz mini, saydılar,

Geyimli-keçimliydi ordu, səvar.
Misir, Bərbər, Hamavərandan daha
Gəlib yüz min atlı qoşuldu şaha.
Şahın ordusundakı hər bir nəfər
Döyüş meydanında olub şiri-nər.

Bir atlı seçib ordudan hökmdar,
Dedi: – Qeysərə, durma, peyqam apar,
De: seçsin elə bir igid pəhləvan
Ki, ellər sayırlar onu qəhrəman!
Ağıllı, şücaətli bir mərd kişi,
Ola nizə vurmaq işi, vərdişi.
Bir ordu ona ver, çata dadıma,
Abad ölkəmə göndər imdadıma!
Gəlib Dəşti-Nizəvərana xəbər
Ki, Hamavəranda olubdur nələr.
Təhəmtən neçə şaha qan uddurub,
O həm Misrə, həm Bərbərə od vurub.
Gəzib, bir qoçaq pəhləvan tapdılar,
Yenilməz, at üstə uçan nizədar.
Yazıb namə Kavusa mərdanə, düz,
Səmimi, ləyaqətli, şahanə söz:
Hamı hökmdara müti qullarıq,
Desə yox, yoxuq, var deyərsə, varıq.
Qoşun Qorqsardan hücum eylədi,
Şahın təxti-tacı bizimdir dedi.
Bizim könlümüz dərdə düşdü yaman,
Necə bir dağı udmaq istər saman.
Bu yandan qoşun çəkdi Əfrasiyab,
Dedi: – Tac mənimdir, – o beyni xarab.
Biz onda uzun nizə aldıq ələ,
Onun canına salmışıq vəlvələ.
Qırıb, həm qırıldıq döyüşdə yaman,
Yaman yaxşı döndü, dəyişdi zaman.
O gün gəldi çatdı ki, tutduq xəbər:
Zəfərlə şahənşah təxtə dönər.
Hamı pəhləvanlar deyir mərdana:



Bu gün hazırıq girməyə meydana.
Atıb Bərbəristanı gəlsən əgər,
Parıldar döyüşdə yenə nizələr.
Töküb düşmənin qanını torpağa,
Düzənlikləri leş çevirsin dağa.
Alıb naməni elçi açdı qanad,
Qoyub Bərbəristana üz, çapdı at.
Gəlib çatdı Kavus dərgahına,
O namə oxundu İran şahına.
İşıqlandı Kavus şahın gözləri,
Bəyəndi ərəblər yazan sözləri
Yazıb namə Əfrasiyaba o dəm:
Sən, ey iştəhası böyük, ağlı kəm!
De: İran təxti hara, sən hara?
Gətirdin bizi sən daha zinhara.
Sənə mülki-Turan deyildirmi bəs?
Niyə pisliyə əl atırsan əbəs?
Düşünmə bu yolla adın yüksələ,
Salar bu əməl başını əngələ!
Kiçiksən, kiçik olmağa sən alış,
Nəyin varsa, qalsın əlində, çalış!
Məgər bilməyirsən mənimdir İran?
Nə İran, başdan-başa bu cahan?
Pələng hər qədər güclü olsa belə,
Səfehdir, vuruşsa əgər şir ilə.
Alıb naməni, baxdı Əfrasiyab,
Qəzəbdən daha qalmadı onda tab.
Cavab verdi: – Kim olmasa sərsəri
Dilinə gətirməz bu söhbətləri.
Tutaq, sən İran şahısan, çox gözəl.
De: Məzəndarana neçün atdın əl?
İnad etmə, gəl, doğrusun söyləsəm,
İkibaşlı mən İrana varisəm.
Feridunun oğlu babamdır mənim,
İran doğma yurdum, obamdır mənim.
Bu qalsın hələ, mən qılınc çalmışam,
Ərəblər əlindən onu almışam.

Toxunsa dağa gürzümün zərbəsi,
Olar yerlə yeksan dağın zirvəsi.
Bulud arxasında uçarsa üqab
Ox atsam, fəzada olar, bil, kabab!
Bu gün hazıram, qaldırıb bayrağı
Sənə öyrədim mən qulaq burmağı.
Eşitdi bunu, elçini tutdu söz,
Dönüb, şaha peyğamı çatdırdı tez
Qulaq asdı Kavus bu sözlərə,
Hücum əmri verdi bütün ləşkərə,
Qoyub Bərbəristandan üz Suryana,
Yetirdi ağır ordunu meydana.
Turan şahı da qaldırıb bayrağı,
Dənizdən sovurdu göyə torpağı.
Təbil, ney səsindən kar oldu qulaq,
Zirehləndi yer, toz göyə qalxaraq.
Təbərzin toqquşdu cərənghacərəng,
Qan axdı, o meydanda başlandı cəng.
Döyüşlərdə Əfrasiyabın o gün
İşi tutmadı, bəxti yatdı bütün.
Turan ordusundan qırıldı çoxu,
Daşa dəydi Əfrasiyabın oxu.
Bu əhvalı gördükdə Əfrasiyab
Coşub daşdı odsuz, necə xam şərab.
Dedi: – Ey mənim qorxmaz oğlanlarım!
Döyüş meydanında nər aslanlarım!
Sizi bəslədim mən şirin can kimi,
Belə bir ağır gündə qurban kimi.
Verin dal-dala siz, Turan ordusu,
Döyüşlərdə bərk qısnayın Kavusu,
Qılıncla vurun pəhləvanlarını,
Alın nizə, zubinlə canlarını!
O sistanlı Rüstəm ki, tüğyan edir,
Qılıncla şirin bağrını qan edir,
Döyüşdə onun dövrəsini alın,
Əyilməz başını kəməndə salın!
Onu kim döyüşdə keçirsə girə;



Atından şücaətlə salsa yerə,
Qızımla mənim evlənər, şad olar,
Turan padişahına damad olar.
Onu dinləyən türkləri tutdu söz,
Hamı bir də meydana döndərdi üz.
Ağır gürzlər əldə iranlılar,
Vurub əzdilər o gözü qanlılar.
Elə bir divan tutdular türklərə,
Meyidlərlə doldu dəniz, dağ, dərə.
Çoxu öldü turanlılardan o gün,
Axan qan yeri batlaq etdi bütün.
Daha qalmadı orduda səbr, tab,
Görüb Rüstəmi qaçdı Əfrasiyab.
Çıxıb qarşıya Suriyan ləşkəri,
O da saldı çox zəhmətə türkləri.
Turan şahı gördü kələkdir işi,
Fələk başlamış tərsinə gərdişi.
Vuruşlar ona vermədi bir bəhər,
Şəkər axtaran yerdə tapdı zəhər.
Böyük bir qoşundan çox az qaldı sağ,
Geri döndü Turana bağrında dağ.

Gəlib toxdadı Parsa Kavus şah:
– Cahanda – dedi, – çəkməsin kimsə ah,
Çıxıb təxtə, xalqa edib iltifat,
Yeyib içdi, əmr eylədi könlü şad.
O hər səmtə bir hakim etdi rəvan,
Ağıllı, açıqgöz, nəcib pəhləvan.
Nişapura, Mərvə, Herat, Bəlxə həm
Qoşun dəstə-dəstə gedib, oldu cəm.
Ədalətlə abad olundu cahan,
Quzu qurd ilə oldu həm mehriban.
Görüb şahda qüdrət, ədalət, hünər,
Qul oldu pərilər ona vəhşilər.
Böyüklər böyük tutdular Kavusu,
Bütün şahlar oldu onun ordusu.
Dedi: – Rüstəm olsun cahanpəhləvan,

Odur bizləri xoş günə çatdıran.
O tikdirdi Əlborz dağında bir ev,
Tikincə evi, zinhara gəldi div,
İki ev də tikdirdi daşdan iri,
İri, çox iri, on kəmənd hər biri,
O evlər içində axurlar qurub,
Polad mıx vurub, daş sütun yondurub,
Kəcavə çəkən, yol basan yüz dəvə
Döyüş atlarıyla salındı evə.
İki ev daha tikdirib şişədən,
Bəzək vurdu firuzə, ləli-Ədən.
Şah istərdi onda yeyə, əylənə,
Gözəllik içində canı piylənə.
Gümüşdən iki ev də tikdirdi şah,
Haman evlərə yığdı hər cür silah.
Qızıldan ona tikdilər bir saray,
Bəzək vurdular səqfinə laybalay.
İçində nə yay hiss edərdin, nə qış,
Hava müşkü ənbərdi, meydan yağış.
Düzülmüşdü yaqut eyvanına,
Saçılmışdı firuzə hər yanına.
Bağında bütün il boyu novbahar,
Çiçəklər açar, gül gülü çağırar,
Ürəklərdə nə qüssə qaldı, nə qəm,
Divin qaməti qüssədən oldu xəm.
Ədalətlə şah xalqına tutdu, əl,
Zamanə unutdu nədir pis əməl.
Şah eylə divan tutdu ki, divlərə,
Ucaldı ünü divlərin göylərə.

Deyərlər ki, İblis bir gün səhər
Yığıb divləri şahdan o, bixəbər,
Dedi: – Hər qədər ki, durur şəhriyar
İşi divlərin nalədir, ahü-zar.
Bir iş var, bizə indi bir div gərək
Ki, dilli-dilavər ola, həm zirək.
Gedib doğru yoldan şahı azdıra,



Ona öz əliylə quyu qazdıra.
Onu haqq yolundan kənara çəkə,
Ağıllı, gözəl başına kül tökə.
Hamı şah Kavusdan qorxaraq
Sükut ilə İblisə asdı qulaq.
Dilə gəldi bir div cəsur, qaniçən,
Dedi: – Hazıram aldadım şahı mən.
Şəkilcə dönüb oldu div bir cavan,
Ədəbli, şirindilli, şən, mehriban.
O gün gəldi ki, qəsrdən şəhriyar
Çıxıb istədi çöldə etsin şikar.
Gəlib verdi Kavusa bir dəstə gül,
Önündə öpüb torpağı, açdı dil:
– Böyükdür – dedi – cah-cəlalın sənin,
Fələkdə niyə olmasın məskənin?
Sənin hökmün altındadır bu cahan,
Bu şahlar qoyundur hamı, sən çoban.
Bir iş qalmış, etsə əgər hökmdar,
Qalar şöhrəti daima yadigar.
Gərək şah bilsin ki, sirri nədir:
Günəş göy üzündə gəzir, hərlənir?
Nədir gecə-gündüz, nədir ulduz, Ay?
Qurub hansı şah asimanda saray?
Divin sözləri Kavusa gəldi xoş,
Deyən, ağlı uçdu, başı qaldı boş,
Elə zənn edirdi ki, çərxi-fələk
Ona üz tutub, ondan istər kömək.
O bilməzdi çərxin əsası nədir?
Hesabsızdır ulduzlar, Allahsa bir.
Bəşər çarəsizdir, baş əymiş ona,
Yanar, çarpışar, dərdi yetməz sona,
Şah istər ala yerlə göydən xərac,
Böyük tanrı duymaz buna ehtiyac.
Şahın qəlbinə düşdü bir vəlvələ,
Qanadsız necə göylərə yüksələ?
Sual verdi alimlərə hökmdar:
– Bu yerdən göyə nə qədər yol olar?

Münəccim dedi, dinlədi şah onu,
Səfeh bir qərar oldu bəhsin sonu.
Buyurdu, gecə çıxdı qullar ova,
O yerdən ki, qartallar etmiş yuva,
Alıb körpə quşlar, geri döndülər,
Bunu şah bilirdi böyük bir hünər.
Sarayda haman quşları bəslədi,
Doyunca yedirtdi quzu, quş əti.
Şirə döndü qartalların hər biri,
Qoçu caynağında tutardı diri.
Dedi, təxt üçün xalis ud aldılar,
Qızıl mıxlar ətrafina çaldılar.
Sifariş verildi uca nizələr,
Haman nizələr oldu təxtə çəpər.
Ətə doğru qartallar uçsun deyə.
Asıldı quzu budları nizəyə.
Seçib quşların dördünü hökmdar,
Dedi: – Onlara təxt edilsin cidar.
Həmin təxtə əyləşdi Kavus şah,
Çıxartmışdı yoldan onu div – tamah.
O qartallar acmışdı tezdən yaman,
Ətin üstuna dördü də atdı can.
Alıb təxti yerdən göyə qalxdılar,
Bulud içrə şimşək kimi çaxdılar.
Qartalların hər nə qədər var gücü,
Qanad gərdilər ətə çatmaq üçün.
Deyirlər: mələklə görüşsün deyə,
Yeri qoydu Kavus, uçdu göyə.
Eşitdim götürmüşdü oxla kaman.
Deyirmiş mənim olmalı asiman.
Rəvayət nə çox, söyləmiş hər gələn,
Bu sirri hələ olmamışdır bilən.
Onu yerdən üzmüşdü, məncə, tamah,
O qartallar uçduqca xoşhaldı şah.
Yorulduqda qartalları basdı tər,
Qanad çalmağa qalmamışdı hünər.
Bulud arxasından qopub bir kərə



Şahın təxti gəldi başüstə yerə.
Uçub Şiri-Çin adlanan cəngələ,
Nəhayət, gəlib düşdülər Amülə.
Nədənsə, tələf olmadı hökmdar,
Gərək sağ qalaydı, bunun sirri var.
Bir az da yeyib, şənlənəydi gərək,
Belindən Səyavuş gələydi gərək.
Verib şahlığı, taci-təxti bada,
Peşiman, pərişan düşmüş oda,
Meşə içrə zillətlə yer axtarır,
Açıb əl göyə, xaliqə yalvarır.

Deyirdi: – Bağışla, məni, ey Xuda!
Qoşun axtarırdı onu dünyada.
Yayıldı xəbər ki, itib Keykavus,
Gəzirdi onu Rüstəm Givü Tus.
Deyirlər ki, Gudərz – qoca pəhləvan
Demiş Rüstəmə: – Körpə yaşdan, inan,
Nə çox təxti-tac sahibi görmüşəm,
Neçə-neçə şahlar yola vermişəm,
Bu Kavusa oxşar bütün dünyada
Nə bir şah soraq almışam, nə gəda!
O bilmir iradə, ağıl, huş nədir,
Başı boş, ürək qurdlu, divanədir.
Çatıb pəhləvanlar şahın yanına,
Bir od oldular, düşdülər canına.
Hərə tənə ilə ona atdı söz,
Tutub şah Kavusa Gudərz üz,
Deyərdi: – O nə qəsr, kaşanədir?
Sənə ən gözəl yer dəlixanədir.
Sənə xoş gəlir öz səfeh işlərin,
Sarayda tutur düşmən hər gün yerin.
Üçüncü kərə darda qaldın yenə,
Yaman gün nə öyrətdi, söylə, sənə?
Yürütdükdə Mazəndarana qoşun,
Unutdunmu, çəkdi bəlalar başın?
Gedib, düşmənə sonra oldun qonaq,

Büt ikən, birəhmən sənə ad qoyaq?[73]
Cahan, bircə həqdən savay sərbəsər
Qılıncın önündə, bilirsən, əsər.
Cahanı qılıncınla tutdun deyə,
Qudurdun məgər, əl atırsan göyə?
Ölüb sən gedərsən, gələr bir zaman,
Unutmaz pisi, yaxşını xalq, inan!
Deyərlər ki, bir padişah var imiş,
Minib qartala ərşə qalxar imiş
Ki, ulduzları bircə-bircə saya,
Yaxından sala göz Günəşlə Aya.
Hər işdə çalış, şahlığa layiq ol,
Nəcib, xeyirxah ol, budur doğru yol!
Böyük tanrıya qulluq et hər zaman,
Ona bağlıdır yaxşı həm də yaman!
Dedi şah: – Düzdür sözün, müxtəsər,
Görən olmamış doğruluqdan zərər.
Ədalət deyirsən, ədalət ki, var,
Adınla sənin etmişəm iftixar.
Bütün pəhləvanlar şahı danladı,
Gedib fikrə şah, səhvini anladı.
Kəcavə hazırlandı, əyləşdi şah,
Xəcalət, peşiman, çəkirdi hey ah.
Gəlib qəsrinə çatdı, ancaq yenə
Kədər çökdü bir dağ kimi qəlbinə.
Rahatlıq haram oldu qırx gün şaha,
Sığındı ibadət üçün Allaha.
Dilində gecə-gündüz Allah adı,
Töküb göz yaşı ağladı, sızladı,
Utandı saraydan çıxa bir yana,
Qəmü qüssədən şah doydu cana.
Gözündən sızan qan dönərdi oda,
Deyərdi: – Bağışla məni, ey Xuda!
Onu pəhləvanlar utandırdılar,
Nə gəzdi, dolandı, nə də verdi bar[74].
Peşimançılıqla çəkirdi əzab,
Yox idi onun bəxşişinə hesab.



Düşüb səcdəyə, üz qoyub torpağa,
Ümid bağladı həqqə yalvarmağa,
Neçə vaxt belə ömrü verdi bada,
Keçincə onun təqsirindən Xuda,
Ədalətlə qurdu yeni bir büsat,
Yaşardı böyüklər, kiçiklər də şad.
Cahan ədl ilə sanki geydi ipək,
Ədalətli şah təxtə oldu bəzək.
Başa tac qoyub hökmranlıq edən,
Böyük bir nümayəndə hər ölkədən
Gəlib şah Kavus dərbarına,
Hamı sidq ilə əydilər baş ona.
Yenə oldu əvvəlkitək şən cahan,
Vəfa qıldı öz əhdinə hökmran.
Böyüklər kiçik bir qul oldu şaha,
Pərəstişlə gəldi uca dərgaha.
Ədalətlə qoysa başa şah tac,
Duyarmı o heç yardıma ehtiyac?
Sona çatdı mətləb, bu dastan bitir,
Görək indi Rüstəm necə cəng edir?

Məharətli şair demişdir belə
Ki, birdən tutaşmışdı nər şir ilə,
Sənə ad qazanmaq gərəksə əgər,
Qılınc əldə meydanda göstər hünər.
Döyüşdə yamanlıq olar hər zaman,
Yamandan gərək qorxmasın qəhrəman.
Əgər işləri salsa dövran dara,
Sənə daldalanmaqdan olmaz çara.
Sığışmaz ağıl hərb ilə bir yerə,
Vuruşdunmu, idrakı at bir kərə!
Ağıl, din yolu başqa yoldur, inan,
Gözəl sözlərim var o haqda, dayan!
Sənə indi Rüstəm yolundan deyim,
Ətirli, təravətli dastan deyim.
Eşitdim ki, fil cüssəli pəhləvan
Şən əylənməyə bir gün oldu rəvan.

Nəvənd adlanan bir yerə çatdılar,
O yerdə ki, bir çox uca qəsr var,
Haman yerdə var indi atəşkədə,
Çokər şölə, şöhrətlidir ölkədə.
İrandan haman məclisə gəldilər
Adı bəlli, şöhrətli sərkərdələr.
Ora Tus, Gudərz, Kəşvad gəlib,
Qoçaq Giv Bəhram ilə şad gəlib,
Gəlib Zəngeyi-Şavəran, Göstəhəm,
Yenilməz Qorkinlə Xərrad həm
Qılınc oynadan Bərzin, – o namidar
Gərazə gəlib tutdu başda qərar.
Neçə atlı onlar gətirdi hərə,
Yığıldı hamı, döndü bir ləşkərə.
Qoşun əhli heç boş oturmazdılar,
İşi meydi, çovqandı, oxdu, şikar.
Tutub Rüstəmə Giv üz məst ikən,
Dedi: – Ey önündə cahan diz çökən!
Şikar etməyə meylin olsa əgər,
Bu çölda tulan yüz pələngə dəyər.
Yaxındır lap Əfrasiyab ovlağı,
Göyə qaldıraq, gəl, tozu, torpağı.
Tula, quş, qoşunla edək bir şikar,
Yəqin bu uzun gün hamını yorar.
Ataq gurların boynuna biz kəmənd,
Oxun zərbəsiylə edək şiri bənd!
Edək biz Turanda elə bir şikar
Ki, qalsın cahanda bu iş yadigar.
Cavab verdi Rüstəm: – Bilirsən özün,
Hələ düşməmişdir yerə bir sözün.
O Turan çölündə səhər yer tapaq,
Şikar axtaraq, əylənək, at çapaq.
Edən olmadı bu sözə etiraz,
Hamı söylədi: – Hazırıq, keyfi saz.
Yataqdan durub pəhləvanlar səhər,
Qoyuldu səfər atlarına yəhər.
Alıb qırğı, şahin qola atlılar,



Gedib Şəhd çaylağına çatdılar.
Buradaydı Əfrasiyab oylağı,
Bu yanı su idi, o yan qum dağı.
Geniş çöllük idi Sərəxsə qədər,
Sürüylə cüyür, ceyran, ahu gəzər.
Gözəl bir düzəndə çadır açdılar,
Düşüb qorxuya ahular qaçdılar.
Uzaqlaşdılar vəhşi şirlər belə,
Uçub getdi quşlar da təşviş ilə.
Şikar başladı, vurdular, yıxdılar,
Qalanmışdı üst-üstə dağtək şikar.
Ara vermədən hey deyib güldülər,
Ürəklər sevinclə dolu, üz gülər.
Gah əyləndilər mey dolu əldə cam,
Gah at çapdılar, həftə oldu tamam.
Təhəmtən durub səkkizinci səhər
Xəbər verdi, toplandı sərkərdələr,
Yenilməz dilavərlərə tutdu üz,
Öz ağlı kəsən işdən o açdı söz,
Dedi: – Bizdən indi olun siz əmin,
Xəbər çatmış Əfrasiyaba yəqin.
Bizə qarşı birdən qoşun göndərər,
Gələr, ovlağı məhşərə döndərər.
Gəlin, biz yola gəzmələr göndərək,
Qoşun görcəyin gəlsin onlar gərək,
Bizə söyləsinlər, xəbərdar olaq,
Yol üstə qıraq düşməni, kam alaq.
Gərazə baş əydi əlində kaman,
Dedi: – Onlara verməRəm mən aman.
Dayansa elə bir igid pusquda
Salar düşməni bir çıxılmaz oda.
Daha düşmənin qeydinə qalmadan,
Şikar ilə kefdəydi hər qəhrəman.
Bu işdən gecə xəlvəti bir nəfər
Gəlib verdi Əfrasiyaba xəbər.
Çağırdı qoşundan neçə pəhləvan,
Dedi Rüstəm haqqında çox dasitan.

O yeddi dilavər ki, Rüstəmlədir,
Deməк, var yanında onun yeddi şir.
Biz indi gərək yaxşı hazırlaşaq,
Qəfil sel kimi üstlərinə aşaq.
Bu yeddi dilavər keçərsə ələ,
Düşər Kavusun canına vəlvələ.
Deyək: çıxmışıq biz şikar qəsdinə,
Qəfildən düşək onların üstünə.
Götürdü qoşundan otuz min nəfər
Qılınc əldə, meydan gəzən şiri-nər.
Dedi onlara: – Durmayın indi siz!
Geciksək, çıxar fürsət əldən təmiz,
Şəhərdən çıxıb, tutdular çöl yolu,
Ürəklər döyüş əzmi ilə dolu.
Bütün yolları bağlasınlar deyə,
Bölündü qoşun bir neçə dəstəyə.
Gərazə baxıb gördü: toz yüksəlir,
Tozun arxasından qoşunlar gəlir.
Salınca Turan bayrağına nəzər,
Qaraldı gözündə cahan sərbəsər,
Qayıtdı geri yel kimi pusqudan,
Sanardın ki, almış yara bir qaban,
Gəlib ovlağa çatdı, gördü, budur,
Təhəmtən qoşunla şərabdan vurur.
Dedi Rüstəmə: – Ey Cahanpəhləvan,
Bu kef məclisindən uzaqlaş bir an!
Turan ordusu üz tutub çöllərə,
Qoşunla dolubdur bütün dağ-dərə!
Tozun içrə Əfrasiyab bayrağı
Günəş kimi parlar, yaxındır yağı.
Çəkib qəhqəhə, güldü Rüstəm ona:
– Dönübdür – dedi – bəxtimiz oğlana!
Baxıbsan Turandan gələn orduya,
Tozundan düşübsən belə qorxuya.
Tutaq ki, gəlir atlı yüz min nəfər,
Polad içrə başdan ayağa qədər.
Bu çöldə əgər olsa bizdən biri,



O qoymaz ki, türklər qayıtsın diri.
Bu gün var qılınc ilə od yağdıran
Bu məclisdə yeddi böyük pəhləvan.
Bu çöldə əgər mən tək olsam belə,
Bu covşənlə altımda Gülrəng ilə
Bacarram elə düşməni peyləmək,
İrandan mənə lazım olmaz kömək.
Sən, ey saqi, Babil meyindən yenə
Böyük bir qədəh doldurub ver mənə!
Şərab süzdü saqi onun camına,
Ədəblə şərabı uzatdı ona.
Əlində o parlaq camı tutdu şad,
Birinci edib şah Kavusu yad,
Dedi: – Şahımız daima şad ola,
Onun ölkəsi, yurdu abad ola!
Öpüb torpağı bir də qaldırdı cam,
– Sağ ol, Tus! – deyə içdi camı tamam.
Bütün pəhləvanlar düşüb təşvişə,
Dil açdı hamı Rüstəmə xahişə.
– Daha badəyə bizdə yer qalmamış,
Mey içməkdə İblis ilə sən yarış!
Qızıl cama tökdü meyi pəhləvan,
Zəvarə adın çəkdi, içdi haman.
Zəvarə dəxi camı aldı ələ.
Gətirdi o Kavus adını dilə.
İçib camı, öpdü üzündən yerin,
Təhəmtən ona söylədi: – Afərin!
Meyi qardaş öz qardaşıyla vurar,
Şərab camını şirlər eylər şikar.

Dedi Rüstəmə Giv: – Ey pəhləvan!
Bizim şəhriyarın əzizi olan!
Qoy Əfrasiyabı gedib haqlayım,
Çayı keçməsin, yolları bağlayım.
Kəsim körpünü, bəlkə o bədgüman,
Geciksin o sahildə xeyli zaman.
Bizim pəhləvanlar geyinsin barı,

Əfsus, dolu qaldı şərab camları.
Kamanına iki ox qoydu qoşa,
Səyirtdi atın körpüyə birbaşa.
Yerə dəyməyirdi atın dırnağı,
Yaxınlaşdı, gördu Turan bayrağı.
Demək, çay keçilmiş, iş olmuş xarab,
Dayanmış qabaq səfdə Əfrasiyab,
Təhəmtən alıb geydi bəbri-bəyan,
Minib Rəxşi, yollandı şiri-jəyan.
Onu gördü covşəndə Əfrasiyab,
Nə huş qaldı başda, nə qəlbində tab.
O pəncə, o qol, o boyun, o kəmər,
Alıb çiyninə bir əmud dağ qədər,
Budur, Tus, Gudərz – olub nizədar,
Durub yan-yana Giv, Qorgin səvar.
O Bəhram, o da Zəngeyi-Şavəran,
O Fərhad, o Bərzin kimi qəhrəman,
Alıb nizə, hindi qılınc əllərə,
Durar yeddisi qarşı bir ləşkərə.
Yerindən hamı qalxaraq mərdanə,
Pələnglər kimi girdilər meydana.
Budur, Giv meydanda səflər yarır,
Sanarsan bir aslan şikar axtarır.
Vurub gürzünü gah sola, gah sağa,
Cəsədlər o meydanda döndü dağa.
Onun qarşısından qaçır çinlilər,
Turan padişahın boğurdu qəhər.
Görüb Rüstəmi, qaçdı Əfrasiyab,
Bilirdi ki, yox zərbinə onda tab,
Qaçan ordu ardınca dəydi ata,
Çalışdı öz əyanlarına çata.
Çox idi Turan ordusundan ölən,
Qalar, qaydadır, darda bəxti dönən.
Sual verdi Əfrasiyab Pirana:
– Məgər yatmağa gəlmişik meydana?
Deyirdik: döyüşlərdə şiri-nərik,
Cahan düşmən olsun, geri dönmərik.



Gözümdə qoşun bir sürü tülküdür,
Bir aslan belə onları hürküdür.
Turanda böyük hörmətin var sənin,
Döyüş görmüsən, şöhrətin var sənin.
Dayan bir, atın başını tez çevir,
Gedib onlara bir qulaqburma ver!
Sən, ey gücdə fil, pəncədə şiri-nər!
Sənindir İran, qalib olsaq əgər.
Eşitdikdə Piran bu xoş sözləri,
Qızındı ürək, parladı gözləri.
Seçib türk igidlərdən on min nəfər,
Qılınc oynadan, baş vuran namivər,
Bilirdi əsas qüvvə o, Rüstəmi,
Onun üstünə cumdu şimşək kimi.
Əlin ağzına tutdu o namidar,
Sanardın Günəşdən od almış, yanar.
Çəkib nərə, dəydi ata pəhləvan,
Dənizdir, deyərdin, qoparmış tufan.
Əlində qılınc, başda qalxan o şir
Qovur düşməni, hey biçir, hey keçir.
Uzaqdan bunu gördü Əfrasiyab,
Dedi: – Başçılar, bağrım oldu kabab!
Bizim pəhləvanlarla Rüstəm əgər
Vuruşsa bu cür gün batana qədər,
Bir atlı sələmət qayıtmaz, yəqin!
Nə mənası var beylə hərb etməyin?
Soruşdu: – O cəngavər Əlkus hanı
Ki, istərdi udsun diri aslanı?
Tələb eyləyirdi Givi məst ikən,
Deyirdi: hərifəm o Rüstəmlə mən!
Tez Əlkusa çatdırdılar bunları
Ki, ondan söz açmış Turan saları.
Özün saldı o öz əliylə qana,
Çevirdi atın başını meydana.
Qoşun mərkəzinə çapıb gəldi düz,
Çatınca Turan şahına tutdu üz,
Dedi: – Sən deyən pəhləvan, bil, mənəm,

Döyüşlərdə aslan mənəm, fil mənəm.
Mənə əmr ver, tək gedim, şəhriyar!
Edim Rüstəmi-Zalı meydanda xar.
Turan şahı Əlkusa asdı qulaq,
Dedi: – Ordudan seç igidlər, qoçaq!
Gedib seçdi mindən ziyadə igid,
Hamısı suvari, hamısı rəşid.
Hamı nizə ilə silahlandılar,
Alıb gürz, covşən də yollandılar.
Zəvarə birinci göründü gözə,
Tez Əlkus onunla gəlib üz-üzə,
Yəqin bildi övladi-Neyrəmdir o,
Elə zənn qıldı ki, Rüstəmdir o.
Zəvarə dönüb bir filə, aslana,
Hücum eylədi nizə ilə ona.
Olunca neçə zərbə rədd əlbəəl,
Sınıb nizəsi, düşdü, sustaldı əl,
Qılıncı belindən çəkib, sanki şir,
Qopan toz içində görünməzdi yer.
Qırıldı qılınclar, iki pəhləvan
Alıb gürzü, çarpışdılar durmadan.
Budur, gürzü Əlkus tez endirir,
Zəvarə onun qorxusundan əsir.
Büküldü beli aldığı zərbədən,
At üstdən yerə düşdü huşsuz bədən.
Çevik endi Əlkus atından yerə,
Başın kəsməyə atdı əl xəncərə.
Elə gördü qardaşını Piyltən,
O səmtə yönəldi, bir oddur, deyən,
Çatıb nərəsi Rüstəmin Əlkusə,
Elə qorxdu, az qaldı ki, qan qusa.
Durub yel kimi, qalxdı tez atına,
İgidlik nədir, düşmədi yadına.
Dedi Rüstəm Əlkusa: – Qaçma, dayan,
Qudurdunmu aslanla çarpışmadan?
Zəvarə ata qalxdı halı yaman,
Əlində qılınc, paltarı laxta qan.



Təhəmtənlə Əlkus tutaşdı həmən,
Özü öz əliylə geyindi kəfən.
Çatıb Rüstəmə, vurdu bir nizə bərk,
Kəmərbənddən ayrılmadı heç ətək.
Təhəmtən döşündən vurub nizəni,
Ciyər qanına qərq edib cövşəni,
Götürdü yəhərdən onu quş kimi,
Baxırdı iki ordu bihuş kimi.
Yerə vurdu bir dağ kimi zərb ilə,
Turan ordusun çulğadı vəlvələ.
Bu həngaməni gördü Əfrasiyab,
Dilavərlərə etdi beylə xitab:
Qazandı bu Rüstəm yeni bir zəfər,
Gərək qalmasın yerdə bu qan hədər.
Pələngə dönün, çarpışın can ilə,
Yuyun bu axan qanları qan ilə!
Qoşun dinlədi – nə dedi şəhriyar,
Durub Rüstəmin üstünə cumdular.
Bunu gördü Rüstəm, qızışdı haman,
Yanında o yeddi igid, qəhrəman.
Qılıncı qınından çəkib yeddi şir,
Deyərdin ki, şirlər şikara gedir.
Bunu görcəyin başqa iranlılar
Alıb gürz ələ, hərbə yollandılar.
Qırıb tökdülər ordunu yan-yana,
O çöl döndü qanla dolu ümmana.
Hara göz yetirsə çölü seyr edən
Görərdi kəsik başla, başsız bədən.
Tapılmazdı boş yer ayaq basmağa,
Yol hardan tapaydı hərif qaçmağa?

Təhəmtən həmin anda mindi ata,
O istərdi Əfrasiyaba çata,
Deyərdi: – Sən, ey Rəxş, ey yaxşı dost!
Amandır, döyüş vaxtı tərpənmə sust!
Sənə istərəm şahı qurban edəm,
Qanıyla daşı ləlü mərcan edəm.

Elə kükrədi od təbiətli at,
Sanardın ki, o birdən açdı qanad.
Təhəmtən kəməndi açıb durmadan
Qaçan padişaha atıb arxadan,
Dəbilqə ucunda kəmənd oldu bənd,
Papaq qaldı, şah getdi, işlətdi fənd.
Ata çəkdi məhmiz, dala baxmadan
Çalışdı çıxa od kimi ortadan.
Qırıldı, töküldü qoşun tən yarı,
Geri dönmədi dərbara çoxları.
Kimi öldürüldü, kimi dəstgir
Olub, qaldı düşmən əlində əsir.
Ərəb atları zər cilov, zər yəhər,
Qızıl tac, qızıl qınlı şəmşirlər,
O qiymətli şeylər ki, şahlarda var,
Qənimət yığışdırdı iranlılar.
Dönüb gəldilər bir daha ovlağa,
Döyüşdən sonra dinc nəfəs almağa.
Yazıb şah Kavusa namə həmən
Şikargahda türklər edən həmlədən,
Zəvara atından yıxılmışsa da,
İgidlərlə birlikdə sağdır o da.

## SÖHRAB

Əgər güclü yel qopsa birdən-birə,
Salar kal narıncı budaqdan yerə.
O zalimmi, yoxsa ədalətlidir?
Şüursuzmu, yoxsa fərasətlidir?
Ölüm haqsa, bəs onda nahaq nədir?
Verən ah-fəryadlara haq nədir?
Bu sirri sənə bilmək asan deyil,
Gödəkdir əlin, çatmaz əsrarə, bil!
Bəli, sən kimi çoxları gəzdilər,
Bu sirri açan olmadı bir nəfər.
Gedən qoymalı yaxşı bir yadigar,
Tutarkən özü başqa evdə qərar.
Bir oddur ölüm, şölə çəksə, inan,
Yanar, kül olar həm qoca, həm cavan!
Yəhər qoysa köçmək atına əcəl,
Gecikmək bu yolda daha verməz əl.
Ölüm haqdır, ona cəfa söyləmə!
Şikayətlə ahü fəğan eyləmə!
Ölüm bilməyir, yaşlısan, ya cavan,
Nə fərqi bədəndən nə vaxt çıxdı can?
Danışma əbəs, həqqə bağla inam,
Qulun susması yaxşıdır, vəssalam!
Səni yoldan azdırmamış div əgər,
Xuda sirrinə əl uzatma hədər.
Çalış yaxşılıq etməyə dünyada,
Adın yaxşılıqla salınsın yada.
Qulaq ver, deyim indi Söhrabdan,
Necə o ata axtaran verdi can.

Bu dastanı dehqan belə söyləmiş,
Qədim bir rəvayətdi, nəql eyləmiş.
Bu minvalla möbid veribdir xəbər
Ki, Rüstəm yataqdan durub bir səhər,
Düşündü, gəzişdi, oturdu yenə,
Sanardın ağır dağ çöküb qəlbinə.
Açılsın deyə könlü, o, namidar
Alıb ox, kaman, getdi etsin şikar.
Şikar axtaran şir kimi pəhləvan
Turan səmtinə atla oldu rəvan.
Gəlib çatdı sərhəddə, bitdi yolu,
Baxıb gördü səhranı gurla dolu.
Sevincdən gülüb gül kimi tacbəxş,
Təkan verdi, sanki qanad açdı Rəxş.
Kəmənd, ox-kamanla girib meydana,
Vurub yıxdı çoxlu guru yan-yana.
O xeyli odun yığdı, vurdu qalaq,
Bir od vurcağın şölələndi ocaq.
Odun yandı, köz düşdü, söndü alov,

Ağacdan kəsib şiş kimi bir kösöv,
Kösöv başına taxdı bir zorba gur,
Sanardın, əlində o bir quş tutur.
Qızardıb yedi büsbütün bir guru,
Sümüklər fəqət qaldılar qupquru.
Yeyib, süfrəsindən çəkilcək həmən,
Su içdi doyunca sərin çeşmədən.
Yorulmuşdu, uzandı tez yuxladı,
Gəzib otlayırdı çəməndə atı.
Turan atlısı yeddi-səkkiz nəfər
Yolüstü haman ovlağa gəldilər.
Su arxı kənarında gəzdikdə şad,
Baxıb gördülər: var çəməndə bir at.
Sahibsiz bilib, Rəxşə yan aldılar,
Kəmənd əldə tez ortaya saldılar.
Rəxş görüncə olub işlər çətin,
Çəkib şeyhə, coşdu bir aslan təkin.
Bu anda hücuma keçib atlılar
Ata hər tərəfdən kəmənd atdılar.
Ölüb üç igid düşdü atdan yerə,
Başı keçmədi Rəxşin ancaq girə,
Kimini təpiklə sərirdi yerə,
Kimini dişiylə salırdı girə.
Yenə dörd tərəfdən atıldı kəmənd,
Kəmənd ilə Rəxş oldu axırda bənd.
Tutub, bağlayıb, şəhrə yollandılar,
Hərə söyləyirdi mənimdir şikar.
Şirin uyğudan Rüstəmi-namidar
Durub, istədi Rəxşə olsun səvar.
Təhəmtən çəmənzara saldı nəzər,
Yox idi o yerlərdə atdan əsər.
Atı tapmayıb, halı oldu yaman,
Yönəldi Səmənqana sarı haman.
Düşündü: – At olmazsa mən nə edim?
Bu rüsvayçılıqla hara mən gedim?
İgidlər soruşmazmı ki, Rəxş hanı?
Yatan Rüstəmin kaş çıxaydı canı!



Yazıq mən, gərək at dalınca gedəm,
Dözəm, bağrımı yarsa da dərdü qəm.
Silahla, kəmərlə gedib durmadan,
Tapım bəlkə bir yerdə atdan nişan.
Canında əzab, qəlbi qəmlə dolu,
Müsibətli Rüstəm gedirdi yolu.

Səməngana çatdıqda o şiri-nər,
Yetişdi şaha, əyana bu xəbər:
Piyada gəlib Rüstəmi-tacbəxş,
Onu tək qoyub, qaçmış ovlaqda Rəxş,
Şah ilə böyüklər sevindi buna,
Quruldu qəbul bəzmi Zal oğluna.
Səməngan şahı tez açıb söhbəti,
Dedi: – Kim edibdir belə cürəti?
Yəqin bil ki, xeyirxahıq biz sən,
Quluq, tabeyik hər zaman əmrinə!
Sənindir bütün malımız, canımız,
Baş istə, verək, şanlı mehmanımız!
Şahı dinlədi, saldı Rüstəm nəzər,
Yox idi yamanlıqdan onda əsər.
Dedi ki: – Çəmənlikdə Rəxşim bu gün
Yəhərsiz, yüyənsiz itib büsbütün!
İziylə Səməngana gəlsən əgər,
Düşüb iz qamışlıqda arxa qədər.
Onu axtarıb tapsan, ey padişah,
Olarsan gözümdə böyük xeyirxah.
Əgər Rəxşimi mən tapa bilməsəm,
Gərək çarpışıb, çoxlu başlar kəsəm!
Dedi Rüstəmə şah: – Ey pəhləvan!
Sənə heç kəs etməz yamanlıq, inan!
Qonaq ol mənə, düşmə sən həycana,
Muradınca işlər düşər sahmana!
Gecə əyləşib, mey içib, şad olaq,
Ürək sarsıdan qəmdən azad olaq.
Bir at ki, gəzir şöhrəti aləmi,
İzi itməz aləmdə, yoxdur qəmi.

Şahın sözləri Rüstəmi etdi şad,
Qəmü qüssədən oldu könlü azad.
Görüncə sözündə şahın müjdə var,
Qonaq qalmağa verdi Rüstəm qərar.
Ona qəsrdə şah edib ehtiram,
Hüzurunda durdu necə bir qulam.
Bütün ölkədə nə qədər başçı var,
Yığıb Rüstəmin başına hökmdar,
Verildi şərab, gəldi sazəndələr,
Qaragözlü, gülüzlü nazəndələr.
Çalanlarla əyləşdilər üz-üzə,
Təhəmtən baxıb qüssədən əl üzə.
İçib məst olunca yuxu etdi kar,
Oturmaqdan olmuşdu Rüstəm bezar.
Verildi ona yatmağa bir otaq,
Gülab, müşk ətriylə doldu yataq.

Bir az keçdi, ötdü qaranlıq gecə,
Səmadan uzaqlaşdı Ay gizlicə.
O vaxt çatdı ki, sirri açmaq olar,
Otaq qapısını yavaş açdılar.
Əlində tutub qul bir ənbərli şəm,
O məstin yatağına qoydu qədəm.
Bir ay üzlü pərdə dalından həmən
Çıxıb, sanki doğdu Günəş şərqdən.
İki qaş kamandı, qoşa saç kəmənd,
Boyu sanki gülşəndə sərvi-bülənd.
Canı ağ idi, cismi pakizə can,
Yaranmaz belə cism torpaq, sudan.
Dodaqlar rütəbdi, dil isə şəkər[75],
Düzülmüşdü ağzında dürrü gövhər.
Əqiq arxasında görən ulduzu
Sanar Zöhrənin yoldaşı bu qızı.
Deyərdin ki, bir bağdır, açmış çiçək,
Günəşdir, verir kainata bəzək.
Qızıl gül veribdir bəzək rüxsara,
Asılmış qulaqlarına güşvara.



İki ləli xəndan, iki gözdə nəm,
İki qaş sütunu gümüş bir qələm.
Vuruldu Təhəmtən onu görcəyin,
Dedi: – Ey Xuda, zövqünə afərin!
Soruşdu ki: – Ey dilbər, adın nədir?
Gecə vaxtı burda muradın nədir?
Cavab verdi dilbər ki: – Təhmineyəm,
Vücudumla bir qəm dolu sinəyəm.
Səmənganda, bil, padişahdır atam,
Pələnglərlə aslanlara övladam.
Cahanda tapılmaz mənə tay gözəl,
Səmada deyil mən kimi Ay gözəl.
Mənim hüsnümə dəyməmiş göz hələ,
Dilimdən yada çıxmamış söz hələ.
Adın düşmüş əfsanətək dillərə,
Eşitdim sənin vəsfini yüz kərə.
Deyirlər ki, şir, div, pələnglə nəhəng
Əlində qalır aciz atdıqda çəng.
Gedirsən gecə vaxtı Turana tək,
Çapırsan at o yerdə hər yana tək,
Yeyirsən bütün guru təklikdə sən,
Qılıncın göyü ağladar, istəsən,
Döyüşdə sənin gürzün, ey namidar,
Pələngin, şirin bağrını çatladar.
Qılıncın qılafsız görərsə üqab[76],
Gətirməz, şikar etməyə göydə tab.
Kəməndindən aslanlar hürküb qaçar,
Bulud, nizəni görcək atəş saçar.
Bu dastanları şövqlə dinlədim,
Düşüb eşqinə gizlicə inlədim.
Deyərdim: görüm bir boyun, qamətin,
Salıb tanrı bu yerlərə qismətin.
Mən indi sənin ixtiyarındayam,
Nə istərsən, istə, budur arzu-kam,
Muradıma məni sən çatdırmasan,
Üzümü balıq quş da görməz, inan!
Sənin eşqin ilə, inan, dünyada

Elə sərxoşam, getmiş ağlım bada,
Budur istəyim ki, Xuda yar ola,
Tumundan mənə bir oğul bar ola.
O da sən kimi güclü bir pəhləvan
Olub, şöhrətiylə öyünsün cahan!
Gəzib addım-addım Səmənganı mən,
Gətirrəm xəbər, bil, sənə Rəxşdən.
Pəri üzlüyə saldı Rüstəm nəzər,
Görüb onda həm mərifət, həm hünər.
Verir həm də ki, Rəxşini vəd ona,
Dedi: – Xeyirxahdır mənə bu sona!
Buyurdu hünər sahibi möbidə,
Şahın yanına ondan elçi gedə,
Gecə elçini şah qəbul eylədi,
Açıb möbid, öz istəyin söylədi.
Xeyir işlə sanki gül açdı murad,
Ucaldı başı sərvtək, oldu şad.
Kəsildi o dəm, adət üzrə kəbin,
Gətirdi qızı əqdinə Rüstəmin,
Gecə olsa da, düşdü səs aləmə
Ki, Təhminəni verdi şah Rüstəmə,
Hamı Rüstəmə söylədi: – Afərin!
Qızıl səpdilər başına sərvərin.
Dedilər: – Yeni ayla xoşbəxt yaşa,
Sənə enməyən baş toxunsun daşa!
İki yar qovuşdu, necə süd-şəkər,
Uzandı gecə, gec açıldı səhər.
Fələkdən Günəş asdı altun kəmənd,
Olarkan kəmənd halqası yerdə bənd,
Cahanı Günəş etdi cənnət bağı,
İki yar üçün çatdı hicran çağı.
Qolundan açıb qolbağı pəhləvan,
O qolbağı ki, vəsf edərdi cahan,
Dedi dilbərə: – al bunu yadigar!
Əgər qız verərsə sənə ruzigar,
Onu zülfünə tik əlinlə özün
Ki, xoşbəxtliyin rəmzi olsun qızın.



Oğul qismət olsa bizə tanrıdan,
Qoluna bunu bağla məndən nişan,
O, görkəmdə Sami-Nəriman olar,
İgidlikdə məşhuri-dövran olar.
Üqabı fəzadan endirər yerə,
Günəş əylənər ki, o fərman verə.
O ayüzlü ilə olub bir gecə,
Demişdi ona çoxlu söz gizlicə.
Səhərdi... Bürünmüşdü yaquta Şərq,
Günəş aləmi eyləmiş nura qərq.
Başından, gözündən alıb busələr,
Vidalaşdı Təhminədən şiri-nər.
Gözü yaşlı ayrıldı ondan pəri,
Sığışmazdı dünyalara qəmləri.
Yan aldı bu dəm Rüstəmə padişah,
Dedi – Xoş açılsın üzünə sabah,
Bizə müjdə ver, Rəxşi də tapmışıq!
Gözü Rüstəmin tapdı sanki işıq!
Gəlib yalına Rəxşin əl çəkdi şad,
Şahı qıldı sonsuz təşəkkürlə yad.

O gündən ötüb keçdi tam doqquz ay,
Oğul doğdu Təhminə – parlaq bir ay!
Sanardın ki, filcüssə Rüstəmdir o,
Bir aslandır o, Sami-Neyrəmdir o!
Gülüb ləbləri, parladı ay üzü,
Ona verdi Söhrab adı şah qızı.
Bir aylıqda bir yaşlı idi deyən,
Ona Rüstəmi-Zal dedi hər yetən.
Üçə çatdı çün, atdı əl çövqana,
Girib Rüstəmi-Zal kimi meydana.
Beşində götürdü ox ilə kaman,
Gözündən quşu aldı göydə nişan.
Çatıb on yaşa, oldu bir şiri-nər,
Yox idi döyüşdə tayı bir nəfər.
Cəsarətlə bir gün dedi: – Ey ana,
Mənə gizli bir mətləbi açsana!

Öz həm yaşlarımdan belə yüksəyəm,
Başım göylərə yüksəlir, mən kiməm?
Kimin nütfəsidir mənim gövhərim ?
Atam kim olub mən kimi göstərim?
Bu sirri əgər sən mənə açmasan,
Oğulsuz qalarsan cahanda, inan!
Ana söylədi: – Dinlə hər nə desəm;
Qəzəblənmə, şad ol, oğul, çəkmə qəm!
Sən övladısan şirürək Rüstəmin,
Ciyərparası Sam ilə Neyrəmin.
Başın göylərə yüksəlirsə əgər,
Atan gövhərindəndir, ey namivər!
O gündən bəri ki, yaranmış cahan
Görən olmamış Rüstəmə tay, inan!
Baban Zal, Samü Nəriman olub,
Nəsilbənəsil dildə dastan olub!
O məktub ki, yazmışdı Rüstəm ona,
Nişan verdi Təhminə öz oğluna.
Yaqut qaşlı, altun üzük üç dənə
Atan göndəribdir İrandan sənə.
Dedi: – Şah Əfrasiyaba əgər,
Mənim sözlərimdən çatarsa xəbər,
Bilərsə ki, sən, Rüstəmin oğlusan,
Cahan pəhləvandı yenilməz atan,
Səni, bil ki, o göndərər meydana,
Fəraqında bağrım dönər al qana!
Cavab verdi Söhrab ki: – Ey ana!
Yayılsın gərək bu xəbər hər yana!
Cahanda böyük pəhləvanlar bütün
Deyər Rüstəm haqqında dastan bu gün.
Atamla edərkən hamı iftixar
Danım nəslimi mən? Deyildirmi ar?
Gərək baxmadan mən kiçik yaşıma,
Yığam türkləri hərb üçün başıma,
Salam təxtdən şah Kavusu mən,
İrandan didərgin edəm Tusu məi,
Verəm təxti-tacı atam Rüstəmə,



Çıxıb təxtə hökm eyləsin aləmə!
İrandan yürüş eyləyib Turana,
Girəm şah ilə təkbətək meydana,
Ucaldam polad nizəmi göylərə,
Salam təxtdən Əfrasiyabı yerə,
Atam Rüstəmin mən kimi oğlu var,
Nə lazım ola başqası hökmdar?
Günəş, Ay olan yerdə ulduz məgər
Özünü işıq mənbəyi göstərər?
Haman gün yayıldı xəbər hər yana
Ki, Söhrab yürüş başlayır İrana.
Qoşunlar ona yardıma gəldilər,
Əsilzadə idi o gənc şiri-nər.

Gedib çatdı Əfrasiyaba xəbər
Ki, Söhrab döyüş təblini döydürər.
Damağında vardır hələ süd dadı,
Qılıncla ox oynatmağa başladı.
Sınaqçın çalır xəncərini daşa,
O istər ki, Kavus ilə çarpışa.
Öz ətrafına hey qoşun toplayır,
Atıb qorxunu, qorxmayır, saymayır.
Danışsaq əgər mətləbi, çox çəkər,
Bu naməlum oğlunda vardır hünər.
Sevindi bu sözlərdən Əfrasiyab,
Gülüb, şənlənib, vermədi bir cavab.
Seçib ordusundan dilavərləri,
Ağır gürz ilə çarpışan ərləri,
İgid pəhləvan on iki min nəfər,
Human, Bariman kimi sərkərdələr,
Yığıb söylədi Şahi-Turanzəmin:
– Sözüm sirrdir, dinləyin siz əmin.
Gələrsə oğulla ata üz-üzə,
Çətin ki, belə hərbə Rüstəm dözə.
Atasından oğlu tutarsa xəbər,
Ata mehri könlündə tüğyan edər,
Əgər bilməsə bu yenilməz cavan,

Əlində ölər o qoca pəhləvan.
Belə olsa, xəlvət durub bir gecə,
Tutub bağlayın Söhrabı gizlicə.
Şah əmr etdi, Human ilə Bariman
Hüzuruna Söhrabın oldu rəvan.
On at, on qatır yükləyib zər, gövhər,
Ərəb atları üstə altun yəhər,
Qızıl tac – üstü cavahirnişan,
Turan şahı hazırladı ərməğan.
Təravətli bir namə də yazdı şah,
Qələmlə onun qəbrini qazdı şah.
Keçirsən ələ sən İran təxtini,
Açarsan bütün aləmin bəxtini.
Turandan İrana uzaq yol deyil,
Səməngan da, Turan da İrandı, bil!
Qoşun göndərim nə qədər istəsən,
Başa tac qoyub, çıx, otur təxtə sən!
Turan ordusundan Human, Bariman,
Tayı olmayan pəhləvanlar, inan.
Gəlir mən tərəfdən sənin yanına,
Müti olmağa əmrü fərmanına.
Döyüşdə edərlər sənə can fəda,
Gedər düşmənin yurdu mütləq bada.
Bu məktubla peşkəşləri aldılar,
Qoşunla Səməngana yollandılar,
Gəlib çatdı Söhraba bundan xəbər,
Human, Bariman ordu ilə gələr.
Yanında babası çıxıb pişvaza,
Görüb ordunu gəldi o pərvaza.
Nəzər saldı diqqətlə human ona,
Qalıb mat baxdıqca əndamına.
Verib Söhraba şah yazan naməni,
Dedi: – Şahi-Turan salamlar səni!
Qatırlarla o atları göstərib,
Dedi: – Şah sənə töhfələr göndərib.
Oxutdu haman naməni pəhləvan,
Dedi: – Ordu İrana olsun rəvan!



Çalındı təbillər, yürüş başladı,
Göyə qalxdı şeypurların fəryadı.
İran mülkünə basdı Söhrab ayaq,
Abad qoymadı kənd, şəhər, yurd, ocaq.
Önündə dura bilmədi bir nəfər,
Qaçırdı əlindən pələng, şiri-nər
Yol üstdə var idi uca dağ – qala,
Hamı söyləyərdi ona: Ağ qala.
Ümid bağlayırdı ki, iranlılar
Qala düşmənin qarşısını alar.
Qala başçısıydı Həcir pəhləvan,
Döyüşlərdə vermişdi çox imtahan,
Kiçikdi o vaxtlar hələ Gostəhəm,
Gücündən vurardı uşaqlıqda dəm.
O əyməzdi şirə, pələngə boyun,
Bacısı igid bir qız idi onun.
Yaxınlaşdı Söhrab, gördü Həcir
Qala üstünə canlı bir sel gəlir.
Atın üstünə qalxdı tez pəhləvan,
Cəsarətlə meydana oldu rəvan.
Qılınc çəkdi Söhrab onu görcəyin,
Qəzəbləndi, odlandı qəlbində kin.
Qoşun mərkəzindən çıxıb şir kimi,
Çapıb at, kamandan qopan tir kimi,
Həcirə dedi: – Yoxsa divanəsən,
Çaşıb salmısan at bu meydanə sən?
De kimsən, adın söylə, bir an dayan
Gərək matəmində otursun anan!
Həcir söylədi: – Ey cavan, yaxşı bil,
Turandan mənə bir nəfər tay deyil!
Həcirəm, bu meydanda mən tək bəsəm,
Gərək başını xəncərimlə kəsəm!
Cahan şahına göndərəm ərməğan,
Edəm cismini torpaq içrə nəhan!
Qulaq verdi Söhrab bu sözlərə,
Gülüb, atdı əl nizəyə bir kərə.
Elə bərk tutaşdı iki pəhləvan

Ki, yüksəldi yerdən göyə toz, duman.
Onun böyrünə nizə vurdu Həcir,
Əsər etmədi nizə, Söhrab – o şir
Tutub nizəni qaytaranda geri.
Həcirin kəmərbəndi oldu yeri
Yəhərdən alıb quş kimi başına,
Yerin qatdı torpağına daşına.
Çöküb sinəsinə cavan pəhləvan,
Başın kəsmək istərdi ki, nagəhan
Sağ əl üstə döndü, edib ahü-zar
Dedi: – Gəl, mənə qıyma, ey namidar!
Buraxdı Həciri, Həcir oldu şad,
Nəsihət dili açdı olcaq azad.
Dilavar onun qolların bağladı,
Əsiri qərargahda saxladı.
Qala əhli tutdu xəbər ki, Həcir
Basılmış, yıxılmış, alınmış əsir.
Yox idi qala içrə o qəhrəman
Bu qəmdən göyə qalxdı ahü-fəğan.

Xəbər tutdu Kəjdəhmin aslan qızı
O meydandan itmiş Həcirin izi.
O qız, qız deyil, mərdi-meydan idi,
Şücaətdə dillərdə dastan idi.
Elə qız hələ doğmamış bir ana,
Deyərlərdi Qordafərid adına.
Eşitdi ki, bəndə düşübdür Həcir,
Qəzəbdən qaraldı, o oldu xəcil.
Toxunmuşdu bu hal onun şəninə,
Geyindi döyüş paltarı əyninə.
Zireh içrə zülfünü etdi nəhan,
Dəbilqə qoyub, taxdı bərgistəvan[77],
Bir aslan kimi meydana çapdı at,
Deyərdin ki, şahindir, açmış qanad.
Çəkib nərə, meydanda saldı haray,
Sanardın ki, şimşək çaxır laybalay
Dedi: – Varsa sizdə elə pəhləvan,



Mənim qarşıma çıxsın o qorxmadan.
Gülümsündü Söhrab, dodaq dişlədi,
Hərifi nəzərdən keçirdib dedi:
– Yenilməz bir aslan önündə budur,
Düşübdür tora öz ayağıyla gur.
Coşub yel kimi, çəkmədi bircə an,
Geyindi dəbilqə, zireh pəhləvan.
Çapıb gəldi Qordafərid üstünə,
İgid qız baxınca onun şəstinə.
Açıb qollarını, götürdü kaman,
Oxundan tapanmazdı quş da aman.
O, Söhrab olan səmtə yağdırdı ox,
Ox ilə hərifə ziyan vurdu çox.
Onun bu işi Söhraba gəldi ar,
Acıqdan əsib coşdu o namidar.
Ata dəydi, çəkdi başına sipər,
Deyərdin: buluddur, yerə qan səpər.
Nəzər saldı Söhraba Qordafərid,
Gəlir üstünə od kimi bir igid.
Kamanı keçirdi qola durmadan,
Atı şahə qaldırdı o qəhrəman.
Cilov çəkdi, aldı ələ nizəni,
Atıb Söhraba zərb ilə nizəni,
Hərif etdi meydanı Söhraba təng,
Qəzəbləndi Söhrab sanki pələng.
Buraxdı atın başını nagəhan,
Çapıb ildırım sürətiylə haman,
Deyərdin ki, şimşək minibdir yelə,
Polad nizəni tez keçirdi ələ.
Kəmərbəndinə vurdu bir zərbə ki,
Zireh halqa-halqa bölündü iki.
Yəhərdən onu top kimi aldı tez,
Topu sanki çovganına saldı tez.
Qarıldı yəhər içrə Qordafərid,
Qılıncı belindən çıxardıb igid,
Vurub nizəni, biçdi tən ortadan,
Atın üstünə qalxdı yerdən haman.

Yox idi həriflə döyüşdə tabı,
Çalışdı qoyub qaçmağa Söhrabı.
Bu əhvalı Söhrab görüb, qaldı mat,
Qəzəblə dalınca onun saldı at.
Çapıb çatdı Qordaferidə yenə,
Əl atdı, dəbilqə keçib çənginə,
Töküldü saçı çiyninə laybalay,
Deyən, parladı asimanda bir Ay,
Baxıb gördü Söhrab: bir qızdır o
Zireh içrə parlaq bir ulduzdur o.
Düşündü ki, İranda qızlar hələ
Hünər göstərirlər döyüşdə belə,
İgidlər əgər sürsə at meydana,
Dönər yer toza, yüksələr asmana.
Ələ aldı bir həlqə-həlqə kəmənd,
Kəmərdən kəməndə onu etdi bənd.
Dedi: – Qaçma məndən, ayüzlü sona!
Bu hüsn ilə gəldin neçin meydana?
Hələ görməmişdim səsomintək şikar,
Çalışma xilas olmağa, ey nigar!
Yaman darda qalmışdı Qordafərid,
O, tək al dilə bağlayırdı ümid.
Xitab etdi Söhraba: – Ey pəhləvan,
İgidlər içində pələng, arslan!
Dayanmış iki ordu, izlər bizi,
Qılınc ilə, gürz ilə közlər bizi.
Sənə öz camalımı açsam əgər,
Yəqin orduna səs düşər, söz gəzər
Ki, bir qızla sən üz-üzə durmusan,
Tozu, torpağı ərşə qaldırmısan.
Darıxma, murada çatarsan hələ,
Bu işdə ağıl ilə rəftar elə!
İki ordu içrə məni etmə xar.
Zəlil istəməz heç zaman yarı yar.
Sənin əmrinə baş əyib Ağ qala.
Burax hərbi, dost ol, qayıt düz yola!
Səninidir qala, həm də ki, xəznələr,



Olar sən deyən, səbr edərsən əgər.
Ötərgi bir üz göstərib Söhraba,
Təbəssümlə səpdi şəkər innaba.[78]
Üzüydü təravətdə cənnət bağı,
Boyu sərvtək bir bağın rövnağı.
Göz ahu gözü, qaşlar isə kaman,
Deyərdin ki, solmaz bu gül heç zaman.
Dedi: – Get, bu peymanını qırma sən,
Döyüşdə məni görmüsən, sevmisən.
Düşünmə, sizi hifz edər bu qala,
Qala yox, belə çərxi-gərdun ola,
Mənim zərbəm ilə olar tarümar,
Mənə vursalar nizə, nizə sınar.
At üstündə Qordafərid, durmadan
Qala səmtinə oldu dərhal rəvan.
Yanınca onun getdi Söhrab həm,
Yaxın gəldi dərvazaya Gəjdəhəm,
Açıldı qapı, keçdi Qordafərid,
Bədən xəstə, can xəstə, ruh naümid,
Qapı bağlanıb, başladı ah-fəqan,
Ürəklərdə qəm coşdu, gözlərdə qan.
Həcir ilə Qordafəridin qəmi
Gətirdi qala əhlinə matəmi.
Dedilər ki, ey pak ürək, şir qadın,
Qəminlə bizə od vurub, odladın.
Döyüşdün, hərifi tutub al dilə,
Ləkə qoymadın ki, gələ bu elə.
Çəkib qəhqəhə, güldü şəhdi-şəkər,
Çıxıb bürcə, ətrafa saldı nəzər,
Yəhər üstə Söhrabı görçək həmən,
Dedi: – Ey Turanın, Çinin şahı, sən
Qayıt yurduna, çəkmə zəhmət hədər,
Bu get-gəl, bu çarpışma verməz səmər,
Çəkib qəhqəhə, söylədi: – Ey igid!
İranlı qızı türkə getməz, eşit!
Deməli, mən deyildim sənin qismətin!
Unut eşqimi, at daşın möhnətin!

Bu qol, bu kürək, bu şücaətlə, bil,
Sənə bir turanlı igid tay deyil!
Fəqət, şah Kavusa çatsa xəbər
Ki, Turandan ordu çəkib bir nəfər,
Şahənşahla Rüstəm gələr üstünə,
Yanarsan, göz olmaz baxa tüstünə!
Təhəmtənlə sən çarpışarsan necə?
O dağ qartalı, sən yetim bir cücə!
Bu ordun, büsatın bütün məhv olar,
Sənin halına daş da qan ağlayar.
Belə qəddü qamət heyifdir, aman!
Pələnglər əlindən qorun, daldalan!
Sənə xeyirxahlıq sözümdür eşit:
Qayıt, gəldiyin yolla Turana get!
Demə güclüyəm, lovğalanma hədər,
Hər axmaq öküz sağrısın döydürər.
Qulaq verdi Söhrab, utandı yaman
Ki, vermiş qıza al dil ilə aman.
Dedi: – Ey gözəl, qəlbi möhkəm qaya,
Qəsəm taci-təxtə, Günəşlə Aya,
Bu bürcü gərək yerlə yeksan edəm,
Səni öz işindən peşiman edəm.
Yaxan bir də keçsə mənim cəngimə,
Nə etsəm, cəzandır, daha incimə!
Peşiman da olsan, o vaxt gec olar,
Bu puç sözlərindən utan, ey nigar!
Unutdun nə tez əhdü-peymanını?
Yalanla xilas etdin öz canını?!
Var idi qalaya yaxın bir şəhər,
Qala əhli ordan alardı bəhər,
Verib qarət əmrini gənc pəhləvan,
Şəhər bir an içrə olundu talan.
Dedi Söhrab: – Artıq gecikdik bu gün,
Döyüş fürsəti çıxmış əldən bütün.
Yatın, dincəlin, qoy açılsın səhər,
Olar Ağ qala onda zirü-zəbər:



Geri döndü Söhrab, qoca Gojdəhəm
Oturtdu dəbirin əlində qələm,
Şaha namə yazdı, dedi: durmadan
Şahın yanına qasid olsun rəvan!
Birinci Xuda namını etdi yad,
Zaman gərdişindən yaman çəkdi dad,
Bir ordu bizə göndəribdir Turan,
Hamı pəhləvandır, hamı qəhrəman.
Cavan bir igid var igidlərbaşı,
Çox olsa onun var iyirmi yaşı.
Boyu sərvi gülşəndə gözdən salar,
Üzündən, deyərsən, Günəş nur alar,
Döşü fil döşü, qamətiysə çinar,
Onun vurduğu gürzdən dağ uçar.
Alarsa o hindi qılıncı ələ,
Salar dağ-daşa, dəryaya vəlvələ.
Bağırsa, deyərsən ki, göy gurlayır,
Vuranda qılınc, ildırım parlayır,
Görüncə ki, düşmən keçib İrana,
Həcir atlanıb, qoydu üz meydana.
Dayandı o Söhrab ilə üz-üzə,
Daha görmədim at belində gəzə.
Həcirə aman vermədi qırpa göz,
Dil açdı, desin, qaldı ağzında söz.
Götürdü yəhərdən onu quş kimi,
Bu halı görən qaldı bihuş kimi.
O, Söhrab əlində əsirdir bu gün,
Həcirsiz, inan, bağrı qanıq bütün!
Bu yerdə uzun bir ömür sürmüşəm,
Turandan nə çox pəhləvan görmüşəm
Bununtək dilavər, bununtək qoçaq,
Verən olmamış türk elindan soraq.
Onun cənginə keçsə hər namidar,
Önündə iki ordunun xar olar.
Döyüş vaxtı dağ üstə çapsa atı,
Üzəngiylə yeksan olar dağ qatı.
Onuntək görən olmamış at sürən,

Deyər, atlanıb Sam gəlir, hər görən.
Onun taleyi göylərə boy atır,
Bizim pəhləvanınsa bəxti yatır.
Əgər bir neçə gün də səbr eyləsək,
Nə tədbir görsək, nə söz söyləsək,
İran padişahı həyan durmasa,
Qoşun çəkməsə, pusqudan vurmasa,
Qala tab gətirməz onun zərbinə,
Kimin cürəti var çıxa hərbinə?
O güc qarşısında nədir Ağ qala?
Onunla yürüşdə qalır şir dala.
Yazıldı gecə, namə yetdi sona,
Tapıb qasidi, etdi təslim ona.
Dedi: – Sübh tezdən apar naməni,
O, turanlılar görməsinlər səni!
Şaha namə saldı yola Gəjdəhəm,
Özü verdi köç əmri könlündə qəm.
Çatıldı, nə lazımdı, tez karivan,
Yola gizli bir yolla oldu rəvan.
Gecəykən qalanı ki, tərk etdilər,
İranşəhrə doğru çıxıb getdilər.
Günəş dağ dalından ucaldanda baş
Hazırlaşdı türklər qoparsın savaş.
Sipəhdar Söhrab qapıb nizəni,
At üstündə cövlan vurub ərsəni[79].
Qala səmtinə çapdı o pəhləvan,
Baxıb gördü: çoxdan köçüb karivan.
Darvazanı açıb keçdi şiri-nər,
Yox idi silah gəzdirən bir nəfər.
Qala əhli gəldi onun yanına,
Aman istədi hər kəs öz canına.
Neçə gün sonra naməni aldı şah,
Oxutdu, qəmə qərq olub, çəkdi ah.
Çağırtdırdı əyanları dərbara,
Açıb söylədi dərdini onlara.
Qoşundan gəlib cümlə sərkərdələr
Hüzurunda Kavusun əyləşdilər.



Gəlib Tus, Gudərz, Keşvad, Giv
Və Qorgin, Bəhram, Fərhad, Niv,
Haman naməni göstərib onlara,
Dedi: – Söyləsin, kim bilirsə çara!
Siz, ey pəhləvanlar, bilin aşikar,
Bizim qarşımızda çətin iş durar.
O Söhrabdan Gəjdəhəm ki, yazır,
Düşündükcə insanın ağlı azır.
Gedər əldən İran, geciksək əgər,
Onun öhdəsindən, deyin, kim gələr?
Deyib dinlənildi, bu oldu qərar:
Gedə Zabilistana Givi-səvar,
Gedib, Rüstəmi işdən agah edə,
Deyə, qorxu var, ölkə əldən gedə.
Gətirsin bu meydanə bəlkə onu,
O qalib çıxardar bizim ordunu.
İşi darda qalmışdı şahın yaman,
Dəbirlə oturdu naçar yanbayan.

Dəbirə belə söylədi şəhriyar:
Bu ünvana yaz: Rüstəmi namidar!
Birinci: – Böyük Tanrıya afərin,
O, sultanıdır həm göyün, həm yerin.
İkinci: – Sən, ey namivər pəhləvan!
Ömür sür səadətlə, ol şadiman.
Sənə pəhləvanlar ümid bağlayar,
Çox aslanlar olmuş əlində şikar,
O Hamavəran mülkünü fəth edən,
İgidliklə Mazəndarana gedən,
Əgər gürz vursan, Günəş ağlayar,
Qılıncın sənin Zöhrəni dağlayar.
Toza döndərəndə daşı, torpağı,
Edər tutiya Rəxşinin dırnağı[80].
Onunla yıxarsan yerə aslanı,
Sənin gürzünə qatlaşan fil hanı?
Kəməndin əsiri neçə şiri-nər,
Uçar dağ, dağa nizə vursan əgər.

Yaman gündə İrana sənsən pənah,
Səni pəhləvanlar bilir xeyirxah!
O məktubu ki, göndərib Gəjdəhəm,
Oxundu, böyüklər mənimlə bəhəm
Dedilər ki, səndən savay dünyada
Elə bir adam yox ki, çatsın dada.
Görüldü belə məsləhət ki, gərək
Dalınca sənin Givi tez göndərək.
Bu namə sənə çatcağın durma, gəl,
Götür-qoysuz heç bir işə qatma əl!
Böyük bir qoşun topla öz başına,
Yolu Zabilistandan al qarşına!
O Söhrabı ki, Gəjdəhəm söyləyir,
Sən ancaq edərsən əlində əsir.
Givə ayrılıqda dedi padişah:
– Atı dörd nala çap, cilov çəkmə, ah!
Yubanma, yetir naməni Rüstəmə,
Durub, dincəlib, bir kəsə söz demə!
Gecə çatmış olsan, qayıt, gəl səhər,
Ona söylə, iş pisdir, ey namivər!
Geciksən, bu gənc aləmə od vurar,
Demişlər: kiçik düşməni tutma xar!
Alıb naməni, Giv döndü yelə,
Yeyib yatmadan yol gedirdi elə.
Yaxınlaşdı ta Zabilə bir səhər,
Gəlib Rüstəmi-Zala çatdı xəbər.
Təhəmtən xəbər verdi əyanlara,
Qoşunla, büsatla çatıb onlara,
Giv atdan enib, göstərib ehtiram,
Dedi: – Rüstəmi-namidara salam!
Enib Rəxşdən Rüstəmi-namidar,
Soruşdu: – İranda, qoşunda nə var?
Gedib birbaşa Rüstəmin qəsrinə,
Hal-əhval soruşdu Təhəmtən yenə.
Verib naməni Giv ona, bir qədər
Danışdı ki, Söhrab nə tüğyan edər.
Baxıb naməyə, Givə asdı qulaq,



Gülümsündü, Rüstəmdə artdı maraq.
Dedi: – Sama oxşar bu gənc pəhləvan
Ki, Turandan İrana olmuş rəvan.
Belə güclüdürsə, yəqin yad deyil,
Onu sən bir azadənin oğlu bil!
Səmənganda şahzadə Təhminədən
Bir oğlum olubdur, fəqət mən bilən,
O çox körpədir, təşnə olmaz qana,
Beşikdən qoyubmu qədəm meydana?
Səməngana vardı gedən bir nəfər,
Ona yolladım çoxlu altun, gövhər.
Cavab gəldi: oğlun yaman boy atır,
Uşaqlıq çağında kamala çatır.
İçir südqoxan ağzı ilə şərab,
Gətirməz yaşıdları zərbinə tab.
Bugün biz də gəl dəm-dümə başlayaq,
Quru ağzımızı bir az yaşlayaq.
Gedək sonra şahənşahın yanına,
Kömək göstərək pəhləvanlarına.
Nə olmuş, yatıbdır məgər bəxtimiz?
Çətinlik görüncə çəkildik nə tez?
Dəniz dalğa-dalğa coşarsa əgər,
Alov püskürən yanğını söndürər.
Məni bayraq altında görsə, inan,
Dönər matəmə işrəti qorxudan!
Girişməz bu tezliklə hərbə hələ,
Nə lazım bu işdə tələsmək belə?
Şərabdan süzüb dalbadal içdilər,
Şahı yad edib Rüstəmə keçdilər.
Səhər durdu Rüstəm yerindən xumar,
Dedi, məclisə mey, məzə qoydular.
Günü verdilər içhaiçlə bada,
Nə getmək, nə də şah düşürdü yada.
Üçüncü günü hey töküb, içdi mey,
Anan olmadı kimdi Kavusi-Key?
Sözə başladı Giv dördüncü gün,
Dedi Rüstəmə ki, bilirsən özün,

Bizim şahın ağlı bir az qıcqırıb,
Bu Söhrab da ki, canına od vurub.
Batıb matəmə, hər yana can atır,
Nə bir dincəlir, nə yeyir, nə yatır.
Yubansaq əgər Zabilistanda biz,
Şərabla davam eyləsə cəngimiz,
Olar şah bizdən yəqin bədgüman,
Qara qəlbdə kin olur hər zaman.
Dedi Givə Rüstəm: – Darıxma belə,
Elə bir adam dünyada yox hələ,
Söyüb danlasın o səni ya məni,
Deyil şah öz təxtinin düşməni!
Buyurdu ki, Rəxşə qoyulsun yəhər,
Təbil naləsindən oyansın şəhər.
Yayıldı xəbər Zabilistana tez,
Geyindi döyüş paltarı el təmiz!

Sevinclə, xeyirliklə at çapdılar,
Gəlib şah dərbarına çatdılar.
Gedib əydilər şah hüzurunda baş,
Qəzəbdən cavab vermədi qəlbidaş!
Givə əvvəl-əvvəl acıqlandı bərk,
Həya gözlərini onun qıldı tərk.
Dedi: – Rüstəmi istədim yanıma,
Niyə xor baxır şah fərmanıma?
Onu öz əlinlə apar, dardan as!
Danışma, onu eyləməz söz xilas!
Bu sözlərdən oldu Givin bağrı qan,
Dedi: – Qıymaram Rüstəmə heç zaman!
Şahın qəhri tutdu Givə, Rüstəmə,
Bütün məclis əhli tutuldu qəmə.
Tutub Tusa üz, söylədi şəhriyar:
– Özün onları dara sarı apar!
Qəzəbdən, budur, şah özü odlanır!
Deyərdin: qamış od tutubdur, yanır!
Qolundan gedib tutdu Tus Rüstəmin,
Donub qaldı mat pəhləvanlar həmin,



Çalışdı, saraydan uzaqlaşdıra,
Apardım deyə Kavusu çaşdıra.
Təhəmtən şaha söylədi qəhr ilə:
– Saqın, oynama atəş ilə belə
Ki, rüsvayçılıqdır bütün işlərin,
Sənin şah təxti deyildir yerin!
O Söhrabı, get, dardan as, hökmdar,
Varınsa hünər, düşməni eylə xar!
Vurub, Tusu atdı kənar, eylə bil
Ki, vəhşi fil üstündən uçdu təbil!
Dönüb baltalanmış nəhəng bir tirə,
Mayallaq aşıb Tus dəydi yerə.
Təhəmtən çıxıb Rəxşə oldu səvar,
Dedi: – Tacbəxşəm mən, aslanşikar!
Yanımda mənim şah Kavus nədir?
Qolumdan tutub dartan o Tus nədir?
Mənim Rəxş – təxtim, qulumdur – cahan!
Dəbilqə – tacım, gürz – üzükdür, inan!
Bu parlaq qılıncı çəkərsəm gecə,
Dolar başla meydan, görərsiz, necə!
Qılıncımla nizəm pənahdır mənə,
Ürək bu iki qolla şahdır mənə!
Məni incidir şah, ona qul olam?
Qul olsam da, öz tanrıma mən qulam!
Sabah tutsa İranı Söhrab əgər,
Nə yaşlı, nə də körpəyə rəhm edər!
Ağılla, fərasətlə rəftar edin,
Bu dərdə əlac arxasınca gedin!
İranda məni bir də görməzsiniz,
Qanadlı quşu gəzməyin yerdə siz!
Dilavərlərin bağrına doldu qan,
Çün onlar sürüydü, Təhəmtən çoban!
Hamı dedi Gudərzə: – Sən, ay kişi,
Asanca düzəldirsən hər bir işi!
Təhəmtən, yəqin ki, səni dinləyər,
Bu işdən sənə yetməz əsla zərər!
Bu divanə şahın hüzuruna get,

Onunla açıqca danış, söhbət et!
O yağlı dilinlə, gəl, imdada çat,
Bu xalqın yatan bəxtini sən oyat!
Bu təklifi Gudərz etdi qəbul,
Şahın yanına durmadan aldı yol.
Dedi şaha: – Rüstəm nə etmiş bu gün?
Sən İranı viran qoyursan özün!
Yadından məgər çıxdı Hamavəran?
Səni kor qoyan div, o Mazəndaran?
Buyurdun: çəkin Rüstəmi tez dara,
De, şahlıq hara, bu səfeh söz hara?
Tutaq, getdi o, çatdı turanlılar
Ki, Söhrab kimi orda sərkərdə var!
Hanı səndə Rüstəm kimi pəhləvan,
Döyüşlərdə Söhraba tutsun divan?
Bələddir qoca Gəjdəhəm orduna,
Bütün pəhləvanlar tanışdır ona!
Deyir: yox elə pəhləvan ki, hələ
Vuruşmaqda Söhraba üstün gələ.
Təhəmtən kimi bir igid aslanı
Özün küsdürürsən, de, ağlın hanı?
Qulaq verdi diqqətlə Gudərzə şah,
Başa düşdü ki, işləmişdir günah.
Düşündü ki, haqsız qızıb gözləri,
Əbəs söyləmişdir acı sözləri.
Təşəkkürlə Gudərzə üz tutdu şah,
Dedi: – Sözlərin haqdır, ey xeyirxah!
Gərək şah ağıllı, səbirli ola,
Bu işlər acıqla salınmaz yola!
Siz indi onun arxasınca gedin,
Dilimdən ona mehribanlıq edin!
Yadından çıxartsın olub keçmişi,
Salaq yaxşılıqla yola hər işi.
Şaha baş əyib, çıxdı Gudərz tez,
Cahanpəhləvana tərəf qoydu üz.
Dalınca onun düşdü sərkərdələr,
Hamı Rüstəmə xahişə gəldilər.



Çatıb Rüstəmə, səf çəkib durdular,
Yanında böyük bir büsat qurdular.
Dedilər: – Yaşa, ey Cahanpəhləvan!
Səadətlə dünyada ol kamiran!
Xar olsun bu dünyada düşmənlərin!
Zəfər taxti üstündə olsun yerin!
Bilirsən ki, Kavusda yoxdur ağıl,
Qəzəbləndimi, söyləyir boş nağıl.
Coşur, gurlayır, tez də peşman olur,
Yatır hirsi, adi bir insan olur.
Sizi boş yerə incidib padişah,
Yox iranlılarda bu işdə günah!
Özü şah belə bilməyir, neyləyir,
Təəssüflə barmaqların çeynəyir.
Cavab verdi Rüstəm ki: – Kavusu mən
Adam saymıram, doğrusun istəsən.
Yəhər təxtim olmuş, dəbilqə tacım,
Zireh paltarım, mən ölümdən qaçım?
Özündən çıxıb şah, yaman odludur,
Bağırmaqla Kavus kimi qorxudur?
Yanımda bu bir cəngə torpaq qədər
Onun qiyməti yoxdur, ey namivər.
Başım şişdi, könlüm qana döndü, mən
Xudadan savay qorxmuram kimsədən!
O çox söylədi, batdı məclis qəmə,
Cavabında Gudərz dedi Rüstəmə:
– Bu gün ölkədə, orduda xəlvəti
Kim isə yayır bir belə söhbəti.
Təhəmtən o türkdən, yəqin, qorxaraq,
Bəhanə gəzirmiş ki, düşsün qaçaq.
Necə Gəjdəhəm bildirib şaha çün:
Gərək ölkədən xalq köçsün bütün.
Deyirlər ki, Rüstəm döyüşdən qaçır,
Bu qaçmaqla da bizlərə yol açır.
Saray əhlinin də budur söhbəti,
Şahın qəhri idi onun məqsədi.
Sanırlar hamı Söhrabı əjdaha,

İran namına get güzəştə şaha!
Cahanı tutubdur adın, şöhrətin,
Qayıtsan əgər əskilər hörmətin.
Düşün bir də, düşmən gəlibdir yaxın,
İran təxti-tacına qıyma, saqın!
Təhəmtən eşitdikdə bu sözləri,
Qızardı üzü, titrədi dizləri,
Dedi: – Zərrəcə qorxuramsa əgər,
Cahanda nəfəs çəkməyimdir hədər!
Bu söhbət, bu söz Rüstəmə gəldi ar,
Şahın yanına getdi o namidar.
Onu görcəyin şah tez qalxaraq:
– Bağışla, – dedi, – mən qızışdım bayaq!
Bir az cırtqozam, həm də kəmhövsələ?
Nədir çarəm, Allah yaratmış belə?!
O gündən ki, bu gənc düşmən gəlib,
Ürək tellərim tük kimi incəlib,
Səni, darda qalmışdım, etdim tələb,
Gecikdin, mənə gəldi qalib qəzəb.
Səni incidən yerdə sınsın belim,
Yanaydı kaş ağzımda hərzə dilim!
Cavab verdi Rüstəm ki: – Ey şəhriyar!
Sənə biz quluq, sən böyük hökmdar!
Budur, hazıram əmrinə müntəzir!
Ağıl səndə, güc səndə – yox bunda sirr!
Dedi şah: – Bu gün yaxşı məclis quraq!
Sabah düşmənin qarşısında duraq!
Düzəltdi elə məclis axşam çağı,
Şahın eyvanı oldu cənnət bağı.
Ucaldı göyə ney səsi, dəf səsi,
Gül üzlü, gözəl qızların nəğməsi.
İçildi gecə sübhədək badələr,
Nə dincəldi, nə susdu xanəndələr.

Səhər əmr verdi ki, Tus Giv ilə
Səfər təbilini bağlasınlar filə.
Xəzinədən çox payladı simü-zər,



Qoşun atlanıb, sursatı çəkdilər.
Süpər əldə, covşənli yüz min səvar,
Çapıb, ordugaha gəlib çatdılar.
Şəhərdən bir ordu töküldü çölə,
Tozundan Günəş gözdən itdi belə.
Quruldu iki mil boyunca çadır,
Bütün yer üzün tutdu fil, at, qatır,
Qoşundan qaraldı hava, dağ təmiz.
Təbil səslərindən coşurdu dəniz.
Gedir atlılar bircə an durmadan,
Günəş də görünmürdü tozdan, inan.
Tozun arxasında polad nizələr,
Sanardın min ulduz yanar, hey sönər.
Neçə rəngdə bayraq vurar dalğalar,
Qızıl təsməli çəkmələr parlayar.
Deyərdin: gecə-gündüz artıq bitib,
Nə təkcə Sürəyya, fələk də itib.
Daşı toz edib torpağa qatdılar,
Qala qənşərinə gəlib çatdılar.
Keşikxanadan gördülər ordunu,
Xəbər verdilər Söhraba tez bunu,
İran ordusundan tutunca xəbər.
Çıxıb bürcə Söhrab, saldı nəzər.
Nə gördü: qoşunla dolubdur cahan,
Humanı çağırdı, dedi: – Pəhləvan,
Görürsən, nə çoxdur İran ordusu?
Bizimçün gərək olmasın qorxusu!
Bu ordu içində hanı bir nəfər
Ağır gürzlə çarpışan şiri-nər?
Günəşlə Ayın yardımıyla bu dəm
Mənimlə bu meydana qoysun qədəm!
Silah çox, adam çoxdur; ancaq ki, mən
Görə bilmirəm bir dilavər, nədən?
Mən Əfrasiyab naminə gör necə
Edim qanlı dərya çölü indicə!
Cavan pəhləvan düşmədi qorxuya.
Enib bürcdən gəldi tez orduya,

Dedi saqiyə: – Camı doldur, gətir!
Düşünməzdi meydan nə, qorxu nədir?
O yandan da əmr eylədi şəhriyar,
Qala qarşısında çadır qurdular.
Çadırlar vuruldu dağa, həm çölə
Ki, yer qalmadı bir qarış da belə,

Çəkildi Günəş pərdəyə gizlicə,
Qoşun çəkdi səhraya zülmət gecə,
Təhəmtən yönəldi şahın yanına,
Ürək kin dolu, od düşüb canına
Dedi: – Şah mənə izn versə əgər,
Dəbilqə qoyub, bağlamazdan kəmər
Gedim, bir görüm bu qılınc oynadan
Hayandan gəlib, kimdir, ey hökmran?
Görüm hansı sərkərdələrdir gələn?
Kimi türklər adlandırır baş bilən?
Dedi şah ona: – Səndədir ixtiyar,
Get, olsun sənə yar pərvərdigar!
Gəlib geydi türk paltarı pəhləvan,
Qala səmtinə oldu tənha rəvan.
Çatıb gördü: türklər içib, məst olub,
Bütün Ağ qala səs – küy ilə dolub.
Qala daxilinə gedib şiri-nər,
Deyərdin; cüyür üstə aslan gedər.
Gəlib gördü: Söhrab təxt üstədir,
Hamı kefdədir, məclis arəstədir.
Yanında onun Jəndərəzm ayləşib,
Ona göz dikib, əhli-bəzm əyləşib.
Oturmuşdu Human – qoçaq pəhləvan,
Həm aslan kimi çarpışan Bariman.
Deyərdin: bütün təxti Söhrab tutub,
Nə Söhrab ki, bir sərvi-şadab tutub.
Bir at sağrısı boyda hər bir qolu,
Döşü – fil döşü, çöhrəsi qan dolu,
Başında igid türk var yüz nəfər,
Hamısı yenilməz, cavan, şiri-nər.
Əli sinədə əlli dilbər nigar
Uca təxt önündə çəkib səf durar.
Hamı Söhraba söyləyir: – Afərin!
Var olsun qılıncın, vuran əllərin!
Oturmuşdu Rüstəm uzaqda bir az,
Görürdü: hamı mey içir, keyfi saz.
Çadırdan bu an çıxdı bir pəhləvan,
Adı Jəndərəzm idi, sinni cavan,
Sataşdı gözü nagahan Rüstəmə,
Yan aldı ona etmədən vahimə,
Soruşdu ki: – Kimsən? Mənə de düzün!
Gedək, tez işıqda görüm mən üzün!
Təhəmtən əl atdı tutub boynunu,
Yerə sərdi bir yumruq ilə onu.
Düşüb Jəndərəzm sanki bir əjdaha,
Geri dönmədi məclisə bir daha.
Gözü yolda Söhrab xeyli zaman
Baxıb görmədi Jənddən bir nişan.
Buyurdu: – Görün Jəndərəzm hardadır?
Yeri boş qalıb, bu yaxınlardadır!
Gedib gördülər ki, düşüb, xar olub,
Döyüşdən də, kefdən də bizar olub.
Bu halı görüb, heyrətə daldılar,
Geri döndülər, bir şivən saldılar,
Xəbər çatdı Söhraba ki, Jəndərəzm
Ölüb, bir də görməz nə meydan, nə bəzm.
Eşitcək bunu o cavan qalxdı tez,
Başı lovlu Jəndə tərəf qoydu üz.
Yanınca nökər, şam və sazəndələr,
Gəlib gördü: ölmüşdür o şiri-nər.
Donub qaldı, əsdi əti, əndamı,
Dedi: – Pəhləvanlar yığışsın hamı!
Xəbər verdi ki, yatmayaq biz gərək,
Silək nizə, hazırlaşaq sübhədək.
Sürü üstünə qurd gəlibdir bu gün,
Sınanmışdır it də, çoban da bütün.
Mənə pak Tanrı əgər olsa yar,
Atım dırnağıyla yeri şumlayar.
Kəməndi yəhərdən açıb, qoymaram

Bu iranlılarda qala intiqam!
Oturdu yenə taxtə o namivər,
Çağırdı, gələ şanlı sərkərdələr.
Dedi: – Jəndərəzmin yeri qaldı boş,
Mənim könlümü siz edin barı xoş!
Dönərkən geri Rüstəmi-namidar
Qoşundan keşikdəydi Givi-səvar.
Görüb Rüstəmi yolda birdən-birə
Belindən ağır gürzü saldı girə
Çəkib nərə fil kimi kəsdi yolu,
Süpər başda, gürz ilə qalxdı qolu.
Təhəmtən bilirdi: gecə sübhədək
Keşikdə yenilməz Giv olsun gərək,
Vurub qəhqəhə, güldü, çəkdi fağan,
Tanış gəldi səs Givə, o pəhləvan
Piyada gəlib Rüstəmin yanına,
Dedi: – Ey Təhəmtən, gedib yatsana!
Gecə vaxtı, söylə, hara getmisən?
Təhəmtən eşitcək bunu Givdən,
Hara getdiyindən danışdı ona,
Dedi: – Jəndərəzmi sərib meydana,
Şahın yanına oldu ordan rəvan,
Danışdı, nə kefdəydi əhli-Turan.
O, Söhrabı min dillə təriflədi,
Boyundan, qolundan, döşündən dedi.
Deyərsən uca sərv əndamına,
Doğarmı belə bir oğul türk ana?
Tayı nə İranda, nə Turanda var!
Boyu, görkəmi Sama çox oxşayar!
Danışdı, necə Jəndərəzmi vurub,
Necə rəzmdən, bəzmdən qaldırıb.
Yeyib içdilər sübhədək yatmadan,
Qoşun hərbə hazırlaşırdı yaman!

Günəş boylanıb, çərxə atdı kəmənd,
Yerin köksünə şöləsi oldu bənd.
Alıb geydi Söhrab tez xoftanı,



Yəhər qoydu, mindi qonur atını.
Əlində bir hindi qılınc abidar,
Başında dəbilğə, üzündə vüqar,
Edib həlqə-həlqə ağır bir kəmənd,
Kəməndi atın tərkinə etdi bənd.
Görünsün deyə aydın iranlılar
Uca bürcün üstündə tutdu qərar.
Həciri çağırdı, dilə tutdu çox:
– Gərəkməz – dedi – bir işə əyri ox.
Ox əyri olarsa, alar kəc nişan,
Hədəf əyri oxdan görər az ziyan.
Hər işdə əsas tut, qoru düzlüyü,
Çəkərsən zərər, at ikiüzlüyü!
Cavab ver suallarıma doğru, düz,
Bu düz yoldan heç vaxt döndərmə üz!
Əlimdən xilas olmağı istəsən,
Yanımda əziz olmağı istəsən
İran barəsində nə etsəm sual,
Mənə düz cavab ver, məni razı sal!
Əgər düz danışsan, alarsan ənam,
Xəzinəmdə nə var, sənindir tamam!
Yalan söyləsən, bil, işin zay olar,
Nəsibin o zindanda ah-vay olar!
Həcir söylədi: – İstəyir şah əgər,
İran ordusu haqda tutsun xəbər,
Nə bilsəm, cavab verməyə hazıram,
Yalan sözlə, söhbətlə yoxdur aram!
Dedi: – Var sualım sənə, söylə sən,
Qoşun, pəhləvan, şah, sərkərdədən!
Mənə söylə sən şah Kavusdan,
Söz aç Giv, Gudərzdən, Tusdan.
Qulaq as, mənə Bəhramı ver nişan,
Hanı, söylə, o Rüstəm – dasitan?
Odur, bir səraperdə var, yeddi rəng,
Yanında çadırlar, içində pələng,
Önündə onun yüz iri fil durar,
Fil üstündə firuzədən təxt var.

Günəşdir, deyən, bayrağı yüksələr,
Qılafı bənövşə, başı Aydı – zər!
Tutub mərkəzində məkan ordunun,
De, kimdir, nədir, söylə, adı onun?
Həcir söylədi: – O, İran şahıdır,
Fil, aslan yeri şah dərgahıdır.
Dedi: – Sağ cinahda durur atlılar,
O yerdə ki, fillər də, sürsat da var.
Vurulmuş sərapərdə, rəngi qara,
Çəkib səf qoşun; bax bir, hardan hara!
Bütün dövrəsi ağ çadırdır niyə?
Verib arxa fillər sərapərdəyə.
Vurar dalğa filgövdəli bayrağı,
Qızıldır bütün qulların başmağı,
Dedi: – Tusi-Nuzərdir o namidar,
O, fil şəklini bayraq üstə vurar.
Dedi: – Bir sərapərdə var: qırmızı,
Alıb dövrəyə atlılardan yüzü.
Qızıl bayrağı üstə şir şəkli var,
O gövhər nədir, gün kimi parlayar?
Dedi: – Onda Gudərz tutmuş məkan,
O azadələr başçısı pəhləvan.
Döyüşdə edər ərsəni filə təng,
Önündə nə aslan durar, nə pələng.
Soruşdu: – Kimindir o yaşıl çadır,
Gözü bu böyük ordunun ondadır?
İçində cavahirnişan təxt var,
Odur, Kaviyan ulduzu parlayar!
Sərapərdədə əyləşən pəhləvan
Vüqarlı, şücaətli, şiri-jəyan!
Boyu, cüssəsi bir nəhəngdir elə,
Qoşunda o boyda adam yox hələ.
Oturmuş, qalanlar ayaq üstədir,
Başı sanki bir qəlbi dağ üstədir.
Bir at var önündə – uzun bir kəmənd
Yəhərdən olubdur ayağında bənd.
Elə kişnəyir, sanki göy gurlayır,



Coşur, şahə qalxır, yəhər parlayır,
Döyüş filləri üstə bərgostəvan,
Yerində gəlir cuşa o pəhləvan!
Əsər bayrağı, əjdahadır deyən,
Qızıl şir başı yüksəlir nizədən.
Özü təkdir, İranda təkdir atı,
Nədir, söylə, o qəhrəmanın adı?
Cavab verdi: – Çindən o gəlmiş bizə,
Şaha xidmətə başlamışdır təzə.
Soruşdu: – Adın bilməyirsən məgər?
Dedi: – Xatirimdən çıxıb, müxtəsər!
O günlərdə ki, gəlmiş o pəhləvan,
Mənim məskənim Ağ qalaydı, inan!
Əzirdi kədər Söhrabı, sanki dağ,
O, Rüstəmdən, heç tutmamışdır soraq.
Anası ona söyləmiş birbəbir
Ki, Rüstəmdəki xas nişanlar nədir?
Ürəkdə duyurdu, görürdü gözü,
İnanmırdı ancaq gözünə özü.
Şirin sözlə tutda Həciri dilə,
Çalışdı gətirsin əsiri dilə.
Desin, hansıdır Rüstəmi-namidar,
Sərapərdəsini həyanda qurar?
Fəqət başqa cür istəyirdi fələk,
Qəza hər nə yazmışsa, olsun gərək!
Soruşdu ki, sərkərdələrdən biri
Kənarda qurub bir çadır, çox iri,
Qabağında fillər, durur atlılar,
Sərapərdədə kərranay gurlayar.
Odur, qurdnişan bayrağı yüksəlir,
Qızıl toppuzu pərdədən görsənir.
Dedi: – Əyləşir orda sərkərdə Giv,
Ona pəhləvanlar deyir: Givi-Niv.
Böyük, oğlu Gudərzin o pəhləvan,
İran ordusuna dayaqdır, inan!
Dedi: – Günçıxan səmtə bir sal nəzər,
Sərapərdə var – rəngi ağ, üstü zər,

Önündə onun mindən artıq səvar,
Çəkib səf, igidlər keşikdə durar.
Piyada ələ nizə, qalxan alıb,
Çölü ağzına sanki ümman alıb.
Süpəhdarın altında təxt – şirmayi,
Uca təxtdə gövhərin yox sayı.
Asıb hər tərəfdən ipək parçalar,
Neçə çərgə qul xidmətində durar,
Sərapərdəyə var yaxın bir çadır,
Piyada qoşunlar önündə hazır.
De, kimdir sərapərdədə əyləşən?
Onun barəsində mənə söylə sən!
Dedi: – O, Fəribürz şahzadədir,
İgidlər tacı, qorxmaz, azadədir.
Dedi: – Qırmızı bir sərapərdə var,
Önündə piyada qoşunlar durar.
Qaban şəkli var bayrağında onun,
Başı altun ay, nizəsiysə uzun...
– Qorazdır – dedi – ordakı namidar,
Döyüşdə tutar, şirləri parçalar.
Ağılda, hünərdə çəkib givlərə,
Gərər döş həmişə çətinliklərə.
Atasından o bir soraq almadı,
Həcirə, deyən, yaddı Rüstəm adı.
Nə istərsən, istə, fəqət ruzigar
Özü hər nə istər, edər aşikar.
Zəmanə nə yazmışsa, o, olmalı,
Axar su gəlib arxına dolmalı,
Ata həsrətiylə yenə o cavan
Yaşıl çadırı bir də verdi nişan.
Dedi: – Gəl, onun da adından danış,
O qat-qat kəmənddən, atından danış!
Cavab-verdi ki, nə bilirdim, dedim,
Nə söz gizlədib, nə yalan söylədim,
Adın bilmədim təkcə o çinlinin,
Deyilləm onunla tanış, əfv edin!
Dedi Söhrab: – İnsafmıdır, ey əmi,



Yarım sözlə yad etmədin Rüstəmi.
Cahanpəhləvan adlanan bir nəfər
Bu ordu içində necə gizlənər?
Deyirdin: odur ordunun aslanı,
Elin, ölkənin bəs pənahı hanı?
Həcir söylədi: – O igid qəhrəman,
O, aslanları pəncəsiylə tutan
Gedib dincələ, Zabilistandadır!
Əlində qədəh bir gülüstandadır!
Dedi: – Boş danışma, çətindir zaman,
Gör, hərbə gəlibsə böyük hökmran,
Cahanpəhləvan heç içib əylənər?
Elə qəhrəmana bütün el gülər!
Uzun söhbətə yox bu gün vaxtımız,
Səninlə bu olsun bizim əhdimiz.
Mənə Rüstəmi sən tanıtsan əgər,
Başın, harda olsan, göyə yüksələr!
Xəznəmi söyləyərəm, gəl, apar,
Sənindir varım, dövlətim, hər nə var!
Əgər saxlasan gizli bu sirri sən,
Mənə bircə kəlmə yalan söyləsən,
Yəqin bil, bədəndən başın ayrılar,
Fikirləş özün, səndədir ixtiyar!
Bilirsənmi, möbid şaha söyləmiş,
O dəmdə ki, bir sirri faş eyləmiş
Ürəkdə qalıb, düşmədən dillərə,
Söz oxşar daş içrə olan gövhərə.
Daşı sındırıb, gövhəri yonsalar,
Minər qiymətə, gün kimi parlayar.
Həcir söylədi:-Hansı bir hökmdar
Olarsa əgər təxti-tacdan bezar,
Atar can elə bir kəsin çənginə
Ki, fil tab gətirməz onun cənginə.
Fələk dursa Rüstəmlə çarpışmağa
Başı asimandan düşər torpağa.
Çinardan uca bir başı gəzdirən,
Var onda yüz aslan gücündə bədən.

Döyüş meydanında qəzəblənsə, bil,
Nə insan durar qarşısında, nə fil!
Elə fil tapılmaz bütün dünyada!
Ona qarşı olsun çətin davada!
Onun Rəxşinin dırnağından qopan
Toza tutiya tay deyildir, inan!
Cavab verdi Söhrab ki, bədbəxt atan,
O azadə Gudərz, Kəşvadəqan
Bu güc, bu bilək, bu hünərlə, Həcir,
Nə üzlə sənə doğma oğlum deyir!
Nə ömründə bir pəhləvan görmüsən,
Nə qovğalı meydanda at sürmüsən.
Odur ki, öyürsən belə Rüstəmi,
Basılmaz bilirsən hələ Rüstəmi.
Coşub daşmayırsa dəniz, müxtəsər,
Odun şöləsi qorxulu görsənər.
Yerindan əgər oynasa göy dəniz,
O müdhiş alovdan yəqin qalmaz iz.
Qılıncı çəkərsə Günəş bircə an
Qaranlıqdan aləmdə qalmaz nişan.
Özü-özlüyündə düşündü Həcir,
Desəm Təhəmtən ordu qəlbindədir,
Bu boylu-buxunlu, yenilməz cavan,
İti pəncəli, güclü türk pəhləvan,
O fil cüssəli köhləni oynadar,
Təhəmtənlə uzləşməyə can atar.
Bu qol, bu kürək, bu güc ilə, yəqin,
Salar cismini torpağa Rüstəmin!
Onun sonra bəs qarşısın kim alar?
Gedib şah Kavusu təxtdən salar.
Kişi düşmənə göstərincə kömək
Şərəflə, rəşadətlə ölsün gərək!
Məni öz əliylə o çəksə dara,
Yəqin ki, bu dünya geyinməz qara.
Atam yetmiş oğluyla sağdır hələ,
Düşüb adları pəhləvantək dilə.
O möbid demişkən, budur son sözüm!



İran yoxsa, qoy məhv-olum mən özüm!
Çəməndə qopub sərv düşsə əgər,
Turac ətri otdan alarmı məgər?
Dedi Söhraba: – Nə yorursan özün,
Niyə Rüstəm haqqındadır hər sözün?
Onunla, çalış, gəlmə sən üz-üzə!
Səni toz edib, bil, səpər bu düzə!
Təhəmtən asanlıqla keçməz ələ,
Ona zor gələn olmamışdır hələ!

Həcrin sözü bərk toxundu ona,
Vurub yumruq ilə onun boynuna,
Yerə sərdi, qəhr ilə döndərdi üz,
Qərargahına doğru yollandı düz.
Geyindi əyninə zireh durmadan,
Dəbilqə qoyub başına pəhləvan,
Damarda qanı coşdu, döndü oda,
Oturdu qaçışda iti bir ata,
Ələ aldı nizə, coşub Nil kimi,
Sürüb getdi meydana bir fil kimi!
Hərif istədi, susdu iranlılar,
Döyüşmək deyil, baxmağa qorxdular.
Üzəngi ayaqda əlində cilov,
Qolu, nizəsi püskürürdü alov!
Bütün pəhləvanlar düşündü bir an
Ki, qızmış filə oxşayır bu cavan!
Onun şəstinə baxmaq asan deyil!
Ona tay – bərabər bir insan deyil!
Çəkib nərə Söhrab, gəzib meydanı,
Dedi: – Göstərin, şah Kavus hanı?
Tutub şaha üz, söylədi pəhləvan:
– De, yaxşı gedir işlərin, hökmran?
Neçin söylənir şah Kavus adın?
De, harda qalıb şahlıq istedadın?
Bu nizə gərək sinəni dağlasın,
Fələklər sənin halına ağlasın.
Yetəndə geçə qətlə, bil, Jəndərəzm,

Qəzəblə müqəddəs bir and içmişəm.
İranda nə qədər qoşun var, qıram,
Salıb şahı təxtdən, dara qaldıram.
Varınsa ləyaqətli bir pəhləvan,
Vuruşmaq üçün qarşıma qıl rəvan!
Dedikcə dedi, coşdu o namidar,
Cavab verməyə qorxdu iranlılar.
Çapıb gəldi, çatdı səraperdəyə,
Vurub nizəni şah olan qübbəyə,
Qolunda onun fil gücü var axı,
Səraperdənin çıxdı yetmiş mıxı.
Uçuldu tamam şah səraperdəsi,
Ucaldı qoşundan həya-huy səsi.
Düşüb qorxuya ordu qaçdı, budur,
Necə şir görəndə qaçar çöldə gur.
Qəmə batdı Kavus, dedi: – Əlaman,
Tapılmazmı sizdən elə qəhrəman,
Gedib Rüstəmi-Zala verin xəbər
Bu türk etdi aslanları dərbədər.
Yoxumdur mənim bir elə pəhləvan,
Cəsarətlə meydana olsun rəvan
Şahın elçisi Rüstəmə oldu Tus,
Gedib söylədi, nə demiş Key Kavus.
Dedi Rüstəm: – Əvvəllər hər hökmdar
Verərkən mənim dəvətimə qərar,
Gah ənam bağışlardı, gah da şərab,
Bu Kavusdan ancaq ki, gördüm əzab,
Buyurdu ki, Rəxşə qoyulsun yəhər,
Yağırdı igidlər üzündən zəhər.
Çadırdan nəzər saldı Rüstəm çölə,
Nə gördü: ötər Giv təşviş ilə.
Qoyub Rəxşə Qorgin parlaq yəhər,
– Gecikmə, – dedi – atlan, ey şiri-nər!
Çəkib tərki Röhham kimi pəhləvan,
Ata bağladı Tus bərgostəvan.
Hamı bir ağızdan deyirdi: – Tələs!
Doğurmuşdu Rüstəmdə heyrət bu səs!



Dedi: – Əhrimən qol qoyubdur işə,
Deyil bais o bir nəfər təşvişə!
Geyindi tez əyninə bəbri-bəyan
Kəyani kəmər bağladı pəhləvan.
Minib Rəxşə Rüstəm, düzəldi yola,
Buyurdu Zəvarə keşikdə qala.
Yanınca onun bayrağın çəkdilər,
Qəzəbdən üzündən yağırdı zəhər.
Baxıb gördü Söhrabdakı əndamı,
O, görkəmdə xatırladırdı Samı.
Dedi: – Gəl, səninlə keçək bir yana,
Sürüb at, gələk üz-üzə meydana.
Coşub, əl-ələ sürtdü Söhrab o dəm,
Cəsarətlə meydana qoydu qədəm.
Dedi Rüstəmə: – Bəllidir keçmişin,
Döyüşlə, savaşla olubdur işin.
İrandan neçin istəməzsən kömək?
Gəlibsən mənim qarşıma indi tək!
Deyilsən bu meydanda sən tay mənə,
Aşarsan, bu yumruqla vursam sənə.
Sinən enlidir, qamətinsə uca,
Yaş ötmüş, bükülmüş belin, ay qoca!
Nəzər saldı Rüstəm ona bir kərə,
O gövdə, o qamət, o sərt əllərə
Dedi: – Baş aparma belə, ey cavan!
Qızışma, bir az yumşal, həddini qan!
Quru torpağın, bil, soyuqdur üzü,
Çalış, söylə yumşaqlıq ilə sözü!
Qocalsam da, meydanda döş gərmişəm,
Qoşunlar qırıb, torpağa sərmişəm.
Əlimlə zəlil etmişəm divləri,
Üzüm dönməmişdir döyüşdən geri.
Mənə bax, əlimdə əgər ölməsən,
Nəhəng üstünə gəlsə də, qorxma sən!
Dəniz, dağ döyüşdə görübdür məni,
Turandan gələn bir neçə düşməni
Necə əzmişəm, yer bilir, asiman,

Hünərdə mənə diz çökübdür cahan!
Dedi: – Bir sualım var idi sənə,
Budur xahişim, doğru söylə mənə!
Məgər sən, o Rüstəmsən, ey namidar?
Baban Sami-Neyrəmdir, o şahsuvar?
Dedi: – Məndə oxşar nə var Rüstəmə?
Nə var nisbətim Sama, nə Neyrəmə?
Mənəm sadə qul, o böyük pəhləvan,
Mənim təxti-tacım hanı, ey cavan?
Toxundu ümid şişəsi daşlara,
İşıqlı gün oldu gözündə qara.

Gedib nizə çiynində o meydana,
Düşündü: hanı sözlərin bəs, ana?
Döyüş meydanı oldu dar bir guşə,
İki nizə düşdü yaxından işə.
Polad nizələrdən əsər qalmadı,
Çevirdi sola pəhləvanlar atı.
Qılınca sarıldı iki pəhləvan,
Dəmirdən yerə od yağırdı, inan!
Elə zərbələr vurdular bir kərə
Ovuldu qılınclar, töküldu yerə,
Bu dəmdə ağır gürzə əl atdılar,
Tükənmişdi taqətləri aşikar.
Əmudlar əyildi ağır zərbədən,
İgidlər də, atlar da sarsıldı tən.
Dəyəndə əmud atlara bir kərə
Tökülmüşdü bərqostəvanlar yerə.
İki pəhləvanın bu çarpışmadan
Belində zireh parçalandı haman!
Atın, atlının halı oldu xarab,
Nə əldə tutar qaldı, nə qolda tab.
Axıb torpağa qanlı tər sanki sel,
Susuzdan ağızda cadarlandı dil.
Ata dərdü qəmli, oğul xarü zar,
Bir az bir-birindən uzaqlaşdılar,
Qəribə işin var sənin, ey cahan!



Özünsən sağaldan, özünsən qıran!
Görüşdə, döyüşdə iki qəlbdən
Biri duymadı mehribanlıq nədən?
Ədavət ki gəldi, ağıl sarsılar,
Məhəbbət yerini qəzəb, kin alar.
Dənizdə balıq, çöldə ceyran, cüyür
Duyur körpəsini, haçan ki, görür.
Tamah gözlərini kor etmiş bəşər,
Öz övladının da gözünü deşər.
Fikirləşdi Rüstəm, mənimlə hələ
Hərif olmamışdır nəhəng, bax, belə!
Əlimdə mənim oldu Ağ div də xar,
Bu gün naümidlik məni sarsıdar.
Belə bir cavan görməmişdir cahan,
Bu qüvvət, bu cürətdə yox pəhləvan!
Zəmanə əlindən yetişdim cana,
Dikibdir iki ordu göz meydana!
Döyüşdən, tutuşdan, qaçışdan sarı,
Nəfəs dərdi, dincəldi çün atları,
Cavanla qoca üz-üzə durdular,
Bu ona, o buna hey ox vurdular.
Dəbilqə, zireh, halqa oldu həyan,
Aman vermədi ox yetirsin ziyan,
Qəzəbdən çəkib ah, qan uddular,
Biri digəriylə kəmər tutdular.
Əgər pəncə atsaydı Rüstəm dağa,
Qopardıb atardı dağı torpağa.
Tutub qurşağın Söhrabın bir ara,
Çalışdı yəhərdən onu qaldıra.
Yox idi qolunda onun bu hünər,
Cavan tutmadı sanki bundan xəbər.
Döyüşdən bezib hər iki pəhləvan,
Əzgin, yorğun ayrıldılar bircə an.
Yəhərdən alıb gürzü Söhrab ələ,
Atı şahə qaldırdı tez qəhr ilə,
Vurub əzdi bir zərbədə çiynini,
Göyə ağrıdan qalxdı Rüstəm ünü.

Gülüb söylədi–Söhrab: – Ey pəhləvan!
Bu bir zərbəyə səndə yoxmuş tavan.
Döyüşdə dönub Rəxşin olmuş ulaq,
İki qolla şöhrət tapar hər qoçaq!
Boyun varsa da sərvət çox uca,
Cavanlıq edirsən, ağılsız qoca!
Bu ondan, o bundan olunca bezar,
İki pəhləvana cahan gəldi dar,
Biri digərindən çevirdikdə üz,
Kədər canlarını üzürdü təmiz,
Sürüb Rəxşi turanlılar üstünə,
Pələng cumdu sanki şikar üstünə.
Bir ac qurd kimi girdi çün orduya,
Dağıldı qoşunlar düşüb qorxuya.
Atın başını çəkdi Söhrab o dəm,
İran ordugahına basdı qədəm.
İşə saldı gürzü, çatıb ləşkərə,
Neçə pəhləvanı uzatdı yerə.
Fikirləşdi Rüstəm, mənimlə hələ
Yetər şah Kavusa bundan ziyan!
Bu qamət, bu qol, bu zireh, bu kəmər,
Cavan türkdə vardır tükənməz hünər.
Bu fikirilə halı dəyişdi təmiz,
İran ordugahına üz qoydu tez.
Gəlib gördü: Söhrab tüğyan edər,
Axar çayları qanla əlvan-edər.
Əlində olan nizədən qan damar,
Deyən, aslanı məst qılmış şikar.
Təhəmtən onu gördü, artdı qəmi,
Ürəkdən çəkib nərə aslan kimi,
Dedi: – Qan içən türk, ey nakişi!
Qoşun əhlinin sənlə varmı işi?
Günahı nədir bunların, söylə, sən,
Quduz qurd kimi həmləyə keçmisən?
Cavab verdi Söhrab ki: – Turanlılar
Bu dava-dalaşda günahsızdılar.
Sənə yetmiş onlardan hansı yara?



Sən, əvvəl hücum eylədin onlara.
Dedi Rüstəm: – Artıq qaranlıq çökər,
Haçan ki, fəzadan Günəş nur tökər,
Bu çöldə ki, mənbər də var, dar da var[82]
Qılınclar günəşdə yenə parlayar.
Süd ətri qılıncla olub aşina,
Mənəmlik elə işləmiş başına,
Elə zənn edirsən, ölüm yox sənə?
Uşaqkən qılınc oynadırsan mənə?
Get indi, görək Tanrı nə istəyir?
Bizi sübh açılcaq qılınc gözləyir!
Çıxıb getdi onlar, qaraldı hava,
Fələk də baxıb qaldı mat Söhraba.
Döyüşçün yaratmış, deyən, asiman,
Yerinda qərar tutmayır bir an.
Dəmirdənmi altındakı at məgər?
Polad cismi var, ruhu ondan betər.
Gecə vaxtı gəldi, çatıb ləşkərə,
Belindən silahları tökdü yerə.
Humana dedi: – Çıxcağın bu səhər,
Günəş saldı dünyaya bir şuru şər.
Nə etdi sizə, söylə, o pəhləvan,
O fil gövdəli, şir ürək qəhrəman?
Human söylədi: – Vardı əmrin sənin,
Yerindən bizim ordu tərpənməsin!
Hələ salmamışdıq işi səhmana,
Münasib deyildi girək meydana.
Çapıb at, bizə sarı o qoydu üz,
Böyük ordunun üstünə gəldi düz.
Sanardın ki, sərxoşdur, az şey qanır,
Bütün ordu tək bir nəfərdir, sanır.
O heç bir kəsə lakin əl açmadı,
Elə pəhləvan yoxdu ki, qaçmadı.
Dedi Söhrab: – O pəhləvan mərd imiş,
Bir insan belə sizdən öldürməmiş
Mən iranlılardan qırıb çatmışam,
Daşı, torpağı qanla islatmışam,

Acam, indi süfrə açaq biz gərək,
Şərabla ürəkdə qəmi öldürək.
Çatıb orduya Rüstəmi – namidar,
Dedi Givə könlündəkin, hər nə var –
Necə üzləşib Söhrab ilə bu gün,
Necə çarpışıb, sarsılıbdır bugün
Dedi Rüstəmə Giv: – İndi eşit!
Hələ görməmişdik belə bir igid!
Gəlib ordunun mərkəzinə qədər,
Tusun üstünə cumdu o şiri-nər!
At üstə tutub nizə durmuşdu Tus.
Düşüb Qorgin atdan, oturmuşdu Tus.
Çatıb, nizə əldə onu görcəyin,
Çəkib nərə, coşdu bir aslan təkin,
Döşündən elə vurdu ki, bir kərə,
Dəbilqə başından atıldı yerə.
Ona etmədi cürət əl açmağa,
Əlacı onun qaldı tez qaçmağa.
Qırıb tökdü bir çox dilavərləri,
Qaçanlar dönüb baxmayırdı geri.
Ona qarşı yoxdur çıxan bir nəfər,
Çatar bu işə təkcə səndə hünər.
Hücum eyləyib girmədik meydana,
Qoşun sadəcə oldu təslim ona.
O gah mərkəzə, gah sağa çapdı at,
Qoşun cürətinə baxıb, qaldı mat
Bu söz saldı od Rüstəmin canına,
Dönüb getdi Kavus şahın yanına.
Baxıb gördü Kavus: Rüstəm gəlir,
Sevindi, yanında ona verdi yer.
Təhəmtən açıb söylədi şah üçün
Ki, Söhrabda nə qüvvə görmüş o gün
Dedi: – Bu cahanda hələ bir uşaq
Görən olmamışdır bunun tək qoçaq.
Uca qaməti ulduzu haqlayar,
Ağır gövdəsin güclə yer saxlayar.
Onun hər qoludur bir at sağrısı,



Toxunsa kimə, sarsıdar ağrısı.
Qılınc, nizə, gürzü kəmənd ilə ox
Bugünkü döyüşlərdə işləndi çox.
Nəhayət, düşündüm: nə çox qəhrəman
Yəhərdən yerə atmışam bir zaman.
Əl atdım kəmərbəndinə nagəhan,
Sıxıb möhkəm ovcumda, verdim təkan.
Onu istəyirdim yəhərdən alam,
Qara torpağa əjdahatək salam.
Küləkdən dəbərməz uca dağ necə,
Yəhərdə o tərpənmədi zərrəcə!
Sabah mən gərək tez gedim meydana,
Güləşdə gəlim bəlkə qalib ona.
Qərarım budur, tanrı yaxşı bilər,
Kimi istəsə həqq, o qalib gələr.
Şücaət, zəfər, güc verən də odur,
Günəşlə Ayı gəzdirən də odur.
Dedi şah ki: – Hifz etsin Allah səni,
Həmişə zəlil eyləsin düşməni!
Gecə sübhədək sürtüb üz torpağa,
Özüm başlaram həqqə yalvarmağa.
Odur qalibiyyət yolu göstərən,
Odur həm fələkdə Aya nur verən.
Sənə qoy bu işdə Xuda yar ola,
Adın yüksələ, düşmənin xar ola!
Təhəmtən dedi: – Bəxtin, ey padişah,
Yar olsa, çatar kamına xeyirxah!
Başı fikr ilə, qəlbi kinlə dolu,
O öz ordugahına tutdu yolu.
Zəvarə, ürəkdə yarası dərin,
Dedi: – Söylə, keçdi necə işlərin?
Yemək istədi Rüstəm ondan bu dəm,
Çalışdı, unutsun, nədir dərdü qəm.
Dedi: – Çəksə hər cür bəlalar başım,
Səbirli, mətanətli ol, qardaşım!
Gərək sübh tezdən gedəm meydana,
Belə vermişəm söz o türk oğluna.

Özünlə götür ordu bayrağını,
Qızıl təxtimi, zərli başmağımı,
Günəş dağ başında olarkən əyan
Sərapərdənin qarşısında dayan!
Əgər mən qazansam döyüşdə zəfər
Dönüb, tez gətirrəm sənə xoş xəbər.
Əgər başqa cür olsa, sən heç zaman
Qızışma, qorun, etmə ahü-fəğan!
Bu meydana siz təkbətək getməyin,
Vuruşmaq üçün heç təlaş etməyin!
Tutub Zabilistana üz, tez gedin,
Zalı bu müsibətdən agah edin!
Anam ağlasa, könlünü al ələ,
De: Tanrı özü istəmişdir belə.
Məni qoy unutsun o, el qaydası: –
Nədir gözyaşı tökməyin faydası?
Qalan olmamış daimi dünyada,
Hədər getməmiş heç də ömrüm bada.
Əlimdə nə çox divlə aslan, pələng,
Həlak oldu onlarla etdikdə cəng.
Neçə bürc, qala fəth edibdir əlim,
Cahan alçalırdı ki, mən yüksəlim.
Döyüşmək üçün atlanan hər adam
Deyər: – Gəl, əcəl, gəlməyindən şadam!
Tutaq ki, mini adlamışdır yaşın,
Budur axırın, yorma nahaq başın!
Zala söylə, görsən onu şadiman
Ki, şahdan üzü dönməsin heç zaman,
Əgər hərbə getsən, qabaq səfdə get,
Nə fərman verərsə, onu sən eşit!
Ölümçün yaranmış qoca, həm cavan,
Bizə daimi ev deyil bu cahan.
Gecə keçdi, Söhrabdan idi sözü,
Yoruldu, uzandı, qapandı gözü.
Qanadlandı parlaq Günəş, saçdı nur,
Qara qarğa gizləndi gözdən, budur.
Təhəmtən alıb geydi bəbri-bəyan,



Minib Rəxşinə sanki şiri-jəyan,
Atın tərkinə bağladı bir kəmənd,
Qılınc dəstəsində əli oldu bənd,
Başında dəbilqə gəlib meydana,
O çöldə gətirdi atı cövlana.
Hamı qəm udur ki, çox olsun payı,
Hərislikdə insanların yox tayı.
O yandansa Söhrab qurmuş büsat,
Saz–avaz ilə mey içirdi rahat.
Tutub Humana üz, dedi ki: – Dünən
Mənimlə bir aslan kimi döşləşən,
Döyüşdə nə qorxar, nə də sarsılar,
Mənimtək onun da uca qəddi var.
Mənəm sanki qol, döş, boyun, sinədən,
Bizi bir qəliblə töküblər, deyən.
Anam söyləyən o nişanlar ki, var,
Hamı onda cəmdir, açıq-aşikar!
Baxıb həsrət ilə ona, durmuşam,
Nə göz çəkmişəm, nə üzə vurmuşam,
Odur, mən bilən, Rüstəmi-namidar,
Cahanda belə pəhləvan az olar.
Atamla döyüşsəm əgər üz–üzə,
Necə görsənim sonra bəs mən gözə?
Human dedi: – Rüstəmlə meydanda mən
Neçə dəfə rastlaşmışam bilmədən.
Görüb duymuşam qüdrətin, qüvvətin,
Ona sən müqabil durarsan çətin.
Bilirsənmi, Mazəndaranda o şir
Nələr eyləmiş, indi də söylənir?
Onun Rəxşinə oxşayırsa bu at,
Hanı bunda bəs ondakı qol–qanad?
Səhər oldu, çıxdı Günəş pusqudan,
Göz açdı igidlər, oyandı haman.
Durub geydi Söhrab döyüş paltarı,
Xumarkən o yollandı meydan sarı.
Ağır gürz əlində girib meydana,
Çəkib nərə, saldı atın cövlana,

Gülər üzlə o Rüstəmə atdı söz,
Sanardın mey içmiş gecə üzbəüz.
Soruşdu: – Necə yatmısan, durmusan?
Niyə qəlbini kinlə doldurmusan?
Əlindən o gürzü, qılıncı, gəl, at,
Yerə vur bu qovğanı, dostluq yarat!
Gəl, atdan düşək, üzbəüz əyləşək,
Doyunca bu köhnə şərabdan içək!
Edək əhdü peymanı xaliqlə biz,
Bezibdir deyək hərbdən qəlbimiz!
Əgər başqası girsə də meydana,
Biz işrətlə sadiq qalaq peymana!
Səni sevmişəm mən ürəkdən özüm,
Necə gör qızarmış həyadan üzüm?
Yəqin ki, böyük nəsildənsən özün,
Danış, qalmasın qoy ürəkdə sözün!
Dedi Rüstəm: – Ey pəhləvan, az danış!
Mənəm, bil, bu sözlərlə çoxdan tanış!
Güləşmək qərarına gəldik dünən,
Məni, gəl, bu sözlərlə aldatma sən!
Cavansan, məni zənn qılma uşaq,
Kəmər tutmağa hazır ol ey qoçaq!
Mən ömrümdə çox gəzmişəm dağ, dərə,
Qulaq asmaram hiyləgər sözlərə!
Dedi Söhrab: – Ey pəhləvan, yaxşı bil,
Bu sözlər qoca mərdə layiq deyil!
Mən arzu edərdim çatanda əcəl
Yataqda öləydim, barı, ey əfəl!.
Öyünsə sənin kimi hər bir adam,
Ya əldə ölər, ya ki darda müdam!
Deyirsən, yenə çarpışaq biz gərək!
Mən hazır: kimə yar olar həqq, görək!
Döyüş atlarından yerə endilər,
Başında dəbilqə, belində kəmər,
Piyada, daşa bağlayıb atları,
Toz içrə gedib bir-birinə sarı,
Gah əlləşdilər, gah da diz çökdülər,



Bədəndən yerə qanlı tər tökdülər.
Qızan fil kimi əl atıb bir kərə
Alıb Rüstəmi, qoydu Söhrab yerə!
Bir aslan necə guru yerdən alar,
İti pəncəsində üz üstə salar,
Üzü, ağzı torpaq dolu Rüstəmin
Çıxıb sinəsində oturdu həmin!
Belindən çıxardı iti xənçəri
Ki, başsız qoya o nəhəng peykəri!
Dedi Rüstəm: – Ey şir tutan qəhrəman,
Əli gah kəmənd, gah qılıncdan tutan!
Bu rəftar bizlərdə adət deyil,
Bizim rəsmimiz başqadır, başqa, bil!
Özündən böyüklə əgər bir nəfər
Döyüşdə güləşsə, qazansa zəfər,
Gələrsə yerə yaşlının arxası.
Kəsilməz başı, bax, budur qaydası!
İkinci kərə yıxsa, tez öldürər,
Ona şir kimi öz gücün bildirər!
O, çün istəmirdi tuta xalq yas,
Bu fənd ilə oldu ölümdən xilas!
Qoca pəhləvana cavan pəhləvan
İnandı, sədaqətlə verdi aman!
Birinə ürək, yaş böyük dərd idi,
Biri sadəlövhdü, cavanmərd idi
Bir ahu görüb yan keçən şir kimi
Çölə qoydu üz, boşladı Rüstəmi.
Kiminlə vuruşmuş, yada salmadan
Şikar eyləyirdi o gənc qəhrəman.
Gecikdi o, Human gəlib çatdı tez,
Soruşdu: – Niyə ondan əl çəkdiniz?
Ona Rüstəm hər nə demişdi o gün,
O da Humana şərh qıldı bütün.
Human söylədi: – hiyləyə uymusan,
Canından niyə gənc ikən doymusan?
Bu qoldan, bu boydan-buxundan heyif!
Bu pəncə, kəmər, döş, boyundan heyif!

Keçirdin igidliklə şiri girə,
Aman verdin öz xamlığından şirə!
Onunla tutaşsan əgər bir də sən,
Görərsən, qalarsan necə girdə sən!
Bu sözlər salıb Söhrabı heyrətə,
Canı çulğalandı qəmə, möhnətə,
Qərargahına qoydu üz durmadan,
Qəzəbdən onun beyninə vurdu qan
Nə xoş söyləmiş bu sözü şəhriyar:
Kiçik olsa da, düşməni tutma xar!
Əlindən onun oldu Rüstəm xilas,
Polad bir qılıncdan, deyən, getdi pas.
İtən bir həyatı tapıbdır deyə,
Yetirdi özün bir axar çeşməyə!
Su içdi bulaqdan, yuyundu təmiz!
Ulu tanrı dərgahına tutdu üz.
O, xaliqdən istərdi qüvvət, zəfər,
Xəbərsizdi tale necə tor sərər.
Fələk dövr edər, bəxt yoldan sapar,
Papağını başından dövran qapar!
Yol aldı bulaqdan meydana sarı,
Fikirdən, xəyaldan üzü sapsarı,
Qolunda kəməndi, əlində kaman
Çapıb gəldi Söhrab elə bu zaman!
Salıb nərəsi aləmi lərzəyə,
Atın sıçradıb, başladı həmləyə!
Onun cürəti, qüdrəti, görkəmi
Düşündürdü heyran qalan Rüstəmi.
Görüb Rüstəmi şir ürəkli cavan,
Cavanlıq qürurundan aldı təkan,
Dedi: – Ey olan şir əlindən azad!
Məgər etmədin zərbi-şəstimi yad.
Yenə sən mənim qarşıma çıxmısan?
Özün öz evini, demək, yıxmısan!

Yenə atları bağladılar daşa,
Bəla açdı bədxah tale başa!



Güləş başlayanda iki şiri-nər,
Yapışdı kəmərdən polad pəncələr.
Kimə öz dönük bəxti etsə hücum,
Daş olsa belə yumşalar sanki mum!
Olan Söhrabın qüvvəsiylə tanış.
Deyərdi: fələk əl-qolun bağlamış!
O qorxmaz pələng qəmli idi yenə,
Atıb pəncə Rüstəm onun çiyninə,
Cavan pəhləvanın əyildi beli,
Əcəl çatdı, taqətsiz oldu əli.
Onu şir kimi vurdu Rüstəm yerə,
Bilirdi o tez qalxacaqdır yenə,
Belindən qılıncı çıxardı haman,
Vurub sinəsindən axıtdıqda qan,
Ürəkdən bir ah çəkdi, qıvrıldı bərk,
Yaman-yaxşı, hər arzunu qıldı tərk,
Dedi: – Mən bəla açdım öz başıma,
Zəmanə çıxartdı səni qarşıma,
Günahkar bu işdə fələkdir yenə,
Məni çəkdi, saldı ölüm çənginə!
Yaşıdlarım oynar uşaqtək hələ!
Məni torpağa saldı dövran belə!
Atamdan anam söhbət açdı hər an,
Məhəbbətlə coşdu vücudumda qan!
Onu axtarırdım, heyif, görmədim!
Bu dünyada mən çox ömür sürmədim!
Necə qıydın, ey qaniçən, canıma?
Boyandı iti xəncərin qanıma!
Zəmanə olar təşnə, bil, qanına!
Batar döşnətək tüklər əndamına.
Balıqtək su altında tapsan məkan,
Gecə kimi zülmətdə olsan nəhan,
Uçub yer üzündən əgər bir kərə,
Ucalsan bir ulduz kimi göylərə.
Atam yerdə qoymaz mənim qanımı,
Quru yerdə görsə cavan canımı,
Bu ordu içindən gedər bir nəfər,

Verər Rüstəmi-Zala mütləq xəbər
Ki, Söhrab səni axtarıb hər zaman,
O namərd əlində ölüb, verdi can!
Eşitdikdə Rüstəm bu müdhiş sözü,
Dumanlandı başı, qaraldı gözü.
– Mənəm Rüstəm, ey kaş batsın adım,
Gözü yaşlı qalsın elim, övladım!
Çəkib nərə, qəlbində qan etdi cuş,
Yıxıldı, başından onun uçdu huş!
Gəlincə huşa ahü fəryad ilə,
Suallarla Söhrabı tutdu dilə,
Varındırmı Rüstəmdən heç yadigar?
Ona pəhləvanlıq adı olsun ar!
Dedi: – Söylə sən, barı Rüstəmmisən,
Xəyanətlə öz oğlun öldürmüsən?!
Bacardıqca verdim işarə sənə,
Məhəbbət izi düşmədi qəlbinə!
O gün ki, qapımda vuruldu təbil,
Anam gəldi ağlar, mənə açdı dil,
Fəraqımda öz canını dağladı,
Qoluma bu qolbağı o bağladı.
Dedi: yadigardır atandan, apar,
Elə gün gələr ki, dadına çatar!
Budur, gəldi, çatdı elə bir zaman,
Ata qarşısında oğul verdi can!
Anam ayrılıq dəmlərində yenə
Tanış bir igid tapdı, qoşdu mənə.
Müsahib ola, məsləhətlər verə,
Atamı göründə mənə göstərə.
Heyif, öldürüldü cavan pəhləvan,
Dönüb taleyim, halım oldu yaman!
Sən indi, gəl, aç cövşənimdən bağı,
Bu çılpaq qolumda gör o qolbağı;
Açıb gördü qolbağ tanışdır ona,
Sovurdu tozu, torpağı başına!
Dedi: – Ey əlimdə mənim xar ölən,
Hər eldə adı fəxr ilə söylənən!



Qırıldı belim, bir də gülməz üzüm,
Qıyınca sənə, kaş öləydim özüm!
Saçın yoldu, gözdən töküb qanlı yaş,
Üzü qanla örtüldü, torpaqla baş.
Dedi Söhrab: – Az eylə ahü-fəğan!
Sağalmaz yaram, yüz ömür ağlasan,
Özün öldürürsən, nədir faydası?
Belə olmalıymış, budur qaydası!
İkindiydi, Rüstəm hələ orduya
Gəlib çıxmadı, düşdülər qorxuya.
Qoşundan seçildi iyirmi nəfər,
Döyüş meydanından gətirsin xəbər.
İki at o çöldə dayanmış, budur,
O yanda toza qərq Rüstəm durur,
Gəlib, atları gördü iranlılar,
Yox idi fəqət Rüstəmi-namidar!
Onu öldürülmüş güman etdilər,
Çəkib ah igidlər fəğan etdilər!
Xəbər tutdu dərhal Kavus şah
Ki, Rüstəm ölüb, qaldı boş barigah!
Qoşun əhlinə düşdü fəryad, şur,
Hamı ağladı, sanki dünya qopur!
Çalındı şah əmriylə şeypur, kus,
O dəm hazır oldu sipəhdar Tus
Dedi Tusa Kavus: – Ey pəhləvan!
Götür atlı, meydana ol tez rəvan!
O Söhrab nələr eyləmişdir, görək!
İran halına ağlayaq biz gərək!
Əgər Rüstəmi öldürübsə o, xar,
İrandan ona qarşı-bəs kim çıxar?
Gərək onda köç təbilini döydürək,
Bu meydanı tərk eyləyək tez gərək.
Qoşundan ucaldıqda bu həmhəmə,
Dilə gəldi Söhrab, dedi Rüstəmə:
– Mənim ki, belə çatdı ömrüm başa,
Oxu türklərin də toxundu daşa!
Çalış, onlara qarşı ol xeyirxah,

Qoşun çəkməsin Turana padişah!
Mənəm İrana sövq edən onları,
Rəva görmə axsın nahaq qanları!
Ümidlə verib çox şirin vədələr,
Mənəm, etmişəm onları dərbədər!
Ata, onlara yaxşılıq arzula,
Çalış, onları sal səlamət yola!
Dodağında ahlar, üzü qanlı yaş
Minib Rəxşi Rüstəm, çölə aldı baş!
Çatıb ordugaha, qopardı fəğan,
Özü öz işindən olub bağrı qan,
Ona gəldi iranlılar dikdi göz,
Önündə hamı torpağa qoydu üz.
Döyüşdən o salim qayıtmış – deyə,
Təşəkkürlə əllər açıldı göyə.
Görüncə, səpib başına torpağı,
Üzünə, gözünə salıb cırmağı,
Sual verdilər ki, nə olmuş məgər?
Kimin dərdi qılmış səni xuncigər?
Açıb söylədi ki, o, nə iş görüb.
Özü öz əziz oğlunu öldürüb!
Onunla bərabər hamı ağladı,
Fəğan yüksəlib, yer-göyü dağladı.
Dedi Rüstəm: – Ey şanlı sərkərdələr,
Daha qalmamış məndə candan əsər.
Hücum etməyin bir daha türklərə,
Nə lazımdı, mən etmişəm bir kərə,
Dönüb, tez qayıtdı yenə meydana,
Yetirdi özün can verən oğluna,
Böyüklər də getdi onunla bəhəm,
Qoca Tus, Gudərz ilə Gostəhəm,
Dil açdı qoşun, qoydu üz torpağa,
O nakam ölən gəncə etdi dua.
Özü Tanrı bu dərdə dərman edə,
Çətin işləri bəlkə asan edə!
O qəsd ilə ki, kəssin öz başını,
Çəkib xəncəri, tökdü göz yaşını.



Böyüklər qolundan onun tutdular,
Töküb göz yaşı, etdilər ahü-zar!
Sual verdi Gudərz: – Ey qəhrəman!
Nə xeyri, yerə çöksə də asiman?
Özünə yüz işkəncə versən belə,
Sağalmaz əzizin bu dərman ilə!
Əgər ömrü qalmışsa, ölməz yəqin,
Onunla yaşa, gör oğul ləzzətin!
Əgər getməli olsa bu növcavan,
De, kimdir cahanda həmişə qalan?
Başında dəbilqə və ya tac da var,
Ölüm ovçudur biz hamımız şikar!
Xitab etdi Gudərzə o pəhləvan:
– Dayanma, qərargaha tez ol rəvan!
Yetir şah Kavusa məndən salam!
De, can üstədir, göz önümdə balam!
İgid oğlumun köksünə dəşnəni
Özüm vurmuşam, yer uda kaş məni!
Yadından əgər çıxmamış xidmətim,
Bir iş gör, azalsın qəmim, möhnətim!
Xezinəndə var nuşdaru sənin,
Odur dərmanı hər ağır xəstənin,
Bir az nuşdaru və bir cam şərab,
Mənə göndər, işlə böyük bir savab!
O bəlkə sağalsın sənin bəxtinə,
Mənim kimi xidmət edər təxtinə!
Çapar gəldi Gudərz şahın yanına,
Dedi Rüstəmin xahişini ona!
Cavab verdi Kavus: – Gudərz, inan!
Sağalsa o fil cüssəli pəhləvan,
Olar Rüstəmə arxa, Rüstəm ki, var,
Məni şübhəsiz, ortadan qaldırar!
O boy, o kürək, o ağıl, o hünər.
Geniş bu cahan Rüstəmə dar gələr!
Eşitdinmi, Rüstəm nələr söylədi?
Məni bu qoşun içrə xar eylədi!
Dedi: saymaram şah Kavus nədir,

Odur şəhriyar, onda bəs Tus nədir?!
O görsə ki, Söhrab kimi oğlu var,
Gəlib qul kimi xidmətimdə durar?
Eşitdikdə Gudərz bu sözləri,
Başından duman qalxdı, döndü geri!
Dedi Rüstəmə: – Nanəcib şəhriyar
Tikanlı ağacdır, barı zəhrimar.
Özün get, o dilbilməzi sal başa,
Əsər et sözünlə o qəlbi daşa!

Təhəmtən buyurdu ki, xidmətkarı
Sərə arx içində yerə paltarı.
Onun üstünə qoydu Söhrabı tez,
Yönəldi şahın yanına səbirsiz
Hələ yolda ikən cahanpəhləvan
Xəbər gəldi, çatdı ona arxadan
Ki, Söhrab qıldı bu dünyanı tərk!
Ona qəsr yox, indi tabut gərək.
"Atam harda?" – Oldu onun son sözü,
Dərin ah çəkdi, qapandı gözü!
Atından Təhəmtən atıldı yerə,
Elə inlədi, düşdü səs göylərə,
Bilirdi, daha dərdinə yox əlac,
Çölün torpağından başa qoydu tac!
Çəkib ün, dedi: – Ey yenilməz cavan!
Sən idin nəsilbənəsil pəhləvan!
Tayın görməyibdir nə Günəş, nə Ay,
Nə cövşən, nə də təxt, nə tac, nə saray!
Cahanda kimin dərdi var mən qədər,
Cavan oğlun hansı qoca öldürər?
Baban Sam idi aləmi fəth edən,
Doğuldun o şahzadə Təhminədən!
Rəvadır, kəsilsə mənim əllərim,
Qara torpağın altı olsun yerim!
Belə bir işi görmüş hansı ata?
Yeri var, üzüm çoxlu danlansa da!
Kim öldürmüş öz novcavan oğlunu?



Ağıllı, igid qəhrəman oğlunu?
Eşitsə, məni Zali-zər danlayar,
Bu matəmdə Rudabə qan ağlayar.
Nə üzlə açıb söyləyim onlara?
Belə bir cinayət hara, üz hara?
Hələ pəhləvanlarla sərkərdələr,
Hər biri bilsə rüsvay edər!
Anası xəbər tutsa, nə söyləyim?
Kimi göndərib, iltimas eyləyim?
Desəm: öz çırağımı söndürmüşəm,
Günahsız o gənci mən öldürmüşəm!
Soruşmazmı ondan atası: niyə?
Nələr söyləyər, ah, o, Təhminəyə?
Yəqin ki, məni dinsiz adlandırar,
Məni pisləyər, canımı yandırar,
Bunu kim bilirdi, bu yaşda uşaq
Atıb sərvtək boy, olar bir qoçaq!
Döyüş əzmi ilə qoşun toplayar,
Məni eyləyər pəncəsində şikar.
Buyurdu ki, şahanə tirmə alın,
Cavan oğlumun üstünə siz salın!
O arzu edərdi tapa taci-təxt,
Tabut qismət oldu ona, döndü bəxt!
Təhəmtən o tabutu qaldırdı, düz
Sərapərdəsinə tərəf qoydu üz!
Gəlib çatdılar orduya birbaşa,
Qoşun əhli torpaq sovurdu başa!
Töküb qanlı yaş, səf çəkib durdular,
Sərapərdəsinə tez od vurdular!
O xeymə, o təxt, yeddi rəng tirmələr,
Qızıl çarpayı, dövrəsi zər, gövhər.
Tutaşdı oda, qalxdı ərşə duman,
Dedi Rüstəm: – Ey novcavan pəhləvan!
Heyif səndəki boy-buxun, surətə!
Heyif səndəki mərdliyə, cürətə!
Heyif çəkdiyin zəhmətindən, heyif!
Könüldə qalan həsrətindən, heyif!

Anan ayrılıq dərdinə ağladı,
Atan, qəm dolu bağrını dağladı!
Səpib çəngə-çəngə başa torpağı,
Cırıb tökdü paltarını dırnağı
Bütün pəhləvanlar, necə bir nəfər
Quru torpaq üstündə əyləşdilər.
Ağı çağlayırdı o öz oğluna,
Böyüklər təsəlli verirdi ona.
Əzəldən fələk işləmişdir belə.
Alar bir ələ tac, kəmənd bir ələ,
Biri tac qoyub dünyadan kam alar,
Birini kəmənd ilə təxtdən salar.
Bu dünyanı sevmək hədərdir, hədər!
Gedənlər qayıtmaz, gələnlər gedər!
Fikirləşmə, can atma varlanmağa!
Xəzinə qayıtsın gərək torpağa!
Bu qanundan agah deyilsə fələk,
Onun da başında beyin yox, demək!
Yəqin, gərdişindəndir o bixəbər,
Ona min sual vermə, etməz əsər!
Əlindən nə getsə bu gün, çəkmə qəm,
Nədir işlərin axırı, bilmirəm!
Dedi Rüstəmə şah: – Əlborz dağı
Və ya sadəcə bir qamış yarpağı,
Nə varsa cahanda udar bil, fələk!
Bu dünyaya bağlanmayaq biz gərək!
Biri tez, biri gec gedər bir qədər!
Ölümdür həyatın sonu, müxtəsər!
Bu dərdi, qəmi, Rüstəm, artıq burax!
Ağıllı deyən sözlərə ver qulaq!
Göyü, yer üzünü uçursan belə,
Bütün aləmə od da vursan belə,
Əlindən gedən bir də dönməz geri,
Tapıb ruhu başqa cahanda yeri!
Uzaqdan tamaşa mən etdim ona,
Qolu, sinəsi, qəddi, əndamına,



Əcəl çəkdi, saldı onu bu yola,
Gərəkdi, əlində sənin məhv ola!
Bu dərdə nədir çarə, söylə, tapaq!
Gedən getdi, yetməzmi qan ağlamaq?
Dedi Rüstəm: – Söhrab, ölüb, doğrudur,
Bu çöldə qoşunlarla Human durur!
Neçə çinli, turanlı sərkərdə var,
Ürəkdən çıxart kini, ey hökmdar!
Şah əmr eyləsin, həqq bizə yar ola,
Zəvara qoşunla düzəlsin yola!
Dedi Rüstəmə şah: – Ey namivər!
Döyüşdən qəmin qövr edirsə əgər,
Mənə pislik etmişsələr də inan!
Bu İranı qoymuşsalar da viran,
Mənim bağrımı yaxdı dərdü qəmin,
Yada salmaram onları, ol əmin!

Qoşunla şah İrana oldu rəvan,
Qalıb gözləyirdi Cahanpəhləvan,
Zəvarə qayıtsın, gətirsin xəbər
Ki, turanlılar əylənər, ya gedər?
Haman gün gəlib çatdı yoldan Həcir,
Dedi: – O qoşun meydanı tərk edir.
Zəvarə qayıtdı açılcaq səhər,
Təhəmtən dəxi qıldı əzmi-səfər,
Qoşunla o, yollandılar Sistana,
Çatınca bu qəmli xəbər Dəstana.
Bütün Sistan əhli qan ağladı,
Axıb sel kimi yolları bağladı.
Gözü yaşda, tabuta salcaq nəzər,
Atıldı atından yerə Zali-zər!
Qabaqda piyada gedirdi ata,
Libası cırıq, bağrı yanmış oda!
O tabut önündə açıb qurşağı,
İgidlər başa səpdilər torpağı!

Dedi Zal: – İnanmazdım əsla buna
Ki, Söhrab gələ gürz ilə meydana!
Böyüklər bilir, dünyada heç zaman
Elə bir oğul olmamışdır doğan!
Bu sözlərlə, nisgillə qan ağladı,
Dili əzbəri oldu Söhrab adı!
Gəlib qəsrinə çatdı Rüstəm haman,
O tabut önündə qopardı fəğan.
Mıxı çəkdi, tabutu açdı o dəm,
Ayırdı kəfəndən o gül cismi həm.
Bütün varlığı sanki düşdü oda,
Zala üz tutub söylədi: – Bax, ata!
Hamı baxdı o nazənin peykərə.
Fəğan yüksəlib, saldı od göylərə!
Cırıb paltarı, tökdü sərkərdələr,
Tozu, torpağı başlara səpdilər.
Tabut qəsri tutmuşdu çün sərbəsər,
Gömülmüşdü sandığa bir şiri-nər!
Sanardın ki, Samdır, belə boy atıb,
Döyüşdən çıxıbdır, yorulmuş, yatıb!
Sarı tirmə çəkdi onun üstünə,
O tabuta mıx vurdu möhkəm yenə!
– Qızıldan – dedi – tikdirin məqbərə,
Qara müşk, ənbər səpin hər yerə!
Bu arzumdu, lakin ölərsəm əgər,
Qoyarlarmı o qəbrdən bir əsər?
Daş aldı, o tikdirdi bir sərdaba,
Cahan əhli yas saxladı Söhraba.
Demişdir belə Bəhram, o xoşkəlam:
– Ölənlərlə dost olmağı bil həram!
Deyil daimi ömr, bel bağlama!
Gecikmə, hazırlaş, ayaq saxlama!
Tutaq ki, atan verdi möhlət sənə,
Çatar, bil ki, tezliklə növbət sənə!
Həyatın belə gizli bir sirri var,
Əbəs gəzmə bu gizli sirrə açar!



Bu dastandı başdan-başa göz yaşı,
Rəvadır, əgər ağlada dağ-daşı!
Kimin qəlbi həssasdır bir qədər,
Yəqin, Rüstəmi-Zala nifrin edər!
Sona yetdi dastan, sözü boşladım,
Səyavuş dastanını başladım!

## İZAHLAR

1. Demiş vəhyi tənzilləri göndərən,
Bizə əmr ilə nəhyə yol göstərən.

*Vəhy* – peyğəmbərin ürəyinə ilham olunan fikirlər.
*Tənzil* – guya Allah tərəfindən ona göndərilən əmrlər.
*Əmr* – xeyir, savab işləri görməyə təşviq.
*Nəhy* – pis işlərdən saqındırmaq əmri.

2. Mənəm əhli-beytin qulu hər zaman.
*Əhli-beyt* – Məhəmməd peyğəmbərin ailə üzvlərinə işarədir.

3. Dəniz içrə yetmiş gəmi seyr edər,
*Yetmiş gəmi* – Yer üzündə yaşayan yetmiş xalq.

4. Onun səmişini Nəbidir, Vəli.
*Nəbi* – Məhəmmədin, *Vəli* – onun əmisi oğlu Əlinin ləqəbləridir.

5. Həməl bürcünə varid olcaq Günəş...
*Həməl* – Quzu bürcü – İran təqvimi ilə mart ayının 21-dən başlanan ilin (yazın) birinci ayında Günəşin yerləşdiyi bürcün adıdır.

6. *Katuzilər* və sonrakı beytlərdə adları çəkilən *nisarilər*, *Basudə, oh-yuxoşi* – Cəmşidin peşələrinə görə əhaliyə verdiyi zümrə adlarıdır ki, şərhini şair özü verir.

7. *Ud, ban (ladən)* yandırılarkən xoş ətir saçan maddələr.

8. *Hürmüzi-fərvərdin* – Hürmüz – hər şəmsi ayın birinci günü.
Burada: iranlıların martın 21-dən aprelin 20-nə qədər davam edən fərvərdin ayının biri – Novruz günüdür. *Fərvərdin* sözü isə pəhləvicə *ravartin* sözündən əmələ gəlmişdir ki, onun da mənası pak adamların qoruyucusu deməkdir

9. *Bivərəsb* – on min atı olan.

10. *Dəh hezar* – dəri-fars dilində on min.



11. *Təxti-Cəmşid* – hazırda xarabalıqları qalmış İranın cənubundakı şəhərin adıdır ki, qədim İran şahlarının paytaxtı olmuşdur.

12. *Fərr* – cah-cəlal, əzəmət. Əfsanəyə görə şahlar nəslinə xas olan ilahi nur, ilahi vergi.

13. Gəlib çatdı Ərvəndruda haman.
*Ərvəndrud* – Ərvənd çayı, İran-İraq sərhədindən axan çay.

14. *Möhürlü cavaz* – möhürlənmiş buraxılış vərəqəsi.

15. *Gəngdej-hudəc* – gözəl qala şəhər. Pəhləvicə Beytülmüqəddəsin adı.

16. *Xaneye-pak* – farsca Beytülmüqəddəs deməkdir ki, Firdovsi oranı Qəsre-Zöhhak (Zöhhakın qəsri) adlandırır.

17. *Təngə* – dar, çıxış yolu olmayan küçə, dalan.

18. *Mehr ayı* – İran təqvimi üzrə ilin yeddinci, payız fəslinin birinci ayıdır. Farsca həm məhəbbət, həm də günəş mənasındadır.

19. *Mehrəqan* – Mehr ayının on altıncı günü. Çox qədin zamanlardan həmin gün İranda xalq bayramı, məhsul bayramı kimi də qeyd edilir.

20. Yeri xəncər ilə meyistan edək,
Göyü nizələrlə neyistan edək.
*Meyistan* – şərab gölü. *Neyistan* – qamışlıq. Yəni xəncərlə, qılıncla o qədər qan tökək ki, yer şərab (qan) gölünə dönsün. O qədər nizə qaldıraq ki, göy qamışlıq kimi görünsün.

21. *Çaçi kaman* – Çaçi – Daşkənd şəhərinin köhnə adlarından biridir ki, orada hazırlanan kamanlar möhkəmliyi və sərrastlığı ilə məşhur olmuşdur.

22. Neçə-neçə zubin, sipərlə sinan...
*Zubin* – qısa nizə; *sipər* – qalxan; *sinan* – uzun nizə; qədim döyüş silahları.

23. *Xavər* – şərq, gündoğan. Burada qala adıdır.

24. *Dejban* – qalabəyi, qala gözətçisi.

25. *Zal* sözünün mənası qoca deməkdir.

26. *Simurğ* – adı nağıllarda, rəvayətlərdə çəkilən əfsanəvi quşdur ki, körpə ikən atası Sam tərəfindən rədd edilmiş Zalı guya o quş götürüb, bəsləyib, böyütmüşdür.

27. *Hindi dəray* – Hindistanda hazırlanmış böyük zəngə deyilir ki, döyüş fillərinin üstündən asardılar.

28. *Bost* – Əfqanıstanda axan Hirmənd çayının iki qolunun birləşdiyi yerdə olan qədim şəhərin adıdır.

29. *Nimruz* – indiki Sistan (İran) vilayətinin köhnə adıdır.

30. İki nərgizə oxşayır gözləri,
Qara kirpiyi sanki qarğa pəri.
Şair gözəlin xumar gözlərini bir cüt nərgizə, onun qalın, uzun, qara kirpiklərini isə mübaliğə ilə qarğa qanadına oxşatmışdır.

31. Gövhər saçdı Sindoxt innabdan.
Şair vəsf etdiyi Sindoxtun zərif al dodağını innaba, çıxan sözləri qiymətli gövhərə, inciyə oxşadaraq gözəl və təbii istiarə yaratmışdır.

32. Nə qeysər gərəkdir, nə fəğfuri-Çin.
Qədim zamanlarda Rum hökmdarı *qeysər* adlanırdı. *Fəğfur* isə qədim Çin imperatorlarının ləqəbi olmuşdur. *Fəğfur*, yəni Allahın oğlu.

33. *Süheyli-Yəmən* – Süheyl yay fəslinin sonlarında görünən və xalq tərəfindən meyvələrin yetişməsinin müjdəçisi kimi sevilən ulduzun adıdır. Bu ulduz Yəmən üzərində daha tez və daha parlaq göründüyünə görə Yəmən Süheyli adlanır və poeziyada saflıq, parlaqlıq rəmzi kimi işlənir.

34. *Lövhü qələm* – dini rəvayətə görə kainat yarandığı gündən Yer üzündə olan bütün mövcudatın təsvir və sərgüzəşti yazılmaq üçün göydə xüsusi bir lövhə (səhifə) və qələm yaradılmışdır.

35. *Sipəhbod* – qoşunun bütün ixtiyarı əlində olan sərkərdə.

36. *Qorqsaran* – İranın hazırkı Gorgan vilayətinin qədim adı. Lüğəti mənası – qurdbaşlılar.

37. Yudu göz yaşıyla qoşa laləni
Bu misrada şair gözəlin iki yanağını qoşa laləyə oxşatmış, yəni o ağladı, göz yaşı ilə yanaqlarını islatdı.

38. *Sari və Amül* – İranın Mazəndaran vilayətindəki qədim şəhərlərin adları.

39. Mənə Sami-Yekzəxm ləqəb verdilər.
*Yekzəxm* – *yek* – bir, *zəxm* - zərbə, – yəni düşməni bir zərbə ilə yıxan Sam.

40. Alıb qoydu qırx dəst faxir libas
Ki, sərraf edərdi gövhərlə qiyas.
*Faxir libas* – qiymətli paltar. Sərraf – qiymətli əşyanın dəyərini müəyyən edən mütəxəssis. Beytdə deyilir: "Qırx dəst elə qiymətli paltar qoydu ki, sərraf onların dəyərini cəvahiratla müqayisə edərdi".

41. *Ziyc* – qədim və orta əsrlərdə ulduzların vəziyyəti və hərəkətini təyin etmək üçün münəccimlərin istifadə etdikləri kitab.

42. O, həm rəzmə, həm bəzmə ziynət verər.
*Rəzm* – döyüş meydanı; *bəzm* – işrət və müsahibə məclisi mənasında təzad təşkil etdikləri halda, klassiklər öz qəhrəmanlarını hərcəhətli müsbət göstərmək üçün bu iki həmahəng sözdən tez-tez istifadə etmişlər, necə ki bu misrada deyilir: o, həm döyüş meydanı (rəzm), həm də şənlik məclisinin (bəzm) bəzək verəni idi.

43. *Quzu bürcü* – ərəbcə Həməl, farsca Bərri. Yazın ilk ayında Günəşin məskəni sayılan bürc. *Tərazu* – mizan, tərəzi. Burada payızın ilk ayında Günəşin olduğu bürc.
*Balıq bürcü* – ərəbcə *Hut*, farsca *Mahi* bürcü. Qışın son ayında Günəş məskəni olan bürc.

44. *Sami-Neyrəm* – Neyrəm (Nəriman) oğlu Sam, Rüstəmin babası.

45. Ayın başına qoydular əfsəri.
*Əfsər* – farsca tac, əklil, zabit və günəş mənasında işlənir. Burada şair vəsf etdiyi gözəlin camalını aya, onun başına qoyulan tacı günəşə oxşatmışdır.

46. Uçar atdığı xeşt iki mil qədər.
*Xeşt* – müasir fars dilində kərpic deməkdir, burada isə xüsusi silah mənasında işlənmişdir. Xeşt – boyca gödək, qalın, ucu iti nizə olub ki, döyüş zamanı pəhləvanlar onun ipək və ya kirişdən olan halqasını şəhadət barmaqlarına keçirib fırlayaraq düşmənə atardılar.

47. Dedi: Qəm, kədər bitdi, rəstəm degər.
*Rəstəm degər* – yəni artıq qurtardım, xilas oldum.

48. *Sürud* – nəğmə, mahnı, mədh.

49. *Təhəmtən* – əsli *bihəmtatən* olmuş, yəni cüssə və güc cəhətdən misli olmayan adam. Burada Rüstəmə verilən ləqəblərdən biri.

50. *Kəyani nəjad* – Kəyan nəslindən olan şahzadə.

51. *Sami səvar* – *səvar* – farsca atlı deməkdir. Firdovsi isə bu kəlməni əsasən böyük şəxsiyyətlər haqqında igid, qəhrəman, yenilməz epitetləri kimi işlətmişdir. Burada *Sami-səvar* qəhrəman Sam mənasındadır.

52. Yatıb bayrağı, parçalanmışdı kus,
Kəfən lalə rəngində, üz səndərus.
Yəni bayraq yatırılmış, kus (əslində metaldan olan və döyüş meydanında dəvə boynundan asılaraq çalınan) böyük təbil parçalanmış, ölənlər isə ağ kəfən əvəzinə qırmızı qana boyanmış libasda düşüb qalmış, üzləri isə səndərus rəngindədir. *Səndərus* – yandırılarkən çox pis qoxu verən, kəhrəbaya oxşar sarı-qara rəngli bir maddədir.

53. *Ərman* – Ceyhun çayı vadisində qədim qala şəhər adı.

54. *Delir* – ürəkli, qorxmaz, cəsarətli.

55. *Sari* – Mazəndaran vilayətinin mərkəzi olan qədim şəhər.

56. *Dəstani-Sam* – Samın oğlu, Zalın xüsusi ləqəbi kimi işlənir.

57. *Bamin və Gərzban* – Herat şəhəri ətrafında iki qəsəbənin adı.

58. *Sunur* – (sonur da deyilir) xətt, cizgi, sərhəd.



59. *Kabilxuda* – Kabilin sahibi, şahı, Zalın qayınatası Mehrabın ləqəbi.

60. Narınca o şəngərf ilə rəng vurar.
*Şəngərf* – kükürd və civənin qarışığından alınmış sarı rəngdir. Şair rəssamın məharətini mübaliğə ilə göstərərək onun hətta narıncın təbii rəngini təkmilləşdirməyə qadir olduğuna işarə edir.

61. Yer altı qat olmuş, səkkiz asiman.
*Dini rəvayətə görə, yer də, göy də hərəsi yeddi təbəqədir.* Şair bu beytdə mübaliğə ilə deyir: qoşunların at çapması nəticəsində yerin bir qatı toz olub göyə qalxdı, altı qatı qaldı. Qalxan toz isə fəzada dayanaraq göyün səkkizinci təbəqəsini təşkil etdi.

62. Dedin İyrəcin övladı qalmamış,
Yalandır, zəhər padizəhr olmamış.
*Padizəhr* – keçmişdə zəhərə qarşı işlənən dərman (antitoksin) olmuşdur: Beytin məzmunu belədir: İyrəcin nəvəsi Mənuçehr meydana çıxarkən şahzadəni gənc ikən öldürən qatilləri gözləmirdilər ki, onun qız nəvəsi bir zaman babasının qanını istəyəcək. Ona görə də onlar Mənuçehrə də İyrəcə baxdıqları kimi, düşmən gözü ilə baxırlar.

63. *Dəstan* – Zalın ləqəbi.

64. *İspruz* – dağ adıdır.

65. *Bəbri-bəyan* – Rüstəmin pələng və ya bəbir dərisindən olan və zireh altından geyindiyi xüsusi geyimi olmuş ki, guya ona heç bir silah kar etməzmiş.

66. *Məğfər* – dəbilqə altında geyilən xüsusi baş geyimi.

67. *Həftkuh* – qədim İran-Turan sərhədində dağ-qala.

68. *Xosrovani ağac* – burada şah nəslindən doğulan gənc qəhrəmana işarə edilir.

69. *Sipəhbodluq* – orduda tam ixtiyar sahibi olmaq.

70. *Təbər* – gödək, qalın, iti ağızlı, çapacağa oxşar qədim döyüş silahı.

71. *Abinus* – tünd qara rəngdə olan xüsusi ağacın adıdır ki, keçmişdə onun yarpaq və şirəsindən bir sıra xəstəliklər üçün dərman hazırlanırdı.

72. Fəzanı dəbilqə edib sindrus.
Yəni çöldə o qədər qoşun toplanmışdı ki, onların dəbilqələri fəzanı *sindrus* – sarı-qara rənginə salmışdı.

73. Büt ikən birəhmən sənə ad qoyaq?
*Birəhmən* – bütə pərəstiş edən, büt qoruyucusudur. Şair qoca pəhləvan Gudərzin dili ilə Keykavusun alçalmasına qarşı çıxaraq deyir: – Sən pərəstişə layiq bütsən (şahsan). İndi isə özünü bütpərəst dərəcəsinə endirirsən.

74. Nə gəzdi, dolandı, nə də verdi bar.
*Bar vermək* – burada şahın əyanı qəbul etməsi mənasındadır. Yəni şah nə gəzib dolandı, nə də bir kəsi qəbul etdi.

75. *Rütəb* – şirəyə dolmuş yaş xurma.

76. *Üqab* – qartal, şahin.

77. Barqistvan – döyüş zamanı atları qorumaq üçün onların başı, boynu, döşü və sağrısına geyindirilən zirehli örtü.

78. Təbəssümlə səpdi şəkər innaba.
Misrada gözəlin al dodaqları innaba, onun xoş təbəssümü isə şəkərə oxşadılmışdır.

79. *Ərsə* – meydan, sahə, dairə.

80. Toza döndərəndə daşı, torpağı,
Tutiya edər Rəxşinin dırnağı.
*Tutiya* – keçmişdə göz ağrısını sağaltmaq və görmə qabiliyyətini artırmaq üçün işlədilən xüsusi toz – dərman olmuşdur. Beytin mənası belədir: Rüstəmin Rəxşinin dırnağı ilə toza döndərilmiş daş, torpaq tutiya şəkli alır.

81. *Sərvi-şadab* – cavan, yaraşıqlı, yamyaşıl sərv ağacı.
82. Bu çöldə ki, mənbər də var, dar da var.
*Mənbər* (minbər) – söz söylənilən yer. Misranın mənası bu çöldə danışmaq imkanı da var, vuruşub ölmək imkanı da.



## MÜNDƏRİCAT

